# ÖN SÖZ

Bu kitabımızı hədis elmləri ilə, sünnənin yazılma tarixi ilə, ümumiyyətlə İslamın tarixi ilə maraqlanan müsəlman və qeyri müsəlmanların xidmətinə təqdim edirik. Kitabda ələ alınan mövzular sünnətlə bağlı zamanımızda müzakirə olunan mövzulardır. Müzakirədə qaldırılmış suallara tarixi baxışın keyfiyyətini bilməyin, iddiaların elmi əsaslar işığında nə qədər tutarlı olduğunu bilməyin əhəmiyyətini nəzərə alaraq bu kitabı qələmə aldıq. Oxucular kitabı oxuduqca cəmiyyətimizdə bu şübhələrin sahiblərinin kim olduğunu tanıyacaqlar. Onların adlarını kitabımızda çəkməyə ehtiyac görmədik. Üstəlik fikrin xətalı və ya doğru olması onun özünün daşıdığı iddianın nə qədər əsaslandırılmış olmasından asılıdır, fikrin sahibinin kim olmağı ilə heç bir əlaqəsi yoxdur.

Kitabı oxumaq və izləmək asan olsun deyə hissələrə ayırdıq. Şübhələrin haradan, hansı fikirlərdən qaynaqlandığını göstərmək üçün məlumatlar verdik. Ehtiyac hiss etdiyimiz yerdə kitabda adları keçən bəzi şəxsiyyətlərin həyatı haqqında məlumat verdik. Kitabdakı fikirləri bacardığımız qədər sitatlar ilə əsaslandırmağa çalışdıq. Gətirdiyimiz sitatları ən etibarlı mənbələrə isnad etdik və kitabın sonunnda istifadə etdiyimiz ədəbiyyatın siyahısını hazırladıq ki, gətirdiyimiz sitatların doğruluğunu və ya dəqiqliyini yoxlamaq asan olsun.

Kitabımızda xətaların olması labüddür, çünki bir bəşər övladının məhsuludur. Belə bir xəta varsa təbii ki, bu nöqsanın mənşəyi insandır, düzəldilməyə həddindən ziyadə sayandır. Əgər mənada və tərtibdə haqqa müvəffəq olmuşuqsa bu da Aləmlərin Rəbbinin lütf etdiyi müvəffəqiyyətdir, Axirətdə tərəzimizdə hesaba alınacağına ümid etdiyimiz bir nəaliyyətdir.

***Nəriman Hüseyn***

# ORİENTALİSTLƏR VƏ HƏDİS ƏDƏBİYYATI

Ignaz Goldziher[1] 1889-cu ildə alman dilində "Muhammedanische Studien" (Müsəlman Elmləri) adlı kitabını nəşr etdikdə Qərbin şərqşünaslığı[2] çizgisində yeni bir nişan ağacı əkmiş oldu. Özündən əvvəlki araşdırmalardan fərqli olaraq Goldziher təqdim etdiyi kitabında çox geniş və təfsilatlı biliklər sərgiləyirdi və şübhəsiz ki, belə bir yenilik şəqrşünaslar mühitini təsirsiz buraxa bilməzdi. O, bu kitabında İslam qaynaqlarındakı hədislərin əksəriyyətinin siyasi dairələr tərəfindən öz maraqlarına xidmət etmək üçün uydurulduğunu iddia edir. İddiasına görə İslam fiqhi öz üstünlüyünü hədislərə yox, lakin qaydalarını əcnəbi mədəniyyətlərdən götürərək İslam mədəniyyətinə daxil etmiş və onları dəstəkləmək üçün hədis uydurmuş siyasi da-

1. Ignaz Goldziher (1850-1921) əsl adı Yitzhaq Yehuda olan yəhudi əslli macar şərqşünasdır. Alman Theodor Nöldeke və holland Christiaan Snouck Hurgronje ilə birlikdə Goldziher Avropada müasir islamşünaslığın banisi sayılır. Goldziher bütün ömrü boyu öz yəhudi dininə sadiq bir kəs olaraq qalmasına baxmayaraq İslam dininə xüsusi bir maraq bəsləyərdi. İslam dinini öyrənmək üçün Macarıstan hökumətinin dəstəyi ilə Suriya, Fələstin və Misirə səyahətlər edib və Qahirədə əl-Əzhar məscidində müsəlman şeyxlərindən islam elmlərini öyrənib. Goldziher İslam dinini bütün əsasları ilə ən məntiqli və şüurlu din hesab edirdi və bu barədə gündəliyində yazır: "O həftələrdə mən İslamın ruhuna o qədər dərin dalmışdım ki, mən daxilən özümün də müsəlman olduğuma əmin olmuşdum və hakimanə bir tərzdə kəşf etmişdim ki, bu – hətta öz etiqadı və rəsmi formulasına baxmayaraq – fəlsəfi düşüncələri tətmin edəcək yeganə dindir. Mənim idealım yəhudiliyi də İslam qədər rasional/şüurlu səviyyəyə qaldırmaq idi. Təcrübəmin mənə öyrətdiyinə görə İslam yeganə dindir ki, mövhumatçı və bütpərəst komponentlər rasional düşüncə tərəfindən yox, elə ənənəvi doktrin/inanc tərəfindən rədd edilir." ("Tagebuch", səh: 59;) Goldziher məsləkinin ilk dövründə xristian akademiklər tərəfindən qəbul edilmirdi, lakin daha sonra akademik dairələr onun dərin biliklərini təqdir etməyə məcbur olurlar. Goldziher'in İslam sevgisinə aldanmadan deməliyik ki, İslam dinində bəyənmədiyi və tənqid etdiyi tərəflər də olub. Hətta məsciddə müsəlmanlar ilə birlikdə namaz qıldığını bilsək belə günün sonunda onun bir yəhudi olduğunu nəzərə almalıyıq.

2. Azərbaycan dilində şərqşünas, avropalıların dilində isə oriyentalist kimi tanınan alimlər Edward Said'ə görə "Xüsusi və ya ümumi baxış acısından Şərqi öyrədən, yazıya tökən yaxud da araşdıran kimsədir və gördüyü iş də şərqşünaslıqdır." (Edward Said, "Orientalizm", səh: 2)

irələrə borcludur. Kitab daha sonra gəlmiş çox sayda şərqşünas üçün ana qaynaq rolunu oynadı və hədisləri tənqid edən qərbli şəqrşünaslar ondan əvəzsiz ilham aldılar.

Bu iddiasında Goldziher bir ilk deyildi. Ondan öncə şotlandiyalı Sir William Muir (1819-1905) və avstriyalı Aloys Sprenger (1813-1893) kimi şərqşünaslar hədis ədəbiyyatının xeyli hissəsinin uydurma olduğunu iddia edirdilər, lakin onlardan heç biri bunu sübut etməyə çalışmaq üçün Goldziher qədər əziyyətə qatlanmamışdı. Buna baxmayaraq Goldziher bütün hədisləri rədd etmirdi, onların içində səhih və etibarlı hədislərin olduğunu qəbul edirdi. Bu işi daha da ötəyə götürən alman əslli Joseph Franz Schacht (1902-1969) oldu. 1950-ci ildə çap etdirdiyi “The Origins of Muhammadan Jurisprudence” (İslami Hüququn Qaynaqları) adlı kitabında[3] hədislərin nəinki siyasətçilər tərəfindən uydurulduğunu iddia etmiş, hətta daha da irəli gedərək İslamın böyük fəqihlərini yalanda ittiham etmişdir. Onun iddiasına görə isnadı qırıq və zəif olan hədislər ən qədim hədislərdir, çünki ilk dövrlərdə isnad olmayıb, ona görə də natamam isnadlar mütləq ən qədim hədislərə aid olmalıdır, isnadı ən yaxşı olan hədislər isə gərək ki, sonrakı dövrdə uydurulmuş, saxtalaşdırılmış sözlər olmalıdır[4]. Schacht özündən əvvəlki şərqşünaslardan fərqlənirdi. Aloys Sprenger 1861 və 1865-ci illər arasında çap etdirdiyi “Das Leben und Die Lehre Des Mohammad” (Muhəmmədin Həyatı və Təlimi) adlı üç cildlik kitabında hədis ədəbiyyatında uydurma hədislərin çox olduğunu söyləsə də səhih, doğru olan hədislərin də bir o qədər, bəlkə daha çox olmasını möhtəməl görürdü. Hətta Muir belə hədislərin ümumilikdə tarixi faktlar kimi qəbul edilməsini doğru hesab edirdi. Bu şərqşünasların heç biri Schacht kimi hədisləri tamamilə uydurma hesab etmirdilər. Fransız əslli hollandiyalı şərqşünas Reinhart Pieter Dozy (1820-1883) “Het İslamisme”[5] adlı

3. Bu kitabında istifadə etdiyi qaynaqlardan biri də azərbaycanlı şərqşünas Mirzə Kazım Bəy’in “Journal Asiatique” adlı dərgidə çap etdirdiyi məqalələridir.

4. Misal üçün holland şərqşünas Gautier Juynboll (1935-2010) “Nafi, the Mawla of Ibn Umar and His Position in Muslim Hadith Tradition” adlı kitabında Schacht’ın uzantısı olaraq İbn Ömərin azadlı qulu Nafi’nin tarixi bir şəxsiyyət olduğunu inkar etmiş, onun uydurulmuş biri olduğunu demişdir. Onun sözündən belə çıxır ki, aradakı boş linki doldurmaq üçün Malik və onun zamanında yaşayanlar Nafi kimi bir nəfəri uydurublar.

5. Fransız dilində “Essai sur l’histoire del’islamisme” adı ilə yayılmış bu kitab Osmanlı zamanında Abdullah Cevdet tərəfindən “Tarih-i İslamiyyet” adı ilə türk dilinə çevrilib.

kitabında "Sahih əl-Buxari" kitabındakı hədislərin yarısının uydurma olduğunu iddia edərkən heç olmasa digər yarısına etimad ediləcəyini qəbul edirdi.

Goldziher, Brockelmann, Margoliouth və onlardan sonra gələn Schacht kimi orientalistlər hədislərin ilk iki əsrdə bir kitab halında yazılmağını da inkar ediblər. Onların dünyasında ilk hədis kitabları əl-Buxari və Muslim'in "əs-Sahih" kitablarıdır. Daha dəqiq desək ilk dəfə hicri üçüncü əsrdə hədis kitablarının yazıldığını iddia edirlər.

Orientalistlər arasındakı bu küləklər keçən əsrin sonlarına qədər əsməyə davam etdi. Schacht və onun müdafiəçiləri şərqşünaslar arasında çox güclü avtoritetə və təsirə sahib idilər. Şübhəsiz ki, Schacht qazandığı bu nüfuzu hər kəsdən öncə Goldziher'ə borclu idi, çünki – Gregor Schoeler'in sözü ilə ifadə etsək – Goldziher "**özündən sonra gələn şərqşünaslara aşkarcasına xeyli təsir göstərmişdi.**" Doktor Kevin Reinhart qeyd edir ki, "**hətta Schacht'ın zamanında – Schacht'ın istehzalı kobud cavabları ilə qismən susdurulmaqlarına baxmayaraq – onunla razılaşmayan bəzi alimlər var idi.**" Bu alimlər say etibarı ilə çox olmasalar da Schacht'ın qərəzli yanaşmasını ifşa ediblər. Bunların arasında Almaniyadan Johann Wilhelm Fück (1894-1974) xüsusilə seçilir. O, hədislərin ümumən səhih və etibarlı qaynaqlar olduğunu müdafiə edib və hədislərin dövrünün siyasətçiləri və müsəlman alimlər tərəfindən uydurulduğunu iddia edən şərqşünaslara etiraz edərkən önəmli bir nöqtəyə toxunmuşdur. Fück hədis rəvayətlərinin daha çox Abdullah bin Ömər, Abdullah bin Abbas, Ənəs bin Malik kimi kiçik səhabələrdən rəvayət edildiyini xatırladaraq bunun hədis uydurmaqla uyğun gəlmədiyinə diqqət çəkir, çünki hədisi uyduranlarin təbii olaraq onu güclü göstərmək məqsədi ilə daha böyük səhabələrə nisbət etməkləri gözlənildiyi halda hədislərin çoxu kiçik səhabələr vasitəsi ilə rəvayət edilmişdir.

Hədislərin qədimliyini və mötəbərliyini müdafiə etməkdə xüsusilə seçilən digər şərqşünas Chicago universitetinin professoru

---

Bu kitab akademik dairələrdə düşüncə azadlığı vəd edən ikinci məşruiyyət dövründə, daha dəqiq 1908-ci ildə çap edilmiş ilk islam əleyhdarı sayılacaq kitab idi.Osmanlının müsəlman ziyalı təbəqəsi bu kitaba cavab keyfiyyətini daşıyacaq məqalələr və kitablar yazıblar. Bu kitabların içində ən məşhurları Manastırlı İsmail Hakkı'nın "Hakk ve Hakikat" kitabı və İsmail Fenni Ertuğrul'un "İzale-i Şukuk" kitablarıdır.

şərqşünas Nabia Abbott (1897-1981) idi. Üç cilddə çap etdirdiyi "Studies In Arabic Literary Papyri" (Ərəb Ədəbi Papirusları Üzərinə Araşdırma) əsərində 19-cu əsrdən başlayaraq üzə çıxarılmış qədim papirus parçalarını araşdırması nəticəsində tarixi qaynaqların doğruluğu qənaətinə varır və bununla bağlı kitabın müqəddiməsində buyurur: "Sənədlərdəki xəbərlərin rəvayət zəncirlərini və tərkiblərini və bu xəbərlərin standart toplulardakı mövcud paralellərini analiz etmək, üstəlik Rəvayət elmləri – "ulumul-hədis" – ilə bağlı qaynaqları geniş şəkildə araşdırmaq məni bu nəticəyə gətirib çıxardı ki, şifahi və yazılı rəvayət yolları elə təqribən ilk başdan bir-birinə paralel olaraq formalaşmışdır və səhabələrinin və ona tabe olanların rəvayət etdikləri kimi Muhəmməddən gələn xəbərlər bir qayda olaraq rəvayət yolunun hər bir addımında incəliklə yoxlanılmışdır və xəbərlərin ikinci-üçüncü əsrlərdə "fenomenal artımı" Muhəmmədin hədisi və səhabələrinin hədisinə gəldikdə heç də ilk növbədə onların möhtəvasının artımı deyildi, lakin sadəcə onların paralellərinin və rəvayətin çox saylı zəncirlərinin proqressiv artımını əks etdirir."

Zamanımızın şərqşünas akademikləri artıq Schacht dönəminin tarixdə qaldığını etiraf edirlər. Hədislərin səhihliyini və originallığını müdafiə edən müasir akademiklərdən alman şərqşünas Gregor Schoeler "The Oral and The Written in Early Islam" (Erkən İslamda-Şifahi Olan və Yazılı Olan) adı altında çap olunmuş məqalələrində[6] yazılı rəvayətləri şifahi rəvayətlərin qarşısına qoymağı xətalı yanaşma hesab edir. O, misallar və müqayisələrin vasitəsi ilə yazılı rəvayətlərin şifahi rəvayətlərin əsası və dəstəyi olduğunu uğurla müdafiə edir. Schoeler çox maraqlı bir müqayisə edir və ilk əsrdə yazılmış hədisləri müasir zamanımızdakı universitet professorların mühazirələrində aparılan qeydlərə bənzədir. Əlavə edək ki, son əsrdə Qərb universitetlərində qərbli akademiklər ilə birlikdə islamşünaslıq sahəsində araşdırmalar aparanların sırasına əslən müsəlman olanlar da qatıldıqları üçün tamamilə yeni küləklərin əsdiyini görə bilirik. Gol-

6. 1944-cü ildə Almaniyada doğulmuş Gregor Schoeler 2009-cu ildən Basel universitetində islamşünaslıq kafedrasının sədridir. Bundan öncə 1982-ci ildən başlayaraq Parisdə Sarbon universitetində professor kimi çalışmışdı. Onun "The Oral and The Written in Early Islam" adlı kitabının əslini alman dilində dərc etdiyi altı məqalə təşkil edir. İlkini 1981-ci ildə, sonrakı məqalələri isə 1985, 1989, 1992 və 2000-ci illərdə nəşr etmişdir.

dziher və Schacht kimilərinin düşüncələri hələ də qərbli islamşünaslar arasında hakim olsa da artıq o düşüncələrin ciddi tənqidə məruz qaldığı da qəbul olunan bir hala gəlib. Xüsusilə Muhəmməd Mustafa Azami, Vail Hallaq kimi bilim adamlarının verdikləri cavablar keçmiş təsəvvürlərin xətalı olduğunu izhar edir. O, "Studies In Early Hadith Literature" (Erkən Hədis Ədəbiyyatı Haqqında Araşdırmalar) adlı kitabı ilə 1967-ci ildə Cambridge universitetində "fəlsəfə doktoru" statusunu qazanır. Azami bu kitabında birinci və ikinci əsrlərdə yazılmış kiçik hədis kitablarını işıq üzərinə çıxararaq şərqşünaslıq çizgisində yeni bir nişan ağacı əkmişdir. Həmçinin Muhəmməd Həmidullah'ın bu yöndə əməyi heç də Azami'nin əməyindən geri qalmır. Həmçinin Professor Doktor Fuad Sezgin "Buhari'nin Kaynakları" adlı kitabı ilə qərbli akademiklərin düşdükləri yalnışlığa bir daha işıq salmışdır.

Bu kitabımızda oxucu – inşallah - hədisin ilk əvvəldən yazıldığının danılmaz sübutları ilə tanış olacaq. Bu və digər sübutları işıq üzünə çıxaraq Muhəmməd Mustafa Azami kimi müsəlman akademiklər şərqşünasların səmimiyyətsizliyini ifşa etməyi bacarıblar.

## İslam coğrafiyasında sünnə inkarı

İslamın qədim tarixində hansısa bir islami camaatın və ya məzhəbin sünnəni şəriətin əsasını təşkil edən bir dəlil olaraq tamamilə inkar etdiyini bilmirik, belə bir şey bizə məlum deyildir. Bir nəzəriyyə olaraq belə bir etiqadı islam alimləri küfr olaraq təsnif ediblər. Cələluddin əs-Suyuti (vəfatı hicri 911) deyir: "**Bil ki, hər kim üsul elmindəki məlum şərtlər çərçivəsində peyğəmbərin – salləllahu aleyhi va səlləm – hədisinin – söz və ya fel olmasından asılı olmayaraq – hüccət olduğunu inkar edərsə küfr etmiş və İslam dairəsindən çıxmışdır və yəhudilər, xristianlar və ya Allahın dilədiyi kafir firqələrdən biri ilə həşr olunacaqdır.**"[7] əs-Suyuti'nin bu şiddətli sözləri hədislərin bir hissəsini qəbul etməyənlərə aid deyildir, lakin peyğəmbərin sözünü və ya felini dəlil hesab etməyən insanlara aiddir. əl-Qadi əş-Şəvkəni də bunu dəstəkləyərək deyir: "**Pak sünnətin dəlil və qanun vericilikdə**

7. "Miftəhul-Cənnə fil-İhticəci bis-Sunnə", səh: 2;

**müstəqil olması dini bir zərurətdir və bu nöqtədə yalnız İslam dinindən bir payı olmayan kəslər müxalif ola bilər.**”[8] Alimlərimizin çıxardıqları bu hökm Qurandan bir çox möhkəm ayəyə dayanır. Onlardan birində Allah – cəllə cələluhu – buyurur: “**Amma, xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar.**”[9] Bu ayənin tələbi ilə şəriət məsələlərindən hər hansı bir məsələdə peyğəmbərin verdiyi hökmü bildiyi halda onu qəbul etməyən kimsə iman sahibi ola bilməz.

Bəzi müəlliflər sünnəni inkar etmək fikrini şiələrə, xaricilərə və mötəzililərə nisbət ediblər. Məlumdur ki, şiələr ümumilikdə sünnə əhlinin kitablarındakı hədisləri – bəziləri müstəsna olmaqla - qəbul etmirlər. Amma bu inkar peyğəmbərin sözünün və ya felinin dəlil olduğunu inkar etmək sayılmamalıdır, sadəcə olaraq həmin hədisləri peyğəmbərin – aleyhissələm – həqiqi sözləri kimi qəbul etməkdən imtina olaraq dəyərləndirilməlidir. Şiələrin bəzi səhabələr müstəsna olmaqla əksər səhabələrin peyğəmbərdən rəvayət etdiklərini etibarlı nəql olaraq qəbul etməməkləri etiqadi məsələlər ilə bağlıdır, yoxsa peyğəmbərin – salləllahu aleyhi va səlləm – sözünü, felini şübhəsiz ki, dəlil hesab edirlər.

Eyni şəkildə xavaric adı altına daxil olan firqələr və həmçinin mötəzililər sünnəni ümumilikdə hüccət olaraq inkar etməyiblər, ancaq sünnədən bəzi mövzuları qəbul etməyiblər. Çünki onların etiqadına əsasən həmin sözləri peyğəmbərə - salləllahu aleyhi va səlləm – nisbət etmək xətadır. Beləliklə şiələr, xaricilər və mötəzililər ümumi olaraq sünnəni dəlil olaraq qəbul edirlər və sünnə dedikdə biz peyğəmbərin – aleyhissalətu vassəlləm – fellərini, sözlərini və təsdiqini qəsd edirik. Xaricilər haqqında onu da əlavə edək ki, onların məzhəblərini biz öz kitablarından oxuya bilmirik, çünki xavaric firqələrinin kitabları mövcud deyildir. Onların fikirləri haqqında oxu-

8. “İrşədul-Fuhul ilə Təhqiqil-Haqqi min İlmil-Usul”, 1/97;

9. ən-Nisə, 65

duqlarımız məlumatların əsas hissəsi onlara müxalif olan qrupların yazdığı kitablardan əldə edilib. Bu baxımdan xaricilərin arasından ibadiləri istisna edə bilərik, çünki bu günə qədər də Oman dövlətində rəsmi məzhəb olaraq mövcudiyyətlərini sürdürürlər. Onların kitablarına nəzər saldığımızda görürük ki, səhabələrdən öz yolları ilə rəvayət etdikləri xəbərləri qəbul edirlər. İbadilər “Musnəd ər-Rabi”[10] kitabında keçən xəbərlərə əsaslanırlar.

Bu arada özlərini “quranilər” adlandıran firqələr üzərində dayanmağımız lazımdır. Bu günlərdə adları tez-tez çəkilən bu qrupun ən əsas şüarı budur ki, dinin yeganə əsası Quran olmalıdır. Bununla bağlı söyləməliyik ki, dini anlayışı olan heç bir ağıllı insan dini hökmlərdə sadəcə Quran ilə kifayətlənməyin mümkün olduğuna inana bilməz, belə ki, Quranda namaz, zəkat, oruc və həcc kimi İslamın sütunları sayılan ibadətlərin təfsilatı yoxdur. Amma qəflətdə yaşayan qruplar arasında bu iddianı edənlər çox təəssüf ki, bizim zamanımızda mövcuddur. Tarixə nəzər salsaq onları xatırladacaq ayrı-ayrı fərdlərin tarixən mövcud olduğunu görə bilərik. Misal üçün əl-Xatib əl-Bağdadi, əl-Beyhəqi və başqalarının qeyd etdikləri bir xəbərdə böyük islam alimi Əyyub əs-Sixtiyəni (h. 66-131) deyir: “**Əgər bir kəsə sünnəni rəvayət etsən və o sənə “burax bunu, bizə Qurandan danış!” deyərsə bil ki, o azğındır və camaatı azdırır.**”[11] Əyyubun bu sözü o dövrdə bu fikirdə olan insanların mövcud olduğunu bizə xəbər verir. Görünür ki, İmam əş-Şafi də “xəbərlərin hamısını inkar edən tayfanın rəyini hekayət etmək” adlı başlıq altında açdığı bölmədə[12] məhz bu fikir sahibləri ilə münaqişə edirdi. Amma bu fikir hansısa bir camaatın şüarı olaraq bilinmirdi və sadəcə ayrı-ayrı fərdlərdə və ya kiçik qruplarda mövcud ola bilərdi. Bəlkə də bu fikirlər ilk öncə məhdud plüralizm adlandıra biləcəyimiz İraq cəmiyyətinə xas bir mühitdə

10. Bu kitabı ibadilər ər-Rabi bin Həbib əl-Fərahidi adlı bir nəfər nisbət edirlər. Amma nə sünnilərin, nə də ibadilərin tarixi qaynaqlarında ər-Rabi bin Həbib haqqında məlumata rast gəlmək olmur. Ona nisbət edilən bu “müsnəd” kitabı da ilk əsrlərdə heç bir yerdə adı çəkilmir. Bir sözlə bu kitab sonrakı əsrlərdə yazılmış və ər-Rabi bin Həbib adlı birinə nisbət edilmişdir. Lakin istənilən halda ibadilər kitabın içindəki xəbərlərə “sünnət” olaraq etibar edirlər. Bizi maraqlandıran nöqtə də məhz budur.

11. “əl-Kifəyə fi İlmir-Rivayə”, səh: 16;

12. Bax: “əl-Umm”, 7/287;

ortaya çıxıb. əş-Şafi'nin müxalifini Basra şəhərinə nisbət etməsi[13], Əyyubun da Basra şəhərindən olması bu ehtimala güc qazandırır.

Sünnəni qismən inkar etmək fikri orta əsrlərdə yalnız marginal qrupların arasında görmək mümkündür. On doqquzuncu əsrdən başlayaraq Qərb dünyasından çıxmış orientalistlərin təsiri müsəlman dünyasına qədər uzanır. Bu təsir xüsusilə Osmanlı Türkiyəsində, Hindistanda və Misirdə özünü bariz şəkildə göstərməyə başlayır. Anadolu torpaqlarında bu fikirlərdən təsirlənmiş yazarların, mütəfəkkirlərin əsərləri ümumi müsəlman coğrafiyasının hər bir tərəfinə çatacaq imkanlara sahib deyildi. Ola bilsin ki, dilin osmanlı türkcəsində olması bu məhdudiyyətin səbəblərindən biri idi. Eyni şey Hindistan üçün də keçərlidir. Amma Misir tamamilə fərqli şərtlərə sahib idi. Misirdə aparılan ideoloji mübahisələr, təqdim olunan fikirlər daha geniş coğrafiyaya təsir edə bilirdi və bunun ən əsas iki səbəbi var idi. İlk səbəb istifadə olunan dilin ərəb dilində olması idi, çünki hər bir halda ərəb dili dini ədəbiyyatın əslini təşkil edirdi. Misirdə çap olunan jurnallar sayəsində bu fikirlər uzaq ərazilərdə yaşayan kütlələrə çatırdı. Bu jurnallar Yəmən, Hindistan, İndoneziya kimi uzaq ölkələrə gedib çıxırdı. İkinci səbəb isə dini maarifləndirmənin ən əsas ocağının Misirdə yerləşməsi idi və biz təbii ki, Əzhar universitetini qəsd edirik. Beləliklə də İslam dünyasında güclü əks səda doğurmuş reform hərəkatı bu səbəblərlə bağlı olaraq Misirdə başlamış oldu. Bu hərəkatın lideri sayılan Muhəmməd Abduh (1266-1323/1849-1905) sünnəni qismən inkar etmək üçün ümumi din və xüsusi din fikrinin formalaşmasında iştirak edir. Bu fikir sahiblərinə görə Quran və mütəvatir xəbərlərin isbat etdiyi din "ümumi din" sayılır və bir də sadəcə hədislərin öyrətdiyi "xüsusi din" mövcuddur. Onların nəzərində tabe olunması vacib olan din ümumi dindir, bəzən buna "əməli sünnə" adını da verirlər. Amma xüsusi din müzakirəyə açıq olmalı, fərdlərin seçiminə tabe olmalıdır. Muhəmməd Abduh bu fikirlərində Cəmaluddin əl-Əfğani'dən (1254-1314/1838-1897) təsirlənmişdi. Hər iki şəxsiyyət dini reform etmək, müasir zamanın tələblərinə uyğunlaşdırmaq fikrinin tərəfdarları sayılırlar. Ona görə də Mustafa Sabri

13. Bax: Mustafa əs-Sibəi, "əs-Sunnə va Məkənətuhə fit-Təşri əl-İsləmi", səh: 148

Efendi[14] (1286-1373/1869-1954) Muhəmməd Abduh haqqında danışarkən deyir: "**Ola bilsin ki, Lüter və Kelvin kimi protestant liderlərin xristianlıqda oynadıqları rolu o və dostu və ya şeyxi Cəmələddin (əl-Əfğani) İslamda oynamaq istədilər. Amma müsəlmanlar üçün yeni bir dinin əsasını qoymaq işi onlar üçün baş tutmadı, onların səylərinin təsiri sadəcə olaraq dirçəliş və reform pərdəsi arxasında gizlənmiş dinsizliyə dəstək verdi.**"[15] Muhəmməd Abduhun ən bariz tələbələrindən olan Muhəmməd Raşid Rida (1282-1354/1865-1935) fəaliyyətinin ilk dövrlərində ümumi və xüsusi din anlayışlarını müdafiə edən kəslərdən idi. Açdığı və idarə etdiyi "əl-Mənar" jurnalında bu fikri dəstəkləyən çox sayda məqaləyə yer vermişdi. O məqalələrdən bir çoxunu şəxsən özü qələmə alır, bir hissəsi də həmfikirlərinin yazılarından ibarət idi. Ümumilikdə bu fikri bölüşən kəslər üçün öz jurnalında çıxış platforması hazırlamışdı. Bu çıxış platformalarından istifadə edən kəslərdən biri də Muhəmməd Təvfiq Sidqi (1298-1338/1881-1920) idi. O, sünnəni inkar etmək fikrində pionerlərdən sayılır. 19-cu əsrin başlanğıcında Təvfiq Sidqi "əl-Mənar" jurnalında "İslam yalnız Qurandır" başlığı altında iki məqalə yayımladı. İxtisas baxımından həkim olan Təvfiq Sidqi bu iki məqaləsində İslam dininin yeganə qaynağının Quran olması gərəkdiyini və sünnəyə etibarın olmadığını müdafiə edirdi. Bu məqalələrdə o, mütəvatir sünnə ilə qeyri mütəvatir sünnə arasında fərq qoymurdu. O dövrün bəzi əzharlı alimləri ona məqalələrində qeyd etdiyi fikirlərlə bağlı cavab verdilər. "əl-Mənar" jurnalının sahibi Muhəmməd Raşid Rida ömrünün o çağındakı[16] modernist fikirlərdən çıxış edərək Təvfiq Sidqi'yə dəstək verdi, amma bəzi nöqtələrdə ona etirazlar etdi. Ondan fərqli olaraq Muhəmməd Raşid Rida mütəvatir hədisləri qəbul etməyi zəruri görürdü. Təvfiq Sidqi daha sonra Raşid Rida'nın təsiri altında əvvəlki rəyindən dönür və mütəvatir hədisləri dinin mənbəyi kimi qəbul etməyə başlayır.

14. Bəziləri onu Osmanlı Dövlətinin sonuncu şeyxul-islamı adlandırır, lakin doğru olan budur ki, sonuncu şeyxul-islam məqamında Medeni Mehmed Nuri Efendi oturub. Mustafa Sabri Efendi 1922-ci ildə Atatürkün ələ keçirdiyi Türkiyəni tərk etməli olur və sonunda Misirdə yerləşir və ömrünün sonuna qədər orada qalır.

15. "Məvqif əl-Aql val-İlmi val-Aləm", 1/144;

16. Bunu onun həyatının ilk dövrünə aid etməyimiz ondan irəli gəlir ki, Raşid Rida ömrünün son mərhələsində bir çox fikrindən dönüb. Bu məsələdə də fikrindən döndüyünü Mustafa əs-Sibəi kitabında qeyd edir.

Bu cərəyanın digər üzvü Əhməd Əmin İbrahim ət-Tabbax (1886-1954) Əzhar universitetinin məzunlarındandır. 1929-cu ildə nəşr etdiyi "Fəcrul-İslam" adlı kitabında İslamdakı iki əsasdan biri olan sünnəyə kölgə salır və onu etibardan düşürür. 1933-cü ildə əsası qoyulmuş "ər-Risələ" jurnalında yazıçı ədib kimi fəaliyyət göstərir və fikirlərini həmin jurnal vasitəsi ilə ictimaiyyətə çatdırırdı. Eyni dövrdə daha bir gənc misirli bu fikirlərə rəvac verən karvana qoşulur. İsmayıl Əhməd Paşa Ədhəm adı ilə tanınan bu gənc 1934-cü ildə sünnənin tarixi haqqında kiçik bir risalə yazır və orada əl-Buxari və Muslim'in "əs-Sahih" kitablarını tamamilə etibardan salır.[17]

Sünnəni inkar edənlərin arasında bəlkə də ən çox əks səda doğuranların başında Mahmud Əbu Rayyə (1307-1390/1889-1970) gəlir. Hicri 1364-cü ildə, miladi 1945-ci ildə "ər-Risələ" jurnalının 633-cü nömrəsində "əl-Hədis əl-Muhəmmədi" adı altında məqalə yazmaqla bu fikir sahiblərinin sırasına qoşulan Əbu Rayyə həmin məqalədə hədis haqqında fikirlərini qısa şəkildə ərz edirdi və üzərində işlədiyi tezisi daha təfsilatlı şəkildə ayrı bir kitabda nəşr edəcəyini vəd edirdi. Həmin il ərzində əzharlı alimlərdən Muhəmməd Əbu Şəhbə eyni jurnalın 642-ci sayında bu məqaləyə cavab verir. Hicri 1377, miladı 1956-cı ildə Əbu Rayə "Ədva aləs-Sunnə əl-Muhəmmədiyyə" adı ilə tanınan kitabını çap etdirdi. Bundan sonra məşhurlaşan Əbu Rayyə'nin kitabı qısa bir zamanda iki dəfə çap olunur. Bu kitabında bütün fikirlərini tam açıqlıqla sərgiləyirdi və həqiqətdə sünnəni tamamilə etibardan salırdı. Görünür ki, Əbu Rayyə bu

17. Əslən türk olan İsmayıl Ədhəm (1329-1359/1911-1940) Misirdə İskəndəriyyə şəhərində anadan olub. Atası müsəlman türk, anası isə nəsrani olan bu gənc onu tanıyanlar tərəfindən dərin zəka və güclü dərrakə ilə tanınıb. Onun 20 yaşında Moskvada professor dərəcəsini qazanması, ondan sonra Sovet Elmlər Akademiyasının üzvü olması və Sankt Peterburqda universitetdə müəllim kimi çalışması buna dəlalət edir. Daha sonra Ankarada Atatürk Universitetində riyaziyyat müəllimi olaraq çalışmışdır. 1936-cı ildə Misirə geri dönür. İsmayıl Ədhəm gənc yaşlarından qərb filosoflarının kitablarını mütaliə edərək, marksist düşüncəli insanlar ilə mübahisə edərək dini prinsiplərini tamamilə tərk edir və hətta "Nə üçün mən ateistəm?" adında bir kitab yazır. Türkiyədə olduğu müddətdə ateizmi yaymaq üçün fəaliyyət göstərir, eləcə də Misirdə olduğu müddətdə dini düşüncələrə qarşı mübarizə aparır. 1940-cı ildə iyun ayının 23-ndə İskəndəriyyə şəhərində Aralıq dənizi sahillərində cəsədi tapılır. Üzərindən tapılan məktubdan anlaşılır ki, həyatdan məyus olduğu üçün, ona rəğbət göstərmədiyi üçün intihar edib. Həmin notda müsəlman qəbiristanlığında dəfn olunmamasını, cəsədinin yandırılmasını və başının yarılaraq öyrənilməsini vəsiyyət edirdi. Vəsiyyətinə rəğmən qohumlarının istəyi ilə müsəlman qəbiristanlığında basdırılır.

baxımından Muhəmməd Abduh'dan təsirlənib. O, kitabında deyir: "**Ustaz İmam Muhəmməd Abduh – radiyallahu anhu! – dedi: "Müsəlmanların bu əsrdə Qurandan başqa imamları yoxdur...**"[18] Muhəmməd Abduh üçün adətən səhabələr üçün işlədilən duanı etməsi onu ziyadə bir təzim ilə andığını göstərir. Şübhəsiz ki, Əbu Rayyə bu fikirlərində Muhəmməd Abduhu özünə müəllim hesab edir. Amma bu təsir sadəcə Muhəmməd Abduh'la qurtarmırdı. O dövrün Misirində Qərbin orientalistlərinin kitabları artıq təhsil ocaqlarında tədris olunurdu. Bununla bağlı Şeyx Mustafa əs-Sibəi (1333-1384/1915-1964) bir xatirəsini bölüşərək deyir: "**Şəriət fakultəsində fiqh, üsul, islam qanunvericiliyi tarixi ixtisasları üzrə ikinci və üçüncü kurslarda tələbə olduğumuz vaxt – və bu, 1939-cu il idi – Şeyx əl-Mərağı'nin zamanında Əzhar şeyxliyi Professor Əli Həsən Abdulqadiri bizə islam qanunvericiliyi tarixi barəsində dərs vermək üçün müəllim təyin etdi. Təhsilini Almaniyada təzəcə qurtarmışdı və o, tarix bölümündə "üsulud-din" fakultəsini bitirmişdi. Xatırladığım qədəri ilə Almaniyada fəlsəfə elmləri üzrə professor diplomunu alanadək dörd il qalmışdı. Ondan aldığımız ilk dərsimizdə bu sözləri ilə başladı: "Mən sizə islam qanunvericiliyi tarixini öyrədəcəm, lakin Əzharın tanımadığı elmi bir metod ilə öyrədəcəm. Sizə etiraf etməliyəm ki, mən Əzharda on dörd il oxumuşdum və İslamı başa düşməmişdim. Lakin İslamı mən Almaniyada oxuyarkən başa düşdüm." Biz tələbələr belə bir sözdən çox təəccübləndik və öz aramızda dedik: "Gəlin müəllimimizə qulaq asaq! Bəlkə həqiqətən də İslam haqqında Əzharın tanış olmadığı, öyrənməyimizə layiq bir şey öyrədəcək." Sonra peyğəmbər sünnənin tarixi haqqında dərsinə qarşısında duran böyük bir kitabdan hərfən tərcümə etməklə başladı və sonradan öyrəndik ki, o, Goldziher'in "İslami Dərslər" kitabı idi...**"[19]

Əbu Rayyə də eyni şəkildə orientalistlərin kitablarından təsirlənmişdi. Onun yazdığı kitab Misirdə sünnəni tamamilə inkar edən ilk elmi kitab sayılır. Ona görə də sünnəni müdafiə edən alimlərdən

18. "Ədva aləs-Sunnə əl-Muhəmmədiyyə", səh: 378-379;

19. "əs-Sunnə va Məkənətuhə fit-Təşri əl-İsləmi", 1/19;

bir çoxu ona qarşı cavab olaraq kitablar təlif ediblər. Cavab yazanlar arasında Muhyiddin əl-Xatib, Muhəmməd Əbu Şəhbə, Muhəmməd Abdurrazzəq Həmzə, Abdurrahmən əl-Muəllimi və başqa alimlərin adları keçir.

Belə bir etirazla qarşılaşmaq olar. Nə üçün misirli yazarların bu fikirlərini orientalistlərdən götürdüklərini iddia edirsiz, hür və azad düşüncə sahibi kəslər kimi bu fikirlərin onların özlərindən sadır olması mümkün deyildirmi?! Mümkündür, belə bir şey təbii ki, mümkündür. Ancaq qarşımızdakı işarələr və bəzi şahidliklər bizə dediyimizi deməyə əsas verir. Misirdə bu havaların əsməyi tarix baxımından Avropada Goldziher tufanının qopmağından sonra başladı. Bu, sadəcə bir təsadüf deyildir. Misirli yazarların öz kitablarında fikirləri həmin orientalistlərə aşkar şəkildə nisbət etməməkləri də bir şey ifadə etməz. Çünki bunu etməmələrinin səbəbi müsəlman cəmiyyətlərinin peyğəmbərin sünnəsi haqqında qeyri-müsəlmanların fikirlərini qəbul etməyəcəklərini bilməkləri idi. Mustafa əs-Sibəi deyir: “**Hicri 1360-cı ildə əl-Əzhar universitetində əz-Zuhri ətrafında münaqişə qalxdıqda Ustaz Əhməd Əmin – və səs-küy onun ətrafında qalxmışdı - Doktor Əli Həsən Abdulqadirə dedi: “Şübhəsiz ki, əl-Əzhar azad elmi rəyləri qəbul etmir. Ona görə də orientalistlərin fikirlərindən münasib gördüklərini yaymaq üçün ən yaxşı yol bu fikirləri onlara aşkar şəkildə nisbət etməməkdir. Lakin mənim “Fəcrul-İsləm” və “Duhə əl-İsləm” kitablarında etdiyim kimi onların fikirlərini öz araşdırman olaraq göstərib əzharlılara ver və fikirlərinə nazik bir libas geyindir ki, ona toxunmaqları onları narahat etməsin!” Bu, Doktor Əli Həsəndən o günlərdə Ustaz Əhməd Əmindən nəql edərkən eşitdiklərimdir.**”[20]

İyirminci əsrin əvvəlində Misir mənəvi cəhətdən müstəmləkə fikri tərəfindən işğal olunmuş halda idi. Mustafa Sabri Efendi bu təəssüfünü bu şəkildə ifadə edir: “**Türkiyəni tərk edib İslam nurunu bizə gətirmiş ərəb ölkələrinə hicrət etdikdə dinsizlərlə mübarizədən istirahət edəcəyimi güman edirdim. Lakin gördüm ki, Misirdəki mədəniyyət mühiti Qərbləşmə hərəkatı ilə zəhərlənib.**” Daha sonra deyir: “**Türkiyədəki üsyankar çevriliş**

20. ”əs-Sunnə va Məkənətuhə fit-Təşri əl-İsləmi”, 1/238;

**onlarda sakit bir şəkildə, Əzhara təsir etmək və onu yeniləşdirmək yolu ilə baş vermişdi.**"[21] Misirdə hökm sürən mühit Hindistanda da çoxdan başladılmışdı. Hindistanda bu cərəyanın başında Seyyid Əhməd Xan (1817-1898) və Mövləvi Çirağ Əli (1844-1895) dururdu. Seyyid Əhməd Xan ingilislərin Ost-Hind şirkətində çalışırdı və qərblilərin üstünlüyünə, müsəlmanların da o üstünlüyü əldə etmələri üçün dinin və dini təhsilin reform edilməsinin zərurətinə inanırdı. Çirağ Əli'nin fəaliyyəti əsasən klassik cihad anlayışını modernistləşdirmək üzərində qurulmuşdu və o, 1857-ci ildə ingilislərə qarşı cihad adı altında aparılan üsyanı dəyərləndirərkən bunun doğru bir təsəvvür olmadığını müdafiə edirdi. Cihad məfhumunun doğru anlaşılmamasını isə hədislərə bağlayırdı. Buna görə də Çirağ Əli modernist dini anlayışa yiyələnməyin yeganə yolunu hədisləri bir əsas olaraq tərk etməkdə görürdü və qələmə aldığı kitablarında vurğunu bu fikrin üzərinə qoyurdu. Eyni fikirlər Əhmədiyyə camaatının lideri Mirzə Ğulam Əhməd (1835-1908) tərəfindən də səsləndirilirdi. İndiki zamanımızda quranilər olaraq tanıdığımız camaat da müasir forması ilə iyirminci əsrin ortalarında Hindistanda formalaşıb. Onların əsas liderləri Mövləvi Abdullah Çakralavi, Xoca Əhməduddin Armitsari və Ğulam Əhməd Pərviz olub. Abdullah Çakralavi "Əhlul-Zikri val-Quran" adlı camaatın əsasını, Ğulam Əhməd Pərviz isə "Əhlul-Quran" camaatının əsasını qoyub. Hindistandakı bu çalışmalara qarşı sünnə əhli alimlər də cavab olaraq kitablar yazıblar və onların içində ən məşhuru Şeyx Munəzir Əhsən əl-Keyləni'nin (1892-1956) qırxıncı illərdə urdu dilində yazdığı, uzun illər sonra isə ərəb dilinə tərcümə olunmuş "Tədvinul-Hədis" kitabıdır.

Beləliklə də 19-cu əsrin sonlarında və 20-ci əsrin əvvəllərində müsəlman coğrafiyasında başladılmış sünnəni inkar etmək hərəkatı günümüzə qədər öz mövcudiyyətini qoruyub saxlayıb. Çox təəssüf ki, bu hərəkatın davamçıları ərəb, fars, urdu, malay dilli müsəlman cəmiyyətlərdən fəaliyyət göstərdikləri kimi türk dilli müsəlman cəmiyyətlərdə də varlıqlarını hiss etdirirlər. Bu gün televizorlarda, yazar guşələrində, internet məkanında eyni cizgini izləyən türk dilli insanları görə bilirik. İddiaları yeni deyildir, orientalistlərin ortaya atdığı iddiaların bənzərini təkrarlayırlar.

---

21. "Məvqiful-Aqli val-İlmi val-Aləmi", 1/23;

## Hədis və mətnlərin tənqidi

Burada daha bir mövzuya yer verməyimiz lazımdır. Sünnəni inkar edənlər sünnənin ilk iki əsrdə yazılmadığını söyləməklə yanaşı daha bir iddianı ortaya atıblar. İddiaya görə ilk müsəlman alimlər hədisləri mətn və məzmuna görə tənqid etməyiblər. Bu mövzuya daxil olmadan öncə rəvayət olunmuş xəbərlər haqqında bəzi önəmli məlumatları bölüşmək istəyirəm.

Mövzunu doğru anlamaq üçün bu məlumatları yaxşı dərk etmək lazımdır. Hər şeydən öncə anlamaq lazımdır ki, hər rəvayət olunan xəbər sünnə hesab olunmur. Sünnə alimlərin nəzərindən keçmiş, tənqid süzgəcindən keçmiş və sabit olmuş xəbərlərə şamildir. Buradan çıxış edərək deyirik ki, xəbərləri bu baxımdan ümumilikdə üç qismə bölmək mümkündür:

1. Mübahisəsiz səhih hədislər
2. Tənqid olunmuş və mübahisəli hədislər
3. Çox zəif, xətalı və uydurma hədislər

Birinci kateqoriyanın özünü də iki hissəyə bölmək olar: "mütəvatir" və "səhih əhəd" hədislər. Mütəvatir hədislər o hədislərə deyirlər ki, hər bir rəvayət təbəqəsində hədisi rəvayət edənlərin sayı o qədər çoxdur ki, onların yalan danışmaq üzərində bir araya gələrək razılaşmaqları adətdə imkansız hesab olunur. Əhəd hədislər isə bu dərəcəyə çatmayan bütün hədislərdir. İslam alimlərinin əksəriyyətinə görə mütəvatir xəbərlərin çatdırdığı məlumat qətidir. Bundan başqa xəbərlərin çatdırdığı məlumat isə zənnidir. İkinci kateqoriyadakı hədisləri də bir neçə yerə bölmək olar. Bura daxil olan hədislərin bir hissəsi mübahisəli hədislərdir; onları mütəxəssis alimlərin bir hissəsi səhih əhəd kateqoriyasına daxil ediblər, digərləri isə zəif hədislər sırasına salıblar. Buna görə də bu növ hədislər mübahisəli hədislər hesab olunur. Bu kateqoriyaya həmçinin hədisin isnadı və ya məzmunu baxımından tənqid olunmuş zəif hədislər də daxildir. Üçüncü kateqoriyaya isə isnadı çox zəif olan və ya xətalı olan hədislər ilə, uydurulmuş saxta hədislər daxildir. Bu təsnifatın bizə verdiyi fayda budur ki, burada hədislərin doğruluq dərəcələrini öyrənmiş oluruq. Bu baxımdan hədisləri beş yerə ayırd etmək mümkündür.

1. Peyğəmbərin – aleyhissalətu vassələm – dediyindən və ya etdiyindən qəti olaraq əmin olduğumuz hədislər; bura mütəvatir hədislər, həmçinin bəzi daxili və xarici dəlillər sayəsində mütəvatir dərəcəsinə qalxmış əhəd hədislər daxildir.

2. Peyğəmbərin – aleyhissələm – dediyindən və ya etdiyindən qəti şəkildə əmin olmadığımız, amma çox güclü ehtimala əsasən dediyinə və ya etdiyinə inandığımız hədislər; bura mübahisə olunmamış, hamı tərəfindən qəbul olunmuş səhih əhəd hədislər daxildir.

3. Peyğəmbərin – aleyhissələm – dediyinə və ya etdiyinə şəkk ilə yaxınlaşdığımız hədislərdir ki, bunlar mübahisəli hədislərdir. Yuxarıda qeyd etdiyimiz kimi onları bir qisim mütəxəssislər səhih hesab ediblər, digərləri isə zəif sayıblar.

4. Peyğəmbərin – aleyhissələm – çox güclü ehtimala əsasən demədiyinə və ya etmədiyinə inandığımız hədislər; bura zəif hədislər daxildir.

5. Peyğəmbərin – salləllahu aleyhi va səlləm – demədiyindən, etmədiyindən qəti şəkildə əmin olduğumuz hədislər; bura isə çox zəif, münkər və uydurulmuş saxta hədislər daxildir.

Bu təsnifat hədislərin yazıya köçürüldüyü dövrdən formalaşıb və müasir dövrün məhsulu deyildir. Çünki tabiin dövründə artıq biz alimlərin hər kəsin hədisini qəbul etmədiyini görürük. Bu qisimlərin xüsusi terminlərlə adlanması ikinci əsrdən başlasa da məna olaraq öncədən mövcud idi.

Tənqid olunmuş hədislər sinfinə isnadına görə tənqid olunmuş hədislər daxil olduğu kimi, həm də mətni və məzmunu baxımından da tənqidə məruz qalmış hədislər də aiddir. Xəbərlərin mətnləri bəzən açıq və qəti əqli dəlillərə zidd olduğu üçün, bəzən Quranın qəti dəlalətinə zidd olduğu üçün, bəzən dinin ümumi prinsiplərinə qarşı gəldiyi üçün, bəzən də tarixi həqiqətlərə zidd olduğu üçün tənqid olunub. Beləliklə də hədislərin yalnız isnad baxımından analiz edildiyini, mətninin kritik düşüncəyə tabe edilmədiyini demək yalnışdır. Bu cümlə ilə mövzunun əvvəlində zikr etdiyimiz iddiaya qayıdırıq.

Goldziher iddia edir ki, müsəlman alimlər xəbərləri "**onların yalnız xarici formalarına görə araşdırıblar və (onlara görə) mətnin tərkibini dəyərləndirmək isnadın doğruluğundan asılıdır.**" Hətta hədisin mətni şübhəli material ilə dolu olsa belə Goldziher'ə görə heç bir müsəlman alimin "**mətndə məntiqi ziddiyyət olduğu üçün və ya tarixi cəfəngiyat mövcud olduğu üçün isnadın doğruluğunda şübhə edirəm" deməyə haqqı yox idi.**" O, buradan belə nəticə çıxarır ki, "**müsəlman tənqidçilər isnad səhih olduğu müddətdə (mətndəki) ən kobud anaxronizmi belə görmək istəmirlər.**"[22]

Onun bu nəticəsi ilə ingilis ərəbşünas Alfred Guillaume (1888-1965) razılaşır. "**Hədis**" ona görə "**nəyin təbiət etibarı ilə məntiqli olması və nəyin etimada layiqli olması baxımından tənqid olunmayıb, sadəcə olaraq xəbəri nəql edənlərin reputasiyası diqqətə alınıb.**"[23] Bunun üzərinə yekun nəticə çıxararaq əlavə edir: "**Digər tərəfdən əgər mətn aşkar ləğviyyat və ya anaxronizm daşıyırsa isnadı səhih olduğu müddətə onu inkar etməyə əsas yox idi.**"[24] Eyni rəyi Arent Jan Wensinck (1882-1939), Joseph Schacht, Gustave von Grunebaum (1909-1972), Gautier Juynboll və əksər orientalistlər bölüşüblər.[25]

Misirdə onlardan təsirlənmiş əzharlı professorlar da eyni düşüncəni müdafiə ediblər. Ən məşhur nümayəndələri sayılan Mahmud Əbu Rayyə kitabında deyir: "**Lakin alimlər və ədiblər (hədislərə) layiqli diqqət ayırmayıblar və araşdırmayıblar. Bunu yalnızca sənədlə bağlı bilikləri olan kəslərə tərk ediblər. Mənaya gəldikdə isə bununla heç maraqlanmayıblar... Araşdırmamın üzə çıxardığı nəticələrdən biri də bu oldu ki, hədis yalnız**

22. İgnaz Goldziher, "Muslim Studies", 2/140-141;

23. Alfred Guillaume, "The Traditions of İslam", səh: 80;

24. Eyni mənbə, səh: 89; Maraqlıdır ki, Alfred Guillaume müsəlman alimləri içindən yalnız İbn Xaldunu istisna edir. Ona görə İbn Xaldun xeyli sayda hədisi əqlən ziddiyyətli gördüyü üçün rədd edib. Bunu nəyə əsasən dediyini görmək olmur, bu barədə kifayət edəcək bir açıqlama vermir. Amma məlum olan budur ki, İbn Xaldun hədisləri deyil, tarixi məlumatları əqli metodlar ilə tənqid edib.

25. Lakin Nabia Abbott, John Burton, Daniel W. Brown, Jonathan A.C. Brown və daha bir çox müasir orientalistlər bu fikirlə razılaşmırlar, əksinə mətn tənqidinin olduğunu etiraf edirlər.

**ikinci əsrdə, yəni peyğəmbərin Rəbbinə qovuşduğu vaxtdan yüz ildən çox bir müddət keçdikdən sonra yazılıb...**"[26] Bu daha əvvəlki bölmədə haqqında danışdığımız misirli Mahmud Əbu Rayyə'nin sözləridir. Üzərində dayandığı iddiaları arasında ən əsası və ən ağırı ondan gətirdiyimiz sitatda keçən bu iki iddiadır. Beləliklə də Əbu Rayyə və onun həmfikirləri hədislərin mətn baxımından tənqid süzgəcindən keçmədiyini söyləyiblər. Sünnəyə qarşı tutduqları mənfi mövqe də ən çox bu iki xətalı təsəvvürdən qaynaqlanır. "Xətalı" dedik və bunun xətalı olduğunu kitabımızda nümayiş etdirməyə çalışırıq. Bizdən öncə ümmətin alimləri bu barədə qane edici şəkildə danışıblar.

Ağıl və mərifət sahibi bir insan Muhəmməd peyğəmbərin tarixi bir şəxsiyyət olaraq mövcud olmasında və bu Yür üzündə yaşamasında şəkk etməz. Əlbəttə ki, yemək, içmək, yatmaq, çalışmaq bəşər təbiətinin bir hissəsidir. Əgər hədislərdə peyğəmbərin – salləllahu aleyhi va səlləm – sağ əli ilə yemək yediyi, üç nəfəsdə suyu içdiyi, yatmadan öncə və oyandıqdan sonra müəyyən bir duanı oxuduğu varid olarsa bunların hamısı əqlən mümkündür, həmçinin bu fellərin əksi də əqlən mümkündür. Bir kimsənin sağ əli ilə yemək yeməsi mümkün olduğu kimi, sol əli də yeməsi də mümkündür, üç nəfəsdə su içməsi mümkün olduğu kimi beş nəfəsdə də içməsi mümkündür, dua ilə yatıb dua ilə ayağa qalxması mümkün olduğu kimi heç bir dua etmədən də bunları etməsi mümkündür. O zaman deyə bilərik ki, əqlin nəzərində hər iki hal mümkündür. Bu cür xəbərlərdə əql bu iki ehtimal arasında hökm etməkdən acizdir və bu hallarda xəbərin doğruluğuna qərar verən əql deyil, xəbər verənin etibarlılığıdır. Əgər sünnə kitablarına nəzər salsaq görərik ki, tərkibindəki hədislərdən, xəbərlərdən çox böyük bir hissə bu növə daxildir. Bu növ xəbərlərin mətnini əqlin tənqidinə tabe tutmalı olsaq bu xəbərlərin əqlin hökm dairəsindən kənarda qaldığına elə əql özü hökm edər. O zaman bu cür hədisləri ilk əsrin mühəddislərinin əqli tənqiddən keçirmədiyini iddia etmək xəta olardı və heç şübhəsiz ki, burada xəbərin doğruluğuna qane olmaq üçün isnadını araşdırmaq lazımdır. Digər tərəfdən mühəddislər sadəcə hədislərə isnadına görə hökm verməyiblər, həm də hədislərin mətnlərinə də

26. "Ədva aləs-Sunnətil-Muhəmmədiyyə", səh: 7-8;

baxıblar. Bəzən isnadı təmiz olsa da hədisin batil və uydurma olduğuna hökm ediblər. Misal üçün əz-Zəhəbi deyir: “**Muhəmməd bin Əli bin əl-Valid əs-Suləmi əl-Basri; ə-Adəni və Muhəmməd ibn Abdil-Alə’dən rəvayət edir, ondan isə ət-Tabərani və İbn Adiy rəvayət edir. əl-Beyhəqi kərtənkələ hədisini onun vasitəsi ilə təmiz bir isnad ilə rəvayət edib. əl-Beyhəqi daha sonra deyib: “Bunun ittihamı bax bu əs-Suləmi’nin üzərindədir.” əl-Beyhəqi doğru söyləyib.**”[27] əz-Zəhəbi yenə deyir: “**Muhəmməd bin Əli əş-Şərabi; Təməm ər-Razinin şeyxidir. “İnsanların ən yalançısı savvağlar və sabbağlardır”[28] hədisini səhih bir sənəd üzərində uydurub.**”[29] Bir başqa yerdə deyir: “**Vaazçı Muhəmməd bin əl-Fədl əl-Buxari; Həşid bin Abdilləh’dən təmiz bir isnad ilə mərfu olaraq “Quran hafizinə gecə namazları fərzdir” (hədisini) rəvayət edir. Yalan bax bu cür olur.**”[30] əl-Hafiz İbn Həcər “Fəthul-Bəri” kitabında deyir: “**Qəribə hesab edilənlərdən biri də İbn Mərdəveyh’in təfsirində İsa bin Tahmən yolu ilə Ənəs’dən rəvayət etdiyidir ki, Əbu Bəkr və Ömər (içki içən səhabələrin) arasında idilər. Bu isə isnadının təmiz olmasına baxmayaraq münkərdir. Bunun sadəcə olaraq bir xəta olduğunu düşünürəm.**”[31] Əbu Davud “əs-Sünən” əsərində deyir: “**Əhməd bin Said əl-Həmədə’ni bizə rəvayət etdi; İbn Vəhb bizə xəbər verdi; Yəhyə bin Əyyub və Nafi’ bin Yezid bizə İbnul-Həd’dən, o da Muhəmməd bin Amr bin Ata’dan, o Ata bin Yəsər’dən, o isə Əbu Hureyra’dan xəbər verdi ki, peyğəmbəri – salləllahu aleyhi va səlləm – belə deyərkən eşidib: “Bir bədəvinin şəhərli əleyhindəki şahidliyi icazəli deyildir.**”[32] İmam əz-Zəhəbi bu hədis haqqında əl-Hakim ən-Nisəburi’nin “əl-Mustədrak” əsərinə yazdığı qeydlərində deyir:

27. “əl-Muğni fid-Duafə”, 2/243;

28. Savvağ qızıl və gümüşü əridib gözəl bəzək əşyaları düzəldən zərgərlərdir, sabbağ isə paltarları rəngə boyayan sənətkarlardır.

29. “əl-Muğni fid-Duafə”, 2/245;

30. “əl-Muğni fid-Duafə”, 2/253;

31. “Fəthul-Bəri”, 10/37;

32. “Sünən Əbi Davud” (3602); İbn Məcə (2367); İbnul-Cərud, “əl-Muntəqa” (1009);

“**Müəllif (əl-Hakim ən-Nisəburi) bu hədisi səhihləşdirməyib və bu, isnadının təmiz olmağına baxmayaraq münkər bir hədisdir.**”[33] Quranı hifz etmək üçün peyğəmbərin Əliyə öyrətdiyi dua haqqında rəvayət edilmiş hədis haqqında əz-Zəhəbi deyir: “**Sənədi təmiz olsa da çox münkər bir hədisdir, qəlbimdə onunla bağlı bir şeylər vardır. Doğrusunu Allah bilir!**” Eyni hədis haqqında “ət-Təlxis” kitabında deyir: “**Bu, münkər şazz bir hədisdir, uydurma olmağından qorxuram. Allaha and olsun ki, bunun isnadının gözəlliyi məni heyrətləndirdi.**”[34] Bu misallardan gördüyümüz kimi isnadların səhih olması alimləri o hədisləri səhih saymağa məcbur etmədi, əksinə mühəddislər mətndə gördükləri problemlərə görə o hədislərin mətnlərini inkar etdilər. Xüsusilə əz-Zəhəbi’nin bu şəkildə mətnlərində qəribəlik və problemlər gördüyü hədislər haqqında sözləri çoxdur. Ona görə də İbn Kəsir (h. 701-774) deyir: “**İsnada səhih və ya həsən hökmü vermək mətnə də eyni hökmü verməyi gərəkdirməz, çünki şaz və ya illətli ola bilər.**”[35] İbn Kəsirin zikr etdiyi bu məna digər alimlərin sözlərində də təsdiqini tapır. Ona görə də islam alimlərinin yalnız isnadı nəzərdən keçirdiklərini iddia etmək aşkar bir xətadır. İbn Əbi Hatim ər-Razi (h. 240-327) deyir: “**Hədisin səhihliyi onu nəql edənlərin dürüstlüyü ilə və (hədisin) peyğəmbər sözü olmağa yarayan bir söz olması ilə ölçülür...**”[36] İbn Əbi Hətim burada hədisin səhihliyini ölçmək üçün iki ayrı ölçü zikr edir; birinci ölçü sənədini, sənədindəki raviləri araşdırmaqdan asılıdır. İkinci ölçü isə hədisin mətninə baxmağı tələb edir və əgər hədisin mətninin peyğəmbər sözü olmağa yaramadığını görsək – sənədi səhih olsa da – inkar edəcəyik. Bütün bunlar müasir zamanımızın kritik düşüncəsi nəticəsində ortaya çıxmış yeni ölçülər deyildir, bunların hamısı hələ Avropada intibah dövrü başlamadan öncə müsəlman aləmində müsəlman alimlərin qoyduqları nəzəri qaydalardır. əl-Xatib əl-Bağdadi (h. 392-464) deyir: “**Bütün xəbərlər üç növdür: Bir növünün səhihliyi bilinir, bir növünün isə fasid olduğu bilinir, bir növün isə bunlar-**

33. “Muxtəsar Təlxis əz-Zəhəbi”, 5/2524 (860);
34. “Muxtəsər Təlxis əz-Zəhəbi”, 1/259 (73);
35. “əl-Bəis əl-Həsis Şərh İxtisar Ulumil-Hədis”, səh: 42;
36. “əl-Cərh vat-Tə’dil”, 1/351;

**dan hansından olduğunu bilmək mümkün deyildir... İkinci növə gəldikdə isə bu, fasid olduğu bilinənlərdir; bunu bilməyin yolu isə ağılların öz quruluşu ilə, özündə daşıyan dəlilləri ilə (xəbərin) səhihliyini/doğruluğunu rədd etməsidir. Bunun misalı cisimlərin qədim olması, yaradıcının mövcudluğunu inkar etmək və buna bənzər şeylərdir. Yaxud da Quranın mətninin və ya mütəvatir sünnənin inkar etməsidir...**”[37] əl-Xatib’in sözləri hansısa hədisin mətninin qəti əqli dəlillərə zidd olması halında onun məqbul olmayacağını konkret şəkildə ifadə edir. Nəzərə çatdıraq ki, əl-Xatib əl-Bağdadi ənənəvi hədis məktəbinin nümayəndəsidir. Şafi’i məzhəbinin böyük fəqihlərindən Əbu İshaq əş-Şirazi (h. 393-476) deyir: “**Xəbəri əgər siqa (ravi) rəvayət edərsə bir neçə səbəbə görə rədd oluna bilər. Onlardan biri əqlin tələb etdiklərinə müxalif olmasıdır, bu zaman batil olduğu bilinir. Çünki şəriət yalnız əqlin mümkün saydıqları çərçivəsində gəlir, əqlə müxalif olması isə mümkün deyildir. İkincisi Quranın mətninə və mütəvatir sünnəyə müxalif olmasıdır. Bu halda onun bir əslinin olmadığı və ya mənsux olduğu bilinir. Üçüncü isə icmaya müxalif olmasıdır; beləliklə də bunu dəlil göstərib demək olar ki, (hədis) mənsuxdur və ya əsassızdır. Çünki ola bilməz ki, hədis səhih olsun, mənsux olmasın və ümmət onun əksi üzərində icma etsin! Dördüncü hamının bilməsi vacib olan bir şeyi yalnız bir ravinin rəvayət etməsidir... Beşinci isə adətən mütəvatir sayında insanların nəql etdikləri bir xəbəri tək bir nəfərin rəvayət etməsi...**”[38] Hədis məktəbinin nümayəndəsi sayıla biləcək Əbul-Fərac İbnul-Cəvzi (h. 510-597) deyir: “**Görmürsənmi ki, əgər siqa ravilərdən bir qrup toplaşaraq dəvənin iynənin deşiyindən keçdiyini xəbər versələr onların siqa olmaqları bizə heç bir fayda verməyəcək, onların verdiyi xəbərə təsir etməyəcək, çünki onlar imkansız bir şeyi xəbər veriblər. Beləliklə də əqlə müxalif olan və üsula qarşı olan hansısa bir hədis gördünsə bil ki, o uydur-**

37. “əl-Kifəyə fi İlmir-Rivayə”, səh: 17;
38. “əl-Lumə’u fi Usulil-Fiqh”, səh: 82;

**madır və etibar qazandırmaq üçün özünü əziyyətə salma!**”[39]

Biz burada hədislərin mətnlərinin necə fərqli meyarlara görə tənqid olunduğunu göstərmək üçün misallar verəcəyik. Verəcəyimiz bu misalların əksəriyyəti məşhur hədis kitablarından götürülüb və ehtiyac olduqda hansı hədisin isnad baxımından da tənqid olunduğunu deyəcəyik.

**Birinci misal:** İmam Əhməd “əl-Musnəd” kitabında deyir: “**Həccac bizə rəvayət etdi; dedi: İbn Əbi Zi’b bizə ət-Təvəmənin mövlası Saleh’dən, o isə Əbu Hureyradan belə dediyini rəvayət etdi: “Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: “Kim bir cənazə yuyarsa qüsl almalıdır və kim onu daşısa qoy dəstəmaz alsın!**”[40] Əbu Hureyra’nın rəvayət etdiyi bu xəbərə möminlərin anası Aişə bint Siddiq etiraz edib. Bədruddin əz-Zərkəşi deyir: “**Əbu Mənsur əl-Bağdadi isnadı ilə Əbu Arubə əl-Huseyn bin Muhəmməd əl-Harrani’nin belə dediyini zikr edir: Babam Amr bin Əbi Amr bizə rəvayət etdi; dedi: Ənsarın mövlası Əbu Yusuf Yaqub bin İbrahim bizə rəvayət etdi; dedi: Muhəmməd bin Amr bizə Yəhyə ibn Abdirrahmən bin Hatib’dən, o da Əbu Hureyra’dan belə dediyini rəvayət etdi: “Kim cənazə yuyarsa qüsl alsın və kim onu daşıyarsa dəstəmaz alsın!” Bunun xəbəri Aişə’yə - radiyallahu anhə - çatdı və dedi: “Məgər müsəlmanların ölüləri murdar olubmu?! Bir kimsə taxta daşıdığı üçün ona nə vacib olmalıdır ki?!**”[41] əl-Beyhəqi “əs-Sünən əl-Kubra” kitabında Aişə anamızın bu sözlərini başqa isnadla zikr edir: “**Subhanallah! Möminlərin ölüləri murdardırmı? O sadəcə taxtanı qaldırıb daşıyan bir adam deyildirmi?!**”[42] Bu misaldan göründüyü kimi Aişə anamız hədisin mətnini inkar etmişdir, cənazənin üzərində durduğu taxtanı daşımağa görə dəstəmaz almaq üçün nə şəri, nə də əqli bir səbəb görmür.

---

39. “əl-Məvduat”, 1/106;
40. “Musnəd Əhməd”, 15/534;
41. “əl-İcəbə li İrad mə-Stədrakəthu Aişətu aləs-Sahabə”, səh: 113;
42. “əs-Sunən əl-Kubra”, 1/458 (1472);

**İkinci misal:** İmam Əhməd "əl-Musnəd" kitabında deyir: "**Xaləf bin əl-Valid bizə rəvayət etdi; Xalid bizə Suheyl'dən, o atasından, o da Əbu Hureyra'dan belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Zina uşağı üçündən ən şərli olanıdır.**"[43] Bu hədisdən zahirən anlaşılan budur ki, zinadan doğulan uşaq valideynlərindən də daha şərlidir. Lakin bu mənanı İbn Abbas rədd edib və bunun xəta olduğunu deyib. Əli bin Əbi Talha deyir: "**İbn Abbas zinadan doğulan uşaq haqqında deyərdi: "Əgər üçündən ən şərli olsaydı anası uşağı dünyaya gətirənə qədər möhlət verilmədən daş-qalaq olunardı.**"[44] Müxtəlif rəvayətlərdən anlaşılır ki, İbn Abbasa bu barədə Əbu Hureyra'nın rəvayət etdiyi hədisi zikr etdiklərində bu cavabı vermişdir. Eyni şəkildə Aişə anamız da Əbu Hureyra'nın bu hədisi rəvayət etməyinə etiraz edib.[45] Hər iki səhabə burada hədisin mətnini Qurana, dində dəyişilməyən ümumi qaydalara zidd gördükləri üçün inkar ediblər.

**Üçüncü misal:** ət-Tirmizi deyir: "**Əhməd bin Məni' bizə rəvayət etdi; dedi: Huşeym bizə rəvayət etdi; dedi: Yunus və Mənsur bin Zəzən bizə Humeyd bin Hiləl'dən, o da Abdullah bin Samit'dən belə dediyini xəbər verdi: Əbu Zərr'i belə deyərkən eşitdim: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Əgər bir nəfər namaz qılarsa və qarşısında yəhərin beli kimi bir şey yoxdursa namazını qara it, qadın və uzunqulaq pozar...**"[46] Bu hədisin mətninə bəzi səhabələr etiraz ediblər. İmam Muslim "əs-Sahih" kitabında Amr ən-Nəqid, Əbu Said əl-Əşac və Ömər bin Həfs – Həfs bin Ğiyas – əl-Aməş – İbrahim ən-Nəxai – əl-Əsvad – Aişə kanalı ilə, həmçinin əl-Aməş – Muslim – Məsruq – Aişə kanalı rəvayət edir: "**Onun (yəni Aişə'nin)**

---

43. "əl-Musnəd", 13/462 (8098);

44. "ət-Təmhid limə fil-Muvatta minəl-Məani val-Əsənid", 24/136;

45. Aişə bu hədisi eşitdikdə deyib: "Allah Əbu Hureyraya rəhm etsin, yalnış eşidib və yalnış cavab verib...hədis bu cür deyildi. Münafiqlərdən bir nəfər Allahın elçisinə - salləllahu aleyhi va səlləm - əziyyət edirdi və (peyğəmbər) dedi: "Kim məni fılankəsdən qurtarar?" Dedilər: "Ey Allahın elçisi, o, bununla belə zinadan doğulub." (Peyğəmbər də) dedi: "O, üçündən ən şərlisidir." Bu rəvayəti ət-Tahavi "Şərhu Muşkilil-Əsər" kitabında (2/367) qeyd edir.

46. "Sunən ət-Tirmizi", 1/441 (338)

**yanında "namazı it, uzunqulaq və qadın pozar" (hədisi) zikr olundu və Aişə dedi: "Bizi uzunqulaqlara və itlərə bənzətdiniz. Allaha and olsun ki, Allahın elçisini – salləllahu aleyhi va sələm – namaz qılarkən gördüm və mən o zaman onunla qiblə arasında yataq üzərində uzanmışdım...**"[47] Aişə anamız bu hədisin ləfzini rədd edib və onu peyğəmbərin – salləllahu aleyhi va səlləm – söyləmədiyi qənaətinə gəlib. Bunu edərkən peyğəmbərlə – aleyhissələm – yaşam təcrübəsinə əsaslanıb. Bu, hədisi məzmun baxımından tənqid etməyin gözəl bir misalıdır.

**Dördüncü misal**: ət-Tirmizi deyir: "**İbn Əbi Ömər bizə rəvayət etdi; Sufyan bin Uyeynə bizə Muhəmməd bin Amr'dan, o da Əbu Sələmə'dən, o isə Əbu Hureyra'dan belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Ataş toxunmuş hər bir şeydə – hətta quru süd parçasında belə - dəstəmaz vardır." İbn Abbas ona dedi: "Ey Əbu Hureyra, yağdan da dəstəmaz alaqmı?! İsti sudan da dəstəmaz alaqmı?!" Əbu Hureyra dedi: "Ey qardaş oğlu! Allahın elçisindən – salləllahu aleyhi va səlləm – hədis eşitdinsə onun üçün misal çəkmə!**"[48] Bu misal da mətnin tənqin edildiyini göstərir, çünki İbn Abbas' müqayisə edərək hədisin mətninə etiraz etmişdir. Əbu Hureyra bu müqayisə ilə razılaşmır,[49] çünki Əbu Hureyra, Ənəs bin Malik, Abdullah bin Ömər kimi səhabələr hədislərin zahirinə bağlı olmağa üstünlük verən məktəbin nümayəndələri sayılırlar. Digər tərəfdən İbn Abbas, Abdullah bin Məsud, Əli bin Əbi Talib, Ömər bin əl-Xattab kimi səhabələr isə hədislərin illətlərini, hikmətlərini araşdırmağa üstünlük verən məktəbin nümayəndələridir. Bu misalda İbn Abbas rəvayət olunan hədisin mətnində bir problem görür, çünki ona görə bu mətn hər bir isti maddəyə toxunmağa görə dəstəmaz almağı tələb edir. Halbuki isti suya toxunmağa görə və ya isti su içməyə görə heç kim dəstəmaz alınması gərəkdiyini deməmişdir.

---

47. "Sahih Muslim" (512);

48. "Sunən ət-Tirmizi", 1/134 (79);

49. Bu hədisi Əbu Hureyra rəvayət etdiyi kimi digər səhabələr də rəvayət ediblər. Misal üçün Ummu Həbibə, İbn Ömər, Ənəs bin Malik, Əbu Talha, Zeyd bin Səbit və başqaları da bu mənanı rəvayət ediblər.

**Beşinci misal:** əl-Beyhəqi "Şuabul-İmən" kitabında əl-Hakim ən-Nisəburi və Muhəmməd bin Musa – Əbul-Abbas əl-Əsamm – əl-Abbas bin əl-Valid bin Məzid – Məxləd bin Qureyş – Abdurrahmən bin Dəlhəm – Ata bin Əbi Rabəh sənədi ilə rəvayət edir ki, Ata dedi: "**Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: "Mərci yetmiş peyğəmbərin dili ilə bərəkətlənib və İsa bin Məryəm də - aleyhissələm – onlardan biridir. O, qəlbi yumşaldır, göz yaşını çoxaldır.**"[50] Bu hədislə bağlı görkəmli islam alimi Abdullah bin əl-Mubərak'ın maraqlı bir cavabı vardır. Əbu İshaq İbrahim bin Yaqub əl-Cəvzəcəni (vəfatı hicri 259) deyir: "**İshaq bin İbrahimi belə deyərkən eşitdim: "İbnul-Mubərak'dan mərci yemək haqqındakı hədis barədə soruşdular ki, o, yetmiş peyğəmbərin dilində bərəkətlənib. Bunun üzərinə dedi: "Xeyr, heç bir peyğəmbərin dili ilə belə bərəkətlənməyib. O, əziyyət vericidir, insanın köpürdür. Sizə kim bunu rəvayət edir?!**"[51] Maraqlı olan budur ki, İbnul-Mubərak ona söylənən hədisin sənədini soruşmadan öncə mətnini tənqid edir. Tənqidində nə qədər isabətli olması bizim müzakirə mövzumuz deyildir. Burada bizi maraqlandıran tərəf rəvayət olunan hədislərin mətn baxımından da tənqid olunduğunu göstərməkdir. Abdullah bin əl-Mubərak bin Vadih əl-Hanzali (h. 118-181) öz dövrünün tanınmış şəxsiyyətlərindən olub. Hədis məktəbinin nümayəndəsi hesab olunur.

**Altıncı misal:** İbn Macə "əs-Sünən" kitabında deyir: "**Əbu Bəkr bin Əbi Şeybə, Suveyd bin Sa'd və Harun bin İshaq bizə rəvayət etdilər; dedilər: əl-Mu'təmir bin Süleyman bizə Muhəmməd bin Fəda'dan, o, atasından, o isə Alqamə bin Abdilləh'dən, o da atasından rəvayət etdi ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – müsəlmanların öz aralarında keçərli olan sikkəsini – bir eyibə görə olması istisna – kəsməyi qadağan etdi.**"[52] Bu hədisi həmçinin Əhməd bin Hənbəl'in "əl-Musnəd" kitabında, Əbu Davud'un "əs-Sünən" kitabında, İbn Əbi Şeybə'nin "əl-Musannəf" əsərində tapmaq olar. Hamı bu hədisi Muhəmməd bin Fəda vasitəsi ilə rəvayət edir. İmam Muhəmməd

50. "Şuabul-İmən", 8/98 (5548);

51. "Əhvalur-Ricəl", səh: 208;

52. "Sünən İbn Macə", (2263);

bin İsmail əl-Buxari "ət-Tərix əl-Əvsət" kitabında Əbu Bəhr Muhəmməd bin Fəda əl-Cəhdami əl-Basri haqqında danışarkən deyir: "**Süleyman bin Hərb dedi: "İbn Fəda bu hədisi rəvayət edib: "Peyğəmbər – salləllahu aleyhi va səlləm – müsəlmanların arasında keçərli olan sikkənin kəsilməsini qadağan etdi." Sikkəni (ilk) zərb edən Həccəc bin Yusuf olub, peyğəmbərin – salləllahu aleyhi va səlləm – zamanında mövcud olmayıb.**"[53] Əbu Cəfər əl-Uqeyli "əd-Duafə əl-Kəbir" kitabında bu nəqli Abdullah bin Əhməd bin Abdissələm vasitəsi ilə əl-Buxari'dən rəvayət edir. Süleyman bin Hərb sözlərindən də anlaşıldığı kimi hədisin mətnini əqli analizə tabe tutur və bu mətnin doğru ola bilməyəcəyinə, mətndə anaxronizm olduğuna diqqət çəkir. Əbu Əyyub Süleyman bin Hərb bin Bəcil əl-Vaşihi əl-Əzdi basralı hədis alimlərindəndir, fəqihdir. əz-Zəhəbi onu "imam", "hafiz", "şeyxul-islam" olaraq vəsf edir. Hicri 140-ci ildə anadan olub və 18 yaşında elm təhsil etməyə başlayıb. Şubə, Həmməd bin Sələmə, Cərir bin Həzim kimi hədis alimləri yanında yazıb öyrənib. əl-Buxari, Əbu Davud, Əbu Zur'a, əd-Dərimi və onların təbəqəsindəki alimlərin şeyxi sayılır. Hicri 214-cü ildə Məkkədə qazi olaraq çalışmağa başlayır və beş ildən sonra qazilik vəzifəsindən alındıqdan sonra Basra şəhərinə geri qayıdır. 224-cü ildə Basra şəhərində vəfat edir. Tarixçi alim və mühəddis Şəmsuddin Muhəmməd bin Abdirrahmən əs-Səxavi bu sözlərin üzərinə bu məlumatları əlavə edir: "**əl-Həccac'ın sikkəni zərb etməyə başlaması (xəlifə) Abdulməlik bin Mərvan'ın əmri ilə olub. Biz bir cüzdə Əbu Rifəah Umərа bin Vasimə hədisindən onun belə dediyini rəvayət etdik: "Muhəmməd dedi: İslamda ilk dinarı zərb edən Abdulməlik bin Mərvan oldu. Daha öncə dinarlar Bizansdan gələrdi, onlara qirtaslar göndərilərdi və tumarların baş hissəsində "Nə Məsih, nə də yaxın olan mələklər Allahın qulu olmağı əsla özlərinə ar bilməzlər" ayəsi**[54] **yazılardı.**[55] **Bizans kralı yazını gördükdə nə mənaya gəldiyini so-**

53. "ət-Tərix əl-Əvsət", 2/145 (2101);

54. ən-Nisə, 172

55. Qirtas Misirdə düzəldilən papirus kağızlar idi, yüksək keyfiyyətdə hazırlanan bu ağ kağızlar tarixən Misirdən Roma və Bizans ölkələrinə ixrac edilərdi. Tumar lülə şəklində bükülmüş kağızlara deyirdilər, ingilis dilində ona "scroll" deyirlər. Öncələr Misirdəki qibti xristianlar bu tumarların baş hissəsində İsa peyğəmbərin ilah olmasına dair bir şey-

**ruşdu. Onun üçün oxudular və dedilər: "Sənin ibadət etdiyin ilahını təhqir ediblər." Bununla İsa'nı qəsd edirdilər. Kral qəzəbləndi və Abdulməlik'ə yazdı: "Allaha and olsun ki, bundan sonra tumarlarda yazsanız biz də dinarlarımızda sizin peyğəmbərinizi təhqir edən sözlər nəqş edəcəyik." Abdulməlik buna üzüldü və Xalid bin Yezid bin Müaviyə yanına daxil oldu. Dahi biri idi. Abdulməlik olanları ona xəbər etdikdə dedi: "Üzülmə! Öz ərazində (sikkə üçün) zərbxana aç və (öz sikkələrini) orada zərb et. Ona qirtasları(n ixrac edilməsini) qadağan et, çünki onun onlara ehtiyacı olacaq və içində yazılanlara rəğmən – xoşu gəlməsə də - onları qəbul edəcək. (Abdulməlik) o cür elədi və İslamda (sikkəni) ilk zərb edən kəs oldu.**"[56]

**Yeddinci misal:** əl-Haris müsnədində deyir: "**Yəhya bin Abdilhəmid əl-Himməni bizə rəvayət etdi; Həşrac bin Nubətə bizə rəvayət etdi; Said bin Cumhən mənə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – mövlası Səfinə'dən belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – məscidi tikdikdə daş qoydu. Sonra dedi: "Qoy Əbu Bəkr mənim daşımın yanına öz daşını qoysun!" Sonra dedi: "Qoy Ömər öz daşını Əbu Bəkrin daşının yanına qoysun!" Sonra dedi: "Qoy Osman öz daşını Ömərin daşının yanına qoysun!" Sonra dedi: "Bunlar məndən sonrakı xəlifələrdir.**"[57] İmam Muhəmməd bin İsmail əl-Buxari isnaddakı ravi Həşrac bin Nubətə haqqında danışarkən bu rəvayətin mətnini zikr edir və deyir: "**Bu hədisi (Həşrac bin Nubətə'dən) başqası rəvayət etməyib, çünki həm Ömər bin əl-Xattab, həm də Əli bin Əbi Talib deyib ki, "peyğəmbər – salləllahu aleyhi va səlləm – özündən**

lər yazır və xaç işarəsi qoyurdular. Müsəlmanlar Misiri fəth etdikdən bir müddət sonra bu adətə son qoydular və artıq Bizansa göndərilən tumarların baş hissəsində Nisa surəsindən ayə yazılmağa başladı. Bizans kralını qəzəbləndirən də bu oldu və sonra müsəlmanları təhdid etdikdə müsəlmanlar onlara qarşı iqtisadi sanksiya tətbiq edərək onları qirtasları olduğu kimi qəbul etməyə məcbur etdilər.

56. "əl-Əcvibə əl-Mərdiyyə fimə Suilə əs-Səxavi anhu minəl-Əhədis ən-Nəbəviyyə", 3/1034;

57. "Buğyətul-Bəhis an Zəvaidi Musnədil-Həris", 2/621 (593);

**sonra xəlifə təyin etməyib”.**”[58] Göründüyü kimi əl-Buxari bu hədisin mətnini tarixi həqiqəti ölçü götürərək tənqid edir.

**Səkkizinci misal:** İbn Məcə “əs-Sünən” əsərində deyir: “**əl-Həsən bin Əli əl-Xalləl bizər rəvayət etdi; dedi: Avn bin Umərа bizə rəvayət etdi; dedi: Abdullah bin əl-Musənnə bin Suməmə bin Abdilləh bin Ənəs bizə atasından, o da babasından, o Ənəs bin Malik'dən, o isə Əbu Qatədə'dən belə dediyini rəvayət etdi; Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: “(Qiyamətin) əlamətlər(i) iki yüz ildən sonradır.**”[59] İmam əl-Buxari bu hədisi tənqid edərək deyir: “**Artıq iki yüz il keçib və əlamətlərdən heç bir şey baş verməyib.**”[60]

**Doqquzuncu misal:** ət-Tirmizi deyir: “**İshaq bin Mənsur bizə rəvayət etdi; dedi: Abdurrazzəq bizə xəbər verdi; dedi: Cəfər bin Süleyman bizə xəbər verdi; dedi: Səbit bizə Ənəs'dən rəvayət etdi ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – qəza ümrəsində Məkkəyə daxil oldu və Abdullah bin Ravahə onun qarşısında yürüyərək (şer) deyirdi: “Ey kafirlərin oğulları, çəkilin onun yolundan! Bu gün ona endiriləné əsasən sizi vuracağıq. Elə zərbə ilə ki, başı yerindən ayırır və dostu dosta unutdurur!” Ömər ona dedi: “Ey İbn Ravahə, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – qarşısında və Allahın haramında şer deyirsən?!” Peyğəmbər – salləllahu aleyhi va səlləm – ona dedi: “Onu rahat burax, ay Ömər! Çünki bu, onlar üçün atılan oxdan da sürətlidir.**”[61] Bu hədisi rəvayət etdikdən sonra Əbu İsa ət-Tirmizi deyir: “**Bu həsən-səhih bir hədisdir, bu rəvayət yolu ilə nadirdir. Abdurrazzəq bu hədisi həmçinin Mə'mər'dən, o da əz-Zuhri'dən, o da Ənəs'dən bu şəkildə rəvayət edib. (Lakin) bundan başqa hədisdə rəvayət olunub ki, “peyğəmbər – salləllahu aleyhi va səlləm – qəza ümrəsində Məkkə'yə daxil oldu və Kəb bin Malik qarşısında idi.” Bu, hədis əhlindən bəzilərinə görə daha səhihdir, çünki Abdullah bin Ravahə Mutə günü qətl edilmişdi və qəza ümrəsi**

58. əl-Buxari, “əd-Duafə əs-Sağir”, səh: 54;
59. “Sunən İbn Macə”, (4057)
60. əz-Zəhəbi, “Mizənul-İtidəl”, 3/306;
61. “Sunən ət-Tirmizi”, (2847)

**bundan sonra olmuşdu.**” ət-Tirmizi hədisin mətnindəki problemə toxunur və Abdullah bin Ravahə'nin qəza ümrəsində Məkkədə olmasını imkansız hesab edir və bunun xəta olduğuna diqqət çəkir. Amma əslində burada xəta ət-Tirmizi'nin özündəndir. əz-Zəhəbi onun sözlərini qeyd etdikdən sonra deyir: “**Deyirəm: Xeyr, Mutə döyüşünün bundan altı ay sonra baş verdiyi dəqiq olaraq bilinir.**”[62] ət-Tirmizi tənqidində xəta etsə də bizim üçün burada önəmli olan hədislərin alimlər tərəfindən məzmununa görə tənqid olunmasıdır.

**Onuncu misal:** ən-Nəsəi “əs-Sünən” kitabında deyir: “**İsa bin Yunus bizə xəbər verdi; dedi: Damra bizə İsmail bin Ayyəş'dən, o da İbn Cureyc'dən, o da Amr bin Şueybdən, o da atasından, o isə babasından belə dediyini rəvayət etdi: “Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: “Qadının qan pulu – diyətinin üçdə birinə çatana qədər - kişinin qan pulu ilə eynidir.**”[63] Bu hədisə və həmçinin Said bin əl-Museyyəb'in sünnə olaraq rəvayət etdiyi digər xəbərə əsasən hicazlılar qadının və kişinin iki barmağı kəsildikdə qan pulu olaraq iyirmi dəvənin, üç barmağı kəsildikdə otuz dəvənin veriləcəyini, dörd barmaq kəsildikdə isə kişiyə qırx dəvə, qadına isə iyirmi dəvə veriləcəyini deyirdilər. Çünki kişinin hər iki əlinin kəsilməsinə yüz dəvə düşür, beləliklə də hər bir barmağının kəsilməsinə görə isə qan pulu olaraq on dəvə müəyyən ediblər. Üç barmağa qədər qadın ilə kişinin qan pulunu eyni hesab ediblər, üç barmaqdan sonra artıq qadının qan pulunun üçdə birinə çatdığını dedikləri üçün kişinin qan pulunun yarısına endiriblər. Bu hədis və Said bin əl-Museyyəb'dən rəvayət olunan xəbərlər məna baxımından tənqid olunub. İmam Malik “əl-Muvatta” kitabında deyir: “**Rabi'ah bin Əbi Abdirrahmən dedi: “Said bin əl-Museyyəb'dən soruşdum: “Qadının bir barmağında nə qədər (qan pulu) var?” Dedi: “On dəvə.” Soruşdum: “Bəs iki barmaq?” Dedi: “İyirmi dəvə.” Dedim: “Bəs üç barmaq?” Dedi: “Otuz dəvə.” Dedim: “Bəs dörd barmaqda?” Dedi: “İyirmi dəvə.” Dedim: “Necə olur ki, yarası böyüdükdə, müsibəti şiddətləndikdə qan pulu azalır?” Said dedi: “Sən iraqlısan?”**

---

62. “Siyər Əaləmin-Nubələ”, 1/236;

63. “Sünən ən-Nəsəi”, 8/44;

**Dedim: "Xeyr, dəqiqləşdirmək istəyən alim və ya öyrənmək istəyən cahiləm." Bunun üzərinə dedi: "O sünnədir, ey qardaş oğlu!"**[64] Said bin əl-Museyyəb "**sən iraqlısan**?" sualını verməklə çox ehtimal ki, "**mətnə müxalif olan qiyası götürürsən?**"[65] demək istəmişdir. Rabi'ah kimi bir alimin Said bin əl-Museyyəb'in nəql etdiyinə etirazı çox aşkardır. Bu, həm də Kufə əhlinin etirazı idi. İmam Muhəmməd bin əl-Həsən əş-Şeybəni eyni şəkildə "**yarası böyüdükdə qan pulu azalır**" deyərək bunu inkar edib.[66] İbn Həcər əl-Asqaləni deyir: "**Qan pulunun üçdə birinə qədər qadının qan pulu kişinin qan pulu kimidir" hədisini ən-Nəsəi (kitabında) Amr bin Şueyb'in atasından, onun da babasından rəvayət etdiyi hədisindən gətirir və bu, İsmail bin Ayyəş'in İbn Cureyc'dən rəvayətindəndir. əş-Şafi dedi: "Malik bunun sünnə olduğunu deyirdi və mən buna qarşı nəfsimdə bir şeylər olmasına baxmayaraq ona bu məsələdə tabe olurdum. Sonra bildim ki, o, Mədinə əhlinin sünnəsini qəsd edir və bu rəyimdən döndüm.**"[67] əş-Şafi də əvvəldən hədisin mətnini problemli hesab edirdi.[68]

**On birinci misal:** ət-Tirmizi "əs-Sunən" kitabında deyir: "**Abdullah bin Əbi Ziyəd bizə rəvayət etdi; dedi: Səyyər bin Hətim bizə Səhl bin Əsləm'dən, o da Yezid bin Əbi Mənsur'dan, o, Ənəs bin Malik'dən, o isə Əbu Talha'dan belə dediyini rəvayət etdi: "Allahın elçisinə - salləllahu aleyhi va səlləm – aclıqdan**

64. "Muvatta Məlik", 5/1261 (3195); əl-Azami çapı

65. "Şərhuz-Zurqani aləl-Muvatta", 4/296;

66. "əl-Huccətu alə Əhlil-Mədinə", 4/285;

67. "ət-Təlxis əl-Həbir", 4/49;

68. ən-Nəsəi'nin rəvayət etdiyi Abdullah bin Amr bin əl-As'ın hədisinə başqa bir izah da verilib. Bu izaha görə qadının qan pulu üçdə bir miqdarı keçdikdə kişinin bütöv qan pulunun yarısına qayıtmır, lakin üçdə birdən sonra hər üzvə görə qan pulu yarıya bölünür. Bu izaha əsasən üç barmağa qədər qadın ilə kişinin qan pulu eynidir, yəni bir barmağa on dəvə, iki barmağa iyirmi dəvə, üç barmağa isə otuz dəvə qan pulu olaraq ödənilməlidir. Dörd barmaq kəsildikdə isə kişiyə qırx dəvə, qadına isə otuz beş dəvə verilməlidir, çünki bir barmağa on dəvə düşürsə bunun yarısı beş dəvə edir. əş-Şəvkəni'dən öncə hansısa bir alimin hədisi bu cür şərh etdiyini görməmişəm. Malikilər və hənbəlilər bu məsələdə ən-Nəsəi'nin hədisi ilə birlikdə Said bin əl-Museyyəb'in sözünə və izahına əsaslanırlar. ən-Nəsəi'nin hədisi isnad baxımından tənqid olunub və deyiblər ki, İsmail bin Ayyəş'in hicazlılardan rəvayətləri zəifdir. İbn Cureyc isə hicazlıdır.

**şikayət etdik və qarınlarımızı açıb hər birimizdə bir daş bağlandığını göstərdik. Allahın elçisi isə - salləllahu aleyhi va səlləm – açaraq iki daş göstərdi.**"[69] Ümumiyyətlə peyğəmbərin – salləllahu aleyhi va səlləm – və səhabələrin aclıq hallarında qarınlarına daş bağladıqlarına dair xəbərlər varid olub. Hətta bəzi cahiliyyə şerlərindən başa düşmək olur ki, ərəblər arasında bu, bilinən bir şey idi. İbn Hibban "əs-Sahih" kitabında deyir: "**Bu xəbər dəlildir ki, peyğəmbərin – salləllahu aleyhi va səlləm – qarnı üstünə daş (həcər) qoyduğunu zikr edən xəbərlərin hamısı batildir. Oradakı sadəcə olaraq "hucəz" sözüdür, "həcər" deyildir və "hucəz" izarın kənarıdır, çünki Allah – cəllə va alə - elçisini – salləllahu aleyhi va səlləm – visal orucu tutduqda yedirib içirərdi. O zaman necə olur ki, visal orucu tutmadığı halda qarnına daş bağlamağa ehtiyac duyacaq qədər onu ac tərk edir?! (Üstəlik) daş necə aclığa qarşı kömək edə bilər axı?!**"[70] İbn Hibban iki səbəbə əsaslanaraq bu hədislərin mətnini inkar edib. Birinci səbəb o hədislərin daha səhih olan başqa hədisə zidd olduğunu başa düşməsidir,[71] ikinci səbəb isə əqli səbəbdir, çünki daş aclığa qarşı heç bir fayda vermir. Ondan sonra gələn alimlər İbn Hibban'ın bu etirazını qəbul etməyiblər və onun etirazlarına cavab veriblər.[72]

---

69. "Sünən ət-Tirmizi", (2371)

70. "Sahih İbn Hibban", 8/344;

71. Çünki əl-Buxari və Muslim'in ittifaq etdikləri hədislərdən birində peyğəmbər – salləllahu aleyhi va səlləm – müsəlmanlara visal orucu tutmağı qadağan edir. Visal orucu isə iki günü birləşdirib oruc tutmaqdır. Səhabələr bu qadağanın qarşısında "axı sən visal tutursan" deyərək cavab verdiklərində onlara deyir: "Mən sizin halınızda deyiləm, mən yedirilirəm və içizdirilirəm." Bax: "Sahih əl-Buxari", (1922, 1961-1967, 6851, 7242, 7299); "Sahih Muslim", (1102-1105);

72. Birinci etiraza cavab verdikləri budur ki, İbn Hibban "mən yedirilirəm və içizdirilirəm" sözlərini doğru anlamayıb. Doğru anlamadığının ən aşkar dəlili isə budur ki, İbn Hibban özü "əs-Sahih" kitabında (5216) İbn Abbas'ın bu sözlərini rəvayət edir: "Peyğəmbər – salləllahu aleyhi va səlləm – gündüzün isti vaxtında çölə çıxdı, Əbu Bəkri və Öməri gördü. Soruşdu: "Sizi çölə çıxaran nə oldu?" Dedilər: "Aclıqdan başqa heç bir şey çıxarmayıb." Dedi: "Nəfsimi əlində tutana and olsun ki, məni də aclıqdan başqa heç bir şey çıxarmadı." Buradan aydın olur ki, peyğəmbər də - aleyhissalətu vassələm – digər insanlar kimi aclıq hiss edirdi. Onun visal orucunda yedirilib, içizdirilməsi hərfi mənada deyildir, lakin məcazi mənadadır. Daşın aclığa qarşı fayda verməsinə gəldikdə isə bu barədə bir çox izah veriblər. O izahlardan birinə görə ərəblərin qarınlarına daş bağlamaqlarına səbəb daşın sərinliyi ilə mədədəki ağrını yüngülləşdirmək idi. Doğrusunu Allah bilir.

**On ikinci misal:** İmam Muslim "əs-Sahih" kitabında rəvayət edir: "**Abbas bin Abdilazim əl-Anbəri və Əhməd bin Cəfər əl-Mə'qari mənə rəvayət etdilər; dedilər: ən-Nədr – və o, Muhəmmədin oğludur - əl-Yəməmi bizə rəvayət etdi; İkrimə bizə rəvayət etdi; Əbu Zumeyl bizə rəvayət etdi; İbn Abbas mənə rəvayət etdi; dedi: "Müsəlmanlar Əbu Sufyana baxmazdılar və onunla oturmazdılar. Buna görə də peyğəmbərə - salləllahu aleyhi va səlləm – dedi: "Ey Allahın peyğəmbəri, mənə üç şeyi ver!" Dedi: "Bəli." Dedi: "Məndə ərəblərin ən yaxşısı və ən gözəli var; Ummu Həbibə bint Əbi Sufyan, sizi evləndirim!" Dedi: "Bəli." Dedi: "Bir də Müaviyə var; onu sənin qarşında katib edim!" Dedi: "Bəli." Dedi: "Məni əmir təyin et ki, müsəlmanlarla vuruşduğum kimi (indi də) kafirlərlə vuruşum!" Dedi: "Bəli.**[73]" Bu hədis də tarixi fakta zidd gəldiyi üçün alimlər tərəfindən tənqid olunub. İbnul-Cəvzi deyir: "**Bu hədisdə ravilərdən biri xəta edib; bunda şəkk və tərəddüd yoxdur... Bunun xəta olduğunu ona görə dedik ki, çünki tarixçilər icma ediblər ki, Ummu Həbibə Abdullah bin Cəhş'in yoldaşı idi, ondan övladı var idi və onunla birlikdə hər ikisi də müsəlman olduğu halda həbəşlilərin torpağına hicrət etmişdilər. Sonra (əri) xristian oldu, o isə öz dini üzərində sabit qaldı. Allahın elçisi də - salləllahu aleyhi va səlləm - ən-Nəcaşi'yə onun ərini istəmək üçün xəbər göndərdi, o da onları evləndirdi və Allahın elçisinin – salləllahu aleyhi va səlləm – adından mehrini verdi...**"[74] Bu hədisin tarixi faktlara zidd olduğu aşkardır. Bu ziddiyyətə görə alimlərin bir hissəsi buradakı evləndirmək sözünü "evliliyi təzələmək" mənasında başa düşüblər və deyiblər ki, Əbu Sufyan Məkkə'nin böyüklərindən biri kimi peyğəmbərdən – salləllahu aleyhi va səlləm – qızını bizzat özünün ərə verməsini istəmişdir. Alimlərin əksər hissəsi bu izah ilə razılaşmayıb və bunun ravilərdən birinin xətası olduğunu deyiblər. İbn Həzm daha da irəli gedərək bu hədisin İkrimə tərəfindən uydurulduğunu iddia edib, lakin onun bu sözü əsassız hesab olunub və rədd edilib.

**On üçüncü misal:** ət-Tahavi "Şərhu Muşkilil-Əsər" kitabında deyir: "**Əbu Umeyyə bizə rəvayət etdi; dedi: Ubeydullah**

73. "Sahih Muslim", (2501);

74. "Kəşful-Muşkil min Hədisis-Sahiheyn", 2/463-464;

**bin Musa əl-Absi bizə rəvayət etdi; dedi: əl-Fudeyl bin Mərzuq bizə İbrahim bin əl-Həsən'dən, o da Fatimə bint əl-Huseyn'dən, o isə Əsma bint Umeys'dən belə dediyini rəvayət etdi; "Allahın elşisinin – salləllahu aleyhi va səlləm – başı Əlinin qucağında olduqda ona vəhy gəldi və (Əli) günəş batana qədər əsr namazını qılmadı. Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Namaz qıldınmı, ey Əli?" Dedi: "Xeyr." Bunun üzərinə Allahın elçisi – salləllahu aleyhi va səlləm - dedi: "Allahım, o Sənin və Sənin elçinin itaətində idi, onun üçün günəşi qaytar." Əsma dedi: "Onu batarkən görmüşdüm, sonra batdıqdan sonra yenidən çıxdığını gördüm.**"[75] İbnul-Qayyim deyir: "**Əsrdən sonra günəş Əli üçün geri qayıtdı və insanlar müşahidə edirdilər" şəklində rəvayət etdikləri də bunun kimidir. Bu hadisə çox məşhur olmadı və bunu Əsma bint Umeys'dən başqa heç kim bilmədi.**"[76]

**On dördüncü misal:** İmam ət-Tirmizi "əs-Sünən" kitabında deyir: "**Quteybə bizə rəvayət etdi; əl-Leys bizə Əbu Qabil'dən, o Şufey bin Məti'dən, o da Abdullah bin Amr bin əl-As'dan belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – yanımıza çıxdı və əlində iki kitab var idi. Dedi: "Bu iki kitabın nə olduğunu bilirsizmi?" Dedik: "Xeyr, ey Allahın elçisi, yalnız əgər sən xəbər versən bilərik." Sağ əlindəkini göstərib dedi: "Bu, Aləmlərin Rəbbindən bir kitabdır; içində cənnət əhlinin adları, onların atalarının və qəbilələrinin adları vardır, sonra axırlarında yekunlaşdırır və onlar heç bir zaman nə artar, nə də azalar." Sonra sol əlindəkinə işarə edib dedi: "Bu, Aləmlərin Rəbbindən bir kitabdır ki, içində cəhənnəm əhlinin adları, atalarının və qəbilələrinin adları yazılıb, sonra axırında yekunlaşdırılıb və onlar heç bir zaman nə artarlar, nə də azalarlar." Səhabələri dedilər: "Əgər iş bitib qurtarıbsa o zaman əməl nə üçündür, ey Allahın elçisi?" Dedi: "Əməllərinizi düzəldin və (Allaha) yaxınlaşdıran əməllər edin! Çünki cənnətə layiq olanın sonluğuna – (ondan öncə) nə əməl etmiş olsa belə**

75. "Şərhu Muşkilil-Əsər", 3/92 (1067);

76. "əl-Mənar əl-Munif fis-Sahih vad-Daif", səh: 58;

**- cənnət əhlinin əməli ilə son qoyulacaq və atəşə layiq olanın sonluğuna – (ondan öncə) nə əməl etmiş olsa belə - atəş əhlinin əməli ilə son qoyulacaq." Sonra Allahın elçisi – salləllahu aleyhi va səlləm – iki əlini də tərpədərək (əlindəkilərin) ikisini də atdı. Sonra dedi: "Allah qullarlının qədərini yazıb qurtarıb; bir qrup Cənnətdədir, bir qrup atəşdədir.**"[77] ət-Tirmizi bu hədisi zikr etdikdən sonra deyir: "**Bu, həsən-sahih və ğarib hədisdir.**" ət-Tirmizi hədisin isnad baxımından səhih olduğuna hökm verir, çünki raviləri etibarlı ravilərdəndir, yalnız Əbu Qabil xəta etdiyinə görə tənqid olunub. Bu hədis qədər mövzusunda varid olmuş məşhur hədislərdən biridir. Məlumdur ki, əql ekoluna mənsub mötəzili məzhəbi bu mənada gəlmiş bütün hədisləri inkar edir, çünki qədər etiqadında mötəzililərin etiqadına ziddir. Amma hədis əhlinin məşhur nümayəndəsi Şəmsuddin əz-Zəhəbi'nin bu hədis barəsindəki sözləri başqa tərəfdən maraqlıdır. əz-Zəhəbu bu hədisi fərqli isnad ilə İbn Ömər'dən rəvayət etdikdən sonra deyir: "**Bu, çox münkər bir hədisdir, hər iki kitabın vəzninin bir neçə qintar olmasını gərəkdirir.**"[78] əz-Zəhəbi'nin hədisin mətninə qarşı etdiyi etiraza baxmayaraq hədis səhihdir və alimlərin bir qismi hədisi əz-Zəhəbi'nin anladığı kimi anlamayıblar.[79] əz-Zəhəbi'nin burada xəta etməsinə baxmayaraq önəmli olan onun bir mühəddis kimi hədislərin mətninə də diqqət etməsidir.

**On beşinci misal:** ət-Tabərani "əl-Mucəm əl-Kəbir" kitabında deyir: "**Əli bin Abdilaziz bizə rəvayət etdi; Əhməd bin Yunus bizə rəvayət etdi; Zuheyr bizə rəvayət etdi; Ailəmdən bir qadın mənə Muleykə bint Amr əz-Zeydiyyə'dən – Zeydilləh**

77. "Sünən ət-Tirmizi", (2141);

78. "Mizənul-İtidəl", 2/684;

79. Hənəfi alimlərindən Muzhiruddin əl-Huseyn bin Mahmud əz-Zeydəni əl-Kufi (vəfatı hicri 727) "əl-Məfətih fi Şərhil-Məsabih" (1/202) kitabında deyir: "O sadəcə olaraq iki kitabı ona görə əlinə aldı ki, onları misal çəksin və sözünü orada olanlara başa sala bilsin. Onun "bu, Aləmlərin Rəbbindən olan bir kitabdır" sözünün mənası "fərz edin ki, bu kitab Aləmlərin Rəbbindən endirilmiş bir kitabdır" şəklindədir. Yoxsa o kitabın həqiqi mənada Aləmlərin Rəbbindən endirilmiş kitab olduğunu qəsd etmir, çünki əgər həqiqi mənada Aləmlərin Rəbbindən gəlmiş bir kitab olsaydı onu tullamazdı, halbuki bundan sonra onların ikisini də atdığı qeyd olunur. Əksinə sağ əlinə qirtasdan bir parça, sol əlinə də bir başqa parça götürüb ki, muxatab olunanlar onları görsünlər ki, onları başa salmaq daha asan olsun..."

**bin Sad'ın övladlarındandır – rəvayət etdi; dedi: "Boğazımda ağrıdan şikayət etdim və onun yanına gəldim. Mənim üçün inək piyi qoydu və dedi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: "Onların südləri şəfadır, yağları isə dəvadır, ətləri isə xəstəlikdir.**"[80] Bu hədisin sənədini Nəsiruddin əl-Albani səhih sayıb.[81] Sənədinin səhih olması mübahisəlidir, çünki onunla razılaşmayanlar da vardır. Burada əhəmiyyətli olan isə hədisin mətninin tənqid olunmasıdır. Bədruddin əz-Zərkəşi deyir: "**Bunun səhih olması mübahisəlidir, çünki "əs-Sahih" kitabında keçir ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – öz zövcələrinin adından bir inəyi qurban kəsdi və o, xəstəlik olan bir şey ilə (Allaha) qürbət gətirməz.**"[82]

**On altıncı misal:** ət-Təbərani "əl-Mucəm əl-Əvsət" kitabında deyir: "**Əbu Muslim bizə rəvayət etdi; dedi: Amr bin Həkkəm bizə xəbər verdi; dedi: Şu'bə mənə xəbər verdi; dedi: Əli bin Zeydi mən Əbul-Mutəvəkkil ən-Naci'dən, onun isə Əbu Said əl-Xudri'dən belə dediyini rəvayət edərkən eşitdim: "Bizans kralı Allahın elçisinə - salləllahu aleyhi va səlləm – hədiyyələr göndərdi və onların içində içi zəncəfil ilə dolu bir qab var idi. Hər kəsə ondan bir parça yedirdi və mənə də bir parça yedirdi.**"[83] Bu hədisi həmçinin İbnul-Arabi "əl-Mucəm" kitabında rəvayət edir. əz-Zəhəbi bu xəbəri "Mizənul-İtidəl" kitabında qeyd etdikdən sonra deyir: "**Bu hədis bir neçə tərəfdən münkərdir; əvvəla Bizans kralının nəyisə peyğəmbərə - salləllahu aleyhi va səlləm – hədiyyə etdiyi bilinmir. İkincisi isə Bizansdan Hicaza zəncəfil hədiyyə edilməsi isə əqlin inkar etdiyi bir şeydir. Bu, Bizansdan Mədinə şəhərinə xurma hədiyyə etməyin eynisidir.**"[84] əz-Zəhəbi bu hədislə bağlı olaraq Amr bin Həkkəm'i ittiham edir. Onun rəvayət etdiyi bu xəbərin sağlam düşüncəyə zidd olduğunu vurğulayır. əz-Zəhəbi'yə görə bir kimsənin Roma şəhərin-

80. "əl-Mucəm əl-Kəbir", 25/42 (79);

81. "Sahih əl-Cami əs-Sağir va Ziyədətuhu", 1/267 (1233); "Silsilətul-Əhədis əs-Sahihə", (1533);

82. "ət-Təzkira fil-Əhədis əl-Muştəhira", səh: 148;

83. "əl-Mucəm əl-Əvsət", 3/43 (2416);

84. "Mizənul-İtidəl", 3/254;

dən Mədinə şəhərinə xurma hədiyyə etməsi nə qədər absurd səslənirsə eləcə də Bizans torpaqlarından Hicaza zəncəfil göndərmək də o qədər absurd səslənir, çünki Bizans torpaqları xurmanı, zəncəfil və daha bir çox qida məhsullarını Yaxın Şərq ölkələrindən idxal edirdi.

**On yeddinci misal:** ət-Tirmizi deyir: "**əl-Fədl bin Səhl Əbul-Abbas əl-Arac əl-Bağdadi bizə rəvayət etdi; dedi: Abdurrahmən bin Ğazvan bizə rəvayət etdi; dedi: Yunus bin Əbi İshaq bizə Əbu Bəkr bin Əbi Musa əl-Əşari'dən, o da atasından belə dediyini xəbər verdi: "Əbu Talib Şam torpaqlarına səfər etdi və peyğəmbər – salləllahu aleyhi va səlləm – Qureyşin yaşlıları arasında onunla birlikdə çıxdı. Rahibin yanına çatdıqlarında yerləşdilər və yüklərini açdılar. Rahib onların yanına çıxdı. Bundan öncə oradan keçərdilər və (rahib) onların yanına çıxmaz, onlara maraq göstərməzdi. Onlar yüklərini açarkən rahib onların aralarından keçərək gəlib peyğəmbərin – salləllahu aleyhi va səlləm - əlindən tutur və deyir: "Bu, aləmlərin ağasıdır və bu, aləmlərin Rəbbinin elçisidir. Allah onu aləmlərə rəhmət olaraq göndərəcək. Qureyşin böyükləri ondan soruşdular: "Hardan bilirsən?" dedi: "Siz Aqabədən görünüb yaxınlaşdığınızda səcdəyə çökməyən nə bir ağac, nə də bir daş qalmadı və bu ikisi yalnız bir peyğəmbərə səcdə edirlər. Mən şübhəsiz ki, onu çiyin kürəyinin altındakı alma boyda olan peyğəmbərlik xalından tanıyıram... Ayaq üstə durduğu halda onların Bizansa getməməklərinə dair and-aman etdi, çünki bizanslılar onu görsələr vəsfinə görə tanıyacaqlar və onu öldürəcəklər... Dedi: "Sizə Allaha and verirəm, hansınız onun vəlisidir?" Dedilər: "Əbu Talib". İsrar etməyə davam etdi və sonunda Əbu Talib onu geri göndərdi və Əbu Bəkr onunla birlikdə Bilalı göndərdi. Rahib də onun üçün piroq və yağı azuqə etdi.**"[85] Hədisin mətni təqdim etdiyimizdən də uzundur, biz ixtisar etdik. Hədis siyər kitablarında məşhurdur və bəzi alimlər isnadının həsən olduğunu deyiblər. əz-Zəhəbi isə hədislə bağlı deyir: "**Bunun batil olduğuna dəlalət edən dəlillərdən biri də onun "Əbu Talib onu geri göndərdi və Əbu Bəkr onunla birlikdə Bilalı göndərdi" sözləridir, (çünki) Bilal hələ dünyaya**

85. "Sunən ət-Tirmizi", 6/20 (3620);

**gəlməmişdi və Əbu Bəkr hələ uşaq idi.**"[86] Saləhuddin əl-Aləi (h. 694-761) əlavə olaraq deyir: "**(Üstəlik) adət ona hökm edir ki, əgər (hədisdə keçən) bu sözlər Əbu Talib'in və Qureyşin böyüklərinin hüzurunda deyilmiş olsaydı peyğəmbərlik verildikdən sonra Əbu Talib o sözləri Qureyşin böyüklərinə qarşı dəlil gətirərdi və onları unutmazdı.**"[87]

Bu misallar bizə Qərbin orientalistlərinin hədislərə və İslam irsinə qarşı çox qərəzli olduqlarını göstərir. Mühəddislərin hədisləri məzmun baxımından tənqid etmədiklərini iddia etmək yalandır. Amma ümumi müqayisədə mühəddislərin isnad araşdırmaları mətn araşdırmalarından qat-qat çoxdur. Bunun isə çox təbii bir izahı vardır. Əqlə və digər əsaslara müxalif olan mətnlərin böyük əksəriyyəti'nin isnadında ciddi problemlər vardır. Mühəddis alimlər bu hallarda mətn haqqında danışmağa ehtiyac görməyiblər, çünki hədisin isnadındakı problemi göstərdikdən sonra artıq hədisi etibardan salmış olurlar və bu halda mətni haqqında danışmağa ehtiyac qalmır.

## Keçmişin imanı və müasir elm

Yuxarıda apardığımız müzakirədən aydın oldu ki, dini mətnlərdə məzmun tənqidi avropalıların kəşf etdiyi bir yenilik deyildir. Erkən bir dövrdə hədislərin məzmunu tənqid olunub. Müsəlman alimlər uydurma, saxta hədislər barəsində məlumat verən kitablar qələmə alıblar. Əbu Said Muhəmməd bin Əli bin Amr ən-Nəqqaş əl-Əsbəhəni'nin (vəfatı h. 414) "əl-Məvduat", İbnul-Qaysərani'nin (vəfatı h. 507) "Təzkiratul-Məvduat", əl-Hüseyn bin İbrahim əl-Cəvzəqani'nin (vəfatı h. 543) "əl-Əbətil val-Mənəkir vas-Sihah val-Məşəhir", Əbul-Fərac İbnul-Cəvzi'nin (vəfatı h. 597) "əl-Məvduat", Əbu Həfs Ömər bin Bədr əl-Məvsili'nin (vəfatı h. 622) "əl-Aqidətus-Sahihə fil-Məvduat əs-Sariha" və "əl-Muğni anil-Hifzi val-Kitəbə", Əbul-Fədl əl-Həsən bin Muhəmməd əs-Sağani'nin (vəfatı h. 650) "əl-Məvduat" kitabları və daha başqa kitablar bu mövzuda yazılmış ədəbiyyatın yalnız bir hissəsidir. Hədislərin məzmun baxımından tənqid olunmasına dair elm

86. "Mizənul-İtidəl", 2/581;

87. "ət-Tənbihət əl-Mucmələ aləl-Məvadi əl-Muşkilə", səh: 66;

ayrıca bir maddə kimi kitablarda təlif olunub. Bunun ən məşhur misalı bəlkə də səkkizinci əsrin böyük alimlərindən İbnul-Qayyim əl-Cəvziyyə'nin (h. 691-751) "əl-Mənər əl-Munif fit-Təshih vat-Təd'if" kitabıdır. İbnul-Qayyimə verilmiş "**sənədinə baxmadan hansısa ölçüyə əsasən uydurma hədisi tanımaq mümkündürmü?**"[88] sualına cavab olaraq bu kitabı ömrünün sonuncu üç ilində yazıb bitirmişdir. Kitabda uydurma və xətalı hədisləri tanımaq üçün çox sayda əlamətlər zikr edir. Bir başqa kitab məşhur mühəddis Saləhuddin əl-Aləi'nin "ət-Tənbihət əl-Mucmələ" adlı həcmcə kiçik bir kitabıdır. O, bu kitabında isnad baxımından səhih olan 23 hədisin mətnini tənqid edir və onların xəta olduğunu müxtəlif səbəblərlə izah edir. Şəmsuddin əz-Zəhəbi "Mizənul-İtidəl" adlı kitabında fərqli yerlərdə mətnlərin məzmununu tənqid edib. Biz o misalların hamısını bu kitabımızda qeyd etmədik, lakin kifayət qədər misal mövcuddur. Bütün bu misallar əlbəttə ki, hədis əhli məktəbindən göstərdiyimiz misallardır. Rəy əhlinə gəldikdə isə onlar bir miqdar hədisi məzmun və məna baxımında daha geniş çapda tənqid ediblər. Bu mədrəsənin ən qədim misalı bəlkə də İsa bin Əbən (vəfatı h. 221) sayıla bilər.

Anlamaq lazımdır ki, tarixi mətnləri oxuduqda orada gördüyümüz mətnin özündən daha çox bizim öz dünya görüşümüzdür. Həqiqət budur ki, içimizdəki hər bir fərd yaşadığı mühitin təsiri altında proqramlaşıb və bizim gördüklərimiz əslində bu proqramlaşmış fərdin görmək istədikləridir. Bu proqramın bir hissəsi olaraq biz bütün insanlar arasında ümumi və ortaq düşüncənin olduğuna inanırıq və tarixi mətnlər bu düşüncəyə zidd göründükdə dərhal beynimizdə sual işarəsi əmələ gəlir. Bu baxımdan biz məntiq ilə proqramlaşmış düşüncə arasında fərq qoymalıyıq. Müasir kütləvi informasiya vasitələrinin təsirinə məruz qalmamış biri də səmanın yuxarıda, yerin aşağıda olduğuna inanır, iki ayrı şeyin eyni bir şey olmayacağını, bir şeyin eyni zamanda iki ayrı yerdə ola bilməyəcəyini və bunun kimi məntiqi, universal prinsipləri bilir və təsdiqləyir. Bir də burada çoxumuzun "sağlam düşüncə" deyərək qarşımızdakını inandırmağa çalışdığımız rerefens nöqtəsi də mövcuddur. Biz universal olduğuna inandığımız bu "sağlam düşüncə" heç də hər zaman universal deyildir. Professor Jonathan Brown buna iki maraqlı misal verir. Məişət şərtlərində ma-

88. "əl-Mənər əl-Munif", səh: 43;

liyyə krizisi yaşayan hər bir ailə xərclərini azaltmağa çalışacaq, çünki bu, sağlam düşüncədir. Lakin bu sağlam düşüncə dövlət səviyyəsində çalışmır, çünki müasir iqtisadiyyatın etiraf etdiyi nəticələrə əsasən iqtisadi böhrandan çıxmaq üçün dövlətin əksinə daha çox maliyyə xərcləməsi lazımdır. Burada artıq sadə "sağlam düşüncə" çalışmır, çünki bu, ekspertiza tələb edir. Həmçinin "sağlam düşüncə" bizə deyir ki, əhalinin sayının azalması üçün orada xəstəliklərin artması, ölüm hallarının çoxalması lazımdır. Ancaq bu gün dünya əhalisini azaltmaqda maraqlı olan təşkilatlar və fondlar bu məqsədə çatmaq üçün insanın həyatının uzadılması, səhiyyə imkanlarının yaxşılaşdırılması üçün investisiya yatırırlar. Cəmiyyətdə səhiyyə imkanlarının yaxşılaşması halında əhalinin sayının azalması fikri statistik əsaslara dayanır. Bunun mexanizmini dərk etməsək də ilk baxışdan "sağlam düşüncə" ilə toqquşduğunu düşünmək olar. Bunu dərk etmək nə üçün bu qədər önəmlidir? Bu gün müsəlmanların gözlərində canlandırılan mənzərə budur ki, hədislərə qərbli orientalistlərin obyektiv, rasional, kritik və neytral baxışı müqabilində keçmiş müsəlman alimlərin qapalı, doqmatik və ənənəvi baxışı durur. Çox təəssüf ki, günümüzün müsəlmanları bu mənzərəyə inanırlar. Müsəlmanlar düşünürlər ki, müasir qərbli alimlərin əlindəki kritik alətlər və müasir elmi kəşflər qədim müsəlman alimlərin zamanında mövcud olmadığı üçün onların səhih saydıqları bəzi hədisləri müasir metodla inkar ediblər. Amma həqiqət budur ki, bu gün tənqid olunan elə bir hədis yoxdur ki, keçmiş zamanlarda o hədislə bağlı fərqli qruplar tərəfindən edilmiş eyni və ya bənzər tənqidlər mövcud olmasın. Misal üçün əl-Buxari'nin rəvayət etdiyi bir hədisdə Əbu Zərr deyir: "**Günəş batdıqda peyğəmbər – aleyhissalətu vassələm – dedi: "Onun hara getdiyini bilirsənmi?" Dedim: "Allah və rasulu daha yaxşı bilir!" Dedi: "O gedərək Ərşin altında səcdə edir, izn istəyir və ona izn verilir.**"[89] Bu hədis bu gün müzakirə olunan və tənqid olunan hədislər arasındadır. Müasir astronomiyadan məlumdur ki, Yür kürəsi Günəş sistemində digər planetlər kimi onun ətrafında fırlanır. O zaman günəşin səcdə etməsi, batdıqdan sonra Yer kürəsinin altında izn alıb yenidən şərqdən çıxması cəfəngiyat kimi görülə bilər. Amma bu hədisin müzakirəsi son iki əsrdə başladılmayıb. Namazın vaxtlarını dəqiq öyrən-

89. "Sahih əl-Buxari" (3199)

mək üçün astronomiya elmlərini öyrənən müsəlman alimləri erkən bir vaxtda günəşin Yer kürəsindən böyük olduğunu, Yerin kürə formasında olduğunu, günəşin bir yerdə batarkən digər yerdə hələ də səmada olduğunu və tamamilə başqa yerdə təzəcə doğduğunu bilirdilər. Həmçinin bilirdilər ki, günəş Yer kürəsinin bəzi yerlərində uzun bir müddət batmır və bəzi yerlərində isə uzun bir müddət çıxmır. Hətta bəzi hallarda ateistlər və ya başqa dinin nümayəndələri bu və bənzər hədisləri müsəlmanların dininə hücum etmək üçün misal gətiriblər. Nəcmuddin ət-Tufi'nin (h. 657-716) "əl-İntisarat əl-İsləmiyyə" kitabından bizə məlumdur ki, onun zamanında bir xristian ərəb dilində müsəlmanlar üçün İslam dinini tənqid edən bir kitab yazıb və orada Kəhf surəsindəki "**nəhayət günəşin batdığı yerə gəlib çatdıqda onu qara palçıqlı bir çeşmədə batan gördü**" ayəsini, Yasin surəsindəki "**günəş də özü üçün müəyyən olunmuş yerdə seyr edər**" ayəsini və bu hədisi misal gətirir. Sonra deyir: "**Bunların hamısının batil olduğu astronomiya elmindən azca biliyi olan hər bir kəsə aşkardır, çünki günəş öz orbitində həmişə dövr edir və o, dördüncü planetdir və o, nə qara palçıqlı çeşmədə batmır, nə də onun üçün müəyyən olunmuş bir yerə axmır, çünki onun dayandığı bir nöqtə yoxdur.**"[90] Görürük ki, miladi on üçüncü əsrdəki xətalı astronomik biliklərə əsasən Quran ayələri və hədislər tənqid olunur. əl-Qadi Əbu Bəkr İbnul-Arabi əl-İşbili (h. 458-543) deyir: "**Qəflət əhlindən bir qrup (müsəlman) ateistlərə tabe olaraq günəşin səcdə etdiyini inkar ediblər.**"[91] Miladi təqvim ilə on birinci və on ikinci əsrin müsəlman İspaniyasında, daha dəqiq desək İşbiliya, indiki adı ilə Sevilya şəhərində yaşamış bu tanınmış alim öz dövründə gedən söhbətlərdən xəbər verir. Əmin ola bilərik ki, bu etirazlar ümumilikdə müsəlman dünyası üçün, xüsusilikdə müsəlman alimləri üçün yeni bir şey deyildi. Beləliklə də bu gün müsəlmanların ağlında əmələ gələn suallar min il öncə də müsəlman alimlərin ağlında mövcud idi. O zaman müasir müsəlmanlar ilə 500 il və ya 1000 il bundan öncə yaşamış müsəlman alimləri arasındakı fərq nədir? Bu fərq hədisin mətni ilə bağlı deyildir, onların görə bilmədiklərini biz görmüş deyilik. Xeyr! Bizim

90. "əl-İntisarat əl-İsləmiyyə fi Kəşfi Şubəh ən-Nəsraniyyə", 1/362;

91. "Aridatul-Əhvazi bi Şərhi Sahih ət-Tirmizi", 9/25;

gördüyümüz problemləri onlar da görürdü. Sadəcə olaraq məsələ bu problemlərlə necə davranmalıyıq sualına, bu problemlərə necə reaksiya verməliyik sualına bağlıdır. Klassik müsəlman alimlərinin göstərdikləri reaksiya ilə müasir müsəlmanların reaksiyası arasındakı fərq bizim dünya görüşümüzdəki fərqə görədir. Biz dindən nə gözləyirik? Din necə olmalıdır, necə hiss olunmalıdır? Bu suallara onların verdiyi cavab ilə müasir müsəlmanların cavabı arasında aşkar bir fərq vardır və bu fərqin hardan qaynaqlandığını təxmin etmək çətin deyildir. Günümüzün həqiqəti budur ki, müsəlmanların bir hissəsi Qərb coğrafiyasında mühacirlər olaraq yaşayırlar, müsəlman torpaqlarında yaşayanlar da kolonialist dövlətlərin qurduqları institutlardan, təhsil ocaqlarından keçiblər. Biz islam ənənəsində əsli olmayan bir çox fikri Qərbin təlimlərindən götürmüşük. Qərbin texniki və hərbi gücü qarşısında 19-cu əsrdən başlayaraq müsəlman dünyası özünü zəif hiss etməyə başlayıb və artıq Avropa və Amerikada doğan fikirlər xüsusi bir cazibə qazanıb, onlar başqa sözlə müsəlmanları maqnit kimi özünə çəkir. Bunun gözəl misalını musiqi zövqündə görmək mümkündür. Azərbaycanda Qərb musiqisini sevən gənclər ilə muğamata könül bağlamış yaşlı nəsil üzərində düşünmək bunu anlamağa kömək edə bilər. Bu gün də özünü bu və ya başqa cür qərblilərə bənzətmək istəyən müsəlmanlar özlərini intellektual, rasional göstərməyə çalışırlar. Şərqə səciyyəvi metafizik dünyaya inam, ruhanilik və mənəviyyatçılıq xüsusiyyətlərini özündə gizlətməyə çalışdıqlarını görərsən, mütaliə dairələrində qərbli filosofların kitablarını da göstərməyi sevərlər. Ona görə də müasir müsəlmanlar keçmişdən bəri məlum olan problemlərə bu gün daha sərt reaksiya verirlər, keçmiş alimlərin təqdim etdikləri təvillər ilə kifayətlənmək istəmirlər, özlərini daha rasional, daha intellektual göstərmək üçün onların tamamını inkar etməyi daha uyğun hesab edirlər. Bu intellektual dairəyə daxil olmağa ehtiyac hissi də əslində materialistin Qərbin rişxəndli baxışlarından qurtulmaq üçündür. İyirminci əsrin əvvəllərində Muhəmməd Raşid Rida ilə əzharlı şeyx Yusuf bin Əhməd əd-Dicvi (1287-1365/1870-1946) arasında gedən münaqişəni də məhz bu fərqliliyin işığında anlamaq olar.[92]

---

92. Raşid Rida özünə aid olan “əl-Mənar” jurnalında hədisləri tənqid edərkən Şeyx əd-Dicvi də əl-Əzhar universitetinin rəsmi jurnalında ona cavablar verirdi. Günəşin ərşin

Bil ki, əziz oxucu, klassik müsəlman alimlər hədisi hərfi şəkildə başa düşməmişdilər. Axı günəşin kürə şəklində olduğunu bilməkləri, alnının olmadığını dərk etməkləri hədisdəki səcdənin hərfi mənada olmadığını özlüyündə xəbər verirdi. Ərəb dilinin geniş imkanlarını onlar bizdən də gözəl bilirdilər. Əlbəttə ki, ərəb dilində "səcdə" sözünün Quranda itaət mənasında, boyun əymək mənasında keçdiyindən agah idilər. Allah – cəllə cələluhu – buyurur: "**Ulduzlar da, ağaclar da səcdə edir.**"[93] Bir başqa ayədə isə "**məgər göylərdə və yerdə olanların, günəşin, ayın, ulduzların, dağların, ağacların, heyvanların və insanların xeyli hissəsinin Allaha səcdə etdiyini görmürsənmi?**"[94] deyir. Gəlin hicri altıncı, miladı on ikinci əsrdə vəfat etmiş sevilyalı müsəlman qazisinə qayıdaq. Onun bu hədislə bağlı apardığı müzakirədən bəzi hissələri təqdim etmək istəyirəm. İbnul-Arabi deyir: "**Qəflət əhlindən bir qrup (müsəlman) ateistlərə tabe olaraq günəşin səcdə etdiyini inkar ediblər və (günəşin səcdəsi) səhihdir, caizdir, mümkündür… "Ərşin altında" sözü ilə qəsd etdiyi "hakimiyyəti altında" mənasıdır… və günəş bütün halı ilə ərşin altında ərşin sahibinə səcdədədir və onun səcdə etməyinin bizə aşkar seçkin şəkildə göründüyü ən xüsusi halı isə batdığı və çıxdığı haldır və bu iki yerdə ən son mənzilləri arasındakı hərəkətidir… Bizə görünmədikdə belə günəş daimi hərəkətdə olsa da bizim müşahidəmizdə o, dayanmış kimidir; beləliklə də müşahidə olunan hərəkətin yoxa çıxmasını bizə nisbətdə "dayanmaq" sözü ilə ifadə etmişdir… "Ərşin altında" deməsi də doğrudur, çünki Yer üzündəki hər bir şey ərşin altındadır, hətta bütün aləm ərşin altındadır, çünki hər bir şey mülk sahibinin əlindədir. Günəş də Onun qüdrəti və qəhri altındadır və (qüdrət, qəhr) mülkün və ərşin mənasıdır, beləliklə də bu bəlağətli məna ilə günəş onun altında olur.**"[95] Bu alim hansısa marginal bir qrupun nümayəndəsi olmayıb, əksinə müsəlman dövlətində qazi olaraq çalışmış, Şərqdən Qərbə qədər ge-

altında səcdə etməsi hədisi də bu münaqişənin mövzularından biri idi.

93. ər-Rahmən, 6

94. əl-Həcc, 22

95. "Aridatul-Əhvazi bi Şərhi Sahih ət-Tirmizi", 9/25-26;

niş müsəlman ərazilərində səyahət etmiş görkəmli bir İslam alimidir. Ateistlər hədisin hərfi mənasını inkar ediblər, müsəlman alimlər isə onsuz da hədisi hərfi mənada qəbul etmirdilər. Eyni vəziyyət bu gün də davam edir, dəyişən yeganə hal budur ki, indiki zamanımızda propaqanda maşınını idarə edənlər dinə geriçilik və xurafat libası geyindiriblər, digər tərəfdən isə ateizm, dünyəvilik üçün rasionallıq, intellektuallıq obrazı yaradıblar.

Eyni şəkildə Quranda zikr olunan[96] və səhih hədislərdə keçən "ayın ikiyə bölünməsi" möcüzəsinə də etiraz ediblər. Eyni dövrdə yaşayan bir başqa müsəlman alimi əl-Qadi İyad bin Musa əl-Yəhsubi (476-544/1083-1149) "əş-Şifə bi Tərifi Huquqil-Mustafə" adlı kitabında deyir: "**Bədbəxt birinin "əgər bu (həqiqətən də) baş versəydi Yer əhalisindən gizli qalmazdı, çünki bu, hamıya görünən bir şeydir" deməyinə də əhəmiyyət verilməməlidir...**"[97] İyad əl-Yəhsubu də Əndəlüsün Qranada bölgəsindəndir, eyni mühit və eyni cəmiyyətdə gedən müzakirələrdən bu şəkildə xəbərimiz olur. Təbii ki, möcüzələrə, Allahın sonsuz qüdrətinə inanan bir müsəlman olaraq o, bu xəbərləri müdafiə edir.[98]

Musa peyğəmbərin – aleyhissələm – ölüm mələyinin gözünü çıxarması haqqında "Sahih Muslim"də keçən hədisə də əsrlər

96. "O saat yaxınlaşdı və Ay (ikiyə) parçalandı. Onlar bir möcüzə gördüklərində üz döndərib "tez keçib gedən bir sehrdir" deyirlər." (əl-Qamər, 1-2)

97. "əş-Şifə bi Tərifi Huquq əl-Mustafə", səh: 176;

98. O, bu etiraza belə cavab verir: "Bizə belə bir xəbər gəlməyib ki, o gecə bütün Yer əhli ayı müşahidə ediblər və onun parçalandığını görməyiblər. Yalan üzərində razılaşmaqları imkansız olacaq çoxluqda adamdan bizə (belə bir şey) nəql olsaydı yenə bizə qarşı bir dəlil olmazdı. Çünki ay Yer üzünün bütün əhalisi üçün bir həddə deyildir; bir qövmün üzərinə çıxmadan öncə başqalarına görünür. Bir qövmə Yer üzünün başqa ölkələrindən onların müqabilində olanlara görünənin ziddi görünə bilər və yaxud da ay ilə onların arasında buludlar və dağlar girə bilər. Bu səbəblə də eklips hadisəsini bəzi ölkələrdə gördükləri halda başqa ölkələrdə görə bilmirlər. Bəzi yerlərdə cüzi görürlər, bir başqa yerdə isə tam şəkildə görürlər. Bəzi ölkələrdə isə bunu yalnız bu elmə iddialı olanlar bilirlər. Bu, Allahın təqdiridir. Ay möcüzəsi də gecə olmuşdu və gecə vaxtı sakitçilik, qapıları bağlamaq, təsərrüfatı durdurmaq insanların adətindəndir və fürsətdən istifadə edib səmanı müşahidə edənlərdən istisna olmaqla səma hadisələrindən demək olar ki, heç bir şey haqqında xəbərləri olmur. Eləcə də ay tutulması ölkələrdə tez-tez baş vermir və insanların əksəriyyəti onlara xəbər verilməyənə qədər bu barədə bilmirlər. Bir çox halda etibarlı insanlar bəzi hallarda gecə səmadan üzə çıxan işıqlar, böyük parlaq ulduzlar barədə müşahidə etdikləri əcaib şeylər danışırlar və heç kəsin bundan xəbəri olmur."

öncə etiraz edilib. Tunisli alim Əbu Abdilləh Muhəmməd bin Əli əl-Məziri (453-536/1061-1141) deyir: “**Bu hədis ateistlərin tənə etdikləri hədislərdəndir. Bunun səbəbi ilə əsərləri nəql edənlərə lağ edirlər və deyirlər: “Bir peyğəmbərin bir mələyin gözünü vurub çıxarması necə mümkündür?! Bir mələyin ümumiyyətlə gözü necə çıxa bilər ki?! Bəlkə də İsa gəldikdə digər gözünü də çıxarıb və kor olub!**”[99] Bu hədis əl-Məziri’nin dövründən öncə də mübahisələrə səbəb olmuş bir hədisdir. İbn Xuzeymə (h. 223-311), İbn Hibban (h. 274-354) kimi daha qədim alimlərin bu hədisin mənasını kitablarında müdafiə etdiklərini[100] oxuduğumuzda hədisə qarşı etirazların çox qədim olduğunu anlayırıq.

İmam Muslim “əs-Sahih” kitabında Ənəs bin Malik’in belə dediyini rəvayət edir: “**Bir nəfər Allahın elçisinin – salləllahu aleyhi va səlləm – ummuvələdi ilə ittiham olunurdu. Buna görə də Allahın elçisi – salləllahu aleyhi va səlləm – Əliyə dedi: “Get və onun boynunu vur!” Əli onun yanına gəldi, gördü ki, bir quyuya girib orada sərinlənir. Əli ona dedi: “Çıx ordan!” Əlini uzatdı və onu oradan çıxardı. Bir də gördü ki, adam məcbubdur, kişilik orqanı yoxdur. Əli ondan əl çəkdi və sonra**

99. “əl-Mu’lim bi Fəvaid Muslim”, 3/230;

100. Alimlərin bu hədislə bağlı izahları çoxdur. Lakin bunlardan ən qədim olan alimlərin izahları budur ki, mələk Musanın gözünə onun tanımadığı bir surətdə görünmüşdür. Musa da evində tanımadığı bir kişini gördükdə ona yumruqla vurmuşdur. Bunun üçün İbn Hibban Qurandan bəzi ayələr zikr edir. Misal üçün Hud surəsində Allah mələklərin İbrahimin yanına gəldiyini xəbər verir: “Elçilərimiz İbrahimə müjdə gətirdilər və “salam” dedilər. O da “salam” dedi və dərhal qızardılmış bir buzov gətirdi. Yeməyə əl vurmadıqlarını gördükdə onlar onun xoşuna gəlmədi və onların yanında canına qorxu düşdü.” (Hud, 69-70) Həmçinin Lut peyğəmbərin yanına gəldiklərində o və qövmü onların mələk olduqlarını anlamamışdılar. Ona görə də Lut peyğəmbər yanına kişi surətində gəlmiş mələkləri qövmünün şərrindən qorumağa çalışırdı. Həmçinin Məryəm haqqında da Allah – cəllə cələluhu – buyurur: “Kitabda Məryəmi də yada sal. O zaman o, ailəsindən (ayrılıb) şərq tərəfdə olan bir yerə çəkilmiş və onlardan (gizlənmək üçün) pərdə tutmuşdu. Biz Öz Ruhumuzu onun yanına göndərdik. O, Məryəmin qarşısında tam insan surətində peyda oldu. (Məryəm) dedi: “Mən səndən ər-Rahmənə sığınıram! Əgər müttəqisənsə (mənə toxunma)!” (Məryəm, 16-18) Bu ayədən də göründüyü kimi Məryəm onun mələk olduğunu anlamayıb, evinə yad bir kişinin daxil olduğunu zənn edərək özünü qorumağa çalışmışdır. Ona görə də Musa peyğəmbərin ölüm mələyini görüb tanımaması qəribsənilməməlidir. Ola bilsin ki, Allah sonsuz hikməti ilə Musa peyğəmbəri sınamışdır.

**peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanına gəldi və dedi: "Ey Allahın elçisi, o məcbubdur, kişilik orqanı yoxdur.**"[101] Bu hekayə peyğəmbərin – aleyhissələm – kənizi qibti Mariya ilə bağlıdır. Münafiqlər bir nəfərin onun yanına daxil olduğunu, onunla zina etdiyini söyləyərək peyğəmbərə əziyyət verirdilər. Buna görə də Allahın elçisi – aleyhissalətu vassələm – Əliyə həmin adamı öldürməyi əmr edir. Əli adamın gündüzün istisindən qorunub sərinlik tapmaq üçün lüt şəkildə quyuya girdiyini görür və oradan çıxardıqda haqqında söylənənlərin doğru olmadığını görür. Şeyx Muhəmməd əl-Ğazzəli bu hədisi "əs-Sunnə ən-Nəbəviyyə beynə Əhlil-Fiqhi va Əhlil-Hədis" adlı kitabında inkar edir. Onun bu hədisə etiraz səbəbi də qədimdən alimlərin qarşısında problem olaraq durub. Hətta İbnul-Qayyim'in sözündən anlaşılana əsasən elm əhlindən bəziləri "Sahih Muslim" kitabında keçməsinə baxmayaraq bu hədisi səhih saymayıblar.[102] İbnul-Cəvzi hədisdəki problemi bu şəkildə zikr edir: "**Bu hədisə qarşı bir etiraz vardır və (etiraz olaraq) demək olar ki, peyğəmbər – salləllahu aleyhi va səlləm - sadəcə ittihama əsasən necə bir nəfəri öldürməyi əmr etdi?!**"[103] Bu problemlə bağlı müzakirəni biz hətta İbn Cərir ət-Təbəri'nin, İbn Həzm əl-Əndəlüsi'nin kitablarından oxuya bilirik. O dövrdən bu əsrə qədər müzakirə davam edir və müsəlman alimlər bu etirazlara müxtəlif yönlərdən cavab veriblər.[104]

---

101. "Sahih Muslim" (2771);

102. İbnul-Qayyim "Zədul-Məad" kitabında (5/15) deyir: "Bu hökm alimlərdən bir çoxuna problemli görünüb və buna görə də onlardan bəziləri hədisi zəif sayıblar..."

103. "Kəşful-Muşkil min Hədisis-Sahiheyn", 3/309;

104. Bu cavabların xülasəsi budur ki, peyğəmbər – aleyhissələm – dəlilsiz, sübutsuz heç kimi öldürməyi əmr etməyib. Yəni İslam alimləri bu hədisdən etiraz edənlərin başa düşdüyünü götürməyiblər. Bu hədisdə zikr olunmasa da digər xəbərlərdən bilirik ki, ittiham olunan adam Mariya'nın əmisi oğlu idi. İkisi də Misir kralı tərəfindən peyğəmbərə - aleyhissələm – hədiyyə edilmişdi. Qeyd edirlər ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – qulun axtalanmış olduğunu, hətta kişilik orqanının tamamilə mövcud olmadığını bilirdi. Çünki onun bundan xəbərinin olmaması iki səbəbə görə çox uzaq bir ehtimaldır. Birinci səbəb budur ki, şəriət qul sahiblərinə onların qayğısına qalmağı, ehtiyaclarını qarşılamağı əmr edir. Allahın elçisi – salləllahu aleyhi va səlləm – nümunəvi bir şəxsiyyət kimi bu məqama daha layiqlidir və köləsinin ehtiyacları ilə maraqlandığı halda bundan xəbərinin olmaması real görünmür. İkinci səbəb isə budur ki, Misir kralının hədiyyə verdiyini rəvayət edən səhabələr kölənin axtalanmış olduğunu zikr edirlər. Bu əmrin məqsədi peyğəmbərin öz ailəsini münafiqlərin iftirasından təmizləmək idi. O, Mədinə əhlinin qarşısında öz əmisi oğlu Əli bin Əbi Talibə gedib ittihamı yoxlamağı

Məşhur "milçək" hədisində görülən problem qədim zamanda da mövcud idi. İbn Quteybə əd-Dinəvari (213-276/828-889) deyir: "**Dedilər ki, əqlin təkzib etdiyi bir hədis: "əgər qaba milçək düşərsə". Dedilər ki, siz rəvayət edirsiz ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – deyib: "Sizdən birinizin qabına milçək düşərsə qoy onu batırsın, çünki qanadlarından birində zəhər vardır, digərində isə şəfa vardır və o, birinci zəhər olanı batırır, arxasınca şəfa olanı batırır!" Dedilər: "Bir şeydə necə həm zəhər, həm də şəfa ola bilər. Milçək də zəhərin harada olduğunu necə bilir ki, onu öncə batırır və şəfanın harasında**

və doğrudursa onu öldürməyi əmr edir. Əli onun arxasınca getdikdə hamının qarşısında onun axtalanmış olduğunu üzə çıxarır, öldürməkdən əl çəkir və bu şəkildə də yayılan şayələrə son qoyur. Bunun bu şəkildə baş verdiyini, insanların qarşısında olduğunu biz əl-Bəzzar'ın rəvayət etdiyi hədisdən öyrənirik. İbn İshaq "əs-Sira" kitabında (səh: 271) deyir: "İbrahim bin Muhəmməd bin Əli bin Əbi Talib mənə atasından, o da babası Əli bin Əbi Talibdən belə dediyini xəbər verir: "Allahın elçisi – sallələllahu aleyhi va səlləm – məni çağırdı. İbrahimin anası Mariya'ya onu ziyarət edən, tez-tez yanına gələn əmisi oğlu qibti haqqında (deyilənlər) ağır gəlmişdi. Buna görə də Allahın elçisi – sallələllahu aleyhi va səlləm – mənə dedi: "Bu qılıncı götür və get! Əgər onun yanında tapsan öldür onu!" Dedim: "Ey Allahın elçisi, sənin əmrində qızdırılmış damğa kimi olum, hətta mənə əmr etdiyini yerinə yetirənə qədər heç bir şey məni fikrimdən döndərməsin? Yoxsa qayıbın görmədiyini görə bilən şahid kimi olum?" Allahın elçisi – sallələllahu aleyhi va səlləm – dedi: "Əksinə qayıbın görmədiyini görə bilən şahid kimi ol!" Qılıncım üstündə ora yaxınlaşdım və onu (Mariyanın evinin) yanında tapdım. Məni gördükdə qılıncı qınından çıxardım, bununla mənim onu axtardığımı başa düşdü. Bir xurma ağacına sarıldı və onun üzərinə qalxmağa başladı, yarısına çatmışdı ki, ona yaxınlaşdım və beli üstə aşağı düşdü. Sonra qıçını qaldırdı və gördüm ki, axtalanıb, kişilərdə olanın nə böyüyü, nə də balacası onda var idi. Qılıncı qınına qoydum, sonra Allahın elçisinin – sallələllahu aleyhi va səlləm – yanına qayıtdım, ona xəbər etdim. Dedi: "(İftiraları) ev əhlimizdən dəf edən Allaha həmd olsun!" Muhəmməd bin İshaq'ın bizə Əlinin nəvəsindən, onun da öz atası Muhəmməd əl-Hənəfiyyə'dən, onun da öz atası Əli bin Əbi Talib'dən rəvayət etdiyi bu xəbərdən biz daha çox məlumat almış oluruq. Buradan öyrəndiyimiz bir neçə nöqtə vardır: 1. Allahın elçisi – aleyhissalətu vassələm – hər bir halda öldürməməyi əmr edir. Həmin qibtini Mariyanın evində taparsa, başqa sözlə desək iftira əhlinin söylədikləri doğrudursa öldürməyi əmr edir. İkincisi isə ona "qayıbın görmədiyini görə bilən şahid kimi ol" deməklə məsələni araşdırmasını əmr edir. Buradan anlamaq olar ki, peyğəmbər – aleyhissalətu vassələm – qulun məsum olduğunu bilirdi. Daha da öncə də qeyd etdik ki, öz qulunun axtalanmış olduğunu bilməməsi uzaq ehtimaldır. Xəbərin sonunda "(İftiraları) ev əhlimizdən dəf edən Allaha həmd olsun" deməyindən anlayırıq ki, bu hadisə ilə iftiralara son qoyulmuş oldu. Əgər bu hadisəni sadəcə Əli və peyğəmbər – sallələllahu aleyhi va səlləm – bilmiş olsaydı o zaman iftiralar dayanmazdı. İftiraların dayanmağı yalnız ona dəlalət edir ki, Əli orada tək olmayıb və yanında bir qrup insan olub. Hər bir halda görürük ki, bu hadisə səhihdir, sadəcə olaraq problem hadisəni necə qəbul etməkdən asılıdır.

**olduğunu necə bilir ki, onu axırda batırır?!**”[105] Əbu İshaq əş-Şatibi də “əl-İtisam” kitabında əqlə zidd olduğu iddia olunan hədislər arasında bunu da zikr edir. Hətta mötəzili məzhəbinin böyüklərindən sayılan Əbu Osman əl-Cəhiz (h. 159-255) “əl-Heyvan” kitabında əl-Adəviyyə qəbiləsindən bir şeyxin bunu inkar etdiyini zikr edir. Alləmə İbn Dəqiqil-İd qeyd edir ki, əl-Cəhiz öz şeyxi İbrahim bin Səyyər ən-Nəzzam'dan (h. 160-229) bu hədis haqqında çirkin sözlər nəql edir.[106] Gördüyümüz kimi bu hədis də qədim zamandan bəri müzakirə olunan bir hədisdir, əqlə zidd olduğu iddia edilib. İlk əsrlərdən başlayaraq alimlərin bu hədisə verdikləri izahlar da fərqlənib.[107]

---

105. “Təvilul-Muxtəlif əl-Hədis”, səh: 334;

106.Bax: “əl-Heyvan”, 3/312-313; “Şərhul-İlməm bi Əhədis əl-Əhkəm”, 1/334;

107. Bu hədislə bağlı olaraq alimlərin əsasən iki izahı mövcuddur. Alimlərin bir hissəsi bu hədisdə keçən xəstəlik və ya zəhərin və şəfanın həqiqi mənada olduğunu deyiblər. Digər hissəsi bunların məcazi mənada qəsd olunduğunu söyləyiblər. Həqiqi mənada olduğunu deyənlər qeyd edirlər ki, bunun elmi Allahın yanındadır, onlar öz zamanlarına görə tibb elmində istifadə olunan metodları zikr etsələr də həqiqətdə milçəkdə həm xəstəliyin, həm də dəvanın necə bir araya gəldiyini bilmədiklərini etiraf ediblər. Bunun məcazi mənada olduğunu deyənlər bunun ruhani xəstəlik və ruhani tədavi ilə bağlı olduğunu söyləyiblər. Hənəfi alimlərindən İbnul-Mələk ər-Rumi (vəfatı h. 854) “Şərhu Məsabih əs-Sunnə” kitabında (4/514) deyir: “Deyilib ki, xəstəlik və şəfa həqiqi mənalarında götürülməlidir, çünki Allahın hikmətində bunları bir heyvanın iki hissəsində birləşdirməsi imkansız deyildir, necə ki, əqrəbin iynəsində zəhər qaynayır, amma bunun özünə qarşı onun cəsədindən tədavidə istifadə olunur. Bu ikisinin məcazi mənada olması da mümkündür, çünki milçək (qaba) düşərkən qanadlarından biri batır və insan nəfsi onu içməkdən iyrənir, bax bu, xəstəlik kimidir. Onun hamısını içinə batırdıqda nəfsini sındırmış olur və bu, şəfa kimidir.” Ondan da öncə İmam İbn Dəqiqil-İd (h. 625-702) “Şərhul-İlməm” kitabında (1/332-333) bu izahı möhtəməl izahlar arasında qeyd edərək deyir: “Də və Dəva sözlərinin zahirindən anlaşılan bunların xəstəliklər və onların sağalması ilə əlaqəli olmasıdır. (Burada) xəstəlik ilə zənginlik və rəfah içində yaşayanların yeməkdən iyrənməsi, ondan qaçması və onu yeməyə təkəbbürlük etməsinin də qəsd olunması ehtimaldır. Hətta ola bilsin ki, (bu xəstəlik) yeməyin tərk edilib tələf olmasına səbəb olsun. (Burada) dəva isə nəfsi sındırmaq, onu təvazökarlığa məcbur etmək, rəfahda həddi aşmamaq və təkəbbürlülərin yolu ilə getməmək olacaq. (O zaman) bu, məcaz olur, həqiqi məna isə daha əvvəl zikr olundu.” İbn Dəqiq əl-İd də hər iki mənanın mümkün olduğunu söyləyir, yəni hədisdən bu iki mənanı başa düşmək mümkündür. Ondan da öncə hicri 449-cu ildə vəfat etmiş əndəlüslü Əbul-Həsən Əli bin Xələf İbn Battal əl-Qurtubi “Sahih əl-Buxari” kitabına yazdığı şərhində (9/456) deyir: “Bu hədis iki mənada izah oluna bilər: Zahirinə həml etmək olar və bu, qanadlarından birində xəstəliyin olması, digərində isə dərmanın olmasıdır, necə ki, peyğəmbər – aleyhissələm – deyib. Batırmaqla xəstəlik gedir və batırmaqla yanaşı birinci qanadında olan xəstəlik dərmanla sağalır. Bu hədisin bəzi rəvayət yollarında gəlib ki, “(milçək) birinci xəstəlik olan qanadı batırır.” Digər izah isə budur ki, buradakı xəstəlik yeməyə milçək düşdükdə yeyənin iyrənməsi, onu murdar görməsidir. Digər qanadındakı dəva isə yeməyə onun

Eləcə də əl-Buxari'nin "əs-Sahih" kitabına aldığı meymunlar arasında baş vermiş zinaya görə daş-qalaq etmək əhvalatı da mübahisəyə səbəb olub. İslam alimlərindən kimi bu hədisi tamamilə inkar etmiş,[108]

hamısını batırmaqla iyrənməyi, təkəbbürü aradan qaldırmaqdır, onun yeməyə düşməyinə az önəm verməkdir. Çünki milçəyin axan qanı yoxdur, yeməyi (tamamilə) korlamasından qorxulacaq qədər qanı yoxdur, ona görə də iyrənməyin bir mənası yoxdur. Peyğəmbərin – aleyhissələm – bunlardan hansını qəsd etdiyini Allah bilir." İbn Battal belə bu iki mənadan hansının qəsd olunduğundan əmin deyildir, hər iki mənanı mümkün hesab edir. Onlardan da öncə İmam Əbu Bəkr Muhəmməd bin Əbi İshaq əl-Kələbəzi əl-Buxari əl-Hənəfi (vəfatı hicri 380) "Məanil-Əxbər" kitabında (səh: 240) deyir: "Bu xəstəliyin fitnəsinin və şəfanın mənasının ruhani tibb mənasında olması mümkündür və bunun eynisi haqqında təbiblər danışıblar. Bunun mənası əxlaqı islah etmək, insan təbiətinə düzən vermək, adətləri və səciyyələri onlardan fasid olanları çıxarmaqla təmizləmək, onlardan saleh olanları tərbiyə etmək, düzəldilməsi mümkün olanları düzəltməkdir, çünki əxlaq xəstəliyi, adətlərin mərəzi dinə zərər verir, cisimlərin xəstəliyi isə bədənlərə zərər verir. Bədənlərin mərəzi günahların kəffarəsidir, halbuki əxlaqın mərəzi isə bəlalara səbəb olur. Beləliklə də qanadlarından birində olan xəstəliyin kibr olması, şəriətin mübah etdiyini, sünnətin halal etdiyini özünə sığışdırmayan təkəbbürlük olması mümkündür. Belə ki, sünnət axar qanı olmayan həşəratların içində öldüklərini yeməyi mübah saymışdır və bu barədə rüxsət varid olub. Allahın elçisi – salləllahu aleyhi va səlləm – buyurur: "Allah Onun əzimətlərinə əməl edilməsini sevdiyi kimi rüxsətlərinə də əməl edilməsini sevir." Sanki insan özünü daha üstün hesab edərək, təkəbbürlük edərək şəriətin mübah gördüyünü yeməməyə üzrxahlıq edərsə bundan onun dini üçün böyük bir fəsad vardır, öz nəfsini əzizləşdirmiş olur, bir çox halda içinə milçək düşmüş həmin yeməyi tullayar və ya həmin içkini dağıdar, beləliklə də bu əməli Allahın halal etdiyini haram etməyə, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – sünnətini özünə sığışdırmamağa, Allahın nemətlərini zay etməyə gətirib çıxarar. Beləliklə də özünü yuxarıdan dartmaq xasiyyətini aradan qaldırmaq üçün, nəfsindəki kibri öldürmək üçün peyğəmbər – salləllahu aleyhi va səlləm – qaba milçək düşərsə onu batırmağı əmr etmişdir..." əl-Kələbəzi bu müzakirəsini uzadır və bənzətmələr edir. Bu izahın hikməti aşkardır və hökmün arxasındakı məqsəd də aydındır. O dövrün qıtlığını, quraqlığını, məhsulun az hasil olduğunu nəzərə alsaq bu hökmü yeməyin içinə sadəcə bir həşərat düşdüyü üçün onu atmağın qarşısını almaq kimi başa düşmək olar, çünki dində israf və malı zay etmək şiddətlə qadağan edilib.

108. Bəzi alimlər bu hədisin mətnini inkar ediblər, rədd ediblər. Əbu Ömər Yusuf İbn Abdilbərr ən-Nəməri (h. 368-463) "əl-İstiy'ab" kitabında (3/1205-1206) Amr bin Məymun əl-Əvadi haqqında danışarkən deyir: "O, kufəli böyük tabiinlərdən biri sayılır və cahiliyyə dönəmində meymunların arasında daş-qalağı görən də odur; əgər (əlbəttə ki,) bu səhihdirsə, çünki raviləri məchuldurlar... və mükəlləf olmayana zina nisbət etmək, heyvanlar arasında hədlərin iqamə olunduğu demək elm əhlindən bir qrupa görə münkərdir." Hətta Əbu Abdilləh Muhəmməd bin Futuh əl-Humeydi (h. 420-488) "əl-Cəm'u beynəs-Sahiheyn" kitabında (səh: 490) deyir: "Biz bu xəbəri araşdırdıq və gördük ki, (bu xəbər) əlyazmaların bəzilərində keçir, hamısında keçmir. "Cahiliyyə günləri" bölümündə zikr olunur. ən-Nueymi'nin əl-Fərabri'dən rəvayətində əslən meymunlar haqqındakı bu xəbərdən bir şey yoxdur, ola bilsin ki, əl-Buxari'nin kitabına sonradan daxil edilənlərdəndir." əl-Humeydi ilə bu iddiada Məcduddin Əbus-Səadət əl-Mubərak ibn əl-Əsir əl-Cəzəri (h. 544-606) "Cami'ul-Usul fi Əhədis ər-Rasul" kitabında, həm də qardaşı tarixçi alim İzzuddin Əbul-Həsən Əli ibn əl-Əsir əl-Cəzəri (h. 555-630) "Us-

kimisi də hədisin doğru anlamağın əhəmiyyəti haqqında danışmışdır. Görünür ki, bu xəbər hələ hədislərin böyük kitablara toplandığı dövrlərdə mübahisəyə səbəb olmuş bir xəbərdir. Əbu Abdilləh İbn Quteybə əd-Dinəvari deyir: "**Dedilər ki, "siz meymunların bir dişi meymunu zinaya görə daş-qalaq etdiklərini rəvayət etmisiz. Əgər meymunlar o dişi meymunu ərə getmiş olduğuna görə daş qalaq etmişdilərsə, o zaman bu, hədis üçün daha məzəlidir. Bu müqayisəyə əsasən siz bilmədiyiniz halda ola bilsin ki, meymunlar Tövratın hökmlərindən çox şeyə əməl edirlər. Bəlkə də dinləri yəhudi dinidir. Əgər meymunlar yəhudidirsə ola bilsin ki, donuzlar xristiandırlar.**" Xəbərə qarşı edilmiş bu etirazı nəql etdikdən sonra İbn Quteybə deyir: "**Biz bu istehzanın cavabında deyirik ki, meymunlar hədisi Allahın elçisindən – salləllahu aleyhi va səlləm – deyildir, nə də hansısa bir səhabədəndir. Bu, sadəcə olaraq Amr bin Meymun'dan zikr olunmuş bir şeydir... Ola bilsin ki, (Amr) meymunların bir meymunu daşladığını görüb və onu zina etdiyinə görə daşladıqlarını güman edib. Belə bir şeyi kiminsə güman etmədən bilməsi mümkün deyildir, çünki meymunlar özləri haqqında xəbər vermirlər. Onların bir-birinin üstünə çıxdıqlarını görən kəs zina edib etmədiklərini bilməz. Bu, sadəcə bir zənndir.**"[109] İbn Quteybə bəzi kimsələrin b xəbər ilə istehza etdiklərini, o xəbəri hədis olaraq qələmə verdiklərini qeyd edir və sonra istehzaya cavab verir.[110] əl-Buxari və Muslim'in kitablarında Ənəs bin Malik'dən dəvənin

dul-Ğabə" kitabında razılaşır. Amma İbn Həcər "Fəthul-Bəri" kitabında əl-Humeydi'yə etiraz edir və bu xəbərin "Sahih əl-Buxari" kitabının əslində keçdiyini inkar etməyini əsassız hesab edir, çünki əksər nüsxələrdə mövcud olduğunu deyir. Ümumiyyətlə "Sahih əl-Buxari" kitabında az bir sayda hədisin həqiqətən də kitabın əslindən olub olmadığı alimlər arasında mübahisəlidir, bu xəbər də onlardan biridir.

109. "Təvilu Muxtəlif əl-Hədis", səh: 372

110. Ümumiyyətlə əl-Buxari'nin bu xəbəri "əs-Sahih" kitabında qeyd etməsi nə ümumilikdə hədislərin, nə də xüsusilikdə "əs-Sahih" kitabının etibarına xələl gətirməz. Çünki əl-Buxari bu xəbəri rəcm hökmü üçün dəlil gətirmir. əl-Buxari'nin qəsdinin möhtəmələn nə olduğunu böyük təfsir alimi Əbu Abdilləh əl-Qurtubi təfsirində (1/442) izah edir: "Əgər bu rəvayət səhihdirsə əl-Buxari'nin bunu kitabında rəvayət etməsindəki tək məqsədi Amr bin Məymun'un cahiliyyə dönəminə şahid olduğunu göstərmək üçündür və onun cahiliyyə dövründə etdiyi zənnə önəm verməmişdir." Gördüyümüz kimi alimlərimiz də Amr bin Məymun'un gümanında xəta etdiyini, bunun doğru olmadığını bəyan ediblər və əl-Buxari'nin "əs-Sahih" kitabında keçən bu xəbər ilə əl-Buxari'nin qəsdinin Amr bin Məymun haqqında məlumat vermək olduğunu deyirlər.

sidiyini içmək haqqında rəvayət etdikləri hədis isə bir başqa misaldır.[111]

---

111. Burada üç önəmli nöqtə vardır. İlk öncə qeyd edək ki, hədis səhihdir və hədisin səhihliyində şəkk yoxdur. Lakin bir hədisin səhih olması heç də onun mətnindəki hər bir ləfzin səhih olmasını gərəkdirməz. Bu hədisi Ənəs bin Malik'dən basralılar rəvayət edirlər, lakin görünür ki, basralılar bu hədisi rəvayət etməkdə ixtilaf ediblər. Əbu Qiləbə, Qatədə rəvayətlərində "sidiklər" sözünü zikr etdikləri halda Humeyd ət-Tavil o sözü Ənəsdən eşitmədiyini deyir. əl-Xatib əl-Bağdadi "əl-Fəsl lil-Vasl əl-Mudrac fin-Nəql" kitabında (2/611-613) bu hədisi İsmail bin Cəfər – Humeyd ət-Tavil – Ənəs bin Malik yolu ilə rəvayət etdikdən sonra deyir: "İsmail bin Cəfər bin Əbi Kəsir əl-Ənsari bu şəkildə hədisin hamısını Humeyd ət-Tavil'dən, o da Ənəs bin Malik'dən rəvayət edir. Orada tək bir ləfz var ki, Humeyd onu Ənəsdən eşitməyib, onu sadəcə olaraq Qatədə'dən, o da Ənəsdən rəvayət edib və bu söz "sidiklərindən" sözüdür." Daha sonra əl-Xatib əl-Bağdadi bir çox yoldan Humeyd ət-Tavil'dən tələbələri vasitəsi ilə rəvayətlərini zikr edir və Yezid bin Harun'un rəvayətində deyir: (Yezid bin Harun dedi: ) Humeyd dedi: "Qatədə "və sidiklərindən" dedi. Mən isə bunu Ənəs'dən eşitməmişəm." Əbu Davud "əs-Sünən" kitabında (333) deyir: "Musa bin İsmail mənə rəvayət etdi; Həmməd bizə Əyyub'dan, o da Əbu Qiləbə'dən, o isə Bənu Amir qəbiləsindən bir nəfərdən belə dediyini rəvayət etdi: "İslama daxil oldum və dinimi öyrənmək istədim. Əbu Zərr'in yanına gəldim, Əbu Zərr dedi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – mənə dəvəni və qoyunları məsləhət gördü və dedi: "Onların südlərindən iç!" - Həmməd (bin Sələmə) dedi: "Mən "sidiklərindən" sözündə şəkk edirəm. Bu, Həmmədin sözüdür. – Əbu Zərr dedi: "Sudan qaçardım, ailəm isə mənimlə idi, cənabətə bulaşdıqda təharətsiz namaz qılardım..." Daha sonra Əbu Davud uzun hədisi axıra qədər zikr edir və axırında deyir: "Həmməd bin Zeyd bunu Əyyub'dan rəvayət edib və "sidiklərindən" sözünü zikr etməyib." Əbu Davud dedi: "Bu, səhih deyildir, (dəvənin) sidikləri haqqında Ənəsin hədisindən başqası yoxdur və onu yalnız Basra əhli rəvayət edib." Bu məlumatlardan öyrənirik ki, Ənəs bin Malik bəzən bu sözü rəvayət etmiş, bəzən isə etməmişdir. Xüsusilə də Ənəsin o zaman uşaq olduğunu nəzərə alsaq bunun onun xətası olması möhtəməldir, lakin daha güclü ehtimal budur ki, Ənəs bu hədisi olduğu kimi eşidib və rəvayət edib. Buna görə də hədis qaydalarına əsaslanaraq peyğəmbərin – salləllahu aleyhi va səlləm – o insanlara dəvə südünü və sidiyini içməyi məsləhət gördüyünü deməyimiz lazımdır. Bununla belə hədisdə bunun sabit olduğunu bilməyimiz hədisi batil etməz, əksinə hədis qaydalara tabe olaraq səhih olaraq qəbul edilməlidir. Amma burada bəzi məlumatları diqqətə almaq lazımdır. Peyğəmbər – aleyhissalətu vassələm – dəvə sidiyinin xəstəliklərə dərman olduğunu deməyib, lakin xüsusilə onların halı üçün məsləhət görüb. Bunun da iki səbəbi ola bilər. İlk səbəb budur ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – onlara Mədinənin yeməklərinin və havasının düşmədiyini gördükdə, onlarda xəstəliyə səbəb olduğunu gördükdə əvvəlki qidalarına qayıtmağı məsləhət görmüşdür, çünki səhrada yaşayan bədəvi ərəblərdə dəvələrin südünü və sidiyini içmək adət idi. Bu barədə Əbul-Abbas Əhməd bin Ömər əl-Qurtubi (h. 578-656) "əl-Mufhim limə Əşkələ min Təlxisi Kitəbi Muslim" adlı kitabında (5/19) deyir: "Çünki o insanlar bədəvi ərəblər idilər və dəvələrin sidiyini və südünü içmək, səhrada yaşamaq onların adətidir. Buna görə də şəhərlərə daxil olduqlarında və normal qidalarından, adətlərindən ayrı düşdüklərində xəstələndilər. Peyğəmbər də - salləllahu aleyhi va səlləm – onlara bu yolu göstərdi və beləliklə də öz adətlərinə geri qayıtdıqlarında yaxşılaşdılar, kökəldilər." əl-Qurtubi'nin bu nöqtə ilə bağlı izahı burada bitir. Buna əsaslanaraq demək olar ki, peyğəmbərimiz – aleyhissalətu vassələm – onlara bu məsləhəti verərkən sadəcə olaraq öz əvvəlki adətlərinə geri qayıtmağı doğru bilmişdir, onlara ümumi olaraq dəvə sidiyinin dərman olduğunu bildirməyib.

Yaxud da əl-Buxari və Muslim'in rəvayət etdikləri "**İsrail oğulları olmasaydı ət çürüməzdi**" hədisi də bu qəbildəndir. Bu hədisə də alimlərimizin münasibəti bir mənalı olmayıb, onların izahları arasında fərqli yanaşmalar görürük.[112]

Bəli, İbn Abbas'dan "dəvənin sidiyində və südündə şəfa vardır" sözü ilə hədis rəvayət olunub, lakin alimlər isnadının səhih olmadığını deyiblər. İkinci səbəb isə budur ki, o dövrdə bizim zamanımızda mövcud olan dərmanlar yox idi. Peyğəmbər – aleyhissələm – Hicazın çox məhdud şəraitində onlar üçün ən yaxşı seçimin dəvələrin südləri və sidikləri olacağını görüb və bu cür məsləhət görüb. Biz bu gün ümumiyyətlə sidiyin bədəndəki zəhərli maddələri kənarlaşdırmaq üçün mövcud olan bir proses olduğunu başa düşürük, insan orqanizminə ümumilikdə zərərlərinin olduğunu anlayırıq. Lakin ümumilikdə zərərli olan hansısa maddə xüsusi bir məqamda və xüsusi bir xəstəliyə qarşı yaxşı bir vasitə ola bilər. Ona görə də bu gün tibb elminin dəvə sidiyinin zərərlərinin olduğunu sübut etməsi onun bəzi faydalarının olduğunu inkar etməz. Bu mövzunun sonunda əlavə etməliyik ki, hətta müasir elm dəvə sidiyinin heç bir halda hansısa hala qarşı kömək edən bir xüsusiyyətinin olmadığını sübut etsə belə bu, hədisin batil olduğunu gərəkdirməz, çünki bu, dini məsələ deyildir, lakin dünyəvi işlərimizlə bağlıdır. Rafi bin Xudeyc'in hədisində peyğəmbərimiz – salləllahu aleyhi va səlləm – buyurur: "Mən sadəcə bir bəşərəm, əgər sizə dininizlə bağlı bir şey əmr etsəm onu götürün! Əgər sizə rəy ilə bağlı bir şey əmr etsəm sadəcə bir bəşərəm." Ənəs bin Malik'in hədisində isə peyğəmbərimiz – salləllahu aleyhi va səlləm – deyir: "Əgər sizin dünyanızla bağlı bir məsələdirsə siz özünüz daha yaxşı bilirsiz, dininizlə bağlı bir şeydirsə mənə aiddir." Bunun eynisini Aişə anamız, Talha bin Ubeydilləh, Cabir bin Abdilləh və Yəsir bin Amr rəvayət edir. Onların rəvayət etdikləri bu hədis peyğəmbərin – aleyhissələm – Mədinə əhlinə xurma ağaclarını mayalamaqla bağlı verdiyi məsləhəti haqqındadır və hədisdə onun məsləhətinin doğru çıxmadığı qeyd edilir. Tamamilə başqa bir vəziyyətdə Əbu Qatədə də peyğəmbərin eyni sözü dediyini rəvayət edir. Bu hədislərə əsasən biz öyrənmişik ki, peyğəmbərimiz – aleyhissalətu vassələm – dünyəvi işlərində və məsləhətlərində digər bəşər övladları kimi xəta edə bilər. Dəvə sidiyi ilə müalicə ərəblərdə mövcud idi və peyğəmbərimizin mövcud tibbi adətlərə uyğun məsləhət verərkən xəta etməsi tamamilə mümkündür. Bunun xəta olduğunu göstərib hədisin batil olduğunu iddia etmək özü batil bir yoldur və doğru metod deyildir. Əksinə bu rəvayətin sənədlərinə baxdıqda görə bilirik ki, rəvayət sistemi çox etibarlı şəkildə çalışır. Humeyd ət-Tavil digər tələbə yoldaşlarından fərqli olaraq müəllimi, şeyxi Ənəs bin Malik'dən hədisdəki "sidiklərindən" sözünü eşitmədiyini deyirsə bu yalnız ona dəlalət edir ki, o alimlər, o hədis raviləri işlərinə ciddi yanaşıblar.

112. Bu hədis səhihdir. "Sahih əl-Buxari" (3330, 3399) və "Sahih Muslim" (1470) kitablarında keçən bu hədisin zahirindən anlaşılan budur ki, əgər "İsrail oğulları ehtiyat üçün ətləri saxlamasaydılar ətlərdə çürümə prosesi heç zaman baş verməyəcəkdi." Lakin peyğəmbərimizin – aleyhissalətu vassələm – bu mənanı qəsd etdiyini demək mümkün deyildir, çünki hədisi fərqli mənalarda başa düşüblər.Əbu Zur'a Vəliyyuddin əl-İraqi (vəfatı hicri 826) "Tarhut-Təsrib" kitabında (7/64) deyir: "Möhtəməldir ki, çürümə İsrail oğulları mövcud olmadan əvvəl qədimdən var idi; səbəbi isə sonradan İsrail oğullarının nə edəcəklərini Allahın əzəldən bilməsidir." Bu izahın əsasını bəlkə də Vəhb bin Munəbbih'in bu sözü təşkil edir: "Bəzi (qədim) kitablarda oxudum ki, (Allah deyib: ) "Mən əgər ölüyə çürüməyi vacib etməsəydim insanlar onları evlərində saxlayardılar, mən əgər yeməyə çürüməyi vacib etməsəydim zənginlər onları toplayıb saxlayar və kasıblara bir şey buraxmazdılar...". Bunu Əbu Nueym əl-Əsbəhəni (h. 336-430) "Hilyətul-Əvliyə"

Siyahımızı uzada bilərik, lakin mövzunun məğzi burada hər bi hədis üçün sünnə əhlinin təqdim etdiyi izahı toplamaq deyildir. Əsas məqsədimiz bu gün problemli qarşılanan bütün hədislərin və ya əksəriyyətinin keçmiş dövrdə də problemli olduğunu sərgiləməkdir. Texnologiyanın inkişafı qeyri-adi bir problem kəşf etməyib, doğrudur ki, müasir dövrümüzdə alimlərin bir hissəsinin bəzi hədislərə verdikləri izahın doğru olmadığını görə bilirik. Amma bu heç bir şəkildə hədis ədəbiyyatını batil çıxara bilməz, belə bir iddiada olmaq gülüncdür, elmi metodlardan uzaqdır. Bəzi hədislərdə xətaların olması ehtimalı minlərlə hədisin səhihliyini kölgə altına ala bilməz.

Bir müsəlmanın öz peyğəmbərini – salləllahu aleyhi va səlləm – xətalardan qoruması təqdirə layiqdir. Bunu başa düşmək olur, sadəcə olaraq burada verilməsi gərəkli olan sual budur: Bunu etməyə ehtiyac varmı? İslam dini bir çox əsaslarda xristianlıq ilə yəhudilik dininin ortasındadır. Xristianlar peyğəmbəri ilahiləşdirdikləri halda, onu bir ilah kimi bütün xətalardan tənzih etdikləri halda yəhudilər peyğəmbərlərə fasiqlik sifətləri nisbət ediblər. İslam dininin baxışı isə ən mötədil baxışdır. Peyğəmbərləri də digər insanlar kimi bəşərə xas olan xətalarla vəsf edirlər, bununla belə peyğəmbərliklərinə xələl gətirəcək xətalardan onları tənzih edirlər. Bu baxımdan peyğəmbərlər yalan danışmazlar, lakin xəta edə bilərlər. Onlar öz rəyləri ilə hansısa dünyəvi bir məsələdə qərar verib xəta edə bilərlər. Quran da bu mənanı təsdiqləyir. Allah – subhənəhu va təalə - buyurur: “**Allahın mərhəməti sayəsində sən onlarla mülayim rəftar etdin.**

---

kitabında (4/37) rəvayət edir. Bu izaha əsasən Allah – cəllə cələluhu - əzəli elmində insanların nə edəcəklərini bildiyi üçün ölmüş canlılara çürümə prosesini qanun qoymuşdur. Burada daha bir izah mövcuddur. İbn Həcər əl-Asqaləni (h. 773-852) “Fəthul-Bəri” kitabında (6/367) deyir: “Bəzi alimlər deyiblər ki, bu hədisin mənası budur: əgər İsrail oğulları əti ehtiyat üçün saxlamaq adətini çıxarmasaydılar – ki, əti saxladıqda çürüyür - ətlər saxlanılmazdı və çürüməzdi.” Bu alimlərdən biri Şərəfuddin əl-Hüseyn bin Abdilləh ət-Tibi (vəfatı hicri 743) “əl-Kəşif an Həqaiq əs-Sunən” kitabında (7/2326) deyir: “Bunun mənası budur ki, İsrail oğulları çürüyənə qədər əti ehtiyat üçün saxlamaq adətini çıxarmasaydılar (onlardan sonra ət) ehtiyat üçün saxlanılmazdı və çürüməzdi.” Ondan öncə bu izahı əl-Qadi Nəsiruddin Abdullah bin Ömər əl-Beydavi (vəfatı hicri 685) “Tuhfətul-Əbrar Şərh Məsabihis-Sunnə” kitabında zikr edib. Bu izahdan anlaşılan məna budur ki, ət, eləcə də digər bioloji maddələr canlılar yaradılandan çürüyür, lakin insanlar öncələr əti ehtiyac üçün saxlamazdılar, əti ehtiyac üçün saxlamaq adətini İsrail oğulları çıxardıqları üçün onlardan sonra kəsilmiş ətləri saxlamaq adəti yayıldı və bu şəkildə çox miqdarda ət çürüyüb tələf oldu.

**Əgər sən kobud və daş qəlbli olsaydın, onlar hökmən sənin ətrafından dağılışardılar. Sən onların günahından keç, onların bağışlanmalarını dilə və görəcəyin işlər barədə onlarla məşvərət et! Qəti qərara gəldikdə isə Allaha təvəkkül et!**”[113] Allahın peyğəmbərinə səhabələri ilə məşvərət etməyi uyğun görməsi onun xəta edə bilməsini göstərir, hətta məşvərət etdikdə belə çıxarılan qərar xətalı ola bilər. Məlumdur ki, İslamda azan vermək sünnəti məşvərətdən doğmuş bir sünnədir və Ömər bin əl-Xattab'ın təklifi olub. Peyğəmbərimizin – aleyhissələm – təsdiqi ilə bu sünnə dinin bir hissəsi olmuş və İslamın şüarına çevrilmişdir. Bədr döyüşündən sonra ələ keçirilmiş əsirlər haqqında da səhabələri ilə məşvərət etmiş və Əbu Bəkr'in verdiyi məsləhəti bəyənib ona əməl etmişdi. Hərbi taktika və planlaşdırmalarda da məşvərət edərdi və rəyini dəyişərdi. Bədr döyüşündə su quyularının arxasında məkan seçməyə qərar verdikdə səhabəsi Həbbəb bin əl-Munzir bin Cəmuh soruşdu: “**Ey Allahın elçisi, bu, Allahın səni yerləşdirdiyi mənzildirmi? Bundan nə qabağa keçə bilərik, nə də arxaya qayıda bilmərik? Yoxsa bu rəy, müharibə və hiylədir?**” Bu sualı ilə Həbbəb bin əl-Munzir bu seçimin vəhy yoxsa hərbi taktika olduğunu bilmək istəyir. Allahın elçisi – aleyhissələm – ona “**yox, bu rəydir, müharibədir və hiylədir**” dedikdə Həbbəb ona su quyularının o biri tərəfindən yer almasını və beləliklə də düşmənin yolunu su quyularından kəsməsini məsləhət görür. Peyğəmbərimiz – aleyhissalətu vassələm – onun bu fikrini bəyənir və qəbul edir. Səhih bir hədisdə Allahın elçisi – aleyhissələm – deyir: “**Mən sadəcə olaraq bir bəşərəm və siz (konfliktli məsələlərdə) aranızda hökm edim deyə mənə baş vurursuz. Ola bilsin ki, sizdən bəziləriniz öz arqumentini çatdırmaqda başqasından daha bacarıqlıdır. Mən eşitdiklərimə əsasən onun xeyrinə hökm edirəm. Əgər bir kimsəyə qardaşının haqqından kəsib verməklə hökm edirəmsə ondan bir şey götürməsin, çünki onun üçün kəsdiyim sadəcə olaraq atəşdən bir parçadır.**”[114] Şübhəsiz ki, peyğəmbərimiz – aleyhissalətu vassələm – bu hədisdə müsəlmanla-

113. Ali-İmran, 159

114. “Muvatta Məlik”, 4/1040 (2662); “Musnəd Əhməd”, 42/445-446 (25670); “Sahih əl-Buxari” (2680, 6967, 7168); “Sahih Muslim” (1713);

ra insanlar arasındakı konflikt və mübahisələrdə çıxardığı qərarlarda xəta edə biləcəyini öyrədir. Bir kimsə özünün haqsız olduğunu bildiyi halda əks tərəfin haqqını əldə etmək üçün arqumentlərini bəzəyərsə və buna əsasən də peyğəmbərimiz onun xeyrinə hökm verərsə onu xəbərdar edir, öz hökmünün başqasının haqqını alıb onun haqqına çevirməkdən aciz olduğunu ifadə edir. İmam Əhməd deyir: "**Abdus-Saməd bizə rəvayət etdi; Həmməd bizə Səbit (əl-Bunəni) dən, o da Ənəs'dən belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – səslər eşitdi və soruşdu: "Bu nədir?" Dedilər: "Xurma ağaclarını mayalandırırlar." Dedi: "Əgər tərk etsələr, mayalandırmasalar düzələr." Bunun üzərinə tərk etdilər, mayalandırmadılar və pis meyvə verdi. Peyğəmbər – salləllahu aleyhi va səlləm – soruşdu: "Siz nə olub?" Dedilər: "Sən dediyin üçün onlar tərk etdilər." Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Əgər bir şey sizin dünya işinizlə əlaqədardırsa siz onu (məndən) daha yaxşı bilirsiz. Dininizlə bağlı bir işdirsə mənə aiddir.**"[115] Bu hədisdən də gördüyümüz kimi peyğəmbərimiz – aleyhissalətu vassələm – dini işlərlə dünyəvi işləri ayırmışdır. Şəkk yoxdur ki, tibb, kənd təsərrüfatı, sənaye işləri, müharibə qərarları dünyəvi işlərə aiddir. əl-Qadi İyad deyir: "**Peyğəmbərlərin dünyəvi məsələlər barəsindəki hökmü və rəyləri başqaları kimidir; bəzi işlərdə həqiqətin əksinə inana bilərlər. Bu, onlar üçün eyib deyildir, çünki onların vəzifələri Axirətlə bağlıdır, məşğuliyyətləri şəriətin əmrləri və qadağalarıdır, dünya işləri isə bunun ziddidir. Dünya əhlindən olan başqa insanlar isə bu baxımdan fərqlidirlər; dünya həyatını zahirən bilirlər, Axirətdən isə qafildirlər.**"[116] Beləliklə də əgər müasir elmi kəşflərin işığında təvilə tabe olmayan hansısa bir hədisdə dünyəvi mövzu ilə bağlı xəta ilə qarşılaşsaq buna görə hədisi batil hesab etməyimiz üçün bir əsas yoxdur. Sadəcə olaraq həmin dünyəvi bir məsələdə peyğəmbərimizin – aleyhissalətu vassələm – xəta etdiyini qəbul edə bilərik. Amma əgər hədis müasir elmə müvafiq bir mənaya açıqdırsa o zaman o mənada qəbul etməyimiz lazımdır.

115. "Musnəd Əhməd", 20/19 (12544);

116. "İkməlul-Mu'lim bi Fəvaid Muslim", 7/335;

## Orientalistlərdə mətn tənqidi

Müsəlman alimlərdən hədislərin məzmununu tənqid etməklə bağlı misallar ilə tanış olduqdan sonra orientalistlərin nəzərindəki məzmun tənqidi ilə tanış olaq. Burada Goldziher'dən bir misal ilə başlamaq istəyirəm. Goldziher deyir: "**Əməvi xəlifəsi Abdulməlik rəqibi Abdullah bin Zubeyr'in Hicaza həcc səfərinə gedən Şam əhlini özünə beyət etməyə məcbur edəcəyindən qorxduğu üçün Məkkəyə həcci durdurmaq istədikdə onu Qüdsdəki "Qubbətus-Saxra" məscidinə yönləndirməli oldu. O belə bir fərman çıxardı ki, vacib olan tavaf İslam qanunda buyurulmuş Kəbə ətrafında keçərli olduğu qədər Qüdsdəki müqəddəs yerdə də keçərlidir. Peyğəmbərə nisbət edilən br hədisi uydurmaq və yaymaq yolu ilə dini həyatın bu siyasi motivli dəyişikliyinə haqq qazandırmaq vəzifəsi müttəqi din alimi əz-Zuhri'yə verildi və bu hədisə görə insanların həcc edə biləcəkləri üç məscid vardır: Məkkə, Mədinə və Qüds'dəki məscidlər...**"[117] Goldziher'in qəsd etdiyi hədis bu gün bütün məşhur hədis kitablarında keçir. Misal üçün əl-Buxari "əs-Sahih" kitabında deyir: "**Əli (bin əl-Mədini) bizə rəvayət etdi; Sufyan bizə əz-Zuhri'dən, o da Said'dən, o da Əbu Hureyra'dan – radiyallahu anhu - , o isə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət etdi; "Səfər yalnız üç məscidə edilər: Haram məscidinə, Allahın elçisinin məscidinə və əl-Əqsa məscidinə.**"[118] Goldziher'in bu iddiası çox məşhurdur və adətən siyasi səbəblərə görə hədis uydurmağa misal vermək üçün qərbli orientalistlər bunu göstərirlər. Goldziher'in müasirlərindən və ondan sonra gəlmiş orientalistlərdən ən məşhur olanları da onun bu tezisini qəbul ediblər. İgnaz Goldziher bu iddiasını tarixçi alim Əhməd bin İshaq əl-Yaqubi'nin (vəfatı hicri 292) sözünə dayandırır. əl-Yaqubi deyir: "**Abdulməlik Şam əhlinə həcci qadağan etdi, bunun səbəbi isə o idi ki, İbnuz-Zubeyr insanlardan həcc etdiklərində beyət alırdı. Abdulməlik bunu gördüyündə onlara Məkkəyə səfər etməyi qadağan etdi. İnsanlar səslərini qal-**

117. "Muslim Studies", 2/44-45;

118. "Sahih əl-Buxari" (1189)

**dırdılar və dedilər: “Allahın evi əl-Harama həcc etmək bizə Allahdan fərz olduğu halda sən onu bizə qadağan edirsən?!” (Abdulməlik) onlara dedi: “Bu, İbn Şihhəb əz-Zuhri’dir ki, Allahın elçisinin belə dediyini rəvayət edir: “Səfər yalnız üç məscidə edilər: əl-Haram məscidi, mənim məscidim və Qüdsdəki məscid.” O, sizin üçün əl-Haram məscidini əvəz edəcək. Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səmaya qalxarkən ayağını üzərinə qoyduğu bu qaya da sizin üçün Kəbə’nin yerinə keçəcək.” Beləliklə də qayanın üzərində bir qübbə tikdirdi və onun üzərindən ipək parçalar asdı, ora xidmətçilər təyin etdi. İnsanları da Kəbənin ətrafında tavaf etdikləri kimi oranı da tavaf etməyə məcbur etdi və əməvilərin idarəsi günlərində bu əməl həyata keçirilirdi.**”[119] Goldziher bu sitata əsaslanaraq Abdulməliki və böyük islam alimi əz-Zuhri’ni ağır işlərdə ittiham edir. Amma görəsən həqiqətən də Goldziher bu iddianı etdikdə avropalılardakı kritik düşüncə və rasionallığı istifadə edərəkmi edib? Yoxsa sadəcə olaraq uzaq bir ehtimal onun qərəzli münasibətindən qida alaraq güclənib? Həqiqət budur ki, Goldziher sadəcə olaraq hədis ədəbiyyatının çoxunun saxta və uydurma olduğunu sübut etmək üçün bu cür zəif dəlillərə etimad edib. Əslində Goldziher araşdırmasında əl-Yaqubi’nin sözü ilə qarşılaşdıqda kritik düşüncəsini işlədərək bu sualları verməli idi. əl-Yaqubi’nin bu məlumatları nə qədər inandırıcıdır? əl-Yaqubi əməvilərin tarixini çatdırmaqda nə qədər etibarlıdır? Bu məlumatları hardan əldə edib, tarixi reallıqlara uyğun gəlirmi? Goldziher əz-Zuhri’nin rəvayət etdiyi hədisin necə uydurulduğunu “analiz” etmədən öncə əl-Yaqubi’nin sözlərini analiz etməli idi. Çox təəssüf ki, bunu etməyib, lakin ona cavab yazanlar bu analizi ediblər və biz oradan əsas nöqtələri bölüşmək istəyirik.

Qeyd edək ki, Goldziher’ə çox sayda müsəlman alim cavab verib, iddiasının batil olduğunu göstərmək üçün kifayət qədər misallar veriblər. Ona həmçinin qeyri müsəlman ərəbşünaslar, tarixçilər də cavab veriblər. Onların arasında xüsusilə Amerikanın Princeton universitetində dərs demiş yəhudi ərəbşünas Shelomo Dov Goitein[120]

---

119. “Tərixu Yaqubi”, 2/311;

120. O da İgnaz Goldziher kimi Macarıstanda doğulub. Amma atası öldükdən sonra

(1900-1985) seçilir. O, 1950-ci ildə American Oriental Society jurnalında çap etdirdiyi “The Historical Background of the Erection of the Dome of the Rock” adlı məqaləsində Goldziher’in bu iddiasını analitik dəlillərə əsasən rədd edir. Onun da qeyd etdiyi kimi burada diqqəti çəkən ilk sual budur ki, belə böyük bir hadisəni görəsən digər tarixçilər də kitablarında qeyd ediblərmi? Bunu yoxladıqda görürük ki, bu hadisəni qeyd edən yalnız əl-Yaqubi olub, ondan sonra isə Misirdəki qibti xristianlarından, Qərbdə Eutychius adı ilə tanınan Said bin əl-Bətriq (h. 263-328) bu hadisəni “ət-Tərix əl-Məcmu” kitabında zikr edir. İslam tarixində həccin qadağan edilməsi, Kəbə’nin yerinə Qüdsün həcc və tavaf məkanı təyin edilməsi çox böyük bir hadisədir və mümkün deyildir ki, belə bir şey tarixçilərin qeydlərinə keçməsin. Hicri 279-cu ildə vəfat etmiş Əhməd bin Yəhya əl-Bələzuri, nə də Muhəmməd bin Cərir ət-Tabəri (h. 224-310) belə bir şeyi kitablarında qeyd etmirlər. Halbuki tarixçilər Abdullah bin əz-Zubeyr ilə əməvilər arasında baş vermiş konflikti bütün təfsilatlarına qədər zikr edirlər. Əksinə ət-Tabəri qeyd edir ki, hicri 68-ci ildə konfliktə olan dörd tərəf, İbn Zubeyr, Abdulməlik, İbnul-Hənəfiyyə’nin camaatları və Nəcdə xariciləri həccdə bir araya gəldilər və bu dörd tərəfin bir yerdə həcc etdiyini zikr edir. Amma Qubbətus-Saxra təxminən hicri 66-cı ildə tikilib. Goitein əlavə edir ki, tarixçi səyyah Muhəmməd bin Əhməd əl-Maqdisi (h. 336-380) Qüds haqqında, xüsusilə Qubbətus-Səxra haqqında yazarkən belə bir məlumata yer vermir. əl-Maqdisinin Qüdsdə doğulduğuna diqqət çəkən Goitein onun bu məlumatlardan xəbərsiz olmağını çox uzaq bir ehtimal hesab edir.

Yəhudi tarixçi əlavə edir ki, bunu qaynaqlarında zikr edən əl-Yaqubi “**şiələrin açıq sözlü tərəfdarıdır.**”[121] əl-Yaqubi’nin şiə olduğunu müasir şiə tarixçilərindən Saib Abdulhəmid “Mucəmu Muərrixiş-Şi’atil-İməmiyyə” kitabında təsdiq edir. Abbasilərin hakimiyyətdə olduğu

1914-cü ildə ailəsi ilə birlikdə Almaniyanın Frankfurt şəhərinə köçür. 1918-23-cü illərdə Frankfurt universitetində tanınmış şərqşünas Josef Horovitz’in rəhbərliyi altında ərəb dili və islamşünaslığı oxuyur. 1923-cü ildə Fələstinə köçür. Qüdsdəki Yəhudi Universitetində mühazirəçi olaraq çalışır. 1957-ci ildə Amerika’nın Philadelphia ştatına köçür və Princeton universitetində çalışır. Ölənə qədər ABŞ-da yaşayır.

121. “Journal of the American Oriental Society”, 70-ci cild, say 2, səh: 104;

dövrdə şiə tarixçilər əməvilər haqqında çox qərəzli bir tarix yazıblar və bu, bu gün tarix araşdırmaları ilə məşğul olan kəslərə məlumdur. Said bin əl-Bətriq isə misirli xristian tarixçidir, hadisələrin şahidi deyildir. Goitein daha sonra deyir: "**Aşkar görünən budur ki, Abdulməlik öz vəziyyətini daha da təhlükəli etmək istəsəydi Quranda təntənə ilə qeyd edilmiş müqəddəs torpaqlara həcc etməyi dəyişdirməyə cəhd etməkdən daha yaxşısı ilə edə bilməzdi. Belə bir addım ilə o, özünü kafir kimi göstərəcəkdi ki, (müsəlmanlara görə) belə birinə qarşı cihad fərz idi. Üstəlik Qubbətus-Səxranın tikintisində məsuliyyət daşıyan rəsmi nümayəndə Racə bin Həyva məşhur din alimi idi və Ömər bin Abdilaziz'in yaxın dostu idi. Belə bir saxtakarlığa onun razılıq verməsi imkansızdır. Bildiyimiz məlumatlara əsasən Abdulməlik özü sünni və dinə əməl edən bir müsəlman idi. Bütün bunları nəzərə almağımız bizi bir əməvi xəlifəsinin İslamın ən müqəddəs binasını başqa bina ilə əvəz etməsi iddiasını rədd etməyə vadar edir.**"[122] Abdulməlik'in Qubbətus-Saxra kimi bir məscidi tikməsinin səbəbini bizə qüdslü tarixçi əl-Maqdisi xəbər verir. O, "Əhsənut-Təqasim fi Mərifətil-Əqalim" kitabında deyir: "**Bir gün əmimə dedim: "Ay əmi, əl-Valid doğru etməyib ki, müsəlmanların pullarını Dəməşq məscidinə sərf edib. Əgər onları yolların, sənaye ocaqlarının təmirinə, qala divarlarını düzəltməyə sərf etsəydi daha doğru və daha üstün olardı." Dedi: "əl-Valid müvəffəq olub və o, böyük bir iş görüb. Belə ki, o, Şamın xristianların torpaqları olduğunu görüb və orada onların çox gözəl kilsələrinin olduğunu görüb, bəzəkləri məharətlə işlənmişdi və əl-Qumamə kilsəsi**,[123] **əl-Ludd**

122. Eyni mənbə, səh: 105;

123. Xristian ərəblər arasında "Kənisətul-Qiyəmə" adı ilə, yəni Qiyamət kilsəsi adı ilə tanınır. Qərb dünyasında "the Church of the Holy Sepulchre" adı ilə bilinir. Lakin müsəlmanları tarixi qaynaqlarında bu kilsənin adı "qiyəmə" əvəzinə "qumamə" sözü ilə qeyd edilir ki, mənası zibillik deməkdir. Şihəbuddin Yaqut bin Abdilləh əl-Həməvi (vəfatı hicri 626) "Mucəmul-Buldən" kitabında (4/396) deyir: "Qumamə; xristianların Qüdsdəki ən əzəmətli kilsələridir... orada onların bir qəbri var ki, onu "qiyamət" adlandırırlar, çünki Məsihin orada yenidən dirildiyinə inanırlar. Doğru olan budur ki, adı Qumamə'dir, çünki ora şəhər əhlinin zibil atdığı yer olub..." Abdurrahmən bin Muəmməd əl-Uleymi isə (vəfatı hicri 928) "əl-Uns əl-Cəlil bi Tərixil-Quds val-Xalil" adlı kitabında (1/257) deyir: "...müsəlmanlar zibilliyə bənzətmək, şərəfli qayanı təzim etmək məqsədi ilə xristianların ən böyük kilsələrinə "qumamə" adını verdilər." əl-Uleymi'nin dediyi daha real görünür,

**və ər-Raha**[124] **kilsələri kimi şöhrətləri yayılmışdı. Ona görə də (əl-Valid Dəməşq) şəhərində müsəlmanlar üçün məscid tikdirərək (müsəlmanları) o kilsələri unutduraraq məscidlə məşğul etdi və onu dünyanın ən möhtəşəm tikililərindən biri etdi. Görmürsənmi ki, Abdulməlik Quməmə kilsəsinin qübbəsinin böyüklüyünü və formasını gördükdə onun müsəlmanların qəlbində əzəmətlənməsindən qorxdu və ona görə də Qayanın üstündə gördüyün məscidi tikdi.**"[125] Tarixçinin bu izahından anlaşılan budur ki, Qubbətus-Saxra'nın tikilməyinin əsas məqsədi Qüdsdə möhtəşəmliyinə görə xristianların kilsələrini geridə qoyacaq bir müsəlman ibadətgahın olması idi. Bu daha real görünür və Goitein bunun tarixi məzmuna daha uyğun gəldiyini əlavə edir. Üstəlik bu addımla Abdulməlik müsəlmanlara özünün daha böyük və daha əzəmətli bir hökmdar olduğunu göstərmiş olurdu.

Doktor Mustafa əl-Azami isə qeyd edir ki, o dövrdə əz-Zuhri elə bir şöhrət qazanmamışdı ki, hansısa dövlət ona belə bir vəzifə versin. Bəzilərinə görə əz-Zuhri 50-ci ildə, digər məlumatlara görə isə 58-ci ildə anadan olub. Abdullah bin əz-Zubeyr isə hicri 73-cü ildə vəfat edib. İbn Zubeyr vəfat etdikdə əz-Zuhrinin ya 23, ya da 15 yaşı var idi. Daha öncə dedik ki, Qubbətus-Saxra təxminən 66-cı ildə tikilməyə başlayıb və 72-ci ildə tamamlanıb. Qubbə tikildiyi müddətdə əz-Zuhri hələ də gənc bir tələbə idi və əməvi sarayının marağını oyatmağı inandırıcı görünmür. əz-Zuhri üstəlik Abdulməlik bin Mərvan ilə hicri 81-ci ilə qədər görüşməyib, o vaxta qədər Mədinə şəhərində yaşayıb və fəaliyyət göstərib.

Əlavə edək ki, bu hədisi təkcə əz-Zuhri rəvayət etməyib. Bu hədisi səhabələrdən Əbu Said əl-Xudri, Əbu Bəsra əl-Ğifəri, Abdullah bin Amr bin əl-As, Əli bin Əbi Talib, Abdullah bin Ömər və Əbu Hureyra rəvayət edir. Misal üçün Əbu Hureyra'dan bu hədisi rəvayət edənlərin kiçik bir şəcərəsini bu şəkildə təqdim etmək mümkündür.

çünki Qüdsdəki Qiyamət kilsəsi qədimdir və oranın zibillik olması çox böyük bir sual işarəsi altındadır.

124. Lod və ya Lydda Fələstində yerləşən şəhərlərdən biridir, Ramla şəhərinin yaxınlığındadır. ər-Raha isə qədim Urhay krallığının adı ilə bağlıdır, indiki Türkiyə ərazisində Şanlıurfa şəhərinin qədim adıdır.

125. "Əhsənut-Təqasim fi Mərifətil-Əqalim", səh: 159;

*Şəkil 1: Əbu Hureyra'dan rəvayət olunan isnadları illüstrasiya edən şəkil*




Bu şəcərədə müşahidə etdiyimiz budur ki, bu hədisi Əbu Hureyra'dan birdən çox kanaldan rəvayət ediblər. Əbu Sələmə bin Abdirrahmən (vəfatı hicri 94) bunu Əbu Hureyra'dan rəvayət edir və onun ən məşhur tələbələrindəndir. Ondan isə bu rəvayəti Əbu Sələmə'nin ən məşhur tələbələrindən biri olan Muhəmməd bin Amr bin Alqamə (vəfatı hicri 145) rəvayət edir, həmçinin Əbu Sələmə'dən rəvayət etməklə məşhurlaşmamış Yezid bin Abdilləh bin Usəmə bin əl-Həd əl-Mədəni də (vəfatı hicri 139) rəvayət edir. Hər iki hədis ravisi İbn Şihəb əz-Zuhri'nin (h. 58-124) müasirlərindəndir. Səlman Əbu Abdilləh əl-Əğarr isə mədinəli hədis ravilərindəndir, çox hədis rəvayət etməyib. Əbu Hureyra və Əbu Said əl-Xudri'dən rəvayəti ilə tanınır. İmran bin Abdilaziz Əbi Ənəs əl-Quraşi (vəfatı hicri 117) bunu Səlman əl-Əğarr'dan rəvayət edir və İmran yaş baxımından əz-Zuhri'dən daha böyükdür.  Doğrudur ki, hədis kitablarında daha çox gətirilən rəvayət kanalı əz-Zuhri'nin Said bin əl-Museyyəb'dən, onun da Əbu Hureyra'dan rəvayət etdiyidir. Lakin bunun səbəbi və izahı

budur ki, İbn Şihəb əz-Zuhri bir alim olaraq tanınıb məşhurlaşdığı üçün Sufyan bin Uyeynə, Mə'mər bin Raşid kimi hədisləri toplayan alimlər məhz onun yanına səfər ediblər. Daha sonra gördüyümüz kimi bu hədis xüsusilə də Sufyan bin Uyeynə'nin hədis halqalarından tələbələrinə yayılıb. Adətən sənədlərdə şaxələri çoxalan ravilər hədisləri yazmaqla məşhurlaşmış ravilərdir. Onlar öz kitablarının tələbələri tərəfindən köçürülməsinə izn verdikləri təqdirdə onlardan rəvayət edənlərin sayı çoxalırdı. Eyni halı biz Əbu Said əl-Xudri'dən rəvayət edənlərdə də görürük.

*Şəkil 2: Əbu Said əl-Xudri'dən gələn rəvayətin isnad şəcərəsi*




Əbu Said əl-Xudri'nin misalında tələbəsi Qaz'a bin Yəhya bin əl-Əsvad əl-Basri əsas ravidir. əs-Safədi'nin dediyinə əsasən hicri yüzüncü ilin civarında vəfat edib. Ondan da rəvayət edənlər içərisində Abdulməlik bin Umeyr əl-Quraşi (vəfatı hicri 136) seçilir. Ondan rəvayət edənlərin arasından seçilən isə İmam Əbu Bistam Şu'bə bin əl-Həccac (h. 85-160) çox hədis toplamış alimdir. Zamanında kitabları məşhur olduğu üçün İslam coğrafiyasının fərqli bölgələrindən hədis öyrənmək istəyən tələbələr onun yanına gedərdilər.

Üstəlik necə düşünmək olar ki, İbn Şihəb əz-Zuhri bu hədisi öz şeyxi Said bin əl-Museyyəb'in (h. 15-94) adından uydurur və Qubbətus-Saxra tikildiyi müddətdə İbnul-Museyyəb sağ idi və elmlə məşğul idi. Xəlifə Abdulməlik bin Mərvan öz oğlunu onun qızı ilə evləndirmək istədikdə bundan imtina edən və əvəzində qızını kasıb bir tələbəsinə ərə verən Said bin əl-Museyyəb kimi bir alim necə buna razı ola bilərdi?! Təsəvvür etmək mümkündürmü ki, əz-Zuhri öz müəlliminin sağlığında onun adından bir hədis uydurur və müəllimi buna qarşı səssiz qalır?! O dövrdə bundan qat-qat yüngül işlərə görə hədis raviləri ittiham olunduqları halda əz-Zuhri'nin belə bir cinayətdən təmiz çıxmasını heç ağıl dərk edə bilirmi?! Doğrudur ki, əz-Zuhri'nin saray ilə yaxşı əlaqələri var idi, ancaq onun dövləti razı salmaqdan ötrü dininə xəyanət edəcək bir insan olduğunu güman etmək ən yumşaq sözlərlə desək həqiqətləri təhrif etməkdir. İbn Həcər "Fəthul-Bari" kitabında deyir: "**Yaqub bin Şeybə "əl-Musnəd" kitabında əl-Həsən bin Əli əl-Həlvani'dən, o da əş-Şafi'dən belə dediyini rəvayət edib: "Əmim mənə rəvayət edərək dedi: "Süleyman bin Yəsər (bir gün xəlifə) Hişəm bin Abdilməlik' in yanına daxil oldu və (xəlifə) ona dedi: "Ey Süleyman! Günahın böyüyünü öz üzərinə götürən kimdir?"**[126] **Dedi: "Abdullah bin Ubeyy." Dedi: "Yalan danışdın! O, Əlidir." Dedi: "Möminlərin əmiri nə dediyini daha yaxşı bilir." Bundan bir az sonra əz-Zuhri daxil oldu və (xəlifə) dedi: "Ey İbn Şihəb, günahın böyüyünü öz üzərinə götürən kimdir?" Dedi: "İbn Ubeyy." Dedi: "Yalan danışdın! O, Əlidir." Bunun üzərinə (əz-Zuhri) dedi: "Yalan danışan mənəmmi, ay atasız? Allaha and olsun ki, əgər səmadan bir kimsə səslənsə ki, Allah yalanı halal edib mən yenə də yalan danışmaram. Urva (bin əz-Zubeyr), Said (bin əl-Museyyəb), Ubeydullah və Alqamə mənə Aişədən rəvayət etdilər ki, onlardan günahın böyüyünü öz üzərinə götürən Abdullah bin Ubey'dir.**"[127]

---

126. ən-Nur surəsindəki 11-ci ayəni qəsd edir: "Şübhəsiz ki, (Aişə barəsində) yalan xəbər gətirənlər özünüzdən olan bir dəstədir. Onu özünüz üçün pis bir şey hesab etməyin. Əksinə bu, sizin üçün xeyirlidir. O dəstədən olan hər bir şəxsin qazandığı günahın cəzası vardır. İçərilərindən günahın böyüyünü öz üzərinə götürəni isə böyük bir əzab gözləyir."

127. "Fəthul-Bəri", 7/437;

İmam əş-Şafi'nin əmisinin nəql etdiyi bu xəbər bizə əz-Zuhri'nin şəxsiyyətini, xarakterini göstərir. Bu qədər tarixi şahidlikləri olduğu halda əl-Yaqubi'nin tarixinə keçən nəqlə əsasən əz-Zuhri'ni ən ağır cinayətlərdə ittiham etmək hansı ölçülərə görə rasional düşüncə sayıla bilər?! Əlavə edilməlidir ki, əl-Yaqubi'nin yazdıqlarında hansısa hədisin uydurulması haqqında ümumiyyətlə söz getmir, sadəcə olaraq Abdulməlik orada əz-Zuhri'nin rəvayət etdiyi hədisi xatırladır.

Goldziher dövlət tərəfindən sponsorlaşdırılmış hədis uydurma əməliyyatını isbat etmək üçün daha bir "dəlil" təqdim edir. O deyir: "**Hədislərin uydurulmasına, yayılmasına və boğulmasına rəsmi təsir erkən bir zamandan başlamışdı. Öz itaətkar valisi əl-Muğira'ya Müaviyə tərəfindən verilmiş göstəriş əməvilərin ruhuna uyğun idi: "Əlini təhqir edib söyməkdən, Osman üçün isə Allahdan rəhmət istəməkdən, Əlinin tərəfdarlarını bədnam etməkdən, onları kənarlaşdırmaqdan və (insanların) onların dediklərini (yəni hədis olaraq deyib təbliğ etdiklərini) dinləməsinin qarşısını almaqdan yorulma. Osmanın tərəfdarlarını isə təriflə, onları özünə yaxınlaşdır və onları dinlətdir." Bu, Əlinin əleyhinə hədislərin uydurulması və yayılması üçün, Əlinin fəzilətlərini öyrədən hədisləri isə boğmaq üçün rəsmi təşviqdir. Əməvilər və onların siyasi tərəfdarları qərəzli yalanları müqəddəs dini formada yaymaqda heç zaman tərəddüd etməyiblər və onlar yalnız şəkk qəbul etməyən avtoritetləri ilə bu saxtakarlıqları örtməyə hazır olan dini avtoritet sahiblərini tapmaqla məşğul idilər...**"[128] Goldziher hədis saxtalaşdırılmasındakı dövlət rolunu bu cür rəvayətlər ilə sübut etməyə çalışır. Qəribə tərəf budur ki, Goldziher öz nəzəriyyəsini dəstəkləmək üçün əsaslandığı xəbərləri zərrə qədər də tənqidi nəzərdən keçirmir. Bu xəbəri ət-Tabəri tarix kitabında zikr edərkən mənbəyini bu şəkildə qeyd edir: "**Hişəm bin Muhəmməd dedi: Əbu Mixnəf'dən, o isə əl-Mucəlid bin Said, əs-Suqub bin Zubeyr, Fudeyl bin Xudeyc və əl-Huseyn bin Uqbə əl-Muradi'dən; hamısı mənə bu hədisin bir hissəsini rəvayət etdi...**"[129] İslamdakı rəvayət elmi ilə məşğul olan

128. "Muslim Studies", 2/44;

129. "Tərix ət-Tabəri", 5/253;

tələbələr bu mənbəyə etibar etməyin doğru olmadığını bilirlər. Səbəbi isə budur ki, bu xəbəri ət-Təbəriyə rəvayət edən Hişəm bin Muhəmməd, həmçinin onun müəllimi Əbu Mixnəf əməvi düşmənçiliyi ilə tanınırlar. Hişəm bin Muhəmməd bin əs-Səib əl-Kəlbi hicri 204-cü ildə vəfat etmiş nəsəb və tarix alimidir, bu mövzularda çox sayda kitablar yazıb. Ancaq etiqad baxımından imami şiələrinə mənsubdur. Haqqında tarixçi alim Əbul-Qasim İbn Asəkir əd-Diməşqi (h. 499-571) deyir: "**Rafizidir, siqa (etibarlı) olmayıb.**"[130] Amma bu xəbərin məsuliyyətinin onun deyil, Əbu Muxnəf'in daşıdığını söyləmək daha doğru olardı. Əbu Mixnəf hicri 157-ci ildə vəfat etmiş Lut bin Yəhya bin Said əl-Əzdi'dir. Onun haqqında əz-Zəhəbi deyir: "**Rafizidir, əxbaridir, o kitabların sahibidir.**"[131] İbn Kəsir deyir: "**Ona görə də (İbn Cərir ət-Təbəri) Əbu Mixnəf Lut bin Yəhya'nın rəvayətləri ilə bu hekayəni çox ətraflı zikr edib və o, - xüsusilə şiəliklə bağlı mövzularda - rəvayət etdiklərində ittiham olunur...**"[132] Bunlardan da öncə İbn Adiyy əl-Curcəni onun haqqında deyib: "**Təəssübkeş şiədir, onların xəbərlərinin sahibidir.**"[133] Əbu Muxnəf sünnət əhlinin alimləri yanında bu sifətləri ilə tanınır. O zaman əməvilərin tarixi haqqında yalanda ittiham olunmuş kimsələrin rəvayət etdikləri xəbərə nə qədər güvənmək olar?! Həm də ət-Təbəri'nin zikr etdiyi xəbərin sözləri Goldziher tərəfindən təhrif olunub, çünki xəbərdə "*val-iqsai ləhum va tərkil-istimə'i minhum*" sözü keçir. Bu isə heç bir şəkildə onlara hədis rəvayət etməyi qadağan etmək mənasına gəlmir, sadəcə olaraq "onlardan uzaqlaşmağı və onlara qulaq asmamağı" əmr edir. Burda daha bir sualı vermək lazımdır. Əgər Goldziher'in iddia etdiyi kimi İslam coğrafiyasını təxminən bir əsr ərzində idarə etmiş əməvi hökmdarları Əlini qınayan saxta hədislərin yazılmasını, rəvayət edilməsinə göstəriş vermişdilərsə o zaman bu gün biz o hədisləri sünnət kitablarında görməli idik. Həqiqət budur ki, əməvi hökmdarları Əli və onun tərəfdarlarına qarşı düşmənçilik etsələr də, Əli haqqında bütün eyiblərin yazılmasına rəğbət göstərsələr də dini avtoritet onla-

130. "Mizənul-İtidəl", 4/304;

131. "Tərixul-İsləm", 9/581

132. "əl-Bidəyə van-Nihəyə", 12/28;

133. "əl-Kəmil fi Duafə ər-Ricəl", 7/241 (1621);

rın əllərində deyildi, hədis məclislərini idarə edənlər onlar deyildilər. Hədisləri rəvayət etmək, onları yazmaq, onları süzgəcdən keçirmək işini öz üzərinə götürənlər möhkəm dini etiqad sahibləri idilər, dindar idilər və peyğəmbərin sünnətini qorumağı özlərinə müqəddəs vəzifə kimi görürdülər. Hətta zeydi şiələrinin arasından çıxmış Muhəmməd bin İbrahim əl-Vəzir (h. 775-840) kimi yəmənli bir alim[134] deyir: "**Əlinin – aleyhissələm – eyibləri haqqında Allahın elçisinin – salləllahu aleyhi va səlləm – adından yalan danışmaq işini heç bir ağıl sahibi bir adam etməz, nə kafir, nə də münafiq biri edər. Ona görə də belə bir şey Əlinin – aleyhissələm – düşmənlərindən sadir olmayıb.**"[135] İbnul-Vəzir'in bu şahidliyi dövlət sponsorlu saxtalaşdırmanın olduğunu inkar edir. Lakin bu heç də ayrı-ayrı fərdlərdən hədis uydurmaq cəhdlərinin olmasını rədd etmir. Hətta Əbu Mixnəf'in nəql etdiyi bu xəbərin doğru olduğunu fərz etsək belə burada Müaviyə'nin hədis uydurmağı əmr etdiyi anlaşılmır. Anlaşılan budur ki, Əlinin söyülməsi, şanının kiçildilməsi əmr edilmişdi. Tarixdən məlumdur ki, əməvi hakimləri minbərlərdən istifadə edərək Əli bin Əbi Talibi – kərraməllahu vachəhu – cinayətlərdə ittiham ediblər, çox ağır işləri ona nisbət ediblər. Onu müsəlmanların qanını axıtmaqda, xəlifə Osmanın qətlini planlaşdırmaqda, möminlərin anası Aişənin çadırına basqın etməkdə ittiham edirdilər. Minbərlər üzərindən Əlini söymək deyildikdə bu şəkildə onu cinayətlərdə ittiham etmək qəsd olunurdu. Əməvi xəlifələri Əliyə nisbət edilmiş bu cür siyasi qərəzdən ortaya çıxmış xəbərləri yazmağı əmr edərdilər. Hişəm bin Abdilməlik'in kufəli alim Süleyman bin Mehran əl-Aməş'dən Əlinin eyiblərini yazmasını istəməsi də bu mənada anlaşılmalıdır. Əbu Muaviyə əd-Darir deyir: "**əl-Aməş›in yanına (xəlifə) Hişəm bin Abdilməlik adam göndərdi ki, «mənə Os-**

134. İbnul-Vəzir fəaliyyətinin ən məhsuldar hissəsində sərbəst ictihada üstünlük vermiş, Quran və sünnətə tabe olmağı tərcih etmiş, hansısa bir məzhəbə təqlid etməmiş bir alim olsa da zeydi ailəsində doğulub, atası və qardaşları zeydi məzhəbinin alimlərindən olub və o mühit onun qanına və ətinə nüfuz edib. Ona görə də xüsusilə Əli bin Əbi Talib'in adından sonra "aleyhissələm" deyərək onun üçün dua edir. Əməvilərə qarşı – haqlı olaraq – bəslədiyi hislərinə baxmayaraq onların belə Əli haqqında hədis uydurduqlarını inkar edir. Muhəmməd ibnul-Vəzir öz ailə üzvləri içində zeydiliyi tənqid etməyi və sünnətə bağlılığı ilə seçilir. İbn Həcər əl-Asqaləni onun haqqında deyir: "Öz ailəsindən fərqli olaraq hədislə məşğul olan, sünnətə şiddətlə meyl edən biri idi. Allah rəhmət etsin!" Bunu İbn Həcər'in tələbəsi əs-Səxavi "əd-Davul-Ləmi" kitabında (6/272) qeyd edir.

135. "əl-Avasim val-Qavasim fiz-Zəbbi an Sunnəti Əbil-Qasim", 2/44;

**manın fəzilətləri, Əlinin pisliklərini bir kitabda yaz göndər!» əl-Aməş də bir kağız götürdü, onu bir qoyunun ağzına saldı. Qoyun onu çeynədi. (Ağzından çıxarıb) elçiyə (verib) dedi: «Ona de ki, sənə cavabım budur.» Elçi də ona dedi: "Əgər sənin cavabınla qayıtmasam məni öldürəcəyini əhd edib." Qardaşları ilə birlikdə üstünə düşdülər: "Ey Əbu Muhəmməd, onu ölümdən qurtar!" İsrar etdiklərində (əl-Aməş) ona yazdı: "Ey möminlərin əmiri! Əgər bütün yer əhlinin fəzilətləri Osmanda olsaydı bunun sənə faydası olmayacaqdı! Əgər bütün yer əhlinin pislikləri Əlidə olsaydı bunun də sənə zərəri olmayacaqdı. Öz nəfsinlə məşğul ol! Salam!**"[136] Bu hekayə əgər əl-Aməş'dən səhihdirsə o zaman Hişəmin əl-Aməş'dən Əlinin nöqsanları və Osman'ın üstünlükləri haqqında hədis uydurmağı əmr etdiyini təsəvvür etmək olmur, çünki əl-Aməş əhli-beyt sevgisi ilə tanınan kufəli alimlərdən idi. əl-Aməş'dən istədiyi Əlinin xəlifəliyini tənqid edən, Osmanı isə tərifləyən tarixi xəbərləri bir kitabda yazmaq idi.

Orientalistlərdən zikr etdiyimiz bu iki kitab ilə kifayətlənmək istəyirəm. Lakin bu cür misallar onların kitablarında çoxdur. Bu misalları Professor Mustafa əl-Azami "Dirasət fil-Hədis ən-Nəbəvi" və "Minhəcun-Nəqdi indəl-Muhəddisin" adlı kitablarında, Şeyx Mustafa əs-Sibə'i "əs-Sunnətu va Məkənətuhə fit-Təşri əl-İsləmi" kitabında, Şeyx Muhəmməd Luqman əs-Sələfi "İhtiməmul-Muhəddisin bi Nəqdil-Hədisi Sənədən va Mətnən" adlı kitabında zikr edirlər və onlara cavab verirlər. Bununla maraqlananlar o kitablara müraciət edə bilərlər.

---

136. Bu hekayəni tarix kitablarından oxuya bilirik. Misal üçün İbn Xallikən (h. 608-681) "Vafəyət əl-Ayən" kitabında (2/402) zikr edir. Bu xəbərin nə qədər səhih olduğunu yoxlamaq imkanımız olmadı, çünki tarixçilər heç bir isnad zikr etmədən bunu əl-Aməş'in tələbəsi Əbu Muaviyə əd-Darir'ə nisbət edirlər.

# İLK ƏSRLƏRDƏKİ ELMİ MÜHİT

Kitabımızın içində keçən mövzuları daha gözəl anlamaq üçün müqəddimə olaraq bəzi məsələləri izah etməyə ehtiyac vardır. Bu mövzuların oxucuya o dövrdəki elmi mühiti, elmin yayılma şərtlərini və istifadə olunan sözlərin daşıdığı həqiqi mənaları dərk etmək üçün dəstək rolunu oynamasını istəyirik. Bu mövzuları anlamadan materialda tez-tez qarşımıza çıxan bəzi sözlərin arxasındakı məqsədi doğru təsəvvür etmək mümkün deyildir. Həmçinin o dövrün elmi mühitini, elm məclislərinin xarakterini beynimizdə canlandırmağa çalışmaq da önəmlidir. Qarşıda bunun əhəmiyyətini özünüzün də görəcəyinizə inanırıq.

Eyni zamanda oxucudan gözlədiyimiz budur ki, təqdim etdiyimiz hər bir mövzunun özlüyündə hədislərin yazıldığını isbat edən sitatlar olduğunu da nəzərə almalıdır. Kitabımızda bir yerdə zikr etdiyimiz sitatı təkrar zikr edərək kitabımızı uzatmaq istəmədik, ona görə də kitabda keçən hər bir sitatın üzərində diqqətlə düşünməyin önəmli olduğuna inanırıq.

## Səhifə və Nüsxə

Oxucu sıx-sıx bu kitabda "səhifə" və ya "nüsxə" sözü ilə qarşılaşacaq. Bu sözləri doğru başa düşmək və düzgün təsəvvür etmək önəmlidir. O dövr üçün "səhifə" və ya "nüsxə" demək ilə kitabı qəsd edirdilər. Lakin nəzərə almaq lazımdır ki, o dövrün kitabları bizim zamanımızda kitab olaraq bildiyimiz materiallar deyildir. O dövrün "səhifələri" və ya "nüsxələri" əksər hallarda tələbələrin hədis məclislərində dərs notları olaraq hədisləri yazdıqları dəftərləri xatırladır. Bu dəftərlər bəzən kiçik həcmdə, bəzən də böyük həcmdə ola bilərdi.

Amma o dövrə xarakterik olan bu kitab növlərini əslində bizim zamanımızın şərtləri ilə kitab adlandırmaq münasib deyildir. Ona görə də G. Shoeler araşdırmalarında bizim zamanımızdakı kitablara yunan terminologiyasında ”syngramma” adını verdiyi halda o dövrün səhifələrinə “hypomnemata” adını uyğun görür. “Hypomnemata” sözü yunan dilində qeyd, şərh, qaralama mənalarını verir.

Yenə bilmək lazımdır ki, məqsədli şəkildə yazılmış kitablar da mövcud idi, lakin bu cür kitablar ikinci əsrdə ortaya çıxdı. Burada Mə’mər bin Raşid’in “əl-Cami” kitabını, İmam Malik’in “əl-Muvatta” kitabını, Muhəmməd bin İshaq’ın “əl-Məğazi” kitabını göstərmək olar. Hətta bu kitablar belə müasir zamanımızdakı kitablardan fərqlənirdi. Bu kitabların müəllifləri ehtiyac gördükləri zaman yazdıqları kitablarda dəyişiklik edə bilirdilər, içindən bir şeyləri çıxarıb yenisini əlavə edə bilirdilər. İmam Malik “əl-Muvatta” kitabını ilk dəfə qələmə aldıqdan sonra ömrünün sonuna qədər həmin kitabda dəyişiklər etmişdir, bu səbəbdən bu gün İmam Malik’in “əl-Muvatta” kitabının çox sayda versiyası vardır, çünki tələbələri fərqli illərdə İmam Malik’dən kitabını öyrənib köçürüblər.

Aydın olur ki, “səhifə” və “nüsxə” sinonim sözlərdir. Bəzən “Həmməm bin Munəbbih’in səhifəsi” adlanır, bəzən isə “Həmməm’in nüsxəsi” adı ilə tanınır. Bədruddin əl-Ayni deyir: “**Çünki “səhifə” yazılı vərəqədir. “əl-Ubəb” kitabında isə deyir: “Səhifə kitabdır, oxunulan şeyə səhifə deyilir”.**”[137] “əl-Ubəb” kitabı ərəb dili alimi əl-Həsən bin Muhəmməd əs-Sağani’nin (h. 577-650) müəllifi olduğu bir lüğət kitabıdır. Səhifə sözü bu mənada çox geniş istifadə olunur. Bəzən “kurras”, “qirtas” və ya “mushaf” kəlimələri də eyni mənada işlədilir. Səhifə normalda bir şeyxin, yəni bir mühəddisin məclisində qeydə alınmış hədislərdən ibarət olduğu üçün tək bir isnadı daşıyır və səhifənin əvvəlində qeyd edilir. İsnadları fərqli olan hədisləri toplayan kitablara isə bir qayda olaraq “cüz” adını verirlər.

Səhifələr ilk dövrdə forma baxımından lülə halında bükülmüş uzun vərəqdən ibarət idi və qorunulmaq üçün dəri qabların içində saxlanırdı. Material olaraq ilk öncə papirusdan istifadə olunurdu. Daha sonrakı dövrlərdə isə artıq kağız icad edildiyi üçün bir neçə

137. “Umdətul-Qari”, 2/238;

vərəqdən ibarət dəftərlər formasını aldı. Tarixçi alim Təqiyyuddin əl-Məqrizi (h. 766-845) deyir: "**İslamın əvvəlində yazılan kitablar dairəvi bükülmüş səhifələrdən ibarət yazıdan ibarət idi.**"[138] Məmluklər dövrünün tarixçilərindən İbn Aybək əd-Dəvadəri "Kənzud-Durar" kitabında deyir: "**(Əvvəllər) dəftərlər divanlarda dairəvi bükülmüş səhifələr idi, onları ilk dəfə cilddən dəftərlər və qirtaslar halına salan Xalid bin Bərmək oldu.**"[139] Xalid bin Bərmək isə (h. 90-163) abbasi dövlətinin vəzirlərindən olub.

Artıq hicri ikinci əsrin sonlarında istifadə olunan kitabların hamısının bizim dövrümüzdəki kitabları xatırlatdığını görmək mümkündür. İbn Asəkir tarix kitabında böyük alim İshaq bin Rahəveyh'in yaddaşının fenomenal şəkildə güclü olduğunu vəsf edərkən deyir: "**İshaq (bir gün) Əmir Abdullah bin Tahir'in yanında idi və (əmirin) yanında İbrahim bin Əbi Saleh də var idi. Əmir İshaqdan bir məsələ barəsində soruşdu və İshaq bunun cavabında dedi ki, "bu məsələdə sünnət belədir, elədir... və sünnət əhlinin yolu ilə gedənlər belə deyirlər. Amma fılankəs və onun tələbələri bunun əksini deyiblər." İbrahim dedi: "Fılankəs heç də elə deməyib." İshaq (əmirə) dedi: "Mən bunu onun babasının kitabında əzbər bilirəm, mənimlə onun üçün bir kitab vardır." İbrahim dedi: "Allah səni islah etsin! İshaq babamın adından yalan danışır!" İshaq dedi ki, qoy əmir adam göndərib camisindən fılan cüzü gətirsin. Kitab gətirildi və əmir kitabı vərəqləməyə başladı. İshaq dedi: "On bir vərəq say, sonra (on birinci vərəqədə) yeddi sətr say!" (Əmir) elə də etdi və gördü ki, İshaqın dediyi kimidir.**"[140] Bu xəbərdən biz İshaq bin Rahaveyh (h. 161-238) kimi bir alimin güclü yaddaşa sahib olmasından ziyadə həm də o dövrün kitablarının artıq müasir bir forma aldığını da görürük. İbn Əbi Hətim ər-Razi öz müəllimi Əbu Zur'a ər-Razi'nin (h. 200-264) yaddaşının güclülüyünə misal verərkən bu hadisəni xatırlayır və deyir: "**Əbu Zur'anın yanına Muhəmməd bin Muslim və əs-Saiğ adı ilə tanınan əl-Fədl bin Abbas gəldi. Aralarında müzakirə keçdi və Muhəmməd bin**

138. "əl-Məvaiz val-İtibar bi Zikril-Xutat val-Əsər", 1/172;

139. "Kənzud-Durar va Cami'ul-Ğurar", 1/390;

140. "Tərixu Diməşq", 8/137-138;

**Muslim bir hədis zikr etdi. Fədl əs-Saiğ onu inkar etdi və dedi: “Ey Əbə Abdilləh, hədis elə deyil.” Dedi: “Bəs necədir o zaman?” O başqa rəvayət zikr etdi. Muhəmməd bin Muslim dedi: “Əksinə doğru olan mənim dediyimdir, sənin dediyin isə xətadır.” Fədl dedi: “Qoy Əbu Zur’a aramızda hakim olsun!” Bunun üzərinə Muhəmməd bin Muslim Əbu Zur’adan soruşdu: “Nə deyirsən? Xəta edən hansımızdır?” Əbu Zur’a susdu və cavab vermədi. Muhəmməd bin Muslim dedi: “Niyə susursan? Danış!” Əbu Zur’a özünü eşitməməzliyə vurmağa başladı. Bu zaman Muhəmməd bin Muslim israr etdi və dedi: “Sənin susmağının nə mənaya gəldiyini anlamıram. Əgər xəta edən mənəmsə xəbər et, əgər xəta edən odursa xəbər et!” Bu səfər (Əbu Zur’a) dedi: “Qardaşım oğlu Əbul-Qasim’i çağırın!” Çağırıldı və ona dedi: “Get və kitabxanaya daxil ol! Birinci rəfi, ikinci rəfi və üçüncü rəfi ötür! Sonra(kı rəfdə) on altı cild ötür, mənə on yeddinci cildi gətir.” (Qardaşı oğlu) getdi və bir dəftər gətirdi və ona verdi. Əbu Zur’a götürüb vərəqlərini vərəqləməyə başladı. Hədisi çıxarıb Muhəmməd bin Muslim’ə verdi. Muhəmməd bin Muslim oxudu və dedi: “Hə, xəta etmişik, nə olsun ki?!**”[141]

## İlk kitabların mövzusu

Burada bilinməsi əhəmiyyətli olan məlumatlardan biri də budur ki, ilk yazılı qaynaqlar hansısa bir mövzu ilə bağlı məhdud kitablar şəklində olmayıb. Burada ilk qaynaqlar dedikdə hədisləri ehtiva edən yazılı materialları qəsd edirik. Onların quruluşu və formatı hədis məclisində hədisləri rəvayət edən şeyxin adı ilə bağlı olub. Şeyxinin rəvayət etdiklərini yazıb toplayan və hazır bir dəftər halına salan tələbələr onu şeyxinin adı ilə adlandırardılar. Misal üçün Əbu Davud ət-Tayəlisi’nin (h. 133-204) “əl-Musnəd” kimi tanınan kitabını əslində tələbəsi Əbu Bişr Yunus bin Həbib əl-Əsbəhəni onun məclislərindən toplayaraq yazıb. Bu kitabımızda da qarşımıza çıxacaq nəqllərdə kitabların şəxslərin adları ilə bağlı olduğuna şahid olacağıq. “Həmməm bin Munəbbih’in səhifəsi”, “Nəfi’nin səhifəsi”, “Cabir bin Ab-

141. İbn Əbi Hətim, “əl-Cərh vat-Tədil”, 1/337;

dilləh'in kitabı", "Əbuz-Zubeyr'in nüsxəsi" və "Əbu Qiləbə'nin kitabı" və qədim zamandan bəri məşhur olmuş bir çox kitablar, səhifələr bu dediklərimizin misallarıdır. Bunun səbəbini anlamaq çətin olmamalıdır, çünki bunları yazanların qəsdi öz fikirlərini daşıyan bir kitab yazmaq olmazdı. Əksinə əksər hallarda şəxsi istifadə üçün bir dərslik materialı hazırlamaq məqsədi ilə edilirdi.

İmam Əhməd deyir: "**əl-Qavariri'ni belə deyərkən eşitdim: Mən və Affən birlikdə Abdulvarisin yanına getdik və dedi: "Nə istəyirsiz?" Affən ona dedi: "İbnu Cəhədə'nin hədislərini çıxar!" O da kitabından imla etdi...**"[142] Yaqub əl-Fəsəvi deyir: "**Əhməd bin Xalil və İshaq (bin Rahəveyh) bizə rəvayət etdilər: (İshaq) dedi: "Cərir bin Abdilhəmid'in yanına gəldim və o, bizə Mənsur'un kitabını oxuyurdu. Yəhyə bin Main ona dedi: "Ey Əbu Abdilləh, Abdulaziz bin Əbən iddia edir ki, sən bu kitabı Mənsura (onun özündən eşitmədən) qiraət olaraq oxumusan? Cərir dedi: "Əgər yalançıdırsa öhdəsindən Allah gəlsin! Allaha and olsun ki, onun məclisində olanda beş hədis müstəsna onları əzbər bilmirdim və o beş hədisi mənə bir dəfə rəvayət etmişdi. Mən bir məclisdə onun mənə rəvayət etdiyi qırx hədisi əzbərlədim.**"[143] Şeyxin məclisində hədisləri oxumaqa "qiraət" yolu ilə "səmə'" yolları arasında fərq var idi. Qiraətdə tələbə şeyxin dərslərində qeydə aldığı hədisləri özü öz kitabından oxuyur və şeyx dinləyir; əgər xəta ilə qarşılaşsa düzəliş edir. Səmə' yolu ilə hədisləri oxumağa gəldikdə isə burada oxuyan tələbə yox, şeyxin özü olur və tələbə qulaq asaraq hədislərini yoxlayır, ehtiyac varsa onlara düzəliş edir. İkinci tərz mühəddislərin əksəriyyətinin nəzərində daha güclü və etibarlıdır, çünki tələbənin qiraətinə qulaq asan şeyxin nəzərindən hansısa xəta yayına bilər və ya şeyxin diqqəti başqa yerdə ola bilər. Buna görə də Yəhya bin Main yuxarıdakı nəqldə Cərirə o sualı verərkən işin bu tərəfini dəqiqləşdirmək istəmişdir. Bu fərqlər haqqında bir qədər sonra bəzi məlumatlar keçəcək.

Burada adı keçən Mənsur (vəfatı 132) kufəli alim Mənsur bin əl-Mutəmir əs-Suləmi'dir. İbn Əbi Hətim deyir: "**ən-Nədr bin Hişəm**

142. "əl-İləl va Mərifətur-Ricəl", 1/437;
143. "əl-Mərifə vat-Tarix", 2/680;

**əl-Əsbəhəni bizə xəbər verdi: əl-Hüseyn bin Hafs'ı belə deyərkən eşitdim: "Sufyan dedi: "Sizə Kufə əhlinin ən xeyirlisinin kitabını çıxaracam." Düşündük ki, Mənsur'un kitabını çıxaracaq. Amma Muhəmməd bin Suqa'nın kitabını gətirdi.**"[144] Burada Sufyan əs-Səvri'nin kitablarının da şeyxlərə görə ayrıldığını görürük. Mənsur'un kitabını çıxaracağını gözləməkləri ona dəlalət edir ki, Mənsur öz zamanında Kufədə hədisləri yazmaqla tanınmış bir alim idi.

Əbu Davud əs-Sicistəni deyir: "**əl-Həsən bin əs-Sabbəh və İbn Yəhyə bizə rəvayət etdi ki, Əli (bin əl-Mədini) onlara rəvayət edib: "Yəhyə bin Said (əl-Qattan)a dedim: Zəkəriyyə – yəni İbn Əbi Zəidə - kitabını (tələbələrə) verərdi?" Dedi: "Bəli, mənə əş-Şa'binin kitabını çıxardı və ondan yazdım. Sonra mənə başqa kitablar da çıxardı onları geri çevirdim, ordan heç bir şey yazmaq istəmədim. Bu, Sad bin İbrahim və Firas'ın kitabı idi.**"[145] Sad bin İbrahim bin Abdilləh bin Auf əz-Zuhri (vəfatı hicri 172) Mədinənin qazisi olmuş fəzilətli bir alim və abiddir. Əbu Yəhyə Firas bin Yəhyə əl-Muktib əl-Həmədəni əl-Kufi isə (vəfatı hicri 129) etibarlı hədis alimlərindəndir. Hər ikisi də Zəkəriyyə bin Əbi Zəidə'nin şeyxlərindəndir. əş-Şabi isə məşhur imam, alləmə Əbu Amr Amir bin Şərahil əş-Şa'bidir, hədis rəvayətində şübhəsiz bir avtoritetdir. Kitabda başqa yerdə Yəhyə bin Said əl-Qattan'ın bu hekayəsini başqa məzmunda zikr etmişik. Yaqub əl-Fəsəvi deyir: "**Əli (bin əl-Mədini) dedi: "Yəhyə dedi: "Zəkəriyya mənə üç səhifə çıxarıb verdi: (onlardan biri) Sad bin İbrahim və başqa şeyxlərindən (yazdığı) səhifə, (digəri) Cabirdən gələn səhifə idi və (üçüncüsü) Amir'dən olan səhifə idi. Onları ona geri qaytardım və dedim: "Əzbərdən bildiklərini mənə rəvayət et!" O, "Girov qoyulmuş heyvan (ödəmə qarşılığı) minilər" hədisində "Amir bizə rəvayət etdi" dedi.**"[146] Hər iki xəbəri birləşdirdikdə başa düşürük ki, Yəhya əslində Amir əş-Şa'binin hədislərini yazır, digərlərini isə geri çevirir, onları Zəkəriyya'nın əzbərindən eşitməyi tərcih edir. Bizim üçün burada hər şey-

---

144. "əl-Cərh vat-Tədil", 1/75;

145. "Suələt Əbi Ubeyd əl-Əcurri", səh: 184;

146. "əl-Mə'rifə vat-Tərix", 2/156;

dən öncə önəmli olan budur ki, kufəli alim Zəkəriyya bin Əbi Zəidə öz kitablarını şeyxlərinə görə ayırmışdı. Bu, yuxarıda dediyimizi təsdiqləyir.

Lakin haşiyəyə çıxaraq bu sualı verməkdə də fayda vardır; nə üçün Yəhya bin Said şeyxi Zəkəriyya'nın kitablarından hədisi köçürmək əvəzinə o hədisləri onun əzbərindən dinləməyə üstünlük verdi? Bunun üçün anlamaq lazımdır ki, hədislərdə rəvayət zənciri boyunca şeyxlər tələbələrini, tələbələr də şeyxlərini sınamağa ehtiyac duyublar, çünki hər bir hədis onu rəvayət edənin etibarlığı miqdarında etibar qazanırdı. Hədisləri yazmaqdan fərqli olaraq onları əzbərləmək xüsusi əmək və etina tələb edirdi və əksər hallarda əzbərləyənlər hədisin önəmini bilənlər, bu yolda səmimi xidmət ortaya qoymaq istəyənlər olurdu. Hədisləri yazmaq isə belə deyildi, çünki yazıb pozmağı bacaran hər bir kəs mürəkkəb və kağız tapıb elm məclislərindən hədis yaza bilərdi və bu zaman işin əhli olmadığı üçün əlbəttə ki, ciddi xətalar edəcək. Əzbərləmədən yazanlardan fərqli olaraq hədisləri əzbərləyənlər rəvayət prosesində artıq sınaqdan keçirdilər, çünki o zamanın normalarına uyğun olaraq onların məclisinə gələn tələbələr artıq onların hədislərini yazmış olaraq gəlirdilər. İşin ikinci tərəfi budur ki, yazıda hərəkələrin, hətta əliflərin işlənməsi, diakritik işarələrin qoyulması nadir hal idi və yazılanı əzbər bilmədiyin halda onu xətalı oxumaq çox asanlıqla baş verən bir hal idi. Ona görə də hafizə, sahibinin etibarını göstərən bir ölçü idi. Bu səbəbdən İmam əl-Əvzai deyir: "**Bu elm şərəfli idi, kişilər öz aralarında bir-birilərindən nəql edərdilər. Bu elm kitablara daxil olduqda əhli olmayan kəslər də bu elmə daxil oldu.**"[147] Ona görə də alimlər kitabını şeyxinə ərz etməyənlərin kitabından hədis qəbul etməzdilər, eləcə də kitabı xətalı olanlar ilə səhih olanları ayırmaq üçün böyük bir əmək sərf edərdilər.

Ümumilikdə elm məclisləri də şeyxlərin hədislərinə görə müəyyən olunurdu. Bunu bir misal verərək göstərmək mümkündür. İbn Adiyy əl-Curcəni deyir: "**Muhəmməd bin əl-Həsən əl-Bərri mənə yazdı; dedi: Kitabımda Amr bin Əli'dən belə dediyini (rəvayət etdiyimi) tapdım: "Bir gün Yəhya (bin Said əl-Qattan)**

147. "Siyər Əaləmin-Nubələ", 7/114;

**mənə dedi: "Hardan gəlirsən?" Dedim: "Muazın yanından." Soruşdu: "Kimin hədisindədir o?" Dedim: "İbn Avn'ın hədisindədir." Dedi: "Şu'bə və əl-Əşas'ı buraxıb İbn Avnın hədislərini yazırsız?!...**"[148] Gördüyümüz kimi Yəhyə bin Said əl-Qattan maraqlanaraq Amr bin Əli əl-Fəlləs'in (16?-249) hansı elm məclisindən, yəni kimin dərsindən gəldiyini soruşur. Amr cavabında Qazi Əbul-Musənnə Muaz bin Muaz bin Nəsr əl-Anbəri'nin (vəfatı 196) dərsindən gəldiyini xəbər verir. Yəhya o dövrdə hədis müəllimlərinin dərsi adətən müəyyən bir şeyxin hədislərinə həsr etdiklərini bildiyi üçün növbəti sualı verir və Muazın kimin hədislərini öyrətdiyini soruşur. Əbu Avn Abdullah bin Avn bin Ərtabən əl-Muzəni'nin (vəfatı 151) hədislərini yazdıqlarını eşitdikdə əvəzində Şubə bin əl-Həccəc (85-160) və Əş'as bin Abdilməlik əl-Humrani'nin (vəfatı 142) hədislərini yazmağı tövsiyə edir. Qeyd edək ki, bu alimlərin hamısı, yəni Yəhyə əl-Qattan, Amr əl-Fəlləs, Muaz, İbn Avn, Şubə və əl-Əşas basralıdırlar. Bunu ağlınızda saxlayın, çünki kitabda qarşıda Basra məktəbinin müəyyən özəlliyi haqqında söz açacağıq.

## Bizə xəbər verdi

Biz bu gün hədis kitablarını oxuduqda hədisin isnadında, yəni rəvayət zəncirində "həddəsənə" (bizə rəvayət etdi) və ya "əxbəranə" (bizə xəbər verdi) və ya "səmi'tu yəqul" (deyərkən eşitdim) və ya "ənbə'nə" (bizə bildirdi) şəklində ifadələr ilə qarşılaşırıq. Hədis elmində təcrübəsi olmayan biri üçün bu sözlər sadəcə eyni mənanı daşıyan, amma fərqli sözlərlə ifadə edilmiş bir söz birləşməsi kimi görünə bilər, lakin həqiqətdə bu heç də elə deyildir; bunların hər biri deyəndən və yerindən asılı olaraq xüsusi bir rəvayət etmə şəklini ifadə edir.

İmam Əbu İsa ət-Tirmizi "əl-İləl əs-Sağir" adlı kitabında deyir: "**Əhməd bin əl-Huseyn bizə rəvayət etdi; Yəhyə bin Suleyman əl-Cufi əl-Basri bizə rəvayət etdi; dedi: Abdullah bin Vəhb dedi: "Harda "həddəsənə" (bizə rəvayət etdi) dedimsə o, insanlar ilə birlikdə eşitdiyimdir. Harda "həddəsəni" (mənə rəvayət etdi) dedimsə o, tək özümün eşitdiyimdir.**

148. "əl-Kəmil fi Duafə ər-Ricəl", 2/37-38;

**Harda "əxbəranə" (bizə xəbər verdi) dedimsə o, mənim müşahidə etməyimlə alim üçün (kitabdan) oxunandır. Harda "əxbərani" (mənə xəbər verdi) dedimsə o, mənim özümün alim üçün oxuduğumdur.**"[149] Burada mütləq qeyd etməliyik ki, bu fərq bütün alimlər tərəfindən gözlənilməyib. Lakin belə bir fərq gözləyənlərin bunu etmələrinin səbəbi isə birini digərindən üstün saymaqları ilə bağlı idi. Onlar tələbənin hədisi bir-başa müəllimin ağzından eşitməsini onun hədisi müəllimə oxumasından daha üstün sayırdılar. Tələbə hədisi müəllimindən eşitmədən sadəcə ona oxuyaraq ərz etsəydi bunda bir qədər zəiflik olduğunu düşünəcəkdilər. Bu barədə hədis ədəbiyyatında müzakirələrə dair çoxlu misal vermək olar. Misal üçün İbn Cureyc'in İbn Şihəb əz-Zuhri'dən hədisi eşitməsi yoxsa ona ərz etməsi barəsində ixtilaf ediblər. Əli bin əl-Mədini deyir: "**İbn Cureyc İbn Şihəb'dən heç bir şey eşitməyib, sadəcə hədislərini ona ərz edib... Yəhya (bin Said əl-Qattan) dedi: "Sufyan bin Həbib mənə dedi: "Xeyr, ondan bu və bu hədisi eşidib." Mən də İbn Cureyc'in yanına gəldim və ondan bu barədə soruşdum. O da dedi: "Bilmirəm eşitmişəm yoxsa ona oxumuşam.**"[150] Bunu bilməkləri onlar üçün çox önəmli idi, çünki bir-başa şeyxin ağzından eşitməyi tələbənin şeyxə hədislərini oxuyaraq ərz etməyi ilə eyni tutulmurdu.

Bu kitabımızda da qarşımıza çıxacaq "xəbər verdi", "rəvayət etdi", "bildirdi" şəklində keçən ifadələri də sadəcə şifahi rəvayət kimi başa düşmək xəta olardı. Onların arasında şifahi yolla rəvayət olduğu kimi, yazılı yolla da rəvayət yer alır. Əksər hallarda şifahi olaraq eşidilən və əzbərlənilən rəvayətlər həm də yazıya köçürülürdü.

## Munəvalə

Munəvalə müəllimin tələbəsinə rəvayət ötürmək yollarından biri idi. Bu metod müəllimin öz kitabını tələbəsinə verməsi və oradan hədisləri rəvayət etməsinə icazə verməsindən ibarət-

149. ət-Tirmizi, "əl-İləl əs-Sağir",

150. "əl-Mərifə vat-Tərix", 2/139;

dir. Bu metod da birinci əsrin sonlarında və ikinci əsrin əvvəllərində formalaşmış və oturuşmuş bir metod idi. Saleh bin Amr deyir ki, "**əl-Həsən (Basri) bir mühəddisin öz kitabını verərək "oradakıların hamısını məndən rəvayət et" deməsində bir problem görmürdü; (rəvayət etdikdə də) "fılankəs mənə fılankəsdən rəvayət etdi" deməsinə də icazə verirdi.**"[151] əl-Həsən əl-Bəsri hicri 110-cu ildə vəfat edib. Bu, həm də əz-Zuhri'dən nəql edilmiş mövqedir. Kufənin ən mötəbər və ən görkəmli hədis alimlərindən sayılan Əbu Attəb Mənsur bin əl-Mu'təmir əs-Suləmi (h. 133) qaydaların formalaşdığı o dövrdə belə deyirdi: "**Əgər bir kimsə kitabını başqasına verərsə və "məndən rəvayət et" deyərsə ondan rəvayət edə bilər.**"[152] Alimlər munəvalə yolu ilə müəllimdən rəvayət edərkən hansı sözdən istifadə edə biləcəyində fərqli fikirlər söyləyiblər. Bəziləri "mənə rəvayət etdi" deməsinə icazə verdikləri halda digərləri bunu qadağan ediblər. Amr bin Əbi Sələmə deyir: "**əl-Əvzai'dən munəvalə haqqında soruşdum; bu halda "mənə rəvayət etdi" deyə bilərəmmi? Dedi: "Əgər sənə (həqiqətən də) rəvayət etmişəmsə o zaman de." Soruşdum: "Mənə xəbər verdi deyimmi?" Dedi: "Xeyr". Soruşdum: "Bəs necə deyim?" Dedi: "De: Əbu Amr dedi və ya Əbu Amr'dan".**"[153] Əbu Amr ilə əl-Əvzai özünü qəsd edir, çünki onun kunyəsi Əbu Amr idi. Belə başa düşülür ki, əl-Əvzai munəvalə metodunda tələbənin "mənə xəbər verdi" deməyini doğru görmür, lakin başqa sözlər işlətməsini təklif edir. Bu həmçinin onu göstərir ki, İmam əl-Əvzai (h. 88-157) öz kitablarını içindəki hədisləri rəvayət etmək üçün tələbələrinə verərdi. Ömər bin Abdilvahid deyir: "**əl-Əvzai bir kitabın içini incələdikdən sonra onu mənə verdi və dedi: "Bunu məndən rəvayət et!**"[154] Beləliklə də müəllimlər yalnız etimad etdikləri, əmanəti qoruyacaqlarına arxayın olduqları tələbələrinə kitabları verərdilər. Veriləcək kitabı da öncədən incələyərdilər, içində xətanın olub olmadığına baxardılar. əl-Əvzai'nin bu üslubu özündən əvvəlkilərdən öyrəndiyi və bu üslubun qədimdən məşhur olduğu tarixi xəbərlər ilə təsdiqini

151. "əl-Muhəddis əl-Fəsil", səh: 435;
152. ət-Tirmizi, "əl-İləlu əs-Sağir", səh: 752;
153. "əl-Muhəddis əl-Fəsil", səh: 436;
154. "əl-Muhəddis əl-Fəsil", səh: 437;

tapır. Bir başqa xəbərdə əl-Əvzai özü deyir: "**Yəhya bin Əbi Kəsir mənə səhifəsini verdi və dedi: "Bunu məndən rəvayət et!**"[155] Yəhyə bin Əbi Kəsir haqqında kitabda qarşıda danışacağıq. İmam Malikdən gətirəcəyimiz bir nəqlə diqqət edək. İsmail bin Əbi Uveys deyir: "**Malikdən hədis eşitməyin ən sağlam yolları haqqında soruşdum?" Dedi: "Alimə - və ya mühəddisə - (hədisi) oxumağın, sonra mühəddisin sənə oxuması, sonra isə sənə kitabını verməsi və "bunu məndən rəvayət et" deməsidir...**"[156] İmam Malik tələbənin kitabı müəlliminə oxumasını müəllimin oxumağından daha üstün saymışdır, amma əksəriyyət bu cür demir. Hər bir halda burada önəmli olan budur ki, munəvalə metodu üçüncü yerdə zikr olunmuşdur, digər iki rəvayət tərzindən daha zəif hesab edilib.

## Vicədə

"Vicədə" sözü kök etibarı ilə "tapmaq" sözündən qaynaqlanır. Bu cür rəvayət tapılmış bir kitabdan edilən rəvayət növüdür. Əgər hansısa mühəddis daha öncə qarşılaşmadığı və ya qarşılaşdığı, amma hədislərini eşitmədiyi bir şeyxin kitabını tapırsa və kitabın ona aid olduğundan əmindirsə onun içindəki hədisləri rəvayət edə bilər və bu şəkildə edilən rəvayət yoluna "vicədə" deyirdilər. İlk əsrlərdə bu cür hallar tarixi kitablarda sıx-sıx rastlanılan idi və o dövrün böyük alimləri böyük diqqət və əhəmiyyət ilə bir-başa rəvayətlər ilə vicədənin arasını ayırmaq üçün xeyli araşdırmalar edirdilər. İbn Əbi Xeysəmə tarix kitabında deyir: "**Yəhyə (bin Said əl-Qattan) dedi: "Məndə olan Sufyan əs-Səvri'yə aid köhnə bir kitabda belə yazıldığını gördüm: "Abdullah bin Zəkvan Əbuz-Zinəd mənə rəvayət etdi; dedi: Busr bin Said mənə rəvayət etdi; dedi...**"[157] və daha sonra hədisi zikr edir. Bu cür vicədə yolu ilə rəvayətlər Abdullah bin Əhməd'in atası Əhməd bin Hənbəl'dən rəvayətlərində çox keçir. Bütün bu rəvayətlərdə atasından eşitdiklərini eşitmədiklərindən fərqləndirmək üçün "**atamın öz əli ilə yazdığı kitabında**

155. "əl-Muhəddis əl-Fəsil", səh: 437;

156. "əl-Muhəddis əl-Fəsil", səh: 437;

157. İbn Əbi Xeysəmə, "ət-Tərix əl-Kəbir", 2/170;

**tapdım**” deyərək atasının kitabından götürdüklərini bir başa özündən eşitdiyi xəbərlərdən ayırmışdır.

Əbu Davud “əs-Sunən” kitabında deyir: “**Əli bin Abdilləh bizə rəvayət etdi: Muaz bin Hişəm bizə rəvayət etdi; dedi: “Atamın kitabında onun əl yazısı ilə yazıldığını gördüm - və özüm ondan (bu hədisi) eşitməmişəm - ki, Qatədə (bizə) Yəhyə bin Malik’dən, o da Səmura bin Cundub’dan (rəvayət edərək) dedi ki, Allahın peyğəmbəri – salləllahu aleyhi va səlləm - dedi: “Zikrdə (yəni cümədə) iştirak edin və imama yaxınlaşın! Çünki insan uzaqlaşdıqca Cənnətdə də - ora daxil olsa belə - axıra saxlanılar.**”[158] Muaz bin Hişəm böyük alim və müəzzəm mühəddis Hişəm bin Əbi Abdilləh əd-Dəstuvai’nin (h. 75-153) oğludur. Onun haqqında kitabımızda qarşıda bir qədər məlumat veriləcək. Bu xəbərdən də görünür ki, Hişəm öz oğluna kitablar tərk edib və oğlu bu hədisi atasının kitabından rəvayət etmişdir. Bu da vicədə yolu ilə rəvayət etməyin misallarındandır. Diqqət etmək lazımdır ki, oğlu həmin hədisi atasından bir başa eşitmədiyini vurğulayır. Bu isə bir daha təsdiq edir ki, hədisləri toplayıb rəvayət edən böyük şəxsiyyətlər səmimi idilər və rəvayətlərin tam haqqını verməyə çalışırdılar.

Əbu Davud bir başqa rəvayətdə deyir: “**İbnus-Sərh bizə rəvayət etdi: Dayım Abdurrahmən bin Abdilhəmid’in kitabında gördüm ki, (dayım) Uqeyl’dən, o da İbn Şihəb’dən ona xəbər verdiyini (rəvayət edir) ki, Abdullah bin Abdirrahmən bin əl-Əzhər ona atasından belə dediyini xəbər verdi: “Peyğəmbərin – salləllahu aleyhi va səlləm – Huneyn’də olarkən yanına şərab içmiş birini gətirdilər...**”[159] Əbu Davud daha sonra hədisin davamını zikr edir. Buradakı İbnus-Sərh’in tam adı Əhməd ibn Amr bin Abdilləh bin Amr bin əs-Sərh’dir, hicri 250-ci ildə vəfat edib və dayısı Əbu Racə Abdurrahmən bin Abdilhəmid bin Səlim əl-Məhri’dir. Əbu Ömər Muhəmməd bin Yusuf əl-Kindi’nin xəbər verdiyinə görə[160] hicri 192-ci ildə vəfat edib. İbnus-Sərh dayısından qalmış kitabda dayısının Uqeyl bin Xalid – İbn Şihəb əz-Zuhri – Abdullah bin Abdir-

158. “Sunən Əbi Davud”, (1108)

159. “Sunən Əbi Davud”, (4488)

160. “Təhzibul-Kəməl”, 17/251;

rahmən bin əl-Əzhər – Abdurrahmən bin əl-Əzhər kanalı ilə hədis rəvayət etdiyini qeyd edir. Bu da vicədənin misallarından sayılır.

Daha maraqlı bir misalı bizə Əbu Ubeyd əl-Qasim bin Səlləm "Ğaribul-Hədis" kitabında zikr edir. "**Əli'nin – radiyallahhu anhu – hədisi: "Qadınlar həqaiq'in – bəziləri "hiqaq"ın deyir – son həddinə çatdıqlarında ata tərəfdən qohumlar (onları ərə verməyə) daha münasibdir." Bunu İbn Mehdi mənə Sufyan'dan, o da Sələmə bin Kuheyl'dən, o isə Müaviyə bin Suveyd bin Muqarrin'dən rəvayət etdi; (Müaviyə bin Suveyd) dedi: Atamın kitabında Əli'dən bu xəbəri (rəvayət etdiyini) gördüm.**"[161]

əl-Beyhəqi "əs-Sunən əl-Kubra" kitabında[162] bu xəbəri Əbu Said bin Əbi Amr → Əbul-Abbas Muhəmməd bin Yaqub → Əhməd bin Abdilhəmid → Əbu Usəmə → Sufyan → Sələmə bin Kuheyl → Muaviyə bin Suveyd → Suveyd bin Muqarrin → Əli bin Əbi Talib kanalı ilə rəvayət edir. Rəvayətin isnadı səhihdir və isnadındakı rəvayət əhli böyük alimlər və tanınmış mühəddislərdir. Həqaiq'in və ya hiqaq'ın son həddinə çatmaq isə az yaşlılıq dövrünün son həddinə çatmaqdır, başqa sözlə desək həddi-büluğa vasil olması qəsd olunur. Müaviyə bin Suveyd'in xəbərindən anlaşılır ki, atasından ona qalmış bir səhifə olub və orada Əli bin Əbi Talib'in bu sözlərini oxuyub. Atası isə rizvan beyətinin iştirakçısı olmuş mübarək səhabə Suveyd bin Muqarrin bin Aiz əl-Muzəni'dir. Oğlu Muaviyə atasının kitabından götürdüyü xəbəri tələbəsi Sələmə bin Kuheylə rəvayət etmişdir. Bu da alimlərin nəzdində vicədə üçün gözəl bir nümunədir. Digər tərəfdən də səhabələrin özlərindən sonra kitablar tərk etdiyinin sübutlarından biridir. Qarşıda bu barədə daha çox misallar zikr olunacaq.

Bu şəkildə o dövrün alimlərinin tapdıqları kitablardan hədis rəvayət etmələri qeyri-adi bir hal deyildi. Kitabın kimə aid olduğunu bilib bundan əmin olduqdan sonra ondan hədisləri rəvayət etməkdə bir sıxıntı olmamalıdır. İbn Əbi Hətim ər-Razi buyurur: "**Atamdan Ata bin Dinar haqqında soruşdular və dedi: "O, hədisi saleh olan biridir, sadəcə olaraq təfsiri divandan götürüb.**[163]

161. "Ğaribul-Hədis", 4/350; əl-Mətbə'ə əl-Əmiriyyə

162. "əs-Sunən əl-Kubra", 7/195;

163. Divan əslən fars sözüdür. Lakin İslam tarixində "divan" sözü İslam dövlətindəki xü-

**Beləki Abdulməlik bin Mərvan məktub yazaraq Said bin Cubeyr'dən onun üçün Quran təfsiri yazmasını tələb etdi. Said bin Cubeyr də onun istədiyi təfsiri yazıb ona göndərdi və Ata bin Dinar həmin təfsiri divanda tapdı. Sonra götürərək (içindəki rəvayətləri) Said bin Cubeyr'dən mürsəl şəkildə rəvayət etdi.**"[164] Ata bin Dinar əl-Huzəli (h. ?-126) bu təfsir kitabından Said bin Cubeyr'in rəvayətlərini rəvayət etməklə məşhurdur. Yaqub bin Sufyan əl-Fəsəvi deyir: "**Əbu Bəkr əl-Humeydi mənə rəvayət etdi: Sufyan bizə rəvayət etdi: Musəvir – yəni əl-Varraq – bizə qardaşı Səyyar'dan belə dediyini rəvayət etdi: "əl-Həsəndən soruşdular: "Ey Əbu Said, sənin bizə rəvayət etdiyin bu hədislər kimdəndir?" Dedi: "Tapdığımız bir səhifədəndir.**"[165] əl-Həsən əl-Basri'nin tapdığı hədis kitabından hədislər rəvayət etməsi heç də qəribə bir hal deyilir. Qarşıda topladığımız xəbərlər və rəvayətlərdə görüb şahid olacağıq ki, hədislərin yazılarda qeyd edilməsi və sonrakı nəsillərə nəql edilməsi erkən bir dövrdə başlamışdı. Hətta əl-Həsən əl-Basri haqqında danışdıqda onun öz zamanında mövcud olan kitabları taparaq toplamağı haqqında məlumat verəcəyik.

## Yaddaş ilə kitabın yoldaşlığı

Heç kəsə gizli deyildir ki, ilk əsrlərdə rəvayət olunan hədisləri əzbərləməyə xüsusi əhəmiyyət verirdilər. Amma hədisləri rəvayət edənlərin böyük əksəriyyəti onları əzbərləməklə yanaşı kitablarına da yazardılar və ümumiyyətlə hədisləri yazmadan əzbərləmək nadir bir hal idi. Çoxunluq hədisləri yazıya köçürdükdən sonra əzbərləməyə yönəlirdilər.

Əlbəttə ki, əzbərlədiklərini yoxlamaq və dəqiqləşdirmək üçün təkrar-təkrar yazdıqlarına geri qayıdardılar. Yazdıqları ilə əzbərlədikləri ya bir-biri ilə razılaşır, ya da razılaşmırdı. Təbii ki, əksər hallar-

---

susi orqan üçün işlənib. əl-Məvardi "əl-Əhkəmus-Sultaniyyə" kitabında (səh: 259) deyir: "Divan; işlər/vəzifələr və mallardan və həmçinin orduların və valilərin etdiklərindən ibarət hakimiyyət hüququnu/vəzifələrini qeydə alan yerə deyilir."

164. "əl-Cərh vat-Tədil", 6/332;

165. "əl-Mərifə vat-Tərix", 2/45;

da yazı əzbərə müvafiq olurdu, lakin bəzən də arada fərqlər ortaya çıxırdı. Bu dediyimizə misal olaraq əl-Humeydi'nin öz şeyxi Sufyan bin Uyeynə'dən nəql etdiyi bu xəbəri göstərmək olar. əl-Humeydi kitabında yazır: "**Sufyan bizə rəvayət etdi; dedi: İbrahim bin Meysərə bizə rəvayət etdi; Vəhb bin Abdilləh bin Qarib və ya Mərib atasından, o da babasından belə dediyini rəvayət etdi: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – vəda həccində belə deyərkən eşitdim: "Allah saçlarını qırxanlara rəhm etsin!" və əli ilə bu cür işarə etdi. (əl-Humeydi sağ əlini uzatdı.) Dedilər: "Ey Allahın elçisi, bəs saçlarını qısaldanlar?" Dedi: "Allah saçlarını qırxanlara rəhm etsin!" Dedilər: "Bəs qısaldanlar, ey Allahın elçisi?" Dedi: "Allah qırxanlara rəhm etsin!" Dedilər: "Ey Allahın elçisi, bəs qısaldanlar?" Bunun üzərinə dedi: "Qısaldanlara da." (əl-Humeydi burada da əlini uzatdı, lakin birinci dəfəki kimi uzatmadı.) Sufyan dedi: "Kitabımda gördüm ki, "İbrahim bin Meysərə'dən, o da Vəhb bin Abdilləh bin Mərib'dən" yazılıb, lakin əzbərimdə "Qarib" olaraq qalıb və insanlar da əzbərlədiyim kimi Qarib deyirlər. Ona görə də mən (hədisi rəvayət etdikdə) "Qarib və ya Mərib" deyirəm.**"[166] Bu misalda Sufyan bin Uyeynə'nin (h. 107-198) kitabında yazdığı ilə əzbərində tutduğu söz arasında bir hərf fərqinin olduğuna diqqət çəkir. Onlardan hansının daha doğru olduğunda qəanət sahibi olmadığı üçün "və ya" bağlayıcısını istifadə edərək hər iki variantı da rəvayət edir.

Daha bir misalı Əbu Davud'un "əs-Sunən" kitabında görə bilərik. Əbu Davud deyir: "**Musəddəd bin Musərhəd bizə rəvayət etdi; Abdullah bin Davud bizə əl-Aməş'dən, o da Səlim'dən, o isə Kureyb'dən rəvayət etdi: İbn Abbas bizə xalası Məymunə'dən belə dediyini rəvayət etdi: "Peyğəmbər üçün – salləllahu aleyhi va səlləm – cənabətdən qüsl alması üçün su qoydum. Qabı sağ əlinə tökdü və onu iki və ya üç dəfə yudu. Sonra övrətinə tökdü və sol əli ilə övrətini yudu. Sonra əlini yerə vurdu və onu yudu. Sonra ağzını yaxaladı, burnuna su çəkdi, üzünü və qollarını yudu. Sonra başına və bədəninə su tökdü. Sonra qırağa çəkildi və ayaqlarını yudu. Mən ona**

166. "Musnəd əl-Humeydi", 2/173 (960)

**dəsmalı uzatdım götürmədi və bədənindən suyu silkələyib atmağa başladı." (əl-Aməş dedi:) Mən bunu İbrahim (ən-Nəxai)yə zikr etdim və dedi: "Onlar dəsmalda bir bəis görmürdülər, lakin adəti məkruh sayırdılar." Əbu Davud deyir: "Musəddəd dedi: Abdullah bin Davuda dedim: "Bunu adət üçün məkruh görürdülər." (Abdullah) dedi: "O cür olmalıdır. Lakin mən kitabımda bu cür yazıldığını gördüm.**"[167] Burada Əbul-Həsən Musəddəd əl-Basri (h. 15?-228) ilə Abdullah bin Davud əl-Xureybi (h. 126-213) arasında keçən dialoqda tələbənin müəllimi ilə xəbərin ləfzini dəqiqləşdirdiyini görürük. Çünki tələbə bunu "kənu yəkrahunəhu lil-adə" (bunu adət üçün məkruh görürdülər) sözləri ilə əzbərində saxlayıb və müəllimi Abdullah bin Davud da bunu təsdiqləyir, lakin kitabında "kənu yəkrahunə əl-adə" (adəti məkruh görürdülər) ləfzi ilə gəldiyini deyir. İkisi arasındakı fərq sadəcə yazıdadır; birində "ləmut-tə'lil" hərfi və əvəzlik keçir, digərində isə bu hərf və əvəzlik keçmir, amma məna olaraq ikisini də eyni şəkildə başa düşmək olur, çünki İbrahimin qəsdi budur ki, onun şeyxləri və səhabələr bəzən dəsmal ilə qurulamaqda bir bəis görmürdülər, lakin bunu adət halına salmağı məkruh hesab edirdilər.

əd-Dərimi "əs-Sunən" əsərində deyir: "**Əbul-Valid bizə xəbər verdi; Şu'bə bizə rəvayət etdi: əl-Həkəm bizə İbrahim'dən belə dediyini rəvayət etdi: Ömər – radiyallahu anhu – "cənabətlinin (Quran) oxumağını məkruh görərdi və ya qadağan edərdi." Şu'bə dedi: "Kitabda "... və heyizli qadın" sözünü də gördüm.**"[168] Bu misalda da basralı mühəddis alim Əbu Bistam Şu'bə bin əl-Həccəc əl-Əzdi əl-Atəki'nin (h. 80-160) rəvayət edərkən əzbərində olmayan, lakin kitabında keçən əlavə sözə də diqqət çəkir. Kitabında sadəcə "cənabətlinin" yox, "cənabətlinin və heyizli qadının" sözləri ilə yazıldığını qeyd edir. Yuxarıda sadəcə hərf fərqi var idisə, burada əlavə bir söz fərqi vardır.

Bir başqa misalı biz İmam əl-Buxari'nin "əs-Sahih" kitabında görə bilərik. əl-Buxari deyir: "**İshaq bizə rəvayət etdi; Həbbən bizə rəvayət etdi; Həmməm bizə rəvayət etdi: Qatədə bizə**

167. "Sunən Əbi Davud", 1/64 (245)

168. "Sunən əd-Dərimi", 1/679;

**Əbul-Xalil'dən, o isə Abdullah bin əl-Haris'dən, o da Həkim bin Hizəm'dən – radiyallahu anhu – rəvayət etdi ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Alıcı və satıcı ayrılmadıqları müddətdə seçim üzərindədirlər." Həmməm dedi: "Kitabımda gördüm ki, üç dəfə "seçir" sözü yazılıb."...**"[169] əl-Buxari daha sonra hədisin davamını gətirir. Beləliklə də İmam Əbu Bəkr Həmməm bin Yəhyə bin Dinər əl-Avzi əl-Muhəllimi (h. 8?-163) öz kitabı ilə əzbəri arasındakı fərqi də qeyd edir. Aradakı fərq budur ki, kitabında "əl-beyyi'ani yəxtər yəxtər yəxtər mə ləm yətəfərraqa" (alıcı və satıcı ayrılmadıqları müddətdə seçə bilərlər, seçə bilərlər, seçə bilərlər) sözləri yazıldığı halda əzbərində "əl-beyyi'ani bil-xiyər mə ləm yətəfərraqa" (alıcı və satıcı ayrılmadıqları müddətdə seçim üzərindədirlər) sözləri ilə xatırlayır. Görünür ki, İmam Əbul-Xattab Qatədə bin Diamə əs-Sədusi'nin (h. 60-118) məclisində oturan gənc Həmməm əl-Avzi kitabında "bil-xiyər" (seçim üzərindədir) sözü yerinə "yəxtər" (seçə bilər) sözünü yazıb. İki məna arasında bir fərq yoxdur, lakin doğru söz əzbərində olan sözdür, çünki digər rəvayətlərdə də bu şəkildə keçir.

Gəlin tanınmış qureyşli imam Muhəmməd bin İdris əş-Şafi əl-Mutalləbi'nin (h. 150-204) kitabından daha bir nümunə ilə tanış olaq. İmam əş-Şafi deyir: "**Yəhyə bin Həssən bizə Həmməd bin Zeyd'dən, o da Amr bin Dinar'dan, o isə Cabir bin Abdilləh'dən xəbər verir ki, "bir nəfər ona aid olan qulamı tədbir ilə azad etdi və ondan başqa bir malı yox idi. Bunun üzərinə Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Onu məndən kim alar?" Nueym bin Abdilləh onu səkkiz yüz dirhəmə aldı və (peyğəmbər) pulu həmin adama verdi." Yəhyə bin Həssən bizə Həmməd bin Sələmə'dən, o da Amr bin Dinar'dan, o isə Cabir bin Abdilləh'dən, o isə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – Həmməd bin Zeyd'in hədisinin bənzərini xəbər verdi. Sufyan bin Uyeynə bizə Amr bin Dinər'dən və Əbuz-Zubeyr'dən xəbər verdi ki, onların hər ikisi də Cabir bin Abdilləh'i belə deyərkən eşidiblər: "Bizdən bir nəfər ona aid bir qulamı tədbir etdi və ondan başqa bir malı yox idi. Bunun üzərinə peyğəmbər – salləllahu aleyhi**

169. "Sahih əl-Buxari", (2114)

**va səlləm – dedi: "Bunu məndən kim alar?" Onu Nueym bin Abdilləh ən-Nəhhəm aldı." Amr dedi: Cabiri belə deyərkən eşitdim: "(Həmin qulam) qibti bir kölə idi, İbnuz-Zubeyr'in əmirliyinin ilk ilində vəfat etdi." Əbuz-Zubeyr isə əlavə etdi ki, onun adı Yaqub idi. (əş-Şafi deyir: ) Bütün ömrüm boyu (hədisi) bu cür eşitmişəm, sonra kitabımda (belə yazıldığını) gördüm: "Bizdən bir nəfər ona aid bir qulamı tədbir etdi və çox keçmədi öldü." Bu, ya mənim kitabımdan qaynaqlanan xəta ya da Sufyandan qaynaqlanan xəta olmalıdır. Əgər Sufyandan qaynaqlanırsa onda İbn Cureyc Əbuz-Zubeyr'in hədisini Sufyandan daha yaxşı bilir. İbn Cureyci həm də Leysin və başqalarının hədisi də dəstəkləyir. Əbuz-Zubeyr hədisi elə dəqiq çatdırır ki, orada tədbir edənin sağ qaldığını xəbər verir. Həmməd bin Zeyd Həmməd bin Sələmə və başqaları ilə birlikdə Amr'ın hədisini təklikdə Sufyandan daha yaxşı bilirlər... Sufyan ilə qədimdə qarşılaşmış birdən çox kəs mənə xəbər verdi ki, o, (bu hədisi rəvayət edərkən) hədisə "öldü" sözünü daxil etmirdi və mən kitabımda "öldü" sözünü gördüyümü xəbər verdikdə bəziləri təəccübləndi və dedi: "Ola bilsin ki, bu, ondan qaynaqlanan bir xətadır və ya bir ehtiyatsızlıqdır ki, sən ondan əzbərləmisən.**"[170] Burada "tədbir" ilə qəsd olunan həmin adamın qulama, yəni xidmətçi kölə oğlana "mən öldükdən sonra sən azadsan" deməsi mənasına gəlir. əş-Şafi'nin öz şeyxi Sufyan bin Uyeynə'dən yazdığı hədis üzərindəki düşüncələri kitab və əzbər arasındakı münasibətlər haqqında təsəvvür formalaşdırmaq üçün gözəl bir misaldır. əş-Şafi xətanın özündən yoxsa Sufyandan qaynaqlandığından əmin deyildir. Lakin hər bir halda bu bir daha təsdiq edir ki, o dövrün alimləri və mühəddisləri əzbərlərindəki elmi öz kitablarında da daşıyırdılar, hətta kitablarında daşıdıqları əzbərlərində daşıdıqlarından daha çox idi. Üstəlik bu onu göstərir ki, eyni hədisi bir neçə şeyxdən əzbərləməklə öz kitablarındakı xətaları da görə bilirdilər.

O dövr üçün yayğın olan adətlərdən biri də budur ki, mühəddislər hədis kitablarının yoxlanması üçün digər mütəxəssis mühəddislərə verərdilər. İbn Adiy "əl-Kəmil" kitabında deyir: "**Əhməd bin**

170. "əl-Umm", 8/16;

**əl-Huseyn bin İshaq əs-Sufi bizə rəvayət etdi: Abdurrahmən bin Bişr bin əl-Həkəm bizə rəvayət etdi; dedi: Sufyan bin Uyeynə'ni belə deyərkən eşitdim: "İbrahim əl-Həcəri'nin yanına gəldim və (yazdığı) hədis kitablarının hamısını mənə verdi. Mənim də şeyxə rəhmim gəldi və onun kitabına düzəlişlər etdim və dedim: "Bu, Abdullah (bin Ömər)dəndir, bu peyğəmbərin – salləllahu aleyhi va səlləm – özündəndir, bu isə Ömərdəndir.**"[171] Burada adı keçən İbrahim bin Muslim əl-Həcəri məhz buna görə tənqid olunub, çoxlu xəta edənlərdən olub. Bu onu göstərir ki, o dövrdə Sufyan bin Uyeynə kimi alimlər onun xətalarını görüb düzəldə biləcək qədər ətraflı biliklərə sahib olublar. Onlardan kimisi də kitablarının dəqiqliyini və doğruluğunu göstərmək üçün yazdıqlarını imamlara təqdim edərdi. İmam Yəhya bin Main deyir: "**Ğundər bizə "tayləsən cirablarından"**[172] **bir cirab çıxardı, içində (Sufyan) bin Uyeynə'nin hədisləri var idi. Xaləf əl-Məxrami onun içindəkilərə baxdı və biz də (diqqətlə) baxdıq ki, içində bir xəta tapaq, lakin xəta tapa bilmədik. Halbuki xəta tapmaqlarını çox istəyirdilər, lakin tapa bilmədilər.**"[173] Burada Ğundər ləqəbi ilə anılan kəs Əbu Abdilləh Muhəmməd bin Cəfər əl-Huzəli'dir. Basra şəhərindən olan və kitabının dəqiqliyi ilə tanınmış alimdir. İbn Cureyc, Şu'bə, Said bin Əbi Arubə, Mə'mər ər-Raşid və başqalarından hədis rəvayət edib. 110-ci illərdə anadan olub və 193-cü ildə vəfat edib. Şu'bənin yanında iyirmi il müddətində hədis elmi tələb edib və Şu'bə hələ sağ ikən onun hədislərini öyrənmək istəyənlər Ğundər'in kitablarına müraciət edirdilər. Ğundər özü də kitablarının dəqiqliyi və xətasızlığı ilə fəxr edərdi. İmam Əhməd bin Hənbəl deyir: "**(Bir gün) Ğundər bizə Sufyan bin Uyeynə'dən (yazdığı) kitabını çıxardı və dedi: "Baxın görün bunda xəta tapa bilirsizmi?" Sonra onu üzərimizə atdı.**"[174] Bu misalların işığında hədislərin nə qədər geniş çapda yazıldı-

171. "əl-Kəmil fi Duafə ər-Ricəl", 1/346;

172. "Tayləsən" və ya "taylisan" çiyinə atılan şal növündəndir, öncələr yəhudilərə xas geyim idi, sonralar isə müsəlmanlar arasında da yayğınlaşdı. "Cirab" isə içinə səfər azuqəsi yığılan bir torbadır, xurcundur. "Tayləsən cirabı" deyildikdə çox ehtimal ki, həmin tərzdə və həmin parçadan hazırlanmış cirab qəsd olunur. Doğrusunu Allah bilir!

173. "Tərixu İbn Main", 4/245 (4178)

174. "əl-İləlu va Mərifətur-Ricəl", 1/305 (514)

ğını təsəvvür edə bilərik. Həm də kitablara daim müraciət edildiyini də görə bilirik, bir çox halda bir ravinin hədislərini yoxlamaq üçün onun ən məşhur tələbələrinə və onların kitablarına müraciət edirdilər. Ona görə də məşhur imam Abdullah bin əl-Mubərak (h. 118-181) deyib: "**Alimlər əgər Şubə'nin hədislərində fikir ayrılığına düşsələr Ğundər'in kitabı onların arasında hakimdir.**"[175] Həmçinin Yaqub əl-Fəsəvi şeyxi Əli bin əl-Mədini'nin belə dediyini zikr edir: "**Hədis əhlindən birinin Süleyman bin Hərb'ə belə dediyini eşitdim: "Şubə'dən rəvayət olunan bir hədisdə ixtilaf etdiklərində Abdurrahmən bin Mehdi soruşdu: "(Baxın) Ğundər bunu necə rəvayət edib?" Süleyman dedi: "Ey qafil insan, Abdurrahmən bunu deməyəcək qədər diqqətli idi. Onun soruşduğu bu idi: "Ğundərin kitabında necədir?" Süleyman dedi: "Ğundər deyərdi: "Şubənin hədisini eşitdim və ona oxudum." Süleyman dedi: "Onun kitabının hədisi səhih idi. Amma özünə gəldikdə isə - işarə etdi ki, - bu işi yaxşı dərk etmirdi.**"[176] əl-Buxari də "ət-Tərix əl-Kəbir" kitabında şeyxi Əli bin əl-Mədini'nin bu sözlərinə yer verir: "**Abdurrahmən bizi Ğundərə tərəf təşviq edib deyərdi: "Kaş ki, mən onun kitablarını yazıb köçürərdim. Biz hələ Şubə'nin sağ olduğu zamanlarda Ğundərin kitablarından faydalanardıq." Əli (bin əl-Mədini) mənə dedi: "Vaki mənə dedi: "Kitabı səhih olan nə elədi?" Soruşdum: "Taylısən sahibi?" Dedi: "Bəli", yəni Ğundər.**"[177] Bəzilərinin nəzərində Ğundər'in yaddaşında güclü olmadığı, lakin hədisləri yazmaqda dəqiq olduğu bu tarixi xəbərlərdən aydın bir şəkildə ortaya çıxır.[178] Süleyman bin Hərb'in etirazı da məhz bununla bağlı idi, çünki o, Basra şəhərinin zamanındakı imamı Abdurrahmən bin Mehdi'nin Ğundərin hafizəsinə etibar edəcəyini qəbul etmir, ona görə də Ğundərin kitabını qəsd etdiyini vurğulayır.

175. İbn Əbi Hətim, "əl-Cərhu vat-Tə'dil", 1/271; Abdurrahmən bin Əbi Hətim bunu Əhməd bin Mənsur bin Raşid əl-Mərvazi'dən, o da Sələmə bin Süleyman'dan, o isə Abdullah bin əl-Mubərak'dan rəvayət edir. Ravilər etibarlı ravilərdir.

176. "əl-Mərifə vat-Tərix", 2/156-157;

177. "əl-Tərix əl-Kəbir", 1/57 (119);

178. Süleyman bin Hərb kimi İbn Hibban da onun hafizəsində zəifliyin olduğunu deyir.

## Şeyxlərin hədislərinin yoxlanışı

Bu başlıq altında biz hədis alimlərinin hədislərinin necə yoxlanışdan keçirildiyini görəcəyik. Onların rəvayət etdiklərinin sadəcə ucuz loğma kimi udulmadığını, lakin sınaqdan və imtahandan keçirildikdən sonra qəbul edildiyini göstərəcəyik. Əlbəttə ki, hər bir hədis aliminin bu metoddan istifadə etdiyini iddia etmək doğru olmazdı. Ancaq kritik bir şəkildə hədisləri nəzərdən keçirən alimlər mövcud olub və onlar hədis ravilərini, xüsusilə də çox hədis rəvayət edən raviləri sınaqdan keçiriblər. Məşhur imam, böyük alim, mühəddislərin şeyxi Əbu Zəkəriyya Yəhya bin Main əl-Ğatafəni əl-Bağdadi (h. 158-233) bu şəkildə hədis rəvayət edənləri yoxlayarmış. İbn Əbi Hətim deyir: "**Əbu Əhməd Muhəmməd bin Ravh ən-Nisəburi bizə xəbər verdi; Əbu Bəkr Muhəmməd bin İbrahim bin Həmməd'i belə deyərkən eşitdim: "Yəhya bin Main bizimlə birlikdə Əbu Sələmə Musa bin İsmail ət-Təbuzəki'nin yanına (Basra şəhərinə) səfər etdi və (ondan) Həmməd bin Sələmə'nin "əl-Cami" kitabını eşitdi. Ondan öncə on yeddi nəfərdən eşitmişdi.**"[179] Həmməd bin Sələmə bin Dinar (h. 91-167) basralı alimlərdəndir, əz-Zəhəbi onu "şeyxul-islam" olaraq vəsf edir. əl-Əvzai Şamda, Malik Mədinədə, İbn Cureyc Məkkədə hədisləri kitablara yazdıqda Həmməd bin Sələmə də Basra şəhərində hədis yazırdı. Bu nəqldən öyrənmiş oluruq ki, onun "əl-Cami" adlı bir kitabı olub və Yəhya bin Main həmin kitabı onun tələbələri arasından 18 nəfərdən dinləyib. 18 nəfərdən dinləməsinin səbəbi də budur ki, Yəhya bununla Həmməd'in hədislərini yoxlayırdı. əz-Zəhəbi kitabında deyir: "**İbn Hibban "əd-Duafə" kitabında dedi: "Muhəmməd bin İbrahim bin Əbi Şeyx əl-Malati'ni belə deyərkən eşitdim: "Yəhyə bin Main Affan'dan Həmməd bin Sələmə'nin kitablarını dinləmək üçün onun yanına gəldi. (Affan) soruşdu: "Məgər onları heç kimdən eşitməmisənmi?" Dedi: "Bəli, mənə Həmməd'dən on yeddi nəfər rəvayət edib." (Affan) dedi: "Allaha and olsun ki, sənə rəvayət edən deyiləm." (Yəhya) dedi: "Bu sadəcə bir dirhəmdir. Basraya gedərəm və orada ət-Təbuzəki'dən dinləyərəm." (Affan)**

179. "əl-Cərh vat-Tədil", 1/315;

**dedi: "Özün bilərsən." Basraya gəldi və ət-Təbuzəki'nin yanına getdi. (ət-Təbuzəki) ondan soruşdu: "Onları heç kimdən eşitməmisənmi?" Dedi: "Olduğu şəkildə on yeddi nəfərdən eşitmişəm və sən on səkkizincisən." (ət-Təbuzəki) dedi: "Bununla nə edəcəksən?" Dedi: "Həmməd bin Sələmə xəta edərdi, ona görə də onun xətasını başqasının xətasından ayırmaq istəyirəm. Əgər görsəm ki, tələbələri (ondan rəvayətdə) bir-biriləri ilə razılaşırlar biləcəm ki, xəta onun özündəndir.**"[180] Yəhya bin Main burada məqsədini izah etmişdir. Həmməd bin Sələmə'nin hədislərini dəqiqləşdirmək üçün, onlarda xəta varsa haradan qaynaqlandığını müəyyənləşdirmək üçün kitablarını on səkkiz tələbəsindən dinləməyə səy göstərib. Əmin ola bilərik ki, Yəhya bin Main basralı alim Həmməd bin Sələmə'nin hədislərində xətaların nə olduğunu bəyan edib, çünki hədis qaynaqlarında bu barədə xeyli məlumat mövcuddur. Həm də tarix baxımından bir mənbəni on səkkiz ayrı vəsiqə ilə yoxlamaq hətta müasir tarixi standartlara görə belə çox üst səviyyədə bir araşdırmadır. Beləliklə də bir şeyxin hədislərini yoxlamaq üçün və yaxud da hansısa bir hədisi yoxlamaq üçün onu bir çox yoldan dəqiqləşdirərdilər. ət-Tirmizi deyir: "**(əl-Buxari) Əli bin əl-Mədini'dən belə dediyini rəvayət etdi: "Bir mövzunun rəvayət yolları bir araya toplanmazsa xətası ortaya çıxmaz.**"[181] Maraqlıdır ki, hətta xətanı doğrudan ayırmaq üçün, zəifi səhihdən ayırmaq üçün zəif olduğunu bildikləri hədisləri də yazırdılar. Yəhya bin Main ilə bu barədə Əhməd bin Hənbəl'in arasında keçən bu dialoqa diqqət edək. Əbu Abdilləh əl-Hakim ən-Nisəburi deyir: "**Hafiz Əbu İmran Musa bin Said əl-Hənzali Həmədan şəhərində mənə xəbər verdi; dedi: əl-Qadi Əhməd bin İshaq Dinəvar şəhərində mənə rəvayət etdi; dedi: Əbu Bəkr əl-Əsram'ı belə deyərkən eşitdim: "Əhməd bin Hənbəl San'a şəhərində bir zaviyədə Yəhya bin Main'i – Allah hər ikisinə də rəhmət etsin! – Mə'mər'in, Əbən'dən, onun da Ənəs'dən rəvayət etdiyi səhifəsini yazarkən gördü. Bir kimsə yanına gəldikdə onu gizlədərdi. Buna görə də Əhməd ona dedi: "Mə'mərin Əbən'dən, onun da Ənəs'dən rəvayət etdiyi səhifənin uydur-**

180. "Siyər Əaləmin-Nubələ", 7/456;

181. "Suələtut-Tirmizi lil-Buxari", 1/49;

**ma olduğunu bildiyin halda onu necə yazırsan?! Bir kimsə sənə deyə bilər ki, necə olur ki, Əbən haqqında pis danışırsan və sonra da onun hədislərini olduğu kimi yazırsan?!" (Yəhya) dedi: "Allah sənə rəhm etsin, ey Əbə Abdilləh! Mən bu səhifəni Abdurrazzəq'dan, o da Mə'mər'dən olduğu kimi yazıram ki, onun uydurma olduğunu bildiyim halda onun hamısını əzbərləyim ki, sonradan bir nəfər gəlib Əbəni Səbit ilə əvəz edərsə və bunu Mə'mər – Səbit – Ənəs yolu ilə rəvayət edərsə ona "sən yalan danışdın, bu hədis Əbəndəndir, Səbitdən deyildir" deyə bilim.**"[182]

Burada sözü gedən Əbən bin Əbi Ayyəş'dir, Ənəs bin Malik'in kölələrindən olub.[183] Yəhya'nın hədislərdə bu dərəcədə dəqiq davranması sübut edir ki, hədislər ciddi bir yoxlamadan keçib.

Hətta bir ravinin öz şeyxindən hədisləri eşidib eşitmədiyini yoxlamaq üçün səfərlər belə ediblər. Əli bin əl-Mədini deyir: "**Abdurrahmən bin Mehdi həmişə Ravh bin Ubədə'yə tənə edərdi və onun İbn Əbi Zi'b vasitəsilə əz-Zuhri'dən rəvayət etdiyi hədisləri inkar edərdi; bu, onda (yazılı) suallar şəklində mövcud idi. Mədinədə Mə'n bin İsa'nın yanına gəldikdə ondan**

---

182. "əl-Mədxal ilə Kitəbil-İklil", səh: 70-71;

183. Əbən'in Ənəsdən rəvayət etdikləri hədislər bir çox alim tərəfindən uydurma adlandırılıb, lakin burada "uydurma" deyildikdə qəsdən uydurulmuş hədislər nəzərdə tutulmur. Onların terminologiyasında hətta xəta ilə nisbət olunmuş hədislərə də uydurma deyirdilər. Əbən bin Əbi Ayyəş'in halında qəsd olunan da budur, çünki onun haqqında oxuduqda kiminsə onu yalan uydurmaqda ittiham etdiyini görmürük. Əbu Hətim ər-Razi deyir: "Saleh bir insan idi, lakin çox pis yaddaşla bəlaya düçar olub" İbn Əbi Hətim ər-Razi deyir: "Əbu Zura'dan onun haqqında soruşdular və dedi: "Hədisi tərk olunub, bizə oxumazdı." Soruşdular: "Qəsdən yalan danışardımı?" Dedi: "Xeyr, Ənəsdən, Şəhr'dən və əl-Həsən'dən hədis eşidərdi və sonra onları bir-birindən ayırmazdı." İbn Adiy əl-Curcəni deyir: "Rəvayət etdiklərinin əksəriyyətini başqaları rəvayət etmir və zəiflikdə halı çox aşkardır. Ümid edirəm ki, qəsdən yalandan danışmayıb, lakin qatıb qarışdırıb, xəta edib və o, sidqdən çox zəifliyə daha yaxındır." İbn Hibban deyir: "Abidlərdən idi. Ənəsdən bir sıra hədis eşitdi və sonra əl-Həsən (əl-Basri) ilə oturub durdu, onun sözlərinə qulaq verərdi. Əgər rəvayət edərdisə əl-Həsən'in sözlərini bilmədən Ənəs'dən mərfu hədis olaraq rəvayət edərdi." Həmçinin əs-Səci deyir: "Saleh və səxavətli biri idi, qəflət sahibi idi, hədisdə xəta edirdi." Bu nəqllərdən aydın olur ki, Əbən bin Əbi Ayyəş sadəcə olaraq çox çirkin xətalar edən biri olub və başqalarından eşitdiyi sözləri daha sonra Ənəsdən hədis olaraq rəvayət edərdi. Buna görə də alimlər onun sözlərini tərk ediblər və rəvayətlərini inkar ediblər. Əbən haqqında bu və digər nəqllər üçün bax: "Təhzibut-Təhzib", 1/98-99;

**onları, yəni İbn Əbi Zi'bin əz-Zuhri'dən hədislərini, həmin sualları çıxarmasını xahiş etdim. Mə'n mənə dedi: "Onunla nə edəcəksənki? Onlar sizdə bir basralıda var, adına Ravh deyirlər. İbn Əbi Zib bizə o kitabı oxuduğu zaman o, bizimlə burda bir yerdə idi." Ondan sona Abdurrahmən bin Mehdi'nin yanına gəldim və xəbər verdim.**"[184]
Hər üç alim, yəni Abdurrahmən bin Mehdi, Ravh bin Ubədə və Əli bin əl-Mədini basralıdırlar və İbn Mehdi öz həmyerlisinin müəyyən bir kitabı rəvayət etməsinə şübhə ilə baxır və onu müəllifi İbn Əbi Zib'dən eşitmədiyinə, başqasından əldə etdiyinə inanır. Əli bin əl-Mədini isə Mədinə şəhərinə səfər etdikdə bunu yoxlamağı unutmur. Bu misaldan çıxardığımız nəticə budur ki, rəvayət olunan və müəyyən şəxslərə nisbət olunan kitablar rahat şəkildə qəbul olunmurdu, tənqid olunur və yoxlanılırdı. Basralılar üçün hədis yazmaq məqsədi ilə Mədinəyə səfər etmək adi bir hal idi. Ravh bin Ubədə həmçinin İmam Malik'in "əl-Muvatta" kitabını öyrənib rəvayət etmiş ravilərdəndir.

## Sahəfi kimdir?

O dövrdə hədislərin geniş şəkildə yazılmasının sübutlarından birini də o zaman üçün "sahəfi" sözünün geniş şəkildə istifadə edilməsində müşahidə edə bilərik. Abdullah bin Əhməd deyir: "**Uqbə bin Mukram əl-Ammi mənə rəvayət etdi; dedi: əl-Valid bin Xalid bin Saxr, yəni Əbul-Abbas əl-Arabi bizə Şu'bədən belə dediyini rəvayət etdi: Əyyub mənə dedi: "Xiləs'dən bir şey rəvayət etmə, çünki o bir sahəfidir.**"[185]
Bu rəvayəti qeyd etdikdən sonra sözünü etdiyimiz müşahidənin nədən ibarət olduğunu izah etmək istəyirik. Əyyub əs-Sixtiyəni bir hədis eksperti olaraq dövrünün digər hədis ravisi Xiləs bin Amr'ı sahəfi olmaqda ittiham edir. Burada belə bir sual vermək doğru olar: bəs o dövrdə sahəfi kimə deyirdilər? Burhənuddin əl-

184. "Tərixu Bağdad", 9/385;
185. "əl-İləl va Mərifətur-Ricəl", 1/364;

Buqa'i (h. 885) deyir: "**əs-Sağani "Məcmə'ul-Bəhreyn" kitabında dedi: "Sahəfi səhifəni oxuduqda xəta edənə deyilir...**"[186]

Bu, islam elmlərində söz sahibi olan mütəxəssislər yanında sözün istifadədəki ümumi mənasıdır. Ancaq sözün bir də mühəddislər yanında xüsusi bir mənası vardır. Onlar "sahəfi" sözünü hədisi şeyxlərin ağzından eşitmədən səhifələrdən, kitablardan götürənlərə deyirdilər. Müsəlman tarixinin ilk əsrlərində yazıda nəinki hərəkələr, hətta diakritik işarələr belə istifadə edilmirdi. Bu o anlama gəlir ki, təcrübəsi olmayan kəslər hərfləri bir-biriləri ilə səhv salırdılar, sözü xətalı oxuyurdular. əl-Uqeyli deyir: "**Əhməd bin Əli əl-Əbbər bizə rəvayət etdi; dedi: Mucəhid bin Musa'dan Həmməd bin Amr ən-Nəsibi haqqında soruşdum. Dedi: "Onun yanına getdim və Zeyd bin Rufey'in Abdullah'dan rəvayətlərini rəvayət edirdi. Ona dedim: "Mənə Xuseyf'in kitabını çıxar göstər!" O da mənə Huseyn'in kitabını çıxardı. Gördüm ki, o, Xuseyf ilə Huseyn'i bir-birindən ayıra bilmir.**"[187]

əl-Həsən bin Abdilləh əl-Askəri də "Təshifət əl-Muhəddisin" kitabında bu xəbəri zikr edir və sonunda Mucəhid bin Musa'nin bu sözünü də qeyd edir: "**Buna görə də onu tərk etdim.**" Daha sonra bu rəvayətə belə bir şərh verir: "**Görmürsənmi ki, bu adam adda xəta etdikdə və ona laqeyd yanaşdıqda Mucəhid bin Musa – və o, fəzilətli bir alimdir – həmin adamın hədisini tərk etdi və ondan hədis rəvayət olunması üçün uyğun görmədi.**"[188]

Bəli, o dövrdə ən kiçik xətalara görə hədis rəvayət edənləri tənqid edən və onlardan hədis rəvayət etməkdən imtina edən alimlərimiz olub. Ona görə də elm məclislərində yazılmış hədisləri şeyxə, yəni hədis müəlliminə ərz etmədən başqasına rəvayət etmək qadağan edilirdi. Ərz etmək isə ya yazdıqları hədisləri bir daha müəllimin ağzından eşitmək və düzəliş etmək ya da tələbənin öz yazdıqlarını şeyxinə, yəni müəlliminə oxuması və onun düzəlişlər etməsi yolu ilə olurdu. Hədis alimi Şəmsuddin əs-Səxavi (h. 902) "əl-Ğayə fi Şərhil-Hidəyə" kitabında bəzi hədislərdə bu səbəblə baş vermiş xətalara misal verdikdən sonra deyir: "**Bu xətaların çoxu səhifələrə tabe olanlar-**

---

186. "ən-Nukətul-Vafiyyə bimə fi Şərhil-Əlfiyyə", 2/225;

187. "əd-Duafə əl-Kəbir", 1/308 (376);

188. "Təshifətul-Muhəddisin", 1/10;

**da baş verib. Daha əvvəl də keçdiyi kimi (ilk alimlərimiz) deyiblər: “Elmi sahəfidən öyrənməyin!” Mənası isə - əl-Xalil’in dediyinə görə - budur ki, sahəfi, səhifələr ona qarışıq gəldiyi üçün onları oxumaq yolu ilə xətalar rəvayət edən kəsdir. Başqaları isə deyiblər ki, bu sözün kökü ondan qaynaqlanır ki, bir qrup insan elmi, səhifələrdən götürürdülər və o səhifələri alimlərə ərz etməmişdilər. Beləliklə də rəvayət etdiklərində dəyişikliklər baş verirdi və buna görə də deyirdilər: “onlar təshif ediblər”, yəni səhifələrdən rəvayət ediblər...**”[189]

Xiləs bin Amr’ın misalına geri qayıdaq. Onun sahəfi olmaqla ittiham olunmasının səbəblərinə baxmaq lazımdır. Xiləs tabi’in nəslinin nümayəndələrindən biridir, lakin Əli bin Əbi Talib və Osman bin Avfan kimi böyük səhabələrdən hədis eşitməyib. Buna baxmayaraq Əlidən və Osmandan hədis rəvayət edib. İmam Əhməd deyir: “**Xiləsin Əlidən rəvayəti bir kitabdır.**”[190] Qəsdi budur ki, Xiləs əslində Əli bin Əbi Talibdən hədis eşitməyib, lakin Əlidən rəvayət etdikləri əlinə keçmiş bir kitabdan rəvayət etdiyi hədislərdir. Əbu Hətim ər-Razi deyir: “**Xiləs bin Amr haqqında deyirlər ki, onun əlinə Əli (bin Əbi Talib)dən səhifələr keçib.**”[191] Səhabələri görmüş bu şəxs ilk əsrdə yaşamış alimlərimizdəndir. Əyyub əs-Sixtiyəni də onunla eyni zamanda yaşayıb və görə bilirik ki, o dövrdə artıq “sahəfi” sözü bir termin olaraq istifadə edilirdi. Buradan çıxara biləcəyimiz nəticə budur ki, o vaxt hədislərin səhifələrə yazılması çox adi bir hal idi, amma o səhifələrin içindəki hədisləri rəvayət edən şeyxlərə ərz edilməsi vacib hesab olunurdu, onlardan səhifədəki hədislər şifahi olaraq eşidilməli idi. Əks təqdirdə gördüyümüz kimi səhifələri sahiblərinə ərz etməyən tələbələr şiddətli tənqid olunurdu. Said bin Abdilaziz ət-Tənuxi (h. 90-167) deyir: “**Belə deyərdilər: Elmi sahəfi’dən öyrənməyin və Quranı da mushafidən öyrənməyin.**”[192] Bu sözü Əbu Əhməd əl-Askəri “Təshifət əl-Muhəddisin” kitabında həm də Süleyman bin Musa əl-Əşdəq’dən də (vəfatı hicri 119) rəvayət edir. Sahəfidən hədisləri öyrənməyi, mushafidən isə Quranı

189. “əl-Ğayətu fi Şərhil-Hidəyəti fi İlmir-Rivayə”, səh: 224;

190. əl-Uqeyli, “əd-Duafə əl-Kəbir”, 2/28;

191. “əl-Əbətilu val-Mənəkir vas-Sihəhu val-Məşəhir”, 2/217;

192. İbn Əbi Hətim, “əl-Cərh vat-Tədil”, 2/31;

öyrənməyi qadağan edirdilər. Əgər sahəfilər, yəni elmi şeyxlərdən deyil də, kitablardan, səhifələrdən öyrənənlər çox olmasaydı o dövrün alimləri bu cür xəbərdarlıqlar etməzdilər.

## Elm məclislərində yazı

Yazı ilə əlaqəli bəzi önəmli özəlliklərə diqqət çəkmək istəyirəm. İlk öncə bilmək lazımdır ki, hədis müəllimləri tələbələri arasında uşaqların olmasında çox maraqlı idilər, çünki yazmaq tərzini uşaqlarda inkişaf etdirmək gələcəyində usta hədis mütəxəssisləri hazırlamağa zəmanət verirdi. Ona görə də hədisləri yazmaq ənənəsi uşaq çağlarından öyrədilirdi. əl-Hafiz əz-Zəhəbi deyir: "**Qazi Abdussaməd bin Said (tarix kitabında) deyir: "Muhəmməd bin Auf'u belə deyərkən eşitdim: "Uşaq ikən kilsədə top oynayırdım və top (məscidə) daxil oldu, əl-Muafi bin İmran əl-Himsi'nin yanına düşdü. Mən də onu götürmək üçün daxil olduqda mənə dedi: "Sən kimin oğlusan?" Dedim: "Auf bin Sufyan'ın oğluyam." Dedi: "Atan bizim qardaşlarımızdan idi, bizimlə birlikdə hədis və elm yazardı və sənə də yaraşan atanın getdiyi yol ilə getməkdir." Anamın yanına getdim, olanları xəbər verdim. Dedi: "Doğru söyləyib, o sənin atanın dostlarından biridir." Mənə köynək və izar geyindirdi və sonra əlimdə mürəkkəb qabı və kağız ilə əl-Muafi'nin yanına gəldim. Mənə dedi: "Yaz! İsmail bin Ayyaş bizə Abdu Rabbih bin Suleyman'dan rəvayət etdi və dedi: "Ummud-Dərdə mənim üçün lövhəmdə yazdı: "Elmi az yaşından tələb edin və onunla böyüdükdə əməl edin, çünki hər məhsul toplayana öz əkdiyi düşəcək.**"[193] Diqqət çəkdiyimiz bu xüsusiyyətin hələ səhabə dönəmindən başladığını görə bilirik, çünki Ummud-Dərdə qadın səhabələrdəndir. Bu adət daha sonrakı nəsillərdə də bu şəkildə davam etmişdir. Əbu Bəkr bin Ayyaş deyir: "**Biz əl-Aməş'in yanında idik və ətrafında toplanıb hədis yazırdıq və yanımızdan bir kişi keçdi və (əl-Aməş'ə) dedi: "Ey Əbu Muhəmməd, ətrafına topladığın bu uşaqlar kimlərdir?" Dedi: "Sənin üçün dinini qoruyub saxla-**

193. "Siyər Əaləmin-Nubələ", 12/615;

**yanlar bunlardır.**"[194] əl-Aməş və onun kimi dövrünün böyük hədis alimləri bu işi uşaqlara öyrətməyin əhəmiyyətini anlayırdılar. Çünki uşaqlar üçün əzbərləmək daha asan idi, həmçinin erkən yaşdan onlara yazmağı öyrətmək böyüdükdə işlərini asanlaşdırırdı. Əlavə etməliyik ki, bu üslub səhabə dönəmindən başlasa da o dövrdə geniş vüsət tapmamışdı, lakin tədricən bir normaya çevrildi. Abdullah bin Əhməd deyir: "**Əbu Bəkr bin Əbi Şeybə mənə rəvayət etdi; dedi: İsmail bin Ayyəş bizə Hişəm bin Urva'dan belə dediyini rəvayət etdi: "Atam mənə dedi: "(Hədisi) yazdınmı?" Dedim: "Bəli." Dedi: "(Onu əsli əlyazmasına) ərz etdinmi?" Dedim: "Xeyr." Dedi: "O zaman yazmamısan.**"[195] Səhabə övladı Urva bin əz-Zubeyr'in öz oğluna hədisi köçürdükdən sonra onu əslinə ərz etməyin, yəni əsli ilə müqayisə etməyin önəmini öyrətməsi bu xəbərdə öz əksini tapıb. Bununla da erkən bir çağdan uşaqlara yazdıqlarını dəqiqləşdirməyin yolları öyrədilirdi və onlarda belə önəmli bir adət formalaşdırılırdı.

Müəllimlərin uşaqlara öyrətmək tərzləri də fərqli idi. Vahid bir təlim və tərbiyə sistemi mövcud deyildi. Abdullah bin Əhməd deyir: "**Atam (Əhməd bin Hənbəl) dedi: "Abdə bin Süleyman əl-Kələbi'ni gördüm, yanında oğlan uşağı var idi və ona hədis imla edərək lövhələrinə yazdırardı. İmla edib qurtardıqda ona dedi: "Oxu!" O da yaxşı oxumadı. Buna görə də dedi: "Yazdığını sil!" Sonra oxumağı yaxşı bacarana qədər ona yenidən imla etdi." Atam onu xeyir ilə təriflədi və onu xeyir ilə yad etdi.**"[196] Burada müəllimin şagirdinə öyrətmək istədiyi yazdığını oxumaq idi. Latın və ya kiril əlifbası ilə yazdığımız üçün yazdığımızı da oxumağımız bizim üçün asandır. Amma qədim zamanın ərəb yazı sistemi ilə yazdıqda oxumaq asan olmurdu, çünki yazanların hamısı hərəkə və nöqtələrdən istifadə etmirdilər. Bu da yazılanı oxumağı çətinləşdirirdi. Əgər yazı hərəkəsiz və diakretik nöqtələrsiz yazılmışdısa onu doğru oxumağın yolu yazılanı əzbərləmək idi. Çox maraqlıdır ki,

---

194. ər-Raməhurmuzi, "əl-Muhəddis əl-Fəsil", səh: 193; ər-Raməhurmuzi bunun isnadını bu cür zikr edir: "Bəkr bin Əhməd bin əl-Fərac əz-Zuhri mənə rəvayət etdi; Yezid bin Mihran Əbu Xalid bizə rəvayət etdi: Əbu Bəkr bin Ayyəş bizə rəvayət etdi..."

195. "əl-İləl va Mərifətur-Ricəl", 2/453 (3015);

196. "əl-İləl va Mərifətur-Ricəl", 2/73 (1590);

bu misalda biz daha öncəki bölmələrdə qeyd etdiyimizin təsdiqini tapırıq. Hədisi yazmaq onun saxlanılmasında və referans kimi istifadə edilməsində mötəbər bir vasitə olduğu kimi həm də əzbəri gücləndirmək üçün gözəl bir metod idi.

Hədis məclislərində yazıda tələbələr bir-birilərindən seçilərdilər. Bəziləri xəttinin gözəlliyi ilə tanınırdı, digərləri sürətli yazaraq çatdırmaq və deyilənlərin hamısını yazmaq qabiliyyəti ilə tanınırdı. Misal olaraq Əbul-Həsən Adəm bin Əbi İyas əl-Asqaləni'ni (vəfatı hicri 220) zikr edə bilərik. İbn Əbi Hətim deyir: "**Atamı belə deyərkən eşitdim: Adəm bin Əbi İyas'ın məclisində iştirak etdim. Bir nəfər ona dedi: "Əhməd bin Muhəmməd bin Hənbəl'dən eşitdim ki, ondan Şubə haqqında soruşdular: "Bağdadda onlara imla edərdi yoxsa sadəcə oxuyardı?" Dedi: "Oxuyardı və dörd nəfər yazardı; Adəm və Əli ən-Nəsəi." Adəm dedi: "Doğru söyləyib. Mən yazıda sürətli idim və yazardım və insanlar məndən köçürərdilər. Şubə Bağdada gəldikdə orada qırx məclisdə rəvayət etdi; hər məclisdə yüz hədis rəvayət edərdi. Mən onlardan yalnız iyirmisində iştirak edə bildim və iki min hədis eşitdim. İyirmi məclisi isə qaçırdım.**"[197] Xəbərin maraqlı olan tərəfi budur ki, xəbər bizi oxumaq ilə imla arasındakı fərq ilə tanış edir. İmladan fərqli olaraq şeyxin qiraəti yavaş olmurdu. İmlada isə şeyx sözləri bir-bir tələffüz edərək yazmaqlarını gözləyir. Ona görə də İmam Əhməd'dən maraqlanırlar ki, Şubədən hədisləri necə yazıblar. Mühəddislərin imlanı tərk edib qiraətə üstünlük verməkləri adətən başqa şəhərlərə səfər edərək orada hədis məclisləri açmaqları ilə əlaqəli idi. Çünki müvəqqəti qalacağı müddətdə məclislərində hamının ehtiyacını qarşılamaq üçün hədisləri oxumağa üstünlük verirdilər. Buna görə də Hişəm bin Yusuf əs-San'ani (vəfatı hicri 197) deyir: **"(Sufyan) əs-Səvri Yəmənə gəldi və dedi: "Mənə sürətli yazmağı bacaran bir katib tapın!" Onlar da məni çağırdılar və (Sufyanın hədislərini) mən yazardım.**"[198] Hişəm ibn Yusuf rəvayətlərindəki dəqiqliyi ilə tanınır.

---

197. "əl-Cərh vat-Tədil", 2/268;

198. "əl-Cərh vat-Tədil", 9/71;

## Hədisi yazılmaz

Bura qədər təqdim etdiyimiz məlumatlardan artıq o dövrün hədis məclisləri, hədislərin rəvayət olunma şəkilləri və hədislərin yazılması haqqında müəyyən dərəcədə təsəvvür formalaşmalıdır. Hədislərin yazılmasının yayğın bir hal və hədis məclislərində zəruri bir vasitə olduğunu göstərən ən aşkar misallardan birini də burada təqdim etmək istəyirik. Hədis rəvayət edənlər tənqid olunduqda onlar haqqında bəzən "**hədisləri yazılmaz**", bəzən də "**etibarlı ravi deyildir, amma hədisləri yazılar**" deyərdilər. Misal üçün Yəhyə bin Main deyir: "**Muhəmməd bin Cabir, hədisi yazılmaz, siqa deyildir.**"[199] Əli bin əl-Mədini deyir: "**İsmail bin Muslim əl-Məkki; hədisi yazılmaz.**"[200] Bir başqa yerdə Abdulvahhəb bin Mucahid haqqında deyir: "**Siqa deyildir və hədisi də yazılmaz.**"[201] Əbu Hətim ər-Razi deyir: "**Əbu Quteybə çoxlu xətalar edir, (buna baxmayaraq) hədisləri yazılar.**"[202] Bir başqa yerdə deyir: "**İmran; və o, Əbu Yəhya ət-Tavil'dir, kufəlidir, güclü deyildir, (amma) hədisi yazılar.**"[203] Əbu Yusuf əl-Fəsəvi deyir: "**Yusuf Beyruti; hədisi yalnız bilinsin deyə yazılar.**"[204] Yəhyə bin Main deyir: "**Umeyr bin İshaq bir şeyə dəymirdi, lakin hədisi yazılar.**"[205] Muhəmməd bin İsmail əl-Buxari deyir: "**Əş'as Əbur-Rabi' əs-Səmmən ... onların nəzərində o, hafiz deyildir, (amma) hədisi yazılar.**"[206] Bu misalları uzatmaq olar, tarix və ricəl kitabları bu misallar ilə doludur. Alimlərin işlətdikləri bu terminlər üzərində düşünsək anlayacağıq ki, hədisləri müəllimlərin məclislərində yazmaq o qədər adi və yayğın bir hal idi ki, kiminsə hədisinin qəbul olunmayacağını ifadə etmək üçün "hədisi yazılmaz" deyərək onu etibardan salırdılar.

---

199. "Min Kələm Əbi Zəkəriyyə Yəhyə bin Main fir-Ricəl", səh: 116 (372)
200. Əli bin əl-Mədini, "əl-İləl", səh: 64
201. "Suələt İbn Əbi Şeybə", səh: 111
202. İbn Əbi Hətim, "Kitəbul-İləl", 2/540;
203. "Kitəbul-İləl", 3/530;
204. "əl-Mə'rifə vat-Tərix", 2/431;
205. əd-Dəvri, "Tərixu İbn Main", 4/250;
206. "əd-Duafə əs-Sağir", səh: 28;

# PEYĞƏMBƏRİN DÖVRÜNDƏ YAZI

Əlbəttə ki, mövzuya hər şeydən öncə peyğəmbərimizin – aleyhissalətu vassələm – dövründən başlamalıyıq. Yenə də yada salmalıyıq ki, şərqşünasların və zamanımızda onların çaldığı havanın sədaları altında rəqs edən saxtakar milli ilahiyyatçıların ortaya atdıqları iddia budur ki, hədislər ilk iki əsr ərzində yazılmayıb. Onlara görə hədislərin yazılması ikinci əsrdən sonra başlayıb. Biz bu iddianın nə qədər doğru olduğunu yoxlamaq üçün peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – bəşəriyyətə Rəbbinin risaləsini təbliğ etdiyi dövrdən başlayacağıq. Bunun üçün önəmli bir suala cavab vermək lazımdır: Allahın elçisi – aleyhissalətu vassələm – hədislərin yazılmasına icazə vermişdimi yoxsa onun zamanında hədislərin yazılması qadağan edilmişdi? Ümumiyyətlə onun sağlığında yazılmış hədislər mövcud idimi?

## Sünnənin yazılması qadağan edilmişdimi?

Hər şeydən öncə burada bir suala cavab verməyimiz lazımdır. Mövzu haqqında araşdırma etmiş hər bir kəs bu sual ətrafında düşüncələrini paylaşıblar, çünki sual mövzunun özəyini təşkil edir: Muhəmməd peyğəmbər – aleyhissalətu vassələm – sünnətin yazılmasını qadağan etmişdimi? Bu məsələ əslində qədimdə öz həllini tapmış bir məsələdir. əl-Xatib əl-Bağdadi (h. 392-463) “Təqyidul-İlm” adlı kitabını məhz bu mövzuya həsr edib. Amma bəzi müstəşriqlər hədis qaynaqlarına kölgə saldığı üçün zamanımızda bu sual yenidən canlanıb.

Əbu Said əl-Xudri deyir ki, "**peyğəmbər – salləllahu aleyhi va səlləm – deyib: "Məndən yazmayın! Kim məndən Qurandan başqa bir şey yazıbsa qoy onu silsin!**"[207] İmam Muslim və başqalarının rəvayət etdiyi bu hədisin zahirindən peyğəmbərin hədislərinin yazılmasını qadağan etdiyi anlaşılır. Sələf adlandırdığımız ilk nəsil müsəlmanların bir hissəsi hədisin zahirinə əsaslanaraq hədisləri yazmağı doğru saymayıblar, lakin ilk nəslin əksər müsəlmanları sünnəti yazmağın icazəli olduğuna inanıblar. Sonrakı dövrlərdə isə bu barədə müsəlmanlar arasında heç bir fikir ayrılığı qalmamış, əksinə ikinci və üçüncü əsrdən başlayaraq ümmətin ən bariz şəxsiyyətləri bu fikir üzərində birləşiblər.

Sünnəti yazmağın qadağan edilməsi haqqında gəlmiş ən səhih hədis Əbu Saiddən zikr etdiyimiz yuxarıdakı hədisdir, bununla belə alimlər onun mərfu və ya məvquf olmasında ixtilaf ediblər.[208] Eyni mənada Əbu Hureyra və digərlərindən rəvayət olunmuş, yəni hədis yazmağı qadağan edən digər hədislər isə isnad baxımından səhih deyildir. İstənilən halda sözü gedən bu hədislər heç bir şəkildə sünnəti yazmağa icazə verən hədislərin qarşısında dəlil sayıla bilməz, çünki buna icazə verən hədislər sübut baxımından daha güclü və say baxımından daha çoxdur. əl-Buxari və Muslim'in "əs-Sahih" kitablarında rəvayət etdiyinə əsasən peyğəmbərimiz – aleyhissələm – Məkkədə insanlara xitab edərkən "**Əbu Şəh – yəmən əhlindən bir kişi – qalxaraq dedi: "(Bu dediklərinizi) mənim üçün yazın, ey Allahın elçisi!" Allahın elçisi də - salləllahu aleyhi va səlləm – dedi: "Əbu Şəh üçün yazın!**"[209] Burada peyğəmbərimiz özü sünnətinin yazılmasını əmr edir. Qarşıda qeyd edəcəyimiz kimi səhabələrdən Abdullah bin Amr bin əl-As peyğəmbərin – aleyhissələm – hədislərini yazmaq üçün xüsusi icazə almışdı. Ondan gəlmiş xəbərlər göstərir ki, onunla bərabər peyğəmbərin – salləllahu aleyhi va səlləm – sünnətini yazıya köçürən başqa səhabələr də var idi. Həmçinin zəkat əhkamı peyğəmbərimizin əmri ilə yazılmışdı və daha sonra Əbu

207. "Sahih Muslim" (3004)

208. Əgər məvquf olduğunu desək bunun anlamı budur ki, bu sözlər peyğəmbərin yox Əbu Said əl-Xudri'nin öz sözləridir. Əgər mərfu olduğunu desək peyğəmbərin sözləri olduğunu qəbul etməliyik.

209. əl-Buxari (2434, 6880); Muslim (1355)

Bəkr xəlifə olduqda həmin yazını Ənəs bin Malikə göndərir. Üstəlik Vail bin Hucr vasitəsi ilə içində İslamın ərkanı, zəkatın fərziyyəti, zinanın və içkinin qadağası qeyd edilmiş bir yazını Hədramut əhlinə göndərmişdi, eyni şəkildə digər səhabə Amr bin Həzm ilə miras, qan pulu və digər sünnətləri ehtiva edən bir başqa yazını Yəmən əhlinə göndərmişdi.

Ona görə də alimlərimiz hədisləri yazmağın ittifaq ilə icazəli olduğunu deyiblər və Əbu Said əl-Xudri'nin hədisində keçən xitabın izahının da qayğısına qalıblar. Hicri dördüncü əsrin alimlərindən Əbu Süleyman əl-Xattabi (h. 319-388) deyir: "**Bunun mənası – doğrusunu Allah bilir! – budur ki, nəyinsə Quran ilə birlikdə bir səhifədə yazılmasını və ya onların bir yerdə toplanmasını xoş görməmişdir...**"[210] Bir başqa alim Əbu Abdilləh əl-Məziri (vəfatı h. 536) buyurur: "**Bu qadağa haqqında alimlərdən bəzisi deyib ki, (peyğəmbər) sadəcə hədisin Quran ilə birlikdə eyni səhifədə yazılmasını qadağan etmişdi ki, onunla qarışmasın və oxuyan səhv salmasın!**"[211] Təqdim olunmuş bu izah müasir zamanımızda bir çox alimin də qəbul etdiyi izahdır.

Amma islam alimlərinin əksəriyyətinə görə həqiqətən də İslamın əvvəlində hədislərin yazılması qadağan edilmişdi. Onlara görə bunun səbəbi hədis yazmaqla məşğul olaraq Qurandan uzaq düşmək qorxusu idi. əl-Xatib əl-Bağdadi deyir: "**Sabit olub ki, ilk nəsillərdən yazmağı xoş qarşılamayanlar bunu Allahın Kitabı ilə başqa bir şeyin eyniləşdirilməməsi üçün və ya başqa şeylərlə məşğul olub Qurandan uzaqlaşmamaqları üçün edirdilər. Qədim kitabların da saxlanılması qadağan edilirdi, çünki onların içində nəyin haqq və nəyin batil, nəyin doğru və nəyin fasid olduğu bilinmirdi, bununla belə Quran o kitablara ehtiyac buraxmırdı və onların üzərində hökm edirdi.**"[212] Yazmağa etiraz edən səhabələrin sözlərinə nəzər salsaq görəcəyik ki, onlar insanların Quranla məşğul olmasına rəğbət göstərdikləri üçün, Quranın tərk olunmağından qorxduqları üçün buna etiraz edirdilər. Digər tərəfdən isə başqa səhabələr bu qorxunun və riskin mövcud olma-

210. əl-Xattabi, "Ğaribul-Hədis", 1/632;

211. "əl-Mu'lim bi Fəvaid Muslim", 3/385;

212. "Təqyidul-İlm", səh: 61;

dığına inandıqları üçün hədisləri yazmağa müsbət yanaşırdılar. Əgər peyğəmbər – aleyhissalətu vassələm – hədisləri yazmağı xüsusi bir göstəriş ilə qadağan etsəydi o halda səhabələr bu mövzuda fikir ayrılığında olmazdılar və hədislərin yazılmasına icazə verməzdilər. Tarixi xəbərlər tamamilə bunun əksini göstərir; hədislər onların sağlığında yazılır və müzakirə olunurdu.

Burada misirli mütəfəkkir Muhəmməd Raşid Rida'nın rəyinə də diqqət çəkmək lazımdır. O, bu barədə gəlmiş hədisləri tamamilə fərqli şəkildə ələ alıb. Muhəmməd Raşid Rida'nın təfsir kitabında qarşıya qoyduğu fikrə görə hədislərin yazılmasına peyğəmbərin icazə verməsi İslamın əvvəlki dövründə olub və guya peyğəmbər – aleyhissələm – ömrünün sonunda hədislərin yazılmasını qadağan edib. Dində modernizm və reform təmayülü ilə tanınmış bu misirli mütəfəkkirin bu rəydə olması qəribə qarşılanmamalıdır, çünki hədisləri şəxsi rəyə əsasən inkar etmək bu rəyə əsasən daha asan başa gəlir. Ona görə də Əbu Rayyə kitabında fikirlərinə dəstək tapmaq üçün Raşid Rida'dan bu şəkildə nəqllər gətirib. Lakin tarix bu iddianı qəti şəkildə çürüdür, çünki hədisləri yazmağa izn verən xəbərlər peyğəmbərin – aleyhissalətu vassələm – ömrünün sonuncu illərini əhatə edir. Üstəlik on dörd əsr ərzində heç bir mütəxəssis alim deməyib ki, peyğəmbər birinci yazmağa izn verib və ömrünün sonunda yazmağı qadağan edib. Kitabda qarşıda keçən məlumatlar təkidlə və israrla hədislərin peyğəmbərin – aleyhissalətu vassələm – zamanında yazıldığını göstərir və bu nöqtədə insaf sahiblərində heç bir şəkk buraxmır.

## Dövrün şahidləri

Məlumdur ki, sünnətin ilk yazılı formaları səhabə zamanında mövcud olub və bir çox səhabə peyğəmbərimizin – aleyhissələm – hədislərini qələmə alıblar. Məşhur hədisdə peyğəmbərimiz yəmənli səhabisi Əbu Şəh üçün vəda xütbəsini yazmağı buyurmuşdu. Səhabələr içində hədisləri yazmaqla ən məşhur olan səhabə Abdullah bin Amr bin əl-As idi. Mə'mər bin Raşid "əl-Cami" kitabında Həmməm bin Munəbbih'dən rəvayət edir ki, o, Əbu Hureyra'nı belə deyərkən eşitmişdir: "**Muhəmmədin – salləllahu aleyhi va səl-**

**ləm – səhabələri arasında Abdullah bin Amr'dan başqa heç kim mənim qədər hədis bilmirdi, o isə (hədisləri) yazırdı və mən yazmırdım.**"[213] Bu sözlərdən anlaşılır ki, Abdullah bin Amr bin əl-As peyğəmbərimizin – aleyhissələm – sağlığında onun hədislərini yazardı. Əbu Davud "əs-Sünən" kitabında isnadı ilə Yusuf bin Məhək'in Abdullah bin Amr'dan belə nəql etdiyini rəvayət edir: "**Allahın elçisindən – salləllahu aleyhi va sələm – eşitdiyim hər bir şeyi yazardım; onları əzbərləmək istəyirdim. Qureyşlilər mənə bunu qadağan etdilər və dedilər: "Eşitdiyin hər bir şeyi yazırsanmı? Halbuki Allahın elçisi – salləllahu aleyhi va səlləm – bir bəşərdir, qəzəbli olanda da, razı olanda da danışır." Mən də yazmaq işini dayandırdım və bunu Allahın elçisinə – salləllahu aleyhi va səlləm – söylədim. O isə barmağı ilə ağzına işarə edərək dedi: "Yaz, nəfsimi əlində tutana and olsun ki, burada haqdan başqa bir şey çıxmır.**"[214] Muhəmməd bin İshaq yolu ilə rəvayət olunmuş xəbərdə isə Abdullah bin Amr deyir: "**Dedim: "Ey Allahın elçisi, səndən eşitdiyim hər bir şeyi yazımmı?" Dedi: "Bəli." Soruşdum: "Razılıq və qəzəb halında olsan belə?" Dedi: "Bəli, çünki mən bu halların heç birində haqdan başqa bir şey söyləmirəm.**"[215] Bu xəbərlər açıq şəkildə ifadə edir ki, peyğəmbərin sünnəti hələ sağlığında qələmə alınırdı.

Hətta xəbərlərdən anlamaq olur ki, Abdullah bin Amr ilə yanaşı başqa səhabələr də Allahın elçisinin – aleyhissələm – sözlərini qələmə alırdılar. əd-Dərimi müsnədində Əbu Qabil'in belə dedyini rəvayət edir: "**Abdullah bin Amr'ı – radiyallahu anhumə - belə deyərkən eşitdim: "Biz Allahın elçisinin – salləllahu aleyhi va səlləm - ətrafında durub yazarkən Allahın elçisindən – salləllahu aleyhi va səlləm – soruşdular: "İki şəhərdən hansı birinci fəth olunacaq? Konstantinopol yoxsa Roma?" Peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Yox, birinci Herakl'ın şəhəri**"[216] Bu xəbər yuxarıda gətirdiyimiz iddianı təsdiqləyir, çünki

---

213. "Musannəf Abdirrazzəq", 11/259;

214. "Sünən Əbi Davud", 3646. İsnadı səhihdir.

215. "Camiu Bəyənil-İlmi va Fadlihi", 388, isnadı həsəndir.

216. "Sunən əd-Dərimi", (503) əd-Dərimi bu xəbəri Osman bin Muhəmməd – Yəhyə bin İshaq – Yəhyə bin Əyyub – Əbu Qabil – Abdullah bin Amr isnadı ilə rəvayət edir. Osman

peyğəmbərin – aleyhissələm – sözlərinin bir qrup halında yazıldığını xəbər verir. Onun hüzurunda yazılmış yazılardan bəzilərinin məqsədi uzaq yerlərdəki müsəlmanlar üçün ən önəmli şəriət məsələlərində həyat rəhbəri rolunu oynaması olub. Bu yazıların içərisində ən məşhuru Amr bin Həzm'in nüsxəsi sayılır.

## Amr bin Həzm'in nüsxəsi

Amr bin Həzm bin Zeyd bin Ləuzən əl-Xazraci əl-Ənsari – radiyallahu anhu – peyğəmbərin – aleyhissalətu vassələm – mübarək səhabələrindəndir. Peyğəmbər onu Nəcran üzərində vali təyin etmişdi. Yəmən əhlinə yazdığı məşhur məktubunu da məhz Amr bin Həzm vasitəsi ilə onlara göndərmişdi. Həmin məktubun mətni bu gün sünnət kitablarında qorunulmuşdur və məktubun əvvəli bu sözlər ilə başlayır:

“**Muhəmməd peyğəmbərdən Şurahbil bin Abdi Kuləl, əl-Haris bin Abdi Kuləl, Nueym bin Abdi Kuləl'ə....**”

Bu məktubda peyğəmbərimiz yəmənlilərə qan pulu, miras və zəkat kimi bir çox önəmli hökmləri izah etmişdir. Məktubun əhəmiyyəti əvəzsizdir, hətta Ömər xəlifə olduğu dövrdə kəsilmiş barmaqlar üçün qan pulunu təyin etdikdə ona Amr bin Həzm'in məktubunu gətirirlər və o məktubda artıq peyğəmbərin bütün barmaqlar üçün eyni təzminatı ödəməyə hökm etdiyini gördükdə öz qərarını dəyişir.

Bu məktubun Amr bin Həzm'in ixtiyarında olduğunu və daha sonra övladlarına keçdiyini bilirik. Daha sonrakı dövrlərdə İbn Şihəb

---

bin Muhəmməd (160-239) Osman bin Muhəmməd bin əl-Qadi Əbi Şeybə'dir, böyük hafiz Əbu Bəkr bin Əbi Şeybə'nin doğma qardaşıdır. əl-Buxari və Muslim “əs-Sahih” kitablarında ondan hədis rəvayət edirlər və siqa olmasında şəkk yoxdur. Yəhyə bin İshaq (140-210) Əbu Zəkəriyyə əs-Seyləhini'dir. Əslən iraqlıdır. Əhməd, İbn Main, İbn Sad və başqaları onun siqa olduğunu deyiblər. əz-Zəhəbi onu “hafiz, imam, səbt” olaraq vəsf edir. İmam Muslim'in “əs-Sahih” kitabındakı ravilərindəndir. Yəhyə bin Əyyub (vəfatı 168) mühəddis alimdir, Misirin fəqihlərindən sayılır və Əbul-Abbas əl-Ğafiqi kunyəsi və nisbəti ilə tanınır. Hədisləri həsən dərəcəsindədir. Əbu Qabil (vəfatı 128) isə Əbu Qabil Həyy bin Həni bin Nadir əl-Məafiri'dir, misirli mühəddisdir. Əslən yəmənlidir, Misirə köçmüş və oranı özünə vətən etmişdir. Aqabə bin Amir, Abdullah bin Amr və başqalarından hədis rəvayət edib. İmam Əhməd onun siqa olduğunu deyir.

əz-Zuhri, Said bin əl-Museyyəb kimi tabii dövrünün böyük imamlarının bu məktub ilə bir-başa tanış olduqlarını tarixi qaynaqlardan oxuyuruq. Əbu Davud "əl-Mərasil" kitabında deyir: "**Vəhb bin Bəyən, İbnus-Sərh və Əhməd bin Said bizə rəvayət etdilər və dedilər: "İbn Vəhb bizə xəbər verdi; Yunus mənə bn Şihəb (əz-Zuhri) dən belə dediyini xəbər verdi: "Allahın elçisinin – salləllahu aleyhi va səlləm – Amr bin Həzm'i Nəcrana göndərərkən ona yazdığı məktubunu oxudum və məktub Əbu Bəkr bin Həzm'də idi...**"[217] ən-Nəsəi deyir: "**Əhməd bin Abdilvahid bizə xəbər verdi: Mərvan bin Muhəmməd bizə rəvayət etdi; dedi: Said – və o, İbn Abdilaziz'dir – bizə əz-Zuhri'dən belə dediyini rəvayət etdi: "Əbu Bəkr bin Həzm mənə Allahın elçisindən – salləllahu aleyhi va səlləm - dəridən hazırlanmış nazik bir parçada yazılmış məktub gətirdi...**"[218] əz-Zuhri'yə bu məktubu gətirən Əbu Bəkr bin Muhəmməd bin Amr bin Həzm olub, yəni səhabə Amr bin Həzm'in nəvəsidir. Həm də Mədinənin böyük alimlərindən olub, eyni zamanda Mədinədə əmirlik və qazilik edib. Daha sonra alimlərimiz bu nüsxədəki hədisləri hədis toplularına öz isnadları ilə qeyd ediblər.

Amrın bu yazısı sonrakı dövrlərdə rəsmi dairələr tərəfindən layiq olduğu etinanı tapır. Ömər xəlifə olduqda bu məktubun nüsxəsinin hazırlanmasını əmr etmişdi və daha sonra Ömərin nüsxəsi "Ömərin sədəqələr barəsindəki kitabı" ilə tanınıb və onun ailəsinin nəzarətində saxlanmışdır. İbnu Zəncəveyh "əl-Əmval" kitabında bununla bağlı bizə xəbər verir ki, "**Ömər bin Abdilaziz xəlifə olduqda Mədinəyə adam göndərərək Allahın elçisinin – salləllahu aleyhi va səlləm – Amr bin Həzm'ə sədəqələr (zəkat) barəsində yazdığı məktubu və Ömər bin əl-Xattab'ın kitabını istədi. Amr bin Həzm'in ailəsində Allahın elçisinin – salləllahu aleyhi va səlləm – sədəqələr barəsindəki kitabını və Ömərin ailəsində isə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – kitabının misli olan Ömərin sədəqələr haqqındakı kitabını tapdı. Hər iki kitabın da onun üçün nüsxəsi hazırlandı.**" İbnu Zəncəveyh daha sonra əlavə edir: "**(Həbib bin Əbi Həbib dedi: ) Amr bin**

217. "əl-Mərasil" (257)

218. "Sünən ən-Nəsəi", (4856)

**Hərim mənə rəvayət etdi ki, Muhəmməd bin Abdirrahmən'-dən həmin iki kitabda olanların nüsxəsini onun üçün hazırlamağı xahiş edib, o da onun üçün o kitabdakıları köçürüb...**"[219] İbnu Zəncəveyh növbəti xəbərdə İbn Şihəb əz-Zuhri'nin bu barədə belə dediyini rəvayət edir: "**Bu, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – sədəqələr haqqındakı kitabının nüsxəsidir və bu, Ömər bin əl-Xattab'ın ailəsində saxlanılır. Səlim bin Abdilləh onu mənə oxutdurdu və mən onu olduğu kimi əzbərlədim...**"[220] Anlaşılır ki, əz-Zuhri həm Amr bin Həzm'in original məktubunu onun nəvəsi Əbu Bəkr bin Muhəmməd'dən, həm də Ömərin nüsxəsini Ömərin nəvəsi Səlim bin Abdilləh'dən əldə edə bilib. ər-Raməhurmuzi deyir: "**əl-Huseyn bin Əhməd əl-Cuşəmi bizə rəvayət etdi: Kəsir bin Əbi Cəbir bizə rəvayət etdi: Ravvad bin əl-Cərrah bizə İbrahim bin Tahhan'dan, o da Ata bin Əbi Rabəh'dən belə dediyini rəvayət etdi: "İbn Həzm'in kitabında – hansını ki, peyğəmbər (salləllahu aleyhi va səlləm) yazıb - oxudum ki, "ağzı yaxalamaq və buruna su çəkmək dəstəmazdandır, bu ikisi olmadan tamamlanmır.**"[221] Bu rəvayətə görə Ata bin Əbi Rabəh də bu kitab ilə tanış idi və onun içindəki hədislərdən rəvayət edirdi. Bütün bunların işığında peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – yazdırdığı bu yazının/kitabın

219. "əl-Əmval", 2/800; İbnuz-Zəncəveyh bu xəbərin isnadı barəsində deyir: "Əbu Ubeyd dedi: Yezid bin Harun bizə xəbər verdi; Həbib bin Əbi Həbib bizə xəbər verdi; Amr bin Hərim bizə xəbər verdi; Muhəmməd bin Abdirrahmən əl-Ənsari mənə rəvayət etdi..." Əbu Ubeyd (157-224) məşhur imam əl-Qasim bin Səlləm əl-Həravidir və onun "əl-Əmval" adlı kitabı vardır ki, İbn Zəncəveyh o kitabdan nəql edir. Yezid bin Harun (118-206) Şeyxul-İslam Əbu Xalid əs-Suləmi'dir. Dövrünün ən böyük alimlərindən və imamlarından sayılır. Həbib bin Əbi Həbib'ə gəldikdə isə o, Həbib bin Yezid əl-Bəcəli'dir; atasının adı Yeziddir, Əbu Həbib kunyəsidir. Basralıdır və "Sahibul-Ənmət" ləqəbi ilə eyni adlı ravilərdən seçilir. Etibarlı ravi sayılır. Amr bin Hərim isə Amr bin Hərim bin Həyyan əl-Əzdi'dir, siqadır. Muhəmməd bin Abdirrahmən isə Əbur-Ricəl Muhəmməd bin Abdirrahmən bin Abdilləh bin Hərisə bin ən-Numən'dir. Mədinənin alimlərindəndir, siqadır. Ömər bin Abdilaziz'in Mədinədəki valisi olub.

220. Eyni məsdər; İbn Zəncəveyh bu xəbəri də Əbu Ubeyd'in kitabından Abdullah bin Saleh - əl-Leys bin Sad – Yunus – İbn Şihəb əz-Zuhri zənciri ilə nəql edir. Abdullah bin Saleh (137-223) misirin imamı əl-Leys bin Sad'ın (94-175) katibi olaraq tanınır və hər ikisi də etibarlı, siqa ravilər olaraq qəbul olunurlar. Yunus isə (vəfatı 159) Əbu Yezid Yunus bin Yezid bin Mişkən əl-Əyli əl-Quraşidir, tabiin dövrünün böyük alimlərindəndir, siqadır.

221. "əl-Muhəddis əl-Fəsil", səh: 501; Bu xəbərin isnadı zəifdir.

sonrakı nəsillər üçün qiymətli bir qaynaq olduğunu görmək olur və təkid ilə o dövrdə hədislərin yazıldığını təsdiqləyir.

Bu kitab öz dövründə o qədər məşhur və etibarlı sayılırdı ki, İslam alimləri onun peyğəmbərin – sallələllahu aleyhi va səlləm – yazdırdığı kitab olmasında şəkk etmirdilər. İmam əş-Şafi deyir: "**Muslim bin Xalid bizə İbn Cureyc'dən, o da Abdullah bin Əbi Bəkr'dən qan pulu haqqında peyğəmbərin – salləllahu aleyhi va səlləm – Amr bin Həzm üçün yazdığı kitabından rəvayət edir: "Canın qarşılığında yüz dəvə düşür." İbn Cureyc dedi: Abdullah bin Əbi Bəkrə sual verdim: "Bunun peyğəmbərin – salləllahu aleyhi va səlləm – kitabı olmasında şəkk edirsizmi?" Dedi: "Xeyr." Bunu İbn Uyeynə bizə İbn Tavus'dan, o da atasından rəvayət edib.**"[222]

Qarşıda Yəhyə bin Əbi Kəsir'in hədis yazmağı haqqında məlumat verdikdə Mədinənin imamlarından Yəhyə bin Said əl-Ənsari'nin Amr bin Həzm'ın nüsxəsini köçürərək ona göndərdiyini göstərəcəyik.

## Digər yazılar

Peyğəmbərimizin – aleyhissalətu vassələm – uzaq əyalətlərə göndərdiyi məktubları və yazıları Amr bin Həzm'in nüsxəsi ilə məhdudlaşmır. Səhih xəbərlər bizə başqa məktubların da mövcud olduğunu ifadə edir. İmam Əhməd bin Hənbəl deyir: "**Vaki' və İbn Cəfər bizə rəvayət etdilər; hər ikisi də dedi: Şu'bə bizə əl-Həkəm'dən, o da Abdurrahmən bin Əbi Leylə'dən rəvayət etdi. İbn Cəfər dedi: İbn Əbi Leylə'ni eşitdim ki, Abdullah bin Ukeym əl-Cuhəni'dən belə dediyini rəvayət etdi: "Biz Cuheynə'də qaldıqda və mən gənc oğlan ikən bizə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – bir kitab gəldi ki, "Ölü heyvanın nə dərisindən, nə də damarından yararlanmayın!**"[223]

222. "Musnəd əş-Şafi", səh: 347;

223. "Musnəd Əhməd", 31/74-75;

Abdullah bin Ukeym əl-Cuhəni kiçik səhabələrdən sayılır, bəziləri onun peyğəmbəri – salləllahu aleyhi va səlləm – görmədiyini, buna görə də səhabə sayılmayacağını deyiblər. Lakin tarixçilər onun peyğəmbərin – salləllahu aleyhi va səlləm – sağlığında İslam dinini qəbul etdiyini deyirlər.

Abdurrazzəq "əl-Musannəf" kitabında deyir: "**İbn Cureyc bizə xəbər verdi; dedi: Əbuz-Zubeyr mənə xəbər verdi ki, Cabir bin Abdilləh'i belə deyərkən eşidib: "Peyğəmbər – salləllahu aleyhi va səlləm – hər qəbiləyə qan pullarını yazdı**[224] **və sonra yazdı ki, "vəlilərinin izni olmadan bir kimsənin özünü başqasının vilayətinə nisbət etməsi halal deyildir." Dedi: Mənə xəbər verildi ki, (yazdığı) səhifəsində bunu edənləri lənətləyir.**"[225] Bu rəvayəti həmçinin İmam Muslim "əs-Sahih" kitabında Muhəmməd bin Rafi' vasitəsi ilə Abdurrazzəq'dən, Əbu Avanə "əl-Mustəxrac" kitabında İshaq bin İbrahim bin Abbəd vasitəsi ilə Abdurrazzəq'dən rəvayət edir. Bu xəbərdən də anlaşılır ki, peyğəmbərin – aleyhissalətu vassələm – zamanında hədislərin və peyğəmbərdən sadir olan hökmlərin yazıldığı səhifələr mövcud idi. Cabir bin Abdilləh həmin səhifəni qəsd edərək içində müəyyən əməli edənlərin lənətlənməsinə dair peyğəmbərin sözünün olduğunu xəbər verir.

Yenə İmam Əhməd xəbər verir: "**Sufyan bin Uyeynə bizə Harun bin Riəb'dən, o da İbn Şixxir'dən, o isə Bənu Uqeyş qəbiləsindən olan bir kişidən rəvayət edir ki, onda peyğəmbərin – salləllahu aleyhi va səlləm – kitabı var idi (və orada yazılmışdı) : "Ayda üç gün oruc tutmaq sinədəki qəzəbi aparır.**"[226] Bənu Uqeyş qəbiləsindən olan kişi səhabələrdən sayılır.

---

224. Hədisdə əslində keçən söz "qarın" sözüdür və bu, qəbilədən daha kiçik olan qola deyirlər. Lakin biz mənanın aydın olması üçün "qəbilə" olaraq tərcümə etdik. Burada qəsd olunan budur ki, cahiliyyə dönəmində öz aralarında vuruşmuş bu qəbilələr arasında həll edilməmiş qan davaları mövcud idi və peyğəmbərimiz – aleyhissalətu vassələm – öz hikməti və siyasətinə dayanaraq onların arasında qərar verir və hər birinə ödəməkləri lazım olan qan pullarını təyin edir. Bununla da qəbilələr arasındakı bu gərginliyi aradan qaldırır.

225. "əl-Musannəf", 9/6; "Mustəxrac Əbi Avanə", 12/59 (5248); Muslim (1507)

226. "Musnəd Əhməd", 34/342; Şeyx Şueyb isnadının səhih olduğunu deyir.

# SƏHABƏLƏRİN SƏHİFƏLƏRİ

Peyğəmbərin – aleyhissalətu vassələm – sağlığında və vəfatından sonra ilk müsəlman cəmiyyətində yazı çox önəmli rol oynamışdır. Yazının ictimai həyatda və rəsmi dairələrdə geniş istifadə edildiyini göstərən tarixi faktlar ilə tanış olmaq mümkündür. Bu gün o dövrdən bizim zamanımıza qədər gəlib çatmış tarixi əsərlər mövcuddur. Artıq onların daşlar üzərində imzalar atdıqlarından, bəzi məlumatları qeyd etdiklərindən xəbərimiz vardır, çünki daşlar üzərində yazılmış bu yazılar müasir tariximizə qədər gəlib çalıb. Qərbin fərqli institutlarında Misirdə tapılmış qədim papirusları araşdırılır və ilk müsəlman cəmiyyətlərdəki ictimai həyat haqqında daha dolğun təsəvvür formalaşır. İndi akademiklər etiraf edirlər ki, o dövr haqqında daha öncə sahib olduqları təsəvvür çox primitiv idi və ilk müsəlman cəmiyyətlərində oxumaq və yazmaqla bağlı daha fərqli bir mənzərə var idi.

*Şəkil 3: Ərəb yarımadasında qayalıqlarda tapılmış yazı. Yazının mətni: "Bismilləh. Mən Zuheyr bunu Ömərin vəfatı zamanı, 24-cü ildə yazdım".*



Bu sahədə aktiv fəaliyyət göstərən qərbli araşdırmaçılardan Petra Sijpesteijn bu təsəvvürün xətalı olduğunu etiraf edir. Müsəlmanların erkən bir vaxtdan yazıdan çox məharətlə istifadə etdiklərini göstərən sənədləri o, "Shaping a Muslim State" (Bir müsəlman dövlətinin formalaşması) adlı kitabında təqdim edir. İnsanların bir-birilərinə yazdığı məktublar, rəsmi sənədlər və alış-verişi təsdiq edən qəbzlər Avropa muzeylərində araşdırılaraq tədricən çap olunur. Bu tapıntıların böyük hissəsi Misirdən gəlir. Daha öncəki təsəvvürə görə müsəlmanlar Misiri fəth etdiklərində oradakı idarəyə, administrasiyaya heç bir dəyişiklik gətirməmişdilər. Bu gün bu təsəvvürün xətalı olduğunu qeyd edən Sijpesteijn əksinə onların öz hüquqi sistemlərini, yeni vergi sistemi daxil etdiklərini və administrativ islahatlar etdiklərini söyləyir.

Ümumiyyətlə peyğəmbərin – salləllahu aleyhi va səlləm – sağlığında və vəfatından sonrakı dövrdə səhabələr arasında oxumağı və yazmağı bacaran xeyli səhabələr var idi. Bunun ən bariz nümunələrindən biri Ömər bin əl-Xattab'ın İslamı qəbul etməsinə səbəb olan hadisədə əks olunur. Ömər bacısının İslamı qəbul etdiyini eşitdikdə evlərinə daxil olur və onların bir səhifədən Quran oxuduqlarını görür. Daha sonra özü o səhifədə yazılanları oxumaq üçün israr edir. Bu xəbər Ömərin özünün, eləcə də bacısının ailəsinin – ya bacısının özünün, ya da onun ərinin – oxumağı bacardıqlarını göstərir. Səhabələrdən bir çoxunun qədim kitabları topladıqlarını, onlarla maraqlandıqlarını və onlardan mətnlər köçürdüklərini də bilirik. Quranın bütöv bir kitab olaraq toplanılıb yazılması da peyğəmbərin – aleyhissələm – vəfatından qısa bir müddət sonra baş vermişdi. Hədislərin yazılması və tam ədəbi bir toplu halına salınması fikri də mövcud idi, bunu etmək üçün potensial da var idi. Hətta səhabələrdən bir çoxu bu işi həyata keçirmək istəklərini ifadə edirdilər. Bununla bağlı Mə'mər ər-Raşid bizə "əl-Cami" kitabında deyir: "**əz-Zuhri'dən, o da Urva (bin əz-Zubeyr)dən (rəvayət etdi) ki, Ömər bin əl-Xattab sünnətləri yazmaq istədi. Buna görə də Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələri ilə bu barədə məşvərət etdi. Onlar da yazılmasına işarə etdilər. Beləliklə də (Ömər) bir ay müddətində istixarə etməyə davam etdi. Sonra bir gün Allah onu qərarına çatdırdı və dedi: "Mən öncə sünnətləri yazmaq istəyirdim, sonra sizdən öncə kitablar yazmış bir qövmü xa-**

**tırladım, onlar (yazdıqları) o kitablarla yalnız məşğul oldular və Allahın kitabını tərk etdilər. Mən isə Allaha and olsun ki, Allahın kitabını başqa heç bir şey ilə dəyişmərəm.**"[227] Məşvərətdə səhabələrin sünnətin yazılmasını istədiklərini görürük. Bu da öz növbəsində bunu etmək üçün vasitələrin və potensialın olduğundan xəbər verir. Lakin çox təəssüf ki, Ömər bin əl-Xattab yəhudi və xristianların təcrübəsinin təkrarlanmasından qorxduğu üçün bu layihəni erkən bir mərhələdə dayandırdı. Bəziləri Ömərin hədisləri yazmağı qadağan etdiyini söyləyir və bunun üçün bəzi xəbərlərə əsaslanırlar. İbn Abdilbərr isnadı ilə birlikdə rəvayət edir ki, Yəhya bin Cə'də deyib: "**Ömər bin əl-Xattab – radiyallahu anhu – sünnəti yazmaq istədi, sonra yazmamaq fikrinə gəldi və sonra vilayətlərə yazaraq dedi: "Kimdə bundan bir şey varsa silsin!**"[228] Bu sözlər Yəhya bin Cə'dəyə aiddir və o, Ömər bin əl-Xattab ilə qarşılaşmayıb. Sünnəti yazmaq istəməsi və sonra bu fikrindən dönməsi xəbərində Urva bin əz-Zubeyr ilə razılaşır, lakin Urva'dan fərqli olaraq yazılanların da silinməsini əmr etdiyini əlavə edir. Bu, doğru ola bilməz, çünki məlumdur ki, səhabələrin bəzilərində hədis səhifələri mövcud idi və onlar silinməmişdi, əksinə sonrakı nəsillərə keçmişdi. Ömər'in hədisləri yazmağı qadağan etdiyini zikr edən xəbərlərin heç biri səhih deyildir və reallıqla uyğun gəlmir. Doğrudur ki, Ömərin zamanında hədislərin yazılmasına məhdudiyyət var idi, çünki xəlifə olaraq Quranla məşğul olmağa dair göstəriş vermişdi. Lakin bu heç bir şəkildə hədislərin onun zamanında yazılmadığı anlamına gəlməz. Eyni şəkildə Osman bin Affən və Əli bin Əbi Talib xəlifə olduqlarında hədislərin yazılmasını qadağan etməmişdilər. Biz o dövrdə hədislərin yazıldığına dair misalları bu bölmədə qarşıda zikr edəcəyik.

Burada səhabələrin hamısının oxuyub yazdığını iddia etmək də yalnışdır. Doğrusu səhabələrin əksəriyyəti oxumağı və yazmağı bacarmırdı. İbn Həcər əl-Asqaləni "Hədyus-Səri" kitabında hədislərin ilk dövrdə yazılmasının məhdud olmağını iki səbəbə bağlayarkən "**çünki həm də onların əksəriyyəti yazmağı bacarmırdı**"[229] de-

227. Abdurrazzəq, "əl-Musannəf", 11/257-258 (20484);

228. "Cəmi'u Bəyənil-İlmi va Fədlihi", 1/275 (345);

229. "Hədyus-Səri Muqəddimətu Fəthil-Bəri", səh: 8;

yir. Amma buna baxmayaraq kitablar məhdud şəkildə yazılırdı, fərqli mövzularda kitablar və yaxud da dəftərlər toplanardı. Məktubların yayğın olması və müsəlmanların uzaq şəhərlərdən bir-birilərinə məktub göndərməkləri isbat edir ki, qısa bir müddət ərzində oxumaq və yazmaq tədricən öyrədilməyə başlanıb. Peyğəmbərimizin – aleyhissalətu vassələm – vəfatından həmən sonrakı dövr ilə ədalətli xilafətin son dönəmləri arasında fərqlər var idi.



*Şəkil 4: Papirus E17861: Erkən İslam dövrünə aid olan bir məktubdur. Məktub bir neçə nəfərə ünvanlanıb və ünvanların arasında Osman bin Muslim'in və Ömər bin əl-Xattab'ın adlarını oxuya bilirik. Məktubu göndərən qohumları və yaxınları arasında 26 dinarın bölüşdürülməsindən danışır. Məktubda adları çəkilənlərin arasında Ummu Kulsum, Əsma və Ummu Əbən vardır. Bu məktub xəlifə Əbu Bəkr'in xilafəti dövründə, yaxud da Ömərin xəlifəliyinin ilk dövrünə aid olmalıdır, çünki Ömər bin əl-Xattab'ın adının qarşısında "əmirul-muminin" yazılmayıb.*

Hətta bəzi məlumatlara əsasən artıq birinci əsrin sonlarında və ikinci əsrin əvvəllərində ictimai kitabxana adlandıra biləcəyimiz məkanlar var idi. Ədəbiyyat alimlərindən Əbul-Fərac Əli bin əl-Huseyn əl-Əsfəhani (h. 284-356) "əl-Əğani" kitabında deyir: **"əl-Hirmi mənə xəbər verdi: əz-Zubeyr (bin Bəkkər) bizə rəvayət etdi; dedi: Abdurrahmən bin Abdilləh bin Abdilləh bin**

**Amr əl-Cuməhi mənə rəvayət etdi; dedi: "Abdulhəkim bin Amr bin Abdilləh bin Safvan əl-Cuməhi evinin birini götürüb orada şahmat, nərd taxtaları, qirqat oyunları və hər bir elmdən dəftərlər yerləşdirmişdi və divara çivlər vurmuşdu. İçəri kim gəlsəydi paltarını o çivlərdən birinə asardı və sonra bir dəftəri çəkib oxuyardı və ya oyun oynanılacaq şeylərdən birini götürüb bəziləri ilə oynayardı...**"[230] Bu xəbərin eynisini İbn Asəkir "Tərixu Diməşq" kitabında rəvayət edir.[231] İbn Asəkir bunu əz-Zubeyr bin Bəkkər'dən iki ayrı yoldan, Əbu Zur'a əd-Diməşqi və Yəhya bin Əli bin Yəhya əl-Munəccim vasitəsi ilə rəvayət edir. Beləliklə də tarixi və ərəblərin nəsəbini araşdırmaq ilə məşhur olan əz-Zubeyr bin Bəkkər (h. 172-256) bu xəbəri kitabında qeyd edir. Əndəlüslü alimi İbn Həzm əz-Zahiri də "Cəmhəratu Ənsəbul-Arab" kitabında Abdulhəkim bin Amr haqqında danışarkən deyir: "**Abdulhəkim Qureyşin gənclərindən idi və qardaşlarına aid bir evi götürmüşdü; içində elm kitabları, şahmat lövhələri, nərd və qirq oyunları var idi.**"[232] Abdulhəkim'in babası Abdullah bin Safvan Məkkə'nin böyüklərindən idi və Abdullah bin əz-Zubeyr'in yanında əməvilərə qarşı vuruşub. Hicri 73-cü ildə öldürülüb.

Abdulhəkim'in kitabxanasında müxtəlif elmlərə aid kitabların olmasını qəribsəmək lazım deyildir, çünki o dövrdə fərqli sahələrdə kitablar yazılırdı. Hətta İbn Culcul adı ilə tanınan əndəlüslü Əbu Davud Süleyman bin Həyyan hicri 377-ci ildə qələmə aldığı "Tabəqatul-Ətibbə val-Hukəmə" adlı kitabında məşhur həkim Məsərcəveyh haqqında danışarkən deyir: "**Məzhəbində yəhudi idi, suryani idi və Mərvanın dövlətində Əhrun bin Ayan əl-Qiss'in kitabını**[233] **ərəb dilinə təfsir etmək işini öz üzərinə götürən o idi. Bu kitabı Ömər bin Abdilaziz "kitablar xəzinəsində" tapır. Onun köçürülməsini əmr edir və namaz qıldığı yerdə yer-**

230. "əl-Əğani", 4/178;

231. Bax: "Tərixu Diməşq", 32/212;

232. "Cəmhəratu Ənsəbil-Arab", səh: 160;

233. Əhrun (Ahroun) əl-Qiss Misirdə İskəndəriyyə şəhərində yaşayıb fəaliyyət göstərmiş bir həkim idi. Tibb elmində yazdığı "kunnəş" ilə tanınır. Kunnəş isə vərəqləri özündə birləşdirən dəftərin adıdır, içində müəllif öz qeydlərini yazır.Qeydlərini yunan dilində yazıb, daha sonra suryani dilinə tərcümə olunub. İranın yəhudilərindən olan Məsərcəveyh isə onu suryani dilindən ərəb dilinə tərcümə edib.

**ləşdirərək müsəlmanların faydalanması üçün onun üzünün köçürülməsi ilə bağlı Allaha istixarə edir. Bu şəkildə onun üçün qırx sabah tamamlandıqda onu insanlar üçün köçürdü və onlara payladı. Bu hekayəni mənə 359-cu ildə əl-Qarmuni məscidində Əbu Bəkr Muhəmməd bin Ömər bin Abdilaziz**[234] **rəvayət edir.**"[235] Mərvan bin əl-Həkəm (h. 2-65) əməvi xəlifələrindəndir. Məsərcəveyh'in ərəb dilinə tərcümə etdiyi tibb kitabı da ərəb dilində yazılmış ilk tibb kitabı sayılır. Ömər bin Abdilaziz'in xəlifəliyi zamanında kitab xəzinəsinin olması da yazılmış və tərcümə edilmiş kitabların rəsmi şəkildə toplandığını göstərir. Əbur-Reyhan Muhəmməd bin Əhməd əl-Biruni (h. 362-440) qiymətli daşlar haqqında yazdığı "əl-Cəməhir" kitabında deyir: "**Abdulməlik bin Mərvan'ın zamanında Şamda yazılmış bir kitab əlimə keçdi və bu fənn ilə bağlı dəyərli məlumatları özündə daşıyır. Onun vaxtında cövhərlərin qiymətləri qırmızı yaqutun mirvarinin yaxşısı ilə eyni qiymətdə olduğuna dəlalət edir.**"[236] Bu da xəlifə Abdulməlik bin Mərvanın (h. 26-86) dövründə yazılmış bir kitabın misalıdır. Bu kitablardan öncə səhabələrin zamanında hədis və fiqh kitabları yazılmağa başlamışdı. Səhabələrdən Cabir bin Abdilləh həcc haqqında bir kitab yazıb, Zeyd bin Səbit isə miras elmi haqqında bir kitab yazıb. Bu barədə səhabələrin hədis ədəbiyyatının şifahi olmaqla yanaşı yazılı forma almasında səhabələrin rolundan danışarkən məlumatlar verəcəyik.

Abdulhəkim bin Amr'ın kitabxanasından başqa kitabxanalar da mövcud idi. Muhəmməd bin Sad deyir: "**Şihəb bin Abbad bizə xəbər verdi; dedi: Sufyan bin Uyeynə bizə İbn Əbi Nəcih'dən, o da Mucəhid'dən belə dediyini rəvayət etdi: "Abdurrahmən bin Əbi Leyla'nin bir evi var idi ki, içində mushaflar var idi. Ora onun yanına qarilər toplanardılar və yemək halı müstəsna olmaqla çox nadir hallarda oradan ayrılardılar.**"[237] Əbu İsa Abdurrahmən ibn Əbi Leyla'nın (h. 17-

234. Muhəmməd bin Ömər bin Abdilaziz bin İbrahim bin İsa bin Muzəhim, İbnul-Qutiyə adı ilə tanınır. Cəddi Muzəhim xəlifə Ömər bin Abdilaziz'in kölələrindən olub.

235. "Tabəqatul-Ətibbə val-Hukəmə", səh: 61;

236. "əl-Cəməhir fi Mə'rifətil-Cəvahir", səh: 50;

237. "ət-Tabəqat əl-Kubra", 6/110;

83) ictimaiyyətə açdığı bu kitabxana Quran üçün xüsusiləşdirilmişdi. Lakin bu, kitabxana mədəniyyətinin olduğundan xəbər verir. Daha bir kitabxananın olduğunu alman oriyentalist Fritz Krenkow (1872-1953) qeyd edir. Brill nəşriyyatının 1913 və 1936-cı illər arasında çap etdiyi ilk İslam Ensiklopediyasında Krenkow'un "kitabkhana" başlığı altında yayınlanmış məqaləsində deyilir: "**İctimai Kitabxanaya bənzəyən bir yer haqqında ilk tarixi məlumatlar öz həyatını yunan elmlərini, xüsusilə kimya və tibbi öyrənməyə həsr etmiş Xalid bin Yezid bin Müaviyə'nin adı ilə bağlıdır. Bizə çatan məlumatlara əsasən o, bu cür kitabların tərcümə edilməsinə səbəb olmuşdur. Ömər bin Abdilaziz'in hakimiyyətinin əvvəlində epidemiya yayıldıqda o, xəzinədəki kitabların çıxarılaraq insanlar üçün açıq edilməsini əmr etdi.**"[238] Professor Mustafa əl-Azami bunun ilk kitabxana olması fikri ilə razılaşmır. əl-Azami'yə görə Abdulhəkim bin Amr və Abdurrahmən bin Əbi Leyla'nın açdığı kitabxana daha qədimdir.

## Əbu Hureyra

Əbu Hureyra adı ilə tanınmış Abdurrahmən bin Saxr hədis ədəbiyyatında xüsusi yerə sahib olan bir səhabədir. Ən çox hədis rəvayət etmiş səhabə olaraq tanınır. Hicrətdən öncə 19-cu ildə doğulduğu deyilir və hicri 59-cu ildə vəfat edib. Daha öncə təqdim etdiyimiz xəbərdə Əbu Hureyra bu sözləri deyir: "**Muhəmmədin – salləllahu aleyhi va sələm – səhabələri arasında Abdullah bin Amr'dan başqa heç kim mənim qədər hədis bilmirdi, o isə (hədisləri) yazırdı və mən yazmırdım.**" Əbu Hureyra hədis rəvayətində xüsusilə seçildiyi üçün tələbələri çox olub və əmirlər onun rəvayət etdiyi hədisləri yazmağa maraq göstəriblər. İbn Sad əl-Bəğdədi "ət-Tabəqat əl-Kubra" kitabında deyir: "**Abdullah bin Saleh (bizə) əl-Leys bin Sad'dan (rəvayət edərək) dedi: Yezid bin Əbi Həbib mənə rəvayət etdi ki, "Abdulaziz bin Mərvan (vali olarkən) Kəsir bin Murra əl-Hədrami'yə - Hims şəhərində Allahın elçisinin**

238. "E.J. Brill's First Encyclopaedia of İslam (1913-1936), 4/1045;

**– salləllahu aleyhi va səlləm – səhabələrindən Bədrdə iştirak etmiş yetmiş nəfərlə qarşılaşmışdı – yazaraq ondan Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələrindən eşitdiyi hədisləri ona yazmasını istədi, "yalnız Əbu Hureyranın hədisləri müstəsnadır, çünki onlar bizdə var" dedi.**"[239] Bu tarixi xəbərdən anlayırıq ki, Əbu Hureyra'nın hədisləri artıq yazılı halda Abdulaziz bin Mərvan'ın yanında mövcud idi. Abdulaziz bin Mərvan hicri 65-ci ildən 86-cı ilə qədər Misirdə vali olub və bu dövrdə böyük tabi'i alimi Kəsir bin Murra'ya səhabələrin rəvayət etdikləri hədisləri yazmasını tapşırmışdı. Bu şahidliyə əsasən demək olar ki, hədisləri yazılı olaraq toplamaq Ömər bin Abdilaziz'dən də öncə başladılmışdı, lakin Ömər bin Abdilaziz'in zamanında dövlət tərəfindən xüsusi dəstəklə geniş çapda onları divanlara toplamaq əməliyyatı başladılmışdı. Ola bilsin ki, bu işi atası Abdulaziz bin Mərvan'ın başlatdığı layihənin davamı olaraq görmüşdür. Əbu Hureyra'nın hədislərinin Abdulaziz bin Mərvan'da olması isə atası Mərvan bin əl-Həkəm ilə bağlıdır. İmam əl-Buxari "əl-Kunə" kitabında deyir: "**Süleyman bin Hərb dedi: Həmməd bin Zeyd bizə rəvayət etdi: Amr bin Ubeyd əl-Ənsari bizə xəbər verdi: Mərvan'ın katibi Əbuz-Za'za'əh mənə rəvayət etdi; dedi: "Mərvan (Mədinədə vali olduqda) adam göndərərək Əbu Hureyra'nı yanına çağırdı və məni pərdənin arxasında oturtdu. Ondan soruşmağa başladı, mən də yazırdım və beləliklə çoxlu hədis yazdım. Sonra onu bir il tərk etdi, sonra yenidən çağırdı və məni pərdənin arxasında oturtdu. Ondan soruşmağa başladı və mən kitabdan izləyirdim, nə bir şey artırdı, nə də bir şey azaltdı.**"[240] Bu xəbərin dəlaləti ilə Əbu Hureyra'nın rəvayətlərində dəqiq olduğunu görə bilirik. Üstəlik Abdulaziz bin Mərvan'da toplanmış Əbu Hureyra'dan rəvayət olunan hədislərin atası Mərvan bin əl-Həkəm'dən qalması aşkardır.

Əbu Hureyra'nın Abdullah bin Amr haqqında söylədiyi sözlərindən anlaşılan budur ki, o, hədisləri yazmazdı.Ancaq Əbu Hureyra'nın özünün də yazdığına dair xəbər varid olub. İbn Abdilbərr deyir: "**İbn Vəhb dedi: Ubeydullah bin Əbi Cəfər mənə əl-Fədl**

239. "ət-Tabəqat əl-Kubra", 7/448,

240. "əl-Kunə", səh: 33 (289)

**bin Həsən bin Amr bin Umeyyə əd-Damri'dən, o da atasından belə dediyini xəbər verdi: "Əbu Hureyra'nın yanında bir hədis rəvayət etdim və onu inkar etdi. Mən də dedim: "Bunu mən səndən eşitmişəm." Dedi: "Əgər məndən eşitmisənsə o, mənim yanımda yazılı olacaq." Beləliklə də mənim əlimdən tutaraq evinə götürdü və bizə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – hədislərindən ibarət çox sayda kitab göstərdi. O hədisi də tapdı və dedi: "Mən sənə demişdim ki, əgər onu sənə mən rəvayət etmişəmsə o mənim yanımda yazılı olmalıdır.**"[241] Bu xəbərdən isə görünür ki, Əbu Hureyra'nın evində bütün hədislər yazılı şəkildə saxlanmışdı. İbn Abdilbərr deyir: "**Bu, bu fəslin əvvəlində Əbu Hureyra'dan – radiyallahu anhu – onun yazmadığına, Abdullah bin Amr'ın isə yazdığına dair rəvayət olunana müxalifdir. O hədis isə nəql baxımından bundan daha səhihdir, çünki o, hədis əhli yanında isbat baxımından daha sabitdir. Əks halda iki hədisin arasını birləşdirmək üçün təvil etmək mümkündür.**"[242] İbn Abdilbərr bu hədisin isnad baxımından güclü olmadığını deyir.[243] Lakin İbn Həcər deyir: "**(İbn Abdilbərr'ə görə) ikisinin arasını belə birləşdirmək mümkündür ki, (Əbu Hureyra) peyğəmbərin zamanında hədis yazmazdı, ondan sonra isə yazmağa başladı. Mən isə deyirəm ki, bundan da tutarlı izah budur ki, hədisin onun yanında yazılı olması heç də onun öz əli ilə yazılı olması anlamına gəlməz. Onun hədis yazmadığı sabit olub, ona görə də onun evində yazılı olan hədislərin başqası tərəfindən yazılmış olması qaçınılmazdır.**"[244] Bu rəvayət sənəd baxımından zəif olsa da iki xəbər arasında bir ziddiyyət yoxdur. Əgər ikinci xə-

---

241. "Cəmi'u Bəyənil-İlmi va Fədlihi", 1/324;

242. Eyni mənbə

243. İmam əz-Zəhəbi "əl-Mustədrak" kitabının təlxisində deyir: "Bu, münkərdir, səhih deyildir." Bax: "Muxtəsar Təlxis əz-Zəhəbi", 5/2192. Bunun səbəbi sənədindəki əl-Fədl'in atası Həsən bin Amr bin Umeyyə'dir, səhabə Amr bin Umeyyə'nin oğludur. Tarixçilər bu şəxsiyyət haqqında hər hansı bir məlumata sahib deyillər, üstəlik İbn Abdilbərr'in gətirdiyi isnadda xəta vardır. əl-Həkim ən-Nisəburi bu hədisi İbn Vəhb yolu ilə rəvayət edərkən qeyd edir ki, İbn Vəhb ilə Ubeydullah arasında İbn Ləhi'ah gəlir və o, zəif hesab olunan bir ravidir. Şeyx Şueyb Arnavut təhqiqlərindən birində İbn Vəhb'in İbn Ləhi'ahdan rəvayətlərini "həsən" sayıb.

244. "Fəthul-Bəri", 1/207;

bərin də doğru olduğunu qəbul etsək deməliyik ki, Əbu Hureyra'nın evindəki hədislərin tələbələri tərəfindən yazılmış olması lazımdır. Həqiqətən də Əbu Hureyra'dan hədis rəvayət edən tələbələri ilə maraqlansaq görəcəyik ki, onlar müəllimlərindən hədis nüsxələri nəql ediblər. Bundan sonra bu nüsxələri rəvayət etmiş tələbələri ilə tanış olacağıq.

## Əbu Saleh əs-Səmmən'in səhifəsi

Əbu Hureyra'dan ən çox hədis rəvayət edən tələbəsi Zəkvan Əbu Saleh əs-Səmmən'dir və hicri 101-ci ildə vəfat edib. Əbu Saleh'dən isə onun rəvayətlərini alan ən məşhur tələbələri arasında əl-Aməş və oğlu Suheyl olub. İbnul-Ca'd "əl-Müsnəd" kitabında deyir: "**Muhəmməd bin İshaq bizə rəvayət etdi: İbn Numeyr bizə xəbər verdi; dedi: Əbu Xalid əl-Əhmər'i belə deyərkən eşitdim: "əl-Aməş'i belə deyərkən eşitdim: "Əbu Saleh'dən min hədis yazdım.**"[245] Suheyl isə atasından ona qalmış "səhifəyə" sahib idi və hətta bəzi alimlər onun atasından rəvayət etdiyi bütün hədisləri həmin səhifədən götürdüyünü deyiblər. Suheyl bin Əbi Saleh'dən hədisləri özündə ehtiva edən bir nüsxə də onun tələbəsi Abdulaziz bin əl-Muxtar'dan gəlib və bu gün həmin nüsxə hədis cüzlərinin birində Dəməşq şəhərində "əz-Zahiriyyə" kitabxanasında saxlanılır.

Suheyl'in atası Əbu Saleh'dən aldığı bu səhifəsini Doktor Muhəmməd Mustafa Azmi keçən əsrdə tədqiq etmiş və "Dirasət fil-Hədisin-Nəbəvi" adlı kitabında çap etmişdir.

## Həmməm bin Munəbbih'in səhifəsi

Eləcədə Əbu Hureyra'dan eşitdiyi hədisləri səhifəyə yazan tələbələrindən biri də Əbu Uqbə Həmməm bin Munəbbih bin Kəmil bin Şeyx Zi Kənəz əs-San'ani olub. Hicri 132-ci ildə vəfat etmiş Həm-

245. "Musnəd İbn əl-Ca'd", 770;

məm bin Munəbbih öz səhifəsində, yəni kitabında Əbu Hureyra'dan eşitdiyi 139 hədisi toplamışdır.

Bu hədislər toplusu bir çox ad ilə tanınıb, lakin ən məşhur "əs-Sahifə əs-Sahihə" adı olub. Bunu Həmməm'dən rəvayət edən və köçürən Yəmənin böyük alimi və fəqihi, hicri 153-cü ildə vəfat etmiş Mə'mər bin Raşid əs-San'ani olub. Ondan isə bunu digər yəmənli alim, hicri 211-ci ildə vəfat etmiş "əl-Musannəf" kitabının sahibi Abdurrazzəq əs-San'ani rəvayət etmiş və köçürmüşdür. İmam Əhməd "əl-Müsnəd" kitabında bu "səhifə"nin bütün hədislərini olduğu kimi qeyd edir. Nəzərə alsaq ki, Əbu Hureyra hicri 58 və ya 59-cu ildə vəfat edib deyə bilərik ki, bu tarixi sənəd Həmməm bin Munəbbih tərəfindən hicri əllinci illərdə yazılıb. Bu səhifədən bəzi hədislər fərqli yollar ilə digər imamların istifadəsinə keçib, bəziləri səhifəni tam olaraq köçürüblər, bəziləri isə bir hissəsini əldə ediblər. İbn Adiy deyir: "**əl-Hüseyn bin İyad əl-Himyəri əl-Misri bizə rəvayət etdi; Əbu Abdilləh bin Ar'ara bizə xəbər verdi: Əli bin əl-Mədini dedi: "Abdurrahmən bin Mehdi'nin yanına gəldim və ona dedim: "Mənə (Abdullah) bin əl-Mubarək'in Mə'mərdən, onun da Həmməm'dən rəvayət etdiyi səhifəsini çıxar." Dedi: "Onu çıxardı. Mən də ona dedim: "Onu mənə ver!" Dedi: "Qoy öncə sənə ordan ehtiyacın olanları imla edim və oradan mənə dörd hədisi imla etdi. Sonra onun özünü mənə verdi və orada bu dörd hədisdən başqası yox idi.**"[246] Bu xəbər yuxarıda verdiyimizin izahın təsdiqidir və göstərir ki, Abdurrahmən bin Mehdi o səhifədən yalnız dörd hədisi köçürüb. Lakin səhifə tam şəkildə çox sayda alimin istifadəsinə keçib. əl-Hafiz İbnus-Saləh əş-Şəhrazuri deyir: "**Bura misallardan biri də onun Həmməm bin Munəbbih'in Əbu Hureyra'dan olan səhifəsindən rəvayət etdikləridir...**"[247] Bununla İmam Muslim'in "əs-Sahih" kitabında bəzi hədisləri məhz Həmməm bin Munəbbih'in səhifəsindən götürdüyünü bildirir. Kitabının bir başqa yerində həm əl-Buxari'nin , həm də Muslimin o səhifədən istifadə etdiyini qeyd edir. Doktor Fuad Sezgin də araşdırmasında əl-Buxari'nin necə o səhifədən yararlandığını misallar ilə nümayiş etdirib.

246. "əl-Kəmil fi Duafə ər-Ricəl", 1/199;

247. "Siyənətu Sahih Muslim", səh: 104;

Alimlərin bir çoxu bəzən nüsxəni tam olaraq köçürmürdülər, bu isə oradakı bəzi hədisləri daha ali, yəni daha qısa isnad ilə başqa kanaldan eşitməkləri səbəbi ilədir. Məhz buna görə də bəzən oradan nüsxənin bir hissəsini götürərdilər. əl-Xatib əl-Bəğdədi deyir: “**Muhəmməd bin Abdilvahid əl-Əkbər bizə xəbər verdi; Muhəmməd bin əl-Abbas əl-Xazzəz bizə xəbər verdi; Əhməd bin Said bizə xəbər verdi; Abbas bin Muhəmməd bizə rəvayət etdi; dedi: “Yəhyə bin Main dedi: “Həmməm bin Munəbbih’in hədislərini kəsməyində bir problem yoxdur.**”[248] İmam Yəhyə bin Main’in qəsdi budur ki, Həmməm bin Munəbbih’in nüsxəsini tam şəkildə rəvayət etmək şərt deyildir, lakin nüsxənin isnadını istifadə edərək onun içindəki hansısa bir hədisi və ya bir neçə hədisi ayrılıqda rəvayət etmək olar. Böyük imamlarımız da nüsxələr ilə bu cür davranıblar, onlar nüsxələrin içindəki hədisləri öz kitablarına ayrı-ayrı yerlərə daxil ediblər.

## Uqbə bin Əbil-Həsnə’nin nüsxəsi

Uqbə bin Əbil-Həsnə də hədisləri yazıya köçürmüş şəxslərdən biri olub və Əbu Hureyra’dan eşitdiyi hədisləri kağıza köçürmüşdür. İbn Əbi Asim “əs-Sunnə” kitabında deyir: “**Abdulvaris bin Abdissaməd bin Abdilvaris bizə rəvayət etdi; Atam bizə rəvayət etdi: Fərqad Əbu Nəsr bizə rəvayət edərək dedi: “Uqbə bin Əbil-Həsnə’dən Əbu Hureyra’dan rəvayət etdiyi bir nüsxə dinlədim ki, Allahın elçisi – salləllahu aleyhi va sələm – dedi...**”[249] və daha sonra hədisin tamamını zikr edir. Buradan anlayırıq ki, Uqbə bin Əbil-Həsnə Əbu Hureyra’dan eşitdiyi hədisləri toplamış və tələbəsi Fərqad Əbu Nəsr’ə ötürmüşdür. Onun topladığı bu hədislər toplusu bizim günümüzə qədər gəlib çıxmayıb, lakin hicri 385-ci ildə vəfat etmiş bağdadlı Əbul-Həsən əd-Dəraqutni deyir: “**Uqbə bin Əbil-Həsnə, Əbu Hureyra’dan içində 30-a yaxın hədis tutan bir nüsxə rəvayət edir. Ondan Fərqad bin əl-Həccəc rəvayət**

248. “əl-Kifəyə fi İlmir-Rivayə”, səh: 214;

249. “əs-Sunnə”, 1/281;

**edir. Basralılardan hesab olunur.**"[250] əd-Dəraqutni'nin həmin nüsxənin içindəki hədislərin sayını qeyd etməsi ona dəlalət edir ki, həmin nüsxə əd-Dəraqutni'nin qarşısına çıxıb və həmin nüsxəyə nəzər salıb. Həmçinin 748-ci ildə vəfat etmiş İmam əz-Zəhəbi "Mizənul-İtidəl" kitabında Uqbə bin Əbil-Həsnə'nin nüsxəsi haqqında deyir: "**Bu, gözəl bir nüsxədir, mənim əlimə keçib və içindəki hədislərin əksəriyyəti səhihdir.**"[251] əz-Zəhəbi'nin bu sözlərindən anlayırıq ki, bu nüsxə onun zamanına qədər gəlib çatmışdı və çox ehtimal ki, ondan sonrakı dövrlərdə də mövcud olub.

## Bəşir bin Nəhik'in nüsxəsi

İlkin islam alimlərindən biri də Əbuş-Şə'sə Bəşir bin Nəhik əl-Basri olub və öz zamanında Əbu Hureyra'dan eşitdiyi hədisləri yazıya köçürənlərdən biri idi. İbn Sad "ət-Tabəqat" kitabında deyir: "**Affən bin Muslim bizə xəbər verdi; dedi: Yəhyə bin Said əl-Qattan bizə rəvayət etdi; dedi: İmran bin Hudeyr bizə rəvayət etdi; dedi: Əbu Micləz bizə Bəşir bin Nəhik'dən belə dediyini rəvayət etdi: "Əbu Hureyra'nın yanına yazdığım kitabım ilə gəldim və o kitabı onun üçün oxudum və dedim: "Bunları səndən eşitmişəm." Dedi: "Bəli.**"[252] Anlaşılan budur ki, Bəşir bin Nəhik şeyxi və müəllimi Əbu Hureyra'dan eşitdiklərini yazıya köçürərmiş və daha sonra yazdıqlarını ona ərz etmişdir. Ərz etməkdəki məqsədi isə Əbu Hureyra'dan öyrəndiyi hədisləri başqalarına ötürmək üçün icazə alması və eşitdiklərini bir daha dəqiqləşdirməsi olmuşdur. Bunu biz ət-Tirmizi'nin "əs-Sünən" kitabında bizə rəvayət etdiyi xəbərdən başa düşürük, belə ki, ət-Tirmizi deyir: "**Mahmud bin Ğeylən bizə rəvayət etdi: Vaki' bizə İmran bin Hudeyr'dən, o da Əbu Micləz'dən, o isə Bəşir bin Nəhik'dən belə dediyini rəvayət edir: "Əbu Hureyra'dan bir kitab yazdım və soruşdum: "Bunu səndən rəvayət edimmi?" Dedi:**

250. "əl-Mu'təlif val-Muxtəlif", 2/797;

251. "Mizənul-İtidəl", 3/85

252. "ət-Tabəqat əl-Kubra", 7/223, Dar Sadir

**"Bəli."**[253] Bəşir'in bu kitabında yazdığı hədislərin bir çoxu məşhur "əs-Sünən" kitablarına düşüb. Bunu ondan rəvayət edən əsas ravi Ənəs bin Malik'in oğlu ən-Nədr idi və ən-Nədr'dən bunu rəvayət edən Qatədə olub.

## Muhəmməd bin Sirin'in nüsxəsi

Muhəmməd bin Sirin səhabələrin tələbələri arasında tanınmış ən böyük imamlardan, alimlərdən biridir. Xəlifə Osmanın zamanında dünyaya gəlmiş bu basralı alim hicri 110-cu ildə vəfat edib. O da Əbu Hureyra'dan hədis eşitmiş və onları kitaba köçürmüşdür. Ondan bu nüsxəni birdən çox kəs eşidib və rəvayət edib. Onlardan biri İmam Əli bin əl-Mədini'nin əlinə keçib. Muhəmməd bin Sirin'dən nüsxəni nəql edənlərdən bir digəri böyük alim İmam Abdurrahmən bin Amr əl-Əvzai'dir. Hicri 155-ci ildə vəfat etmiş əl-Əvzai həqiqətdə Muhəmməd bin Sirin'in hədis məclislərində iştirak etməyib, başqa sözlə onun ağzından hədis eşidərək yazmayıb. Bildiyimiz budur ki, İbn Sirin ölüm yatağında olduqda əl-Əvzai onun yanına gəlib. İmam əd-Dəraqutni deyir: "**əl-Əvzai İbn Sirin'in yanına xəstə olduqda daxil oldu və ondan (hədis) eşitmədi.**"[254] Buna baxmayaraq əl-Əvzai hədis kitablarında Muhəmməd bin Sirin'dən hədis rəvayət etmişdir, çünki İbn Sirin'dən hədis eşitməsə də onun kitabı, onun nüsxəsi ixtiyarında olub. İbn Hibban "əs-Siqat" kitabında deyir: "**İbn Sirin'dən bir nüsxə rəvayət edir və bunu ondan Bişr bin Bəkr ət-Tinnisi rəvayət edir və əl-Əvzai İbn Sirin'dən (hədis) eşitməyib.**"[255] Bir daha təkrar etməyimiz lazımdır ki, hədis eşitməsə də İbn Sirin'in kitabını əldə etmişdir.

---

253. "Sünən ət-Tirmizi", 6/249; Bəşşər Avvad təhqiqi. Şeyx Abdurrahmən əl-Muallimi "əl-Ənvar əl-Kəşifə" kitabında (səh: 42) Bəşir bin Nəhik'in Əbu Hureyra'dan yazdığı kitablar haqqındakı sənədlərin səhih olduğunu deyir.

254. "Sunən əd-Dəraqutni", (185)

255. "əs-Siqat", 7/63;

## Abdurrahmən bin Yaqubun nüsxəsi

Tarix kitablarında Abdurrahmən bin Yaqub əl-Huqari Məvla Cuheynə və ya Abdurrahmən bin Yaqub Məvlal-Hurqa adı ilə tanınır, əz-Zəhəbi onu "Əbu Hureyra'nın yoldaşı" olaraq tanıdır. Ondan rəvayət edən ən məşhur ravi onun öz oğlu Əbu Şibl əl-Alə bin Abdirrahmən'dir. Güvənilən, etibar olunan ravidir. Onun Əbu Hureyra'dan rəvayət etdiyi hədislər yazılı şəkildə oğlu əl-Alə Əbu Şibl'in yanında mövcud olub. İmam Əbu Əhməd bin Adiy əl-Curcəni – rahiməhullah – "əl-Kəmil" kitabında deyir: "**əl-Alə bin Abdirrahmən'də atasından, onun da Əbu Hureyra'dan (rəvayəti ilə) nüsxələr vardır ki, onları əl-Alə'dən siqa/güvənilən ravilər rəvayət edir. Onun hədislərində bir bəis görmürəm.**"[256] İbn Adiy'in sözlərindən başa düşürük ki, əl-Alə'nin atası vasitəsi ilə Əbu Hureyra'dan olan rəvayətləri yazılı şəkildə ondan sonrakı dövrlərə qədər ötürülüb. İbn Sa'd tabəqat kitabında deyir: "**Muhəmməd bin Ömər dedi: "Malik bin Ənəs mənə xəbər verdi: "əl-Alə ibn Abdirrahmən bin Yaqub'da bir səhifə var idi ki, onun içindəkiləri rəvayət edərdi. Əgər bir kimsə gəlib içindəkilərdən bir hissəsini yazıb, digər hissəsini tərk etmək istədikdə əl-Alə (ona) deyərdi: "Ya bunların hamısını götürürsən, ya da hamısını tərk edirsən." Muhəmməd bin Ömər dedi: "əl-Alə'nin səhifəsi Mədinədə məşhurdur, (əl-Alə) siqa idi, çox hədis rəvayət edən idi.**"[257] İmam Malikin bu sözlərini həmçinin Əbu Muhəmməd İbn Quteybə əd-Dinəvari "əl-Məarif" kitabında[258] nəql edir.

əl-Alə bin Abdirrahmən'dən də bu səhifəni bir çox alim almış, öyrənmiş və özündən sonrakılara öyrətmişdir. Onlardan biri də Əbu Muhəmməd Abdulaziz bin Muhəmməd əl-Cuhəni əd-Dəravardi'dir; böyük mühəddis alimdir. əd-Dəravardi məhz bu səhifəni rəvayət edənlərdən biri kimi tanınır, hətta onun öz hafizəsindən rəvayət etdiklərini alimlər tənqid ediblər, lakin bu səhifəsindən rəvayət etdiklərini isə qəbul ediblər. İmam Yəhyə bin Main deyir: "**əd-Dəravardi'nin əl-Alə bin Abdirrahmən'dən, onun da**

---

256. "əl-Kəmil fi Duafə ər-Ricəl", 6/374;

257. "ət-Tabəqat əl-Kubra", (235) Ziyad Muhəmməd Mənsur

258. Bax: səh: 491; əl-Heyətul-Misriyyə əl-Ammə, Qahirə, ikinci nəşr: 1992

**atasından rəvayət etdiyi peyğəmbərin – salləllahu aleyhi va səlləm – Ammara “səni bağı bir qrup öldürəcək” dediyi hədis əd-Dəravardi’nin kitabında yoxdur. əl-Alə’nin kitabını əd-Dəravardi’dən eşidib öyrənən biri mənə xəbər verdi ki, o bir kitabdır ki, içində bu hədis yoxdur... əd-Dəravardi’nin hafizəsi zəifdir, kitabı isə daha doğrudur.**”[259] Ondan bunu rəvayət edən digər kəs isə Ravh bin Qasim’dir. əl-Xatib əl-Bağdadi hədis əhlinin əlində olan hədis nüsxələrinə bəzi misallar verərkən bunu da onların arasında zikr edir və deyir:” **... və daha bir nüsxə Yezib bin Zurey’də, Ravh bin Qasim’dən, o da əl-Alə bin Abdirrahmən’dən, o da atasından, o isə Əbu Hureyra’dandır...**”[260] Bu nüsxəni zikr etdikdən sonra Abdurrazzəq’in Mə’mər bin Raşid’dən, onun Həmməm bin Munəbbih’dən rəvayət etdiyi nüsxəni zikr edir və daha sonra əlavə edir ki, bu cür nüsxələr çoxdur.

Bu nüsxəni rəvayət edən daha bir kəs elə onun öz oğlu Şibl bin əl-Alə’dir. İbn Hibban “əs-Siqat” kitabında deyir: “**Şibl bin əl-Alə bin Abdirrahmən bin Yaqub, əl-Hurqa qəbiləsinin mövlalarından. Kunyəsi Əbul-Mufəddal’dır. Atasından rəvayət edir. Ondan da İbn Əbi Fudeyk müstəqim bir nüsxə rəvayət edib. Bizə o nüsxəni əl-Fədl bin Muhəmməd əl-Attar Antakya şəhərində rəvayət etdi; dedi: Əhməd bin əl-Valid bin Bərd əl-Əntaki mənə rəvayət etdi; İbn Əbi Fudeyk bizə rəvayət etdi; dedi: Şibl bin əl-Alə bizə atasından rəvayət etdi.**”[261] Hicri 354-cü ildə vəfat etmiş Əbu Hətim İbn Hibban əl-Busti gördüyümüz kimi bu nüsxəni əldə etmişdi. O, nüsxəni “müstəqim” olaraq vəsf edir. Bu isə o deməkdir ki, İbn Hibban o nüsxənin içindəki hədislərin doğruluğuna şahidlik edir və bunu bir alim başqa yoldan gəlmiş rəvayətlər ilə tutuşduraraq söyləyə bilir. Bu sözü əslində onu ifadə edir ki, nüsxənin içindəki hədislər alimlər tərəfindən Əbu Hureyra’nın hədisləri olaraq tanınırdı və o hədisləri Əbu Hureyra’dan kimlərin rəvayət etdiyi də bilinirdi və əgər bir nüsxənin içindəki hədislər bu faktlara uyursa o zaman içindəki hədislər müstəqim sayılır, müxalif olarsa o nüsxəni qəbul etmirdilər. Bu halda biz ən azından əd-Də-

259. “Min Kələm Əbi Zəkəriyyə Yəhyə bin Main fir-Ricəl”, (362)

260. “əl-Kifəyə fi İlmir-Rivayə”, səh: 214;

261. “əs-Siqat”, 6/452;

ravardi və Şibl bin əl-Alə'nin bu nüsxəni məsuliyyət ilə özlərindən sonrakı tələbələrə ötürdüklərini bilirik.

## əl-Valid bin Rabəh'in nüsxəsi

əl-Valid bin Rabəh bin Asim bin Adiy əd-Dəvsi hicri 33-cü ildə anadan olub. İbn Əbi Zəbəb'in azadlı qullarındandır və Mədinədə yaşayıb. Əbu Hureyr və Səhl bin Huneyf kimi səhabələrdən hədis eşitmiş və rəvayət etmişdir, həmçinin Əbu Abdilləh Səlmən əl-Əğar'dan da hədislər rəvayət etmişdir. İbn Hibban onu "əs-Siqat" kitabında etibarlı ravilər arasında qeyd edir. Həmçinin Əbu İsa ət-Tirmizi nəql edir ki, İmam əl-Buxari onu "həsənul-hədis" olaraq dəyərləndirmişdir, bu isə rəvayətlərinin məqbul olduğunu göstərir. Əbu Hətim ər-Razi onu "saleh" adlandırır. Ondan hədis rəvayət edənlər arasında ən məşhurları iki oğlu Muhəmməd və Muslim və tələbəsi Kəsir bin Zeyd olub. əl-Valid bin Rabəh hicri 117-ci ildə vəfat edib.

Əbu Əhməd ibn Adiy deyir: "**İbn Əbi Həzim, Sufyan bin Həmzə və Süleyman bin Biləl'in hər biri Kəsir bin Zeyd'dən, o da əl-Valid bin Rabəh'dən, o da Əbu Hureyra'dan, o isə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – bir nüsxə rəvayət edir. İbn Əbi Həzim'dən bunu İbrahim bin Həmzə, Əbu Musab, İbn Kəsib və başqaları rəvayət edirlər. Sufyan bin Həmzə'dən isə bunu İbrahim bin əl-Munzir, İbn Kəsib və başqaları rəvayət edirlər. Süleyman bin Biləl'dən isə İbn Vəhb rəvayət edir...**"[262]

## Musa bin Yəsər'in nüsxəsi

Əbu Hureyra'dan hədis eşidib onu yazı şəklində tələbələrinə ötürənlərdən biri də Musa bin Yəsərdir. Onun haqqında əz-Zəhəbi deyir: "**Musa bin Yəsər əl-Məxrami əl-Mədəni, məxramilərin azadlı köləsidir, "əl-Məğazi" kitabının müəllifinin əmisidir. Əbu Hureyra'dan eşitmişdir.**" "əl-Məğazi" kitabının müəllifi ilə qəsd etdiyi məşhur alim Muhəmməd bin İshaq bin Yəsərdir. Bəli,

262. "əl-Kəmil fi Duafə ər-Ricəl", 7/206-207;

Musa bin Yəsər adından da görüldüyü kimi Muhəmməd bin İshaqın əmisidir. əz-Zəhəbi davam edir: “**Ondan qardaşı oğlu Muhəmməd bin İshaq, Davud bin Qeys əl-Fərra və Abdurrahmən bin əl-Ğasil rəvayət edib. Onu Yəhya bin Main etibarlı ravi kimi dəyərləndirib.**”[263] Doğum tarixi və vəfatı haqqında tarixi qaynaqlarda bir məlumat tapa bilmədim.

Tarixçi alim Əbu Yəhyə əl-Xalili (vəfatı hicri 446) Muhəmməd bin İshaq haqqında yazarkən deyir: “**Onun bir əmisi oğlu var ki, ona Musa bin Yəsər deyirlər; Əbu Hureyra’dan bir nüsxə rəvayət edir və o nüsxəni ondan Muhəmməd bin İshaq və Davud bin Qeys əl-Mədəni rəvayət edir.**”[264] Burada “əmisi oğlu” deyir və bunun bir xəta olduğu aşkardır. Bu xətanın əl-Xalili’dən yox, lakin əlyazmaları köçürənlərdən qaynaqlandığını demək olar.

Bu nüsxədən hədisləri Davud bin Qeys vasitəsi ilə Abdurrazzəq əs-San’ani “əl-Musannəf” kitabında, Mə’mər bin Raşid isə Muhəmməd bin İshaq vasitəsi ilə “əl-Cami” kitabında rəvayət edib. Həmçinin İshaq bin Rahaveyh, Əhməd bin Hənbəl və sair alimlər öz şeyxləri vasitəsi ilə bu nüsxədəki hədisləri öyrəniblər. Üstəlik bu nüsxədən hədislər İbn İshaq’ın sira kitabında da yer alır və bu gün biz həmin sira kitabının müxtəsəri sayılan İbn Hişəm’in kitabında o hədisləri görə bilirik.

## Abdullah bin Ömər

Əbu Abdirrahmən Abdullah bin Ömər bin əl-Xattab bin Nufeyl əl-Adəvi əl-Quraşi peyğəmbərin – aleyhissalətu vassələm – sünnətini ən yaxşı bilən, onun əsərlərini ən çox toplayıb izləyən səhabələrdən biri olaraq tanınır. Səhabələr içərisindən çox hədis rəvayət etmiş kəslərdən sayılır. Hicrətdən 10 il öncə doğulduğu deyilir. Dəqiq bilinən budur ki, Məkkədə ikən İslam dinini qəbul etmiş, atası ilə birlikdə Mədinəyə hicrət etmişdir. Yaşı hələ az olduğu üçün Uhud döyüşünə qatıla bilməmişdi. Qatıldığı ilk döyüş Xəndək döyüşü olub. Ağac al-

263. “Siyər Əaləmin-Nubələ”,

264. “əl-İrşad fi Mərifəti Uləmə əl-Hədis”, 1/290;

tında beyət edən səhabələrdən biridir. İraqın, Şamın, İranın, Misirin fəthində iştirak edib. Hicri 73-cü ildə vəfat edib.

İmam Əhməd "əl-Musnəd" kitabında isnadı ilə zikr edir ki, "**Abdulaziz bin Mərvan yazaraq Abdullah bin Ömərə dedi: "Ehtiyaclarını mənə çatdır!" Abdullah bin Ömər də ona belə yazdı: "Mən Allahın elçisini – salləllahu aleyhi va salləm – belə deyərkən eşitdim: "Məsuliyyətini daşıdığın ailəndən birinci başla, üst əl aşağı əldən daha xeyirlidir." Mən üst əli verən əl, aşağı əli isə istəyən əl hesab edirəm və mən səndən bir şey istəyəcək deyiləm və Allahın səndən mənə göndərdiyi ruzini də geri çevirmərəm.**"[265] Abdullah bin Ömər'in ümumilikdə hədisləri yazıya köçürdüyü məlum deyildir. Ancaq bu xəbərdə keçdiyi kimi məktublarda peyğəmbərin – aleyhissalətu vassələm – hədislərini zikr edərmiş. Buna baxmayaraq onun hədisləri yazılıb, çünki ondan elm tələb edən və hədis yazan tələbələr çox olub.

## Nəfi'nin səhifəsi

Nəfi Əbu Abdilləh mədinənin imamlarından sayılır, Abdullah bin Ömər'in azadlı qulu olmuş, buna görə də onun elmini ən yaxşı öyrənmiş tələbələrindəndir. Təxminən hicri 30-cu ildə dünyaya gəlib və hicri 117-ci ildə vəfat edib, bəzi tarixçilərə görə vəfat ili 119-cu ildir. Nəfi bir elm tələb edən olaraq İbn Ömər, Aişə, Əbu Hureyra, Rafi bin Xadic, Əbu Said əl-Xudri, Ummu Sələmə kimi səhabələrdən hədis eşitmişdir. Lakin daha çox İbn Ömər'dən hədis eşitmişdir.

Tarixi qaynaqlar bizə xəbər verir ki, Nəfi öz müəllimi Abdullah bin Ömər'dən öyrəndiklərini yazıya köçürmüşdür. İbn Sad "əl-Tabəqat əl-Kubra" kitabında deyir: "**Muhəmməd bin Ömər bizə xəbər verdi: "Nəfi' bin Əbi Nueym, İsmail bin İbrahim bin Uqbə və Əbu Mərvan Abdulməlik bin Abdilaziz bin Əbi Fərva mənə rəvayət edərək dedilər: "Nəfi'nin Abdullah bin Ömər'dən eşitdiyi kitabı bir səhifədə/dəftərdə idi, beləliklə də biz o səhifəni ona oxuyanda deyərdik: "Ey Əbu Abdilləh, biz sənə (hədisləri kitabından) oxuyuruq, buna əsasən (amma) deyi-**

265. "əl-Musnəd", 10/456;

**rik: "Nəfi bizə rəvayət etdi." (Nəfi) dedi: "Bəli.**"[266] Adı keçən bu üç alim Nəfi'nin tələbələri olublar, məlumdur ki, Nəfi əcəmi olduğu üçün ərəb dilində xətalar edərdi və özü oxumağı xoşlamazdı, yazdıqlarını tələbələrinə oxutdurardı. Bununla belə tələbələri özləri ona oxuduqları halda "bizə Nəfi rəvayət etdi" deməkləri üçün müəllimlərindən icazə alırdılar. Bu bir daha təsdiq edir ki, Nəfi'nin kitabı var idi və o kitabında əsasən səhabə Abdullah bin Ömər'dən rəvayət etdiyi hədisləri toplamışdı. Əlavə edək ki, Nəfi'nin tələbələrindən biri də İmam Malik'dir və ondan "əl-Muvatta" kitabından çox sayda hədis rəvayət edib. İbn Hibban "əs-Siqat" kitabında deyir: "**Xalid bin Ziyad bin Cərv əl-Əzdi Tirmiz əhlindəndir, Nəfi'dən müstəqim bir səhifə rəvayət edir...**"[267] İbn Hibban'ın bu nüsxəni "müstəqim" sözü ilə vəsf etməsi içindəkilərin doğru olduğuna dəlalət edir. Həmçinin bir başqa yerdə buyurur: "**Muhəmməd bin Abdirrahmən bin Yezid bin Ğanc Mədinə əhlindəndir, Nafi'dən müstəqim bir nüsxə rəvayət edir. Bunu ondan əl-Leys bin Sad rəvayət edir.**"[268] əl-Leys bin Sad isə zamanında Misirin imamı sayılmış və Malik bin Ənəsin müasiri və dostu olmuş bir alimdir. İbn Hibban digər kitabında onun hədisləri haqqında deyir: "**Muhəmməd bin Abdirrahmən bin Ğanc... hədisləri müstəqimdir, Nafi'dən rəvayət etdikləri sanki Malik'in və Ubeydullah bin Ömər'in səhifəsidir.**"[269] Onun sözündən başa düşmək olur ki, Malik və Ubeydullah bin Ömər hər biri ayrılıqda Nafidən bir səhifə yazmışdılar və Muhəmməd bin Abdirrahmən bin Ğanc'ın Nafidən rəvayət etdiyi hədislər sanki Malikin və Ubeydullahın səhifələrindən rəvayət edilmişdir. İbn Hibbanın bu cür deyə bilməsi üçün Malikin və Ubeydullahın səhifələrini görmüş olması lazımdır. İbn Hibban "əs-Siqat" kitabında bir başqa nəfər haqqında danışarkən deyir: "**Mu'lə bin İsmail əl-Mədəni, Nafi'dən rəvayət edir və ondan da Ərta'ə bin əl-Munzir müstəqim bir nüsxə rəvayət edir və içində "ğaraib" vardır.**"[270] Buna əsasən Nafi'dən nüsxəsini rəvayət edənlərdən də

---

266. "ət-Tabəqat əl-Kubra", 1/143;
267. "əs-Siqat", 6/263;
268. "əs-Siqat", 7/424;
269. "Məşəhiru Uləmə əl-Əmsar", səh: 301;
270. "əs-Siqat", 7/493;

biri Mu'lə bin İsmail əl-Mədəni olub və ondan rəvayət edən Ərtaə bin əl-Munzir olub. Bu nüsxəni də İbn Hibban görüb və içindəki rəvayətlərdən xəbərdar olub. İçində "ğaraib" olması isə o anlama gəlir ki, Nafidən rəvayət olunan digər nüsxələrdə olmayan bəzi rəvayətlər vardır, amma qalan rəvayətlər isə digər nüsxələr ilə üst-üstə düşür. İbn Hibban bu nüsxəni nəql edən bir başqası haqqında da xəbər verir və deyir: "**Vasit bin əl-Haris bin Həvşəb, əl-Avam bin Həvşəb'in qardaşı oğlu, Vasit əhlindəndir. Qatədə, Ata və Nafi'dən rəvayət edib. Ondan isə Abdullah bin Xiraş bin Həvşəb müstəqim bir nüsxə rəvayət edir, rəvayətdə sabit olanların hədislərinə bənzəyir. Bizə bu nüsxəni Vasit şəhərində Əhməd bin Muhəmməd əl-Cəvvazi rəvayət etdi: (Dedi) Atam bizə rəvayət etdi: Muhəmməd bin Subeyh əl-Əğarr bizə rəvayət etdi: Abdullah bin Xiraş bizə Vasit bin əl-Haris'dən, o da Nafi'dən, o da İbn Ömər'dən rəvayət etdi ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – minik üzərində vitr namazını qıldı.**"[271] Nafi'dən bu yolla gələn nüsxəni də İbn Hibban Vasit şəhərində əldə edə bilib.

Ümumiyyətlə Nafi' elmin yazılmasına təşviq edən və bunun üzərində çalışan biri idi. İmam əd-Dərimi deyir: "**əl-Valid bin Şucə bizə xəbər verdi: Muhəmməd bin Şueyb bin Şəbur bizə xəbər verdi: əl-Valid bin Süleyman bin Əbis-Səib bizə Süleyman bin Musə'dən rəvayət etdi ki, "o, Ömərin azadlı qulu Nafi'ni öz elmini imla edərkən gördü və onun qarşısında (dediklərini) yazırdılar.**"[272] Nafi'dən səhifə rəvayət edənlərdən biri də Cuveyriyyə bin Əsmə əl-Basri'dir. Cuveyriyyə bin Əsmə bin Ubeyd'in kunyəsi Əbul-Muxariq'dir. Hicri 173-cü ildə vəfat edib. Cuveyriyyə'nin səhifəsi məşhurdur və günümüzə qədər gəlib çatıb. Cuveyriyyədən bu səhifəni rəvayət edən qardaşı oğlu Abdullah bin Muhəmməd bin Əsmə'dir və hər iki ravi alimlərin nəzdində etibarlıdır, güvənilləndir. əl-Buxari və Muslim bu isnad ilə "əs-Sahih" kitablarında hədis rəvayət ediblər, başqa sözlə ifadə etsək əl-Buxari və Muslim bu səhifədən hədis götürüblər. Bu səhifə sonrakı nəsillər tərəfindən xüsusi bir etina görmüşdür. İmam Abdulkərim bin Muhəmməd ər-Rafi'i əl-Qazvini

271. "əs-Siqat", 7/565;

272. "Sunən əd-Dərimi", (524)

"ət-Tədvin fi Əxbər Qazvin" kitabında Qəzvin şəhərinin böyük alimlərindən bu səhifəni öyrənmiş bir neçə alimin adını çəkir. Misal üçün kitabın birinci cildində ər-Rafi'i deyir: "**Muhəmməd bin Abdək bin Ğanim əl-Ğanimi; Qəzvində, sonra Bağdadda fiqh elmi öyrənmişdir... Cuveyriyyə bin Əsmə'nin səhifəsini (hicri) 543-cü ildə İmam Əhməd bin İsmayıl'dan öyrənmişdir.**"[273] Yenə buyurur: "**Muhəmməd bin Abdilcəbbər əl-Muəddəb; Ataullah bin Əli bin Məlkəveyh'dən Cuveyriyyə bin Əsmə'nin səhifəsini onun Zahir əş-Şəhəmi'dən, onun da Əbu Sad əl-Kəncəruzi'dən, onun da Əbu Amraveyh əl-Hiri'dən, onun isə əl-Həsən bin Sufyan və Əbu Yalə əl-Məvsili'dən, onların isə Abdullah bin Muhəmməd bin Əsmə'dən, onun da əmisi Cuveyriyə'dən, onun da Nafi'dən, onun isə İbn Ömər'dən – radiyallahu anhu – rəvayəti ilə eşitmişdir.**"[274] Nəql etdiklərindən anlaşılır ki, bu səhifənin ən ali isnadları o dövrdə iki nəfərdə, İmam Əhməd bin İsmayıl'da və Ataullah bin Əli'də olub və digər alimlər bu səhifəni öyrənmək üçün bu iki alimə yönələrmişlər. Bu səhifəni Əhməd bin İsmayıl'dan öyrənmiş elm əhli arasında Muhəmməd bin əl-Abbas əz-Zəkəni'nin, Şirzad bin əl-Həsən bin Şirzad əs-Sərrac'ın və Hibətullah bin Bədrak əs-Sufi'nin adlarını çəkir. Ataullah bin Əli'dən öyrənən elm əhli arasında isə Mahmud bin Ömər bin Haşim əl-Qassar'ı qeyd edir. Cuveyriyyə'nin səhifəsi bu gün əlyazma şəklində İstanbulda Şəhid Əli Paşa kitabxanasında və Dəməşqdə əz-Zahiriyyə kitabxanasında mövcuddur.

## Ənəs bin Malik

Əbu Həmzə Ənəs bin Malik əl-Xazraci peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – xidmətçisi kimi tanınır. Əbu Həmzə onun kunyəsidir, babasının adı ən-Nədr kimi bilinir. Xazrac qəbiləsindəndir və səhabələr arasında peyğəmbərin xidmətçisi kimi tanınır. İmam Əhməd deyir: "**Sufyan bizə əz-Zuhri'dən rəvayət etdi ki, o, Ənəsi belə deyərkən eşidib: "Peyğəmbər – salləllahu aleyhi**

273. "ət-Tədvin fi Əxbəri Qazvin", 1/311;

274. Eyni mənbə: 1/313;

**va səlləm – (Mədinəyə) gəldikdə mənim on yaşım var idi və vəfat etdikdə mənim iyirmi yaşım var idi. Analarım məni ona xidmət etməyə təşviq edirdi...**”[275] Ənəs öz sözləri ilə peyğəmbərimizə on il xidmət etdiyini, onun yanında şagirdlik etdiyini bizə xəbər verir. Bu on il ərzində peyğəmbərimizdən – aleyhissalətu vassələm – nə qədər hədis eşitmiş, nə qədər hikmət öyrənmişdir.

Ənəs səhabələr içində bəzi özəlliklərinə görə seçilirdi. Sünnətin qorunulmasında önəmli olan bu özəlliklərə toxunmaqda fayda görürük. Ənəsdə gördüyümüz ilk özəllik budur ki, Ənəs yalnız sözlərini dəqiq xatırladığı hədisləri rəvayət etmişdir. əd-Dərimi “əs-Sunən” kitabında deyir: “**Əsəd bin Musə bizə xəbər verdi; Şu’bə bizə Attəb’dən belə dediyini rəvayət etdi: Ənəs bin Malik’i – radiyallahu anhu – belə deyərkən eşitdim: “Mən əgər xəta etməkdən qorxmasaydım sizə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – eşitdiyim çox şeyi rəvayət edərdim, çünki mən onu – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitmişəm: “Kim qəsdən adımdan yalan danışarsa qoy cəhənnəmdə yerini hazır etsin!**” Ənəs bu qorxusu üzərindən yalnız sözlərinin dəqiqliyindən əmin olduğu hədisləri bizə rəvayət etmişdir.

Ənəsin digər özəlliyi uzun bir ömür yaşamasıdır. Onun hicrətdən 10 il öncə doğulduğunu bilirik, ölüm tarixinə gəldikdə isə fərqli xəbərlər gəlib: bəziləri onun hicri 91-ci ildə, bəziləri 92-ci ildə, digərləri isə 93-cü ildə öldüyünü deyiblər. Məşhur olan budur ki, hicri 93-cü ildə 103 yaşında vəfat etmişdir. Beləliklə də səhabələrdən ən sonuncu ölənlərdən biridir. Ona görə də onun etibarlı, güvənilən tələbələri hicri 150-ci illərdən sonraya qədər yaşayıb. Tələbələrindən Humeyd ət-Tavil hicri 142-ci ildə, Süleyman ət-Teymi hicri 143-cü ildə, Yəhyə bin Said əl-Ənsari hicri 144-cü ildə, İsa bin Tahmən hicri 160-cı ildə vəfat edib. Ənəsin tələbələrinin tələbələri isə 200-cü ildən sonraya qədər yaşayıblar. Ona görə də hicri iki yüzüncü ildə bir islam aliminin arada bir vasitə ilə peyğəmbərin səhabəsindən hədis rəvayət etməsi mümkün idi.

Ənəs bin Malik’dəki bir başqa özəllik onun peyğəmbərin – aleyhissalətu vasəlləm – hədislərini özünün yazması və başqa-

275. “Musnəd Əhməd”, 19/132; Muəssəsətur-Risələ

larına yazdırması olmuşdur. əl-Beyhəqi "əl-Mədxal" kitabında isnadı ilə birlikdə rəvayət edir ki, Ənəs bin Malik'in tələbəsi "**Hubeyra bin Abdirrahmən Ənəs bin Malik'dən rəvayət edərək dedi: "Ənəs hədis rəvayət etdikdə və insanlar ondan çoxca hədis tələb etdikdə özünə aid olan səhifələri gətirib onların qabağına atardı və sonra deyərdi: "Bu, mənim Allahın elçisindən – salləllahu aleyhi va sələm – eşitdiyim və yazdığım hədislərdir, sonra onları ona ərz etmişəm.**"[276] İmam Muslim deyir: "**Şeybən bin Fərrux bizə rəvayət etdi; Süleyman, yəni İbnul-Muğira bizə rəvayət etdi; dedi: Səbit bizə Ənəs bin Malik'dən rəvayət etdi; dedi: Mahmud bin ər-Rabi mənə İtbən bin Məlik'dən rəvayət etdi; dedi: "Mədinəyə gəldim və (orada) İtbən ilə görüşdüm, ona dedim: "Mənə səndən bir hədis çatıb." Dedi: "Gözümə bir şeylər baş verdi və Allahın elçisinin – salləllahu aleyhi va sələm – yanına adam göndərib bildirdim ki, onun yanıma gəlib mənzilimdə namaz qılmasını çox istəyirəm." Dedi: "Peyğəmbər – salləllahu aleyhi va sələm – və səhabələrindən Allahın dilədiyi qədəri gəldi,**

---

276. "əl-Mədxal iləs-Sunən əl-Kubra", (610); əl-Beyhəqi bu xəbərin isnadını zikr edərək deyir: "Əbu Sad əl-Məlini bizə xəbər verdi; Əbu Əhməd bin Adiyy bildirdi; Cəfər bin Əhməd bin Asim əd-Diməşqi bizə rəvayət etdi; Hişəm bin Ammar bizə rəvayət etdi; Sadəqa bin Xalid bizə rəvayət etdi; Utbə bin Əbi Həkim bizə rəvayət etdi; Hubeyra bin Abdirrahmən bizə Ənəs bin Malik'dən rəvayət etdi..." Bu xəbər həqiqətən də Əbu Əhməd bin Adiyy'in "əl-Kəmil fi Duafə ər-Ricəl" kitabında (1/98) yer alır. əl-Xatib əl-Bağdadi bunu üç ayrı isnad ilə zikr edir: 1) Əbul-Huseyn bin əl-Fədl əl-Qattan – Abdullah bin Cəfər bin Dərastəveyh – Yaqub bin Sufyan – Əbu Said Abdurrahmən bin İbrahim – Muhəmməd bin Şueyb – Utbə bin Əbi Həkim əl-Həmədəni – Hubeyra bin Abdirrahmən, 2) Əbu Əli əl-Həsən bin Əli bin İbrahim əl-Muqri əl-Əhvazi – Əbu Bəkr Ömər bin Abdilkərim bin Ömər əl-Fəzəri – Əbu Əli əl-Həsən bin Həbib bin Abdilməlik - əl-Abbas bin əl-Valid – Muhəmməd bin Şueyb bin Şəbur – Utbə bin Əbi Həkim – Hubeyra bin Abdirrahmən, 3) Əbul-Fərac Abdussələm bin Abdilvahhəb əl-Quraşi – Süleyman bin Əhməd bin Əyyub ət-Tabərani – Əhməd bin Ənəs bin Malik – Hişəm bin Ammar – Sadəqa bin Xalid – Utbə bin Əbi Həkim – Hubeyra bin Abdirrahmən. Bu üç isnad təsdiq edir ki, bu xəbər həqiqətən də Utbə bin Əbi Həkim'dən qaynaqlanıb. Utbə'yə gəldikdə isə Əbu Bişr əd-Dəvləbi, ən-Nəsəi, Muhəmməd bin Auf ət-Tai onu zəif ravi görüblər. Əbu Bəkr bin Əbi Xeysəmə'nin Yəhyə bin Main'dən rəvayət etdiyinə görə o da zəif hesab edib. Lakin Abbas əd-Dəvri və əl-Mufəddal'ın rəvayətinə görə isə Yəhyə bin Main onu siqa hesab edib. İbn Adiyy, Əbu Hətim ər-Razi onda bir bəisin olmadığını deyiblər. Əbu Zura əd-Diməşqi, İbn Hibban, ət-Tabərani, Duheym, Mərvan ət-Tatari onu siqa hesab ediblər. Ona görə də İbn Həcər əl-Asqələni onun üçün yekun olaraq "saduqdur, çoxlu xətalar edir" hökmünü verib. Hubeyra bin Abdirrahmən'ə gəldikdə isə Şam torpaqlarındandır və İbn Hibban onu siqa ravilər arasında zikr edib.

**daxil oldu və o, mənzilimdə namaz qıldı, səhabələri isə öz aralarında (münafiqlər haqqında) danışırdılar. Sonra bunların çoxunu və ən ağırını Məlik bin Duxşum'a nisbət etdilər; (peyğəmbərin) ona bəd-dua edib də həlak olmasını arzu etdiklərini, başına pis iş gəlməsini istədiklərini söylədilər. Allahın elçisi – salləllahu aleyhi va səlləm – namazını bitirdi və dedi: "Məgər o, Allahdan savayı bir ilahın olmadığına və mənim Allahın elçisi olduğuma şahidlik etmirmi?" Dedilər: "O, bunu edir, lakin qəlbində bu yoxdur." (Peyğəmbər) dedi: "Allahdan savayı ilahın olmadığına və mənim Allahın elçisi olduğuma şahidlik edən elə bir kəs yoxdur ki, atəşə girsin və ya (atəş) onu yesin!" Ənəs (bin Malik) dedi: "Bu hədis xoşuma gəldi, ona görə də oğluma – "bunu yaz!" – dedim, o da yazdı.**"[277] Bu iki xəbər bizə Ənəsin necə hədis yazmağa əhəmiyyət verdiyini göstərir. Bu rəvayətdəki Mahmud bin ər-Rabi və İtbən bin Məlik də səhabədir və Mahmudun digər səhabədən eşidib rəvayət etdiyini təqdir ilə oğluna yazdırmışdır. əd-Dərimi "əs-Sunən" kitabında deyir: "**Muslim bin İbrahim bizə xəbər verdi; Abdullah bin əl-Musənnə bizə rəvayət etdi; Suməmə bin Abdilləh bin Ənəs mənə rəvayət etdi ki, Ənəs – radiyallahu anhu – oğullarına deyərdi: "Oğlum, bu elmi qeydə alın!**"[278] Övladlarına hədisləri yazmağı öyrədən və onları bu işə təşviq edən Ənəs – Allah ondan razı olsun! – yanına tələbələr götürərək onlara da hədis yazmağı öyrədərdi. əd-Dərimi deyir: "**İsmail bin Əbəs bizə xəbər verdi; İbn İdris bizə Mehdi bin Məymun'dən, o da Səlm əl-Aləvi'dən belə dediyini rəvayət etdi; "Əbən'i Ənəsin – radiyallahu anhu – yanında lövhə üzərində yazarkən gördüm.**"[279] Bu özəlliklər yalnız Ənəs bin Malik'ə aid deyildir, lakin bu üç özəlliyi özündə toplayan az səhabə olmuşdur. Ənəsin hədisləri yazdırmasının təbii nəticəsi olaraq onun tələbələrindən daha sonrakı zamanlara hədis nüsxələri keçib. Humeyd ət-Tavil və Süleyman ət-Teymi bu tələbələrdəndir. Humeyd ət-Tavil'in səhifəsi daha məşhurdur.

---

277. "Sahih Muslim", (54)

278. "Sunən əd-Dərimi", (508); Abdurrahmən əl-Muallimi "əl-Ənvar əl-Kəşifə" kitabında (səh: 41-42) bu rəvayətlərin Ənəsdən səhih olduğunu deyir.

279. Eyni mənbə: (509)

## Sumamə bin Abdilləh'in kitabı

İmam Əhməd bin Hənbəl "əl-Musnəd" kitabında deyir: "**Əbu Kəmil bizə rəvayət etdi; Həmməd bin Sələmə bizə rəvayət etdi: Bu kitabı mən Sumamə bin Abdilləh bin Ənəs'dən aldım, o da Ənəs bin Malik'dən aldı ki, Əbu Bəkr onlara yazdı: "Bunlar Allahın elçisinin – salləllahu aleyhi va səlləm – müsəlmanların üzərinə fərz etdiyi zəkatın fərzləridir...**"[280] və daha sonra heyvanlardakı zəkatın və pullardakı zəkatın təfsilatını uzun şəkildə zikr edir. İmam Əhməd bunu şeyxi Əbu Kəmil'dən rəvayət edir, İbn Məcə isə bunu öz şeyxi Musa bin İsmail'dən rəvayət edir. Musanın rəvayətində verilən əlavə məlumat budur ki, Əbu Bəkr həmin kitabı peyğəmbərimizdən – salləllahu aleyhi va səlləm – almışdır və Əbu Bəkr zəkat toplamaqla vəzifələndikdə həmin məktub ona verilmiş və üzərində peyğəmbərin möhürü olmuşdur. Daha sonra Əbu Bəkr bu məktubu Ənəs bin Malik üçün yazmışdır. Görünür ki, o məktub Sumamə bin Abdilləh'ə keçib. Daha sonra isə Sumamə'dən Həmməd bin Sələmə'yə keçib. Sumamə'nin içində zəkatın təfsilatını və bəzi digər hökmləri daşıyan bu kitabı başqalarının da ixtiyarında olub. əd-Dəraqutni deyir: "**Əli bin əl-Mədini dedi: "Abdullah bin əl-Musənnə mənə rəvayət etdi; dedi: "Sumamə mənə bu kitabı verdi."... Həmməd bin Zeyd bunun eynisini Əyyub'dan nəql edib: "Sumamə mənə bir kitab verdi" və bunu zikr etdi.**"[281] Bu xəbərlərdən aydın olur ki, Ənəs bin Malik'in zəkat haqqındakı kitabı nəvəsi Sumamə'yə, ondan isə Həmməd bin Sələmə, Abdullah bin əl-Musənnə və Əyyub əs-Sixtiyəni'yə keçib. Abdullah bin əl-Musənnə digər iki imam qədər tanınmayıb, amma Sumamə'nin qardaşı oğludur.

## Humeyd ət-Tavil'in səhifəsi

Əbu Ubeydə Humeyd bin Əbi Humeyd Tiruveyh əl-Xuzai əl-Basri kiçik tabiilərdən sayılır və hicri 68-ci ildə doğulub. Ənəs bin

280. "əl-Musnəd", 1/232;

281. "əl-İlzəmət vat-Tətəbbu", səh: 252;

Malik, Bəkr bin Abdilləh, Səbit əl-Bunəni, əl-Həsən əl-Basri, Qatədə bin Diəmə, Musə bin Ənəs, Yəhyə bin Said əl-Ənsari və başqalarından hədis rəvayət etmişdir. Çox hədis rəvayət edənlərdən sayılmır və rəvayətlərinin böyük əksəriyyəti Ənəs bin Malik'dəndir. Ənəs ilə məşhurlaşıb, hətta bəzən "Humeyd sahibu Ənəs" (Ənəsin yoldaşı Humeyd) adı ilə tanıdıblar. Alimlər yanında etibarlı, güvənli bir ravi kimi dəyərləndirilib. Hicri 143-cü ildə namaz əsnasında vəfat etmişdir.

Fuad Sezkin "Tərixut-Turas əl-Arabi" kitabında xəbər verir ki, Türkiyədə "Şəhid Əli" kitabxanasında "Humeyd ət-Tavil'in Ənəsdən səhifəsi" saxlanılır. Şeyx Yəhyə bin Abdilləh əl-Bəkri əş-Şəhri uzun müddətdir ki, Humeyd ət-Tavil'in şeyxi Ənəsdən rəvayət etdiklərini bir arada toplamaq üçün səy göstərdiyi ərəfədə bu məlumat ilə qarşılaşır və dörd ilə yaxın müddətdə Türkiyədən onun əlyazmasını əldə etməyə çalışır. Sonunda əlyazmanın foto surətini əldə etdikdə bunun Muhəmməd bin Hişəm'in Mərvan bin Muaviyə əl-Fizəri'dən, onun Humeyd'dən, onun da Ənəs'dən rəvayət etdiyi hədislər olduğunu görür. Bu hədislər hicri altıncı əsrdə vəfat etmiş Əbul-Məali əl-Furavi'nin "əs-Subə'iyyət" adı ilə tanınan kitabında qorunulmuşdur, çünki əl-Furavi ən ali isnad ilə Humeyd'in səhifəsini hifz etmişdir. Əbul-Məali'nin bu isnadı öz dövründə ən ali isnadlardan sayıldığı üçün bu kitab "Subə'iyyət Əbil-Məali əl-Furavi" adı ilə qeydə düşüb. "əs-Subə'iyyət" isə "yeddiliklər" deməkdir və qəsd olunan onunla peyğəmbərin – aleyhissalətu vasəlləm – arasında yalnız yeddi ravinin olmasıdır. Həqiqətdə Humeydin bu səhifəsindəki hədislərin bir hissəsini toplayan kəs Əbu Cəfər Muhəmməd bin Hişəm bin Mələs ən-Numeyri əd-Diməşqi'dir. Ondan sonra bu nüsxə bir şeyxin öz tələbəsinə öyrətmək surəti ilə Əbu Abdilləh Muhəmməd bin əl-Məmun ər-Raşid bin Hibətilləh əl-Mutavvi'i əl-Ləhəvuri'yə qədər gəlib çatıb. Əslən Lahavur'dan olan bu zat elm tələbi üçün vətənini tərk etmiş bir müddət Xorasanda, sonra Bağdadda yaşamışdır, daha sonra bir çox ölkələri gəzdikdən sonra Azərbaycanda qərar tapmış, orada vaz edib dəvət aparmışdır, lakin mülhidlər tərəfindən hicri 603-cü ildə öldürülmüşdür. əl-Mutavvi'i bu səhifəni öz şeyxi Əbul-Məali Abdulmunim bin Abdilləh bin Muhəmməd bin əl-Mufəddal bin Əhməd əl-Furavi əs-Sa'idi ən-Neysəburi'yə oxuyaraq ondan almışdır.

əl-Furavi hicri 497-ci ildə anadan olub; Nisəbur, Bağdad, Hicaz kimi ərazilərə səyahət etmişdir və ali sənədlərə nail olub. Hicri 587-ci ildə doxsan yaşında ikən vəfat etmişdir. O isə öz növbəsində bu səhifəni öz şeyxi Əbu Bəkr Abdulğaffər bin Muhəmməd bin əl-Həsən bin Əli bin Şiraveyh bin Əli əş-Şiravi ən-Nisəburi'dən alıb. əş-Şiravi hicri 414-cü ildə anadan olub və hicri 510-cu ildə doxsan altı yaşında vəfat etmişdir. Humeyd ət-Tavil'in bu səhifəsi həmçinin Əbul-Xayr əl-Qazvini'nin səhifələr toplusu olan "Kitəbus-Sərd val-Fərd" adlı kitabında da yer alır.

## Abdullah bin Abbas

"Həbrul-Ummə" (ümmətin alimi) və "Turcumənul-Quran" (Quranın tərcüməçisi) ləqəbləri ilə tanınan Abdullah bin Abbas bin Abdilmuttalib bin Həşim peyğəmbərimizin əmisi oğludur və kiçik yaşlı səhabələrin arasında ən elmlisi hesab olunur. Bu isə şəkk yoxdur ki, peyğəmbərimizin – aleyhissələm – onun üçün "**Allahım, onu dində fəqih elə və ona təvili öyrət**"[282] duasının bərəkətidir. Üstün zəkası və mübahisəsiz Quran biliklərinə görə xəlifə Əli bin Əbi Talib – kərraməllahu vachəhu – onu hərurilər ilə münaqişə etməyə göndərmişdi. Ömər bin əl-Xattab yaşca özlərindən kiçik olmasına baxmayaraq onun məşvərət məclisində iştirak etməsini istəyərdi. İbn Abbas hicri 68-ci ilə Taifdə yetmiş bir yaşında vəfat edib.

İbn Abbas eşitdiyi hədisləri yazmağa önəm verən səhabələrdən idi. Peyğəmbər – aleyhissalətu vassələm – vəfat edərkən yaşının kiçik olmasına baxmayaraq digər səhabələrdən öyrəndikləri sayəsində ən çox hədis rəvayət edən və ən elmli səhabələrdən biri olmuşdur. əl-Xatib əl-Bəğdədi deyir: "**Əbu Əli əl-Həsən bin əl-Huseyn bin əl-Abbas bin Dumə ən-Ni'ali bizə xəbər verdi: Əli ibn Harun əs-Simsər əl-Hərbi bizə xəbər verdi: Musa bin Harun bizə rəvayət etdi: Əhməd bin Abədə bizə rəvayət etdi: Fudeyl bin Suleyman bizə rəvayət etdi: Ubeydullah bin Əbi Rafi'nin azadlı köləsi Fəyid bizə Ubeydullah bin Əbi Rafi'dən belə dediyini rəvayət etdi: "İbn Abbas (atam) Əbu Rafi'nin yanı-**

282. "Musnəd Əhməd", 4/225, 5/65;

**na gələrək ondan soruşardı: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – bu və bu günlərdə nə edirdi?" İbn Abbas özü ilə lövhələr gətirərdi və (eşitdiklərini) ora yazardı.**"[283] İbn Sad deyir: "**Muhəmməd bin Ömər bizə xəbər verdi: Ubeydullah bin Əli'nin azadlı köləsi Fəid mənə Ubeydullah bin Əli'dən, o da nənəsi Səlma'dan belə dediyini rəvayət etdi: "Abdullah bin Abbas'ı yanında lövhələr ilə birlikdə gördüm; onlara Allahın elçisinin – salləllahu aleyhi va səlləm – felləri ilə bağlı Əbu Rafi'dən eşitdiklərini yazırdı.**"[284] Əbu Rafi isə peyğəmbərin – aleyhissələm – azadlı köləsi olub. Öncələr əmisi Abbas bin Abdilmuttalib'in köləsi idi və onu qardaşı oğlu Muhəmməd bin Abdilləh'ə, yəni peyğəmbərimizə hədiyyə vermişdi. Abbas islam dinini qəbul etdikdə bunun müjdəsini peyğəmbərimizə çatdıran Əbu Rafi oldu və bu xoş xəbərə görə Allahın elçisi – aleyhissalətu vassələm – onu azad etdi. Həmçinin Əbu Rafi'nin ömür yoldaşı Səlma da peyğəmbərimizin – aleyhissələm – azad etdiyi bir kölə idi. Bu şübhəsiz ki, Əbu Rafi'ni peyğəmbərin xidmətində durmuş, onun peyğəmbərlik həyatının önəmli hissəsində iştirak etmiş dəyəri ölçülməz bir şahidə çevirir. İbn Abbas da peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – həyatını yaxından öyrənmək üçün, onun sözlərini və əməllərini yazıya köçürmək üçün Əbu Rafi' kimi səhabələrə müraciət edərdi. İmam Əhməd deyir: "**Yəhyə bin Said (əl-Qattan) bizə İbn Cureyc'dən belə dediyini rəvayət etdi: Həsən bin Muslim mənə Tavus'dan belə dediyini xəbər verdi: "Zeyd bin Ərqam (Məkkəyə bizim yanımıza) gəldi və İbn Abbas ondan xatırlamasını istəyərək soruşdu: "Peyğəmbər – salləllahu aleyhi va səlləm – ihramlı ikən ona hədiyyə verilmiş ət haqqında mənə necə xəbər vermişdin?" Dedi: "Bəli, bir kişi ona ov heyvanının ətindən bir üzv hədiyyə verdi, o da geri çevirdi və dedi: "Biz bunu yemirik, biz ihramlıyıq".**"[285] İbn Abbas burada səhabələrin böyüklərindən olan Zeyd bin Ərqam'dan daha öncə eşitdiyi bir hədisi dəqiqləşdirir və təbii ki, bu, peyğəmbərin – aleyhissalətu vassələm – sünnətini öyrənmək üçün önəmli olan bir mərhələdir.

283. "Təqyidul-İlm", səh: 114

284. "ət-Tabəqat əl-Kubra", 2/371;

285. "Musnəd Əhməd", 32/22 (ər-Risələ) ; Muslim (1195)

İbn Abbas həmçinin peyğəmbərin – aleyhissələm – yazdırdığı məktubları da toplamaq üçün böyük bir əmək sərf etmişdir. Cəmələddin Əbu Muhəmməd əz-Zeyla'i deyir: "**Sonra əl-Vaqidi isnadı ilə İkrimə'dən belə dediyini rəvayət edir:** "**Bu kitabı mən İbn Abbasın ölümündən sonra onun kitabları arasından tapdım və üzünü köçürdüm. Beləliklə də orada yazılı idi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm - əl-Alə bin əl-Hədrami'ni əl-Munzir bin Səva'ya göndərdi və Allahın elçisi – salləllahu aleyhi va səlləm - ona bir məktub yazaraq onu İslama dəvət etdi...**"[286] İkrimə İbn Abbas'ın ən tanınmış tələbələrindəndir. Bu kitabda peyğəmbərin – aleyhissələm - Bəhreyndəki ərəblərin böyüyü əl-Munzirə yazdığı məktublar və əl-Munzir'in cavabı yer alır, məktubda cizyə kimi bəzi şəriət hökmləri zikr olunur.

İbn Abbas özü hədisləri toplayaraq yazdığı kimi ondan elm almağa gəlmiş tələbələrinə də hədisləri yazdırardı. əd-Dərimi deyir: "**İsmail bin Əbən bizə İbn İdris'dən, o da Harun bin Antəra'dan, o atasından rəvayət edir: "İbn Abbas mənə bir hədis rəvayət etdi və dedim: "Bunu səndən yazımmı?" Mənə yazmağa icazə verdi.**"[287] Harun bin Antəra kufəli alimlərdəndir, İbn Abbas ilə qarşılaşıb və ondan hədis yazıb. İmam ət-Tirmizi deyir: "**Suveyd bin Nəsr bizə rəvayət etdi; Əli bin əl-Huseyn bin əl-Vaqid bizə Əbu İsmət'dən, o da Yezid ən-Nəhvi'dən, o isə İkrimə'dən xəbər verdi ki, "Taif əhlindən bir neçə nəfər İbn Abbas'ın yanına gəldilər ki, onun kitablarından yazsınlar...**"[288] Bu kimi xəbərlər ona dəlalət edir ki, İbn Abbasın məclisləri elm öyrənmək istəyənlər ilə qaynayardı. O dövrün ən bariz şəxsiyyətləri peyğəmbərin – aleyhissələm – sünnətini öyrənmək üçün belə bir məclisdən uzaq düşməzdilər, əksinə İbn Abbasın elmə öyrətmək həvəsindən istifadə edərək hədisləri dəqiqləşdirərdilər. Biz bunu onun tələbələrindən biri Məymun bin Mehran'ın sözlərindən anlaya bilərik. İbn Sad kitabında isnadını zikr edərək deyir: "**Məymun bin Mehran dedi: "Əgər İbn Abbas'ın yanına içində altmış hədis yazılmış bir səhifə ilə gəlsən onları ondan soruşma-**

286. "Nəsbur-Rayə", 4/420;

287. "Sunən əd-Dərimi", (521)

288. "əl-İləl əs-Sağir", səh: 751; Dər İhyə ət-Turas əl-Arabi

**dan geri dönəcəksən, (çünki) onları (məclisində onsuz da) eşidəcəksən." Əbu Bəkr (ibn Ayyəş bunu izah edərək) deyir: "Ondan (başqa) insanlar soruşurlar və bu da sənin üçün kifayət edəcək.**"[289] Şübhəsiz ki, bu xəbər bizə iki şeyi ifadə edir: İbn Abbasın məclisinə gələnlər içində hədislər yazılmış səhifələr ilə gələrdilər. İdafə etdiyi digər məna isə məclisində iştirak edənlərin və soruşduqları hədislərin çoxluğudur.

Heç bir şəkk olmamalıdır ki, İbn Abbas'ın yazdırdığı bu kitablar özündən sonra tələbələri tərəfindən nəql edilmişdir. Bu barədə kifayət qədər isbat edici xəbərlər vardır. əl-Vaqidi bizə İkrəmə'dən belə dediyini xəbər verir: "**Bu kitabı İbn Abbas öldükdən sonra onun kitabları arasında tapdım, həmən onun nüsxəsini çıxardım...**"[290] İbn Sad deyir: "**Əhməd bin Abdilləh bin Yunus bizə xəbər verdi: Zuheyr bizə rəvayət etdi: Musa bin Uqbə bizə rəvayət etdi: "Kureyb bizim yanımızda bir dəvə yükü və ya yarım dəvə yükü kitab buraxdı." (Musa bin Uqbə) dedi: "Əli bin Abdilləh bin Abbas (kitablardan) yazmaq istədikdə ona məktub yazardı: "Mənə bu və ya o səhifəni göndər!" Onun üzünü köçürərdi və sonra ikisindən birini geri göndərərdi.**"[291] Bu xəbərdə adı keçən Kureyb səhabələrə tələbəlik etmiş bir alimdir. Tam olaraq Əbu Rişdin Kureyb bin Əbi Muslim əl-Haşimi kimi tanınan bu zat İbn Abbas'ın əvvəllər köləsi olub və sonra İbn Abbas ona azadlıq bəxş etmişdir. Bir qayda olaraq azad olunmuş kölələr öz keçmiş ağalarının yanında qalaraq işləyərmişlər. Kureyb hicri 98-ci ildə vəfat edib. Bu tarixi şahidlik ilə öyrənmiş oluruq ki, İbn Abbasın kitablarının hamısı və yaxud da bir hissəsi azadlı köləsi Kureyb'in ixtiyarında qalmışdır. Həmçinin öyrənmiş oluruq ki, İbn Abbas'ın oğlu Əli əs-Səccəd atasının kitablarından hansısa birinə ehtiyac duyduqda onu Kureyb'dən alaraq köçürərmiş. Əli əs-Səccəd hicri 118-ci ildə vəfat edib. Həm Kureyb'dən, həm də Əli əs-Səccəd'dən bu kitabları

289. "ət-Tabəqat əl-Kubra", 6/335; Doktor Əli Muhəmməd Ömər'in təhqiqi; İbn Sad deyir: "Əhməd bin Abdilləh bin Yunus bizə xəbər verdi: Əbu Bəkr bin Ayyəş bizə əl-Aməş'dən, o da Məymun bin Mehran'dan belə dediyini rəvayət etdi..." İbn Həcər "əl-İsabə fi Təmyizis-Sahabə" kitabında (4/128) bu sənədi səhih olaraq dəyərləndirib.

290. "Nəsbur-Rayə", 4/420;

291. "ət-Tabəqat əl-Kubra", 5/293;

İbn Şihəb əz-Zuhri, Musa bin Uqbə kimi kitab yazmağa əhəmiyyət verən alimlər miras alıblar.

## Əli bin Əbi Talha'nın səhifəsi

Tam adı Əbul-Həsən Əli bin Səlim Əbi Talha bin əl-Muxariq əl-Həşimi əl-Cəzəri olan bu zat İbn Abbas'dan məşhur təfsir səhifəsini rəvayət etmişdir. Kunyəsi bəzi qaynaqlarda həm də Əbu Muhəmməd olaraq qeyd edilir. Atası Səlim əslində peyğəmbərimizin – salləllahu aleyhi va səlləm - əmisi Abbasın köləsi olub və azad edilib. Bir adət olaraq azad olunmuş kölələr keçmiş ağalarının nəsəbinə nisbət olunublar. Bu səbəbdən də əl-Həşimi olaraq tanınıb. Nə zaman doğulduğu tarixi qaynaqlarda qeyd olunmur, lakin İraqdakı Cəzirə bölgəsində dünyaya gəldiyi və ömrünün bir hissəsini orada keçirdikdən sonra Şamdakı Hims şəhərinə köçdüyü zikr olunur. Elə hicri 143-cü ildə Hims şəhərində vəfat edib.

Əli bin Əbi Talha öz dövrünün elm əhlindən faydalanmış bir kimsədir. İbn Abbas'ın tələbələrindən Mucahid bin Cəbr, Sair bin Cubeyr və İkrimə'dən hədis və təfsir öyrənib. Həmçinin Əbul-Vaddək, Raşid bin Sa'd, Muhəmməd bin Zeyd, əl-Qasim bin Muhəmməd və başqalarından da elm alıb. Ondan isə Sufyan əs-Səvri, Həsən bin Saleh bin Həyy, Mə'mər bin Raşid, Ata əl-Xorasani və başqaları rəvayət ediblər. İmam Muslim "əs-Sahih" kitabına onun hədisini də daxil edib.

Əli bin Əbi Talha daha çox rəvayət etdiyi səhifəsinə görə məşhurdur. Bu səhifə həm də İbn Abbas'ın səhifəsi olaraq da tanınıb, çünki içindəkiləri Əli bin Əbi Talha məhz Abdullah ibn Abbas'dan rəvayət edir. Lakin Əli həqiqətdə İbn Abbas ilə qarşılaşmayıb. Ona görə də bu səhifə haqqında iki rəy mövcuddur. Bir rəyə görə İbn Əbi Talha bu səhifəni İbn Abbas'ın tələbələrindən, xüsusən Mucahid və İkrimə'dən toplayaraq yazmışdır. İkinci rəy isə budur ki, bu səhifə İbn Abbas'ın özünün yazdığı səhifədir ki, Əli bin Əbi Talha'nın əlinə keçmiş və ondan rəvayət etmişdir. Bu səhifənin "İbn Abbasın səhifəsi" kimi məşhurlaşması buna dələlət edir. Həm-

çinin buna dəlalət edən başqa bir məqam əl-Xatib əl-Bağdadi'nin tarix kitabında zikr etdiyi bu xəbərdir: "**Əbul-Həsən bin əl-Furat'ın kitabında öz əl yazısından oxudum: Muhəmməd bin əl-Abbas əl-Həravi bizə xəbər verdi: Yaqub bin İshaq bin Mahmud əl-Fəqih bizə rəvayət edərək dedi: "Əli bin Əbi Talha haqqında Saleh bin Muhəmməd'dən soruşdular: "Təfsir kitabını kimdən eşidib?" Dedi: "Heç kimdən.**"[292] Bu xəbərdən anlaşılan budur ki, Əli bin Əbi Talha bu kitabı eşidərək almayıb. Burada daha iki ehtimal vardır. Bu kitab həqiqətən də İbn Abbas'ın özünün yazdığı kitabdır və tələbələri onu köçürüblər və daha sonra İbn Əbi Talha bu kitabı onlara oxumadan sadəcə özü üçün köçürüb. Yaxud da Mucahid və İkrimə'nin öz şeyxləri İbn Abbas'dan yazdıqları səhifələrdən toplayaraq kitab halına salıb və "İbn Abbasın təfsiri" olaraq məşhurlaşıb. Əbu Cəfər ət-Tahavi'nin sözləri bu mənaya dəlalət edir, belə ki, bununla bağlı olaraq deyir: "**Əli bin Əbi Talha'nın İbn Abbas'dan – onunla qarşılaşmasa belə - hədisini qəbul edirik, çünki elm əhli yanında isnadlar ilədir. O, sadəcə olaraq içində bu hədislər olan kitabı Mücahid'dən və İkrimə'dən götürüb.**"[293]

Bu səhifənin İbn Abbas'dan sabit olduğunu müdafiə edənlərdən biri də Əbu Cəfər ən-Nəhhəs (vəfatı hicri 338) olub. O, "ən-Nəsix val-Mənsux" kitabında deyir: "**Bunun İbn Abbas'dan olması səhihdir. Bunun isnadına tən edənlər deyirlər ki, İbn Əbi Talha heç də İbn Abbas'ın özündən eşitməyib, təfsir kitabını sadəcə Mucahid və İkrimə'dən götürüb. Bu söz tən etməyi gərəkdirməz, çünki onu iki etibarlı şəxsdən götürüb və o özü də etibarlı və doğru sözlüdür.**" ən-Nəhhəs daha sonra isnadını zikr edərək İmam Əhməd bin Hənbəl'dən belə dediyini rəvayət edir: "**Misirdə Müaviyə bin Saleh'dən rəvayət olunan "təvil" kitabı vardır ki, əgər bir kimsə Misirə gedib təkcə o kitabı yazarsa və sonra geri qayıdarsa mənə görə onun səfəri boşuna olmaz.**"[294] Bu rəvayəti həm də İmam ət-Tahavi "Şərhu

292. "Tərixu Bəğdəd", 13/380;

293. "Şərhu Muşkilil-Əsər", 6/282;

294. "ən-Nəsix val-Mənsux", səh: 75; Əbu Cəfər ən-Nəhhəs deyir: "Əhməd bin Muhəmməd əl-Əzdi mənə rəvayət etdi: Əli bin əl-Huseyn'in belə deyərkən eşitdim: əl-Huseyn

Məanil-Əsər" kitabında Əhməd bin Hənbəldən zikr edir. Burada adı keçən Müaviyə İbn Saleh əl-Hədrami əl-Himsi'dir. Əli bin Əbi Talha'dan təfsir kitabını rəvayət edən o olduğu üçün bəzən onun adı ilə də çağırılır. Müaviyə bin Saleh Şam torpaqlarından çıxaraq Misirdən keçib Əndəlüsə qədər uzun bir səfər edib və orada qazi olaraq çalışıb. Daha sonra həcc edərkən Misirdə bir müddət qalır və bu müddət ərzində həmin təfsir kitabını ondan Misirdəki alimlər yazırlar. Lakin ondan bu kitabı yazıb məşhurlaşdıran misirli alim Abdullah bin Saleh bin Muhəmməd bin Muslim əl-Cuhəni olub, İmam əl-Leys bin Sad'ın katibi olaraq tanınır. Müaviyə bin Saleh hicri təqvim ilə 158-ci ildə vəfat edib. Abdullah isə hicri 137-ci ildə dünyaya gəlib. Abdullah bin Saleh kitab toplayan kəslərdən idi. Abdurrahmən bin İbrahim deyir: "**Yüz doxsan səkkizinci ildə İbn Vəhb'in vəfatından sonra Misirə gəldim və Müaviyə bin Saleh'in kitablarını Abdullah bin Saleh'dən yazdım.**"[295] İbn Həcər əl-Asqələni deyir: "**Bu nüsxə əl-Leys'in katibi Əbu Saleh'də idi; onu Müaviyə bin Saleh'dən, o da Əli bin Əbi Talha'dan, o da İbn Abbas'dan rəvayət edir. Bunu həmçinin əl-Buxari də Əbu Saleh'dən götürüb və bu "əs-Sahih" kitabında çox yerdə etimad edir.**"[296]

---

bin Abdirrahmən bin Fihm'i belə deyərkən eşitdim: Əhməd bin Hənbəli belə deyərkən eşitdim.." ət-Tahavi də bunu Əli bin əl-Huseyn'dən rəvayət edir. əl-Huseyn bin Abdirrahmən bin Fihm böyük alim və hafizdir, əl-Həkim ən-Nisəburi "əl-Mustədrak" kitabında onu "etibarlı və güvənilən" olaraq vəsf edir. əl-Xatib əl-Bəğdədi onun "etibarlı" olduğunu deyir. Oğlu Əli bin əl-Huseyn'ə gəldikdə isə Misirdə qazi olaraq çalışıb. İbn Yunus onu tarixində zikr edir və onu "etibarlı, möhkəm" olaraq vəsf edir. Beləliklə də bunun İmam Əhməddən sabit olduğunu deyə bilərik.

295. "Tərixu Bəğdəd va Zuyulihi", 9/487; Bunu əl-Xatib əl-Bağdadi belə rəvayət edir: "Abdurrahmən bin Osman əd-Diməşqi bizə yazdığı məktubunda bizə rəvayət etdi: Əbul-Məymun Abdurrahmən bin Abdilləh əl-Bəcəli bizə xəbər verdi: Əbu Zur'a Abdurrahmən bin Amr bizə xəbər verdi: Abdurrahmən bin İbrahim mənə rəvayət etdi..." Əbu Zur'a məşhur tarix kitabının sahibi əd-Diməşqidir, əl-Bəcəli və Abdurrahmən bin Osman da tanınmış alimlər və etibarlı ravilərdir.

296. "Fəthul-Bəri", 8/439;

## Cabir bin Abdilləh

Cabir bin Abdilləh bin Amr bin Həram əl-Ənsari əl-Xazraci peyğəmbərin – aleyhissələm - mübarək səhabələrindən biridir. Mədinədən gəlib ikinci Aqabə beyətində iştirak edənlərdən biri olmuş və uzun ömür yaşamışdır; buna görə də Allahın elçisindən – salləllahu aleyhi va səlləm - ən çox hədis rəvayət edənlər sırasındadır. Cabir də bəzi səhabələr kimi hədislərini yazmışdır. Əbu Bəkr bin Əbi Şeybə "əl-Musannəf" kitabında yazır: "**Hüseyn bin Əli bizə ər-Rabi' bin Sa'ddan belə dediyini rəvayət etdi: "Cabiri mən İbn Səbit'in yanında lövhələrdə yazarkən gördüm.**"[297] Bundan əlavə o, yanına gələn tələbələrinə də hədisləri yazdırardı. ət-Tahavi "Şərhu Məanil-Əsər" kitabında deyir: "**İbn Əbi Davud bizə rəvayət etdi; Əbur-Rabi əz-Zəhrani bizə rəvayət etdi; Yaqub əl-Qummi bizə rəvayət etdi; dedi: Abdullah bin Muhəmməd bin Aqil (bin Əbi Talib) bizə rəvayət edərək dedi: "Biz Cabir bin Abdilləh'in yanına gələrdik, ondan Allahın elçisinin – salləllahu aleyhi va səlləm – sünnətlərini soruşardıq və onları yazardıq.**"[298] əl-Xatib əl-Bağdadi də bunu "Təqyidul-İlm" adlı əsərində[299] başqa isnadla zikr edir və orada Cabir'in yanına gedənlərin Abdullah bin Muhəmməd bin Aqil bin Əbi Talib ilə yanaşı Əbu Cəfər Muhəmməd bin Əli və Muhəmməd bin əl-Hənəfiyyə olduğunu zikr edir. Onun rəvayətində deyir: "**Ondan Allahın elçisinin – salləllahu aleyhi va səlləm – sünnətləri, onun namazı haqqında soruşardıq və onları yazıb öyrənərdik.**" Diqqət etsək görərik ki, hər üç zat əhlul-beyt üzvləridir. Əbu Cəfər məşhur imam Muhəmməd əl-Bəqir'dir, hətta xəbərlərdə varid olana əsasən oğlu Cəfər əs-Sadiqi də Cabirin yanına götürərdi. Muhəmməd əl-Hənəfiyyə isə Əli bin Əbi Talib'in – radiyallahu anhu – oğludur.

297. "Musannəf İbn Əbi Şeybə", 5/313;

298. "Şərhu Məanil-Əsər",

299. "Təqyidul-İlm", səh: 133-134

## Süleyman əl-Yəşkuri'nin nüsxəsi

Cabirdən hədis yazmış tələbələrindən biri də Süleyman bin Qeys əl-Yəşkuri olub. O, Cabir bin Abdilləh ilə birlikdə Məkkədə bir il qalmış və ondan eşitdiyi, öyrəndiyi hədisləri yazıya köçürmüşdür. Bu səhifə sələfin hədis imamları arasında "Sahifətu Cabir bin Abdilləh" adı ilə tanınıb. Abdullah bin Əhməd bin Hənbəl deyir: "**Atamı belə deyərkən eşitdim: "Süleyman əl-Yəşkuri çoxdan yaşamış bir şeyxdir; İbnuz-Zubeyr fitnəsində öldürüldü." Ondan soruşuldu: "Ondan kim rəvayət edib?" Dedi: "Qatədə, lakin ondan heç bir şey eşitməyib və Əbu Bişr ondan hədislər rəvayət edib, lakin ondan bir şey eşitdiyini düşünmürəm." Sonra dedi: "Süleyman əl-Yəşkuri'nin səhifəsini Basra şəhərinə gətiriblər, Qatədə də onu əzbərləyib.**"[300] Yaqub əl-Fəsəvi deyir: "**Süleyman bin Hərb'i belə deyərkən eşitdim: "Süleyman əl-Yəşkuri bir il Məkkədə məskunlaşdı və Cabir bin Abdilləhin yanında yerləşdi və ondan bir (səhifə) kitab yazdı və çox keçmişdə vəfat edib. Səhifəsi isə anasının yanında qaldı və Basra əhli onu borc verməsini istədi, anası eləmədi. Dedilər: "Heç olmasa imkan ver ki, ondan oxuya bilək." Dedi: "Bax bunu edə bilərəm." Beləliklə də Qatədə və ondan başqaları gələrək oxudular. Şeyxlərimiz "Süleyman əl-Yəşkuri rəvayət edir" dedikdə və ya buna yaxın sözlər dedikdə bunu qəsd edirlər.**"[301] Süleyman əl-Yəşkuri əslində Cabir bin Abdilləh'dən öncə ölüb, lakin öldükdən sonra yazdığı nüsxəsi anasının ixtiyarında qalıb. Buradan öyrənmiş oluruq ki, bu nüsxə hicri 80-ci ildən öncə yazılıb. Daha sonra bu nüsxəni əldə edən tələbələr o nüsxəni istifadə etməklə Cabir bin Abdilləh'dən hədis rəvayət ediblər, hətta Qatədə bu nüsxəni əzbər bilərdi. Yaqub əl-Fəsəvi deyir: "**Qatədə (bir dəfə) Said' (bin Əbi Arubə'y)ə dedi: "Ey Əbun-Nədr, mushafı götür." Dedi: "Ona Bəqərə surəsini ərz etdim" və orada bir hərfdə belə olsa xəta etmədi. Dedi: "Ey Əbun-Nədr, yaxşı oxudummu?" Dedi: "Bəli." Dedi: "Mən Cabir bin Abdilləh'in səhifəsini Bəqərə surəsindən daha yaxşı əzbərləmişəm.**"[302]

300. "əl-İləl va Marifətur-Ricəl", 2/487 (3207);
301. "əl-Marifə vat-Tarix", 2/279;
302. Eyni məsdər: 2/278-279;

Tarixi qaynaqlar təsdiqləyir ki, əl-Həsən əl-Bəsri, Əbuz-Zubeyr, Sabit əl-Bunəni, əş-Şabi, Mucəhid kimi böyük hədis imamları Cabir bin Abdilləh'in hədislərini bilmək üçün bu səhifəni əldə etmişdilər. Həmçinin yəmənli Mə'mər bin Raşid də bu səhifədən hədislər rəvayət edib və bu gün çap olunmuş "əl-Cami" kitabında bunu açıq şəkildə görə bilirik, həmçinin Abdurrazzəq əs-San'ani'nin "əl-Musannəf" kitabında da ondan gələn rəvayətlər yer alır. Misal üçün Mə'mər "əl-Cami" kitabında deyir: "Cabir bin Abdilləh'in səhifəsində deyir: "**İki vacib edici, iki çoxaldıcı və misli qarşılığında misli olan vardır: iki vacib ediciyə gəldikdə kim heç bir şərik qoşmadan Allaha qovuşarsa cənnətə daxil olar və kim şərik qoşaraq Allaha qovuşarsa cəhənnəmə daxil olar. İki çoxaldıcıya gəldikdə isə kim bir yaxşılıq edərsə ona on qatından tutmuş yeddi yüz qatına qədər yazılar. Misli qarşılığında misli olana gəldikdə isə kim bir pislik edərsə onun qarşılığında eyni misli yazılar.**"[303] Gördüyümüz kimi Mə'mər bu hədisi bir başa Cabir'in səhifəsindən götürmüşdür.

Bu nüsxə həm də Vəhb bin Munəbbih'in nüsxəsi kimi də tanınıb, çünki Vəhb bin Munəbbih bu nüsxəni məşhurlaşdıranlardandır. Bunu Vəhb'dən rəvayət edən isə İsmayıl bin Abdilkərim bin Mə'qal bin Munəbbih'dir. Lakin maraqlı tərəf budur ki, Vəhb bin Munəbbih bu səhifəni bir başa Cabir bin Abdilləh'dən rəvayət edir və "Cabirdən soruşdum" sözləri ilə başlayır. Ehtimal budur ki, Vəhb bin Munəbbih bu səhifəni ələ keçirdikdən sonra onun içindəki hədisləri bir-bir Cabirdən soruşmuş və dəqiqləşdirmişdir, çünki Vəhb bin Munəbbih'in nüsxəsi zahirən Cabirdən məlum hədislərin doğru olub olmaması ilə bağlı verilmiş suallardan ibarətdir. Bu, təkcə Vəhb bin Munəbbih ilə məhdudlaşmır, digərləri də eyni cür davranıblar. əl-Buxari tarix kitabında deyir: "**İbrahim bin Musa dedi: İbn Əbi Zəidə bizə xəbər verdi: Asim dedi: "Biz əş-Şabi'yə Cabirin səhifəsini və ya içində Cabirin hədisi olan səhifəni ərz etdik və dedi: "Orada elə bir şey yoxdur ki, onu Cabirdən eşitməyim, istərdim ki, siz ondan başa baş qurtulasız.**"[304] Anlaşılan budur ki, əş-Şabi həmin səhifədəki hədisləri bir başa Cabir'in özündən eşitmişdir,

303. "Musannəf Abdirrazzəq", 11/183 (20277)

304. "ət-Tərix əl-Kəbir", 6/451 (2961)

beləliklə də buna əsasən səhifənin içindəkilərin dəqiqliyindən əmin olmuşdur.

Şeyx Subhi əs-Səmirayi – rahiməhullah - ət-Tibi'nin "əl-Xulasə" kitabına etdiyi təhqiqin müqəddiməsində bu nüsxənin əlyazma halında mövcud olduğunu zikr edərək deyir: "**Cabir bin Abdilləh'in səhifəsi əlyazma halında Şəhid Əli Paşa kitabxanasında mövcuddur.**" Şəhid Əli Paşa kitabxanası isə İstanbulda yerləşir. 1933-cü ildə içindəki əlyazmalar Süleymaniyyə kitabxanasına köçürülmüşdür.

Əlavə edək ki, Cabir'in səhifəsi çox sayda hədis ehtiva edir və fərqli sünnətləri özündə cəm edib. Cabirin Süleyman əl-Yəşkuri tərəfindən hazırlanmış səhifəsindən başqa kitabları da olmuşdur. əl-Hafiz əz-Zəhəbi deyir: "**(Cabir) peyğəmbərdən – salləllahu aleyhi va səlləm – çoxlu faydalı elm daşımışdır və onun həcc ilə bağlı kiçik "mənsək" kitabı vardır ki, onu Muslim rəvayət edib.**"[305] İmam Muslim "əs-Sahih" kitabında bu mənsəkdən həccin əhkamı ilə bağlı otuza yaxın hədis rəvayət edib. Bu rəvayətlərdən ən uzunu əhlul-beytin imamlarından Cəfər əs-Sadiq'in atası Muhəmməd əl-Bəqir'dən, onun da Cabir'dən rəvayət etdiyi hədisdir ki, orada peyğəmbərin – aleyhissalətu vassələm – həcci kamil şəkildə vəsf edilib və təxminən dörd səhifəni əhatə edir. Bu cür uzun hədislər də şübhəsiz ki, yalnız səhifələr vasitəsi ilə rəvayət olunurdu.

## Əbuz-Zubeyr'in nüsxəsi

Cabir bin Abdilləh'dən hədis yazmış tələbələrindən biri də Əbuz-Zubeyr Muhəmməd bin Muslim bin Tədrus əl-Əsədi əl-Quraşi əl-Məkki'dir. Səhabələrdən Abdullah bin Abbas, Abdullah bin Ömər, Əbut-Tufeyl və xüsusilə də Cabir bin Abdilləh'dən hədis eşidib, onların tələbələri arasından Ata bin Əbi Rabəh, Tavus bin Keysən, Said bin Cubeyr, Əbu Saleh Zəkvan kimi elm əhlindən hədis rəvayət edib. Hafizəsinin güclülüyü və hədis toplamaqdakı hərisliyinə görə məşhur bir hədis ravisi kimi tanınmışdır, hətta bəzi şeyxləri ondan hədis öyrəniblər: onların arasında Ata bin Əbi Rabəh də var idi. Ata bin Əbi Rabəh əslində onu məqsədli şəkildə Cabir bin Abdilləh'in yanına

305. "Təzkiratul-Huffəz", 1/36;

hədis əzbərləmək üçün göndərərdi. Sufyan bin Uyeynə rəvayət edir ki, "**Əbuz-Zubeyr dedi: Ata məni Cabirin yanına göndərərdi ki, onlar üçün (Cabirdən) hədis əzbərləyim.**"[306] Şübhəsiz ki, bu xəbər bizə Ata bin Əbi Rabəh kimi böyük bir şəxsiyyətin Əbuz-Zubeyr'in qabiliyyətinə olan etimadını göstərir. Həqiqətən də Əbuz-Zubeyr alimlər yanında bu etibarı qazanıb. İmam Muslim "əs-Sahih" kitabında ondan çox sayda hədis rəvayət etmişdir. Əbuz-Zubeyr tarixi qaynaqlarda keçdiyi kimi hicri 128-ci ildə vəfat edib.

Əbu Cəfər əl-Uqeyli (vəfatı hicri 322) deyir: "**əl-Leys bin Sad dedi: "Məkkəyə gəldim və Əbu Zubeyr'in yanına getdim və mənə iki kitab verdi. O iki kitabı götürüb geri dönmüşdüm ki, özlüyümdə düşündüm ki, qayıdıb ondan bunların hamısını Cabirdən eşidib eşitmədiyini soruşummu? (Qayıdaraq soruşdum və) dedi: "Onlardan eləsi var ki, özüm eşitmişəm, eləsi də var ki, bizə onu (Cabirdən) rəvayət ediblər." Ona dedim: "Mənə bunlardan hansını sənin özünün eşitdiyini öyrət!" O da mənə indi yanımda olduğu kimi öyrətdi.**"[307] Bu xəbərə əsasən alimlərimiz Misir'in imamı əl-Leys bin Sad'in Əbuz-Zubeyr'dən, onun da Cabir bin Abdilləh'dən rəvayət etdiklərini tam və sağlam bir qaynaq olaraq görürlər, çünki əl-Leys bin Sad özünün də xəbər verdiyi kimi Əbuz-Zubeyr'in kitablarından yalnız onun birbaşa Cabir bin Abdilləh'dən eşitdiklərini yazmış və başqaları vasitəsi ilə eşitdiklərini isə tərk etmişdir. Tarixçi Yaqub bin Sufyan əl-Fəsəvi də (vəfatı hicri 277) bu hadisəni öz kitabında zikr edir və deyir: "**İbn Bukeyr dedi: Hubeyş bin Said mənə əl-Leys bin Sad'dan**

306. ət-Tirmizi, "əl-Cami əl-Kəbir", 6/250; Darul-Ğarb əl-İsləmi; Bunu İmam Əbu İsa ət-Tirmizi "əl-Cami" kitabının illətlər bölməsində zikr edir və deyir: "Muhəmməd bin Yəhyə bin Əbi Ömər əl-Məkki bizə rəvayət etdi; dedi: Sufyan bin Uyeynə bizə rəvayət etdi; dedi: Əbuz-Zubeyr dedi..." ət-Tirmizi'nin şeyxi Muhəmməd ibn Əbi Ömər əl-Məkki əl-Adəni hicri 243-cü ildə vəfat etmiş məkkəli alimdir, Haramın imamlarındandır. Etibarlı və güclü bir ravidir.

307. "əd-Duafə əl-Kəbir", 4/130; əl-Uqeyli bunu bu isnad ilə rəvayət edir: "Zəkəriyyə bin Yəhyə əl-Həlvani bizə rəvayət etdi: Əhməd bin Sad bin Əbi Məryəm bizə rəvayət etdi: əmim bizə rəvayət etdi və (həmçinin) Muhəmməd bin İsmail bizə rəvayət etdi: əl-Həsən bin Əli bizə rəvayət etdi: Said bin Əbi Məryəm bizə rəvayət etdi: əl-Leys bin Sad bizə rəvayət etdi..." Yəni əl-Uqeyli bunu iki yoldan bilir. Birinci Zəkəriyyə bin Yəhyə əl-Həlvani – Əhməd bin Sad bin Əbi Məryəm - əmisi Said bin Əbi Məryəm yoludur, ikinci yol isə Muhəmməd bin İsmail - əl-Həsən bin Əli – Said bin Əbi Məryəm yoludur. Hər iki yol da sağlamdır, səhihdir.

**belə dediyini xəbər verdi: "Əbuz-Zubeyr'in yanına gəldim və bizə kitablar çıxardı. Soruşdum: «Eşitdiyin hədislər Cabirdəndir?" Dedi: "Həm də başqasından." Dedim: "Cabirdən eşitdiyin hədislər?" O da mənə bu səhifəni çıxardı.**"[308] Buna əsasən deyə bilərik ki, Əbuz-Zubeyr çox sayda hədis yazıb və Cabirdən eşidərək yazdığı ayrıca bir səhifəsi olub və əl-Leys bin Sad məhz o səhifəni alaraq köçürüb. İbn Bukeyr həmçinin xəbər verir ki, əl-Leys bin Sad Misirdən çıxaraq Mədinə və Məkkəyə səfər edərkən iyirmi yaşında idi. Ona görə də bilməliyik ki, bu gün hədis kitablarında əl-Leys bin Sad – Əbuz-Zubeyr – Cabir bin Abdilləh kanalı ilə rəvayət edilən hədislər məhz bu səhifədən götürülmüş hədislərdir.

Əbuz-Zubeyr'in bu nüsxəsini rəvayət edənlərdən biri də Əbu Abdilləh Mə'qil bin Ubeydilləh əl-Cəzəri'dir. Hicri 166-cı ildə vəfat edib. Ata bin Əbi Rabəh, Amr bin Şueyb, Nəfi, əz-Zuhri, Zeyd bin Əbi Uneysə, Əbuz-Zubeyr kimi alimlərdən hədis eşidib. İbn Adiy deyir: "**Bu Mə'qil'in Əbuz-Zubeyr'dən, onun da Cabir'dən bir nüsxəsi vardır ki, onu əl-Həsən bin Muhəmməd bin Ə'yən ondan, Mi'qal'dən rəvayət edir. Əbu Arubə bizə Sələmə bin Şəbib'dən və Muhəmməd bin Mə'dən'dən, onlar da əl-Həsən bin Muhəmməd bin Ə'yən'dən bu nüsxəni rəvayət edib. Əbu Aqil bizə bu nüsxədən bəzi hədisləri ali isnad ilə Said bin Həfs'dən, o da Mə'qildən rəvayət edib. Bu Mə'qil hədisləri həsəndir/gözəldir, onun hədisləri arasında münkər elə bir hədis görmədim ki, burada zikr edə bilim...**"[309] Bu nüsxənin səhih bir nüsxə olduğuna dəlalət edən başqa bir sübut budur ki, İmam Muslim "əs-Sahih" kitabında Sələmə bin Şəbib - əl-Həsən bin Muhəmməd bin Ə'yən – Mi'qal bin Ubeydilləh – Əbuz-Zubeyr – Ca-

---

308. "əl-Mərifə vat-Tərix", 1/166; İbn Bukeyr burada Əbu Zəkəriyyə Yəhyə bin Abdilləh bin Bukeyr əl-Məxzumi'dir, Misirdəndir, zamanında Misirin qaziliyində çalışmışdır. Hicri 154-cü ildə doğulmuş və hicri 231-ci ildə vəfat etmişdir. Alimlər onu güvənli ravi olaraq vəsf ediblər. Hubeyş bin Said isə Əbul-Qasim Hubeyş bin Said bin Abdilaziz bin Əbən bin Əbi Həyyən əl-Xavləni'dir. Onu İbn Yunus tarix kitabında zikr edir və hicri 208-ci ildə vəfat etdiyini deyir. İbn Məkulə "Təhzibu Mustəmirril-Əvhəm" kitabında (səh: 178-179) onu "şahidliyi məqbul" olaraq vəsf edir.

309. "əl-Kəmil Fi Duafə ər-Ricəl", 8/212; Kitabın bu nəşrində "Sələmə bin Şəbib" əvəzinə Suleyman bin Şəbib yazılıb, bu isə onların təhqiq etdikləri əlyazmada xətanın olmasından qaynaqlanır. Doğru olan "Sələmə bin Şəbib"dir. Məzin əs-Sirsəvi'nin təhqiqində (11/85) əlyazmadakı bu xəta haqqında məlumat keçir.

bir kanalı ilə 22 hədis rəvayət edib və bu onu göstərir ki, bu nüsxə İmam Muslim'in ixtiyarında olub. Muslim bu nüsxədən bəzi hədisləri rəvayət edərkən eyni hədisi başqa paralel isnadlarla da dəstəkləyərək həmin hədisin Cabir'dən sabit olduğunu göstərmişdir.

Bəzən hədis tələb edən tələbələr hədisləri dəqiqləşdirmək üçün bu cür məşhur nüsxələri axtarardılar. Əbu Cəfər əl-Uqeyli deyir: "**Sufyan dedi: "Bir nəfər Əbuz-Zubeyr'in yanına gəldi və yanında Süleyman əl-Yəşkuri'nin kitabı var idi. Sonra Əbu Zubeyrə sual verməyə başladı; ona hədislərdən birini oxuyar və sonra deyərdi: "Bax gör bu hədis sənin kitabında necədir?" O da kitabında olanı xəbər verərdi və (Süleymanın) kitab(ın)da olduğu kimi deyərdi.**"[310] Bu, iki nüsxənin müqayisə edildiyini göstərən gözəl bir misaldır, çünki həm Süleyman əl-Yəşkuri, həm də Əbuz-Zubeyr kitablarındakı hədisləri Cabir bin Abdilləh'dən eşitmişdilər.

## Abdullah bin Amr bin əl-As

Abdullah bin Amr bin əl-As bin Vail – radiyallahu anhu - atası Amr bin əl-As'dan öncə İslam dinini qəbul edib. Deyilənə görə adı daha öncə əl-As olub və peyğəmbər tərəfindən – aleyhissalətu vassələm – Abdullah adı ilə əvəz edilib. Ümumilikdə onun peyğəmbərdən rəvayət etdiyi hədislər yüzlərlədir. İki "əs-Sahih" kitabında ondan rəvayət edilmiş hədislərin sayı otuz altıdır. Çox quran oxuyan və oruc tutan bir səhabə olaraq tanınır.

Daha öncə də rəvayət etdiyimiz xəbərdən anlaşıldı ki, mübarək səhabələrdən biri olmuş Abdullah bin Amr peyğəmbərin – aleyhissalətu vassələm – izni ilə onun hədislərini yazmışdır. O, öz səhifəsinə

310. "əd-Duafə əl-Kəbir", 4/130; Əbu Cəfər əl-Uqeyli kitabında bunun isnadını belə qeyd edir: "Muhəmməd bin İsmail bizə rəvayət etdi; əl-Həsən bizə rəvayət etdi; Nueym bizə rəvayət etdi; Sufyan dedi..." Muhəmməd bin İsmail (vəfatı 276) Məkkənin imamı Əbu Cəfər Muhəmməd bin İsmail bin Səlim əs-Saiğ əl-Quraşi'dir. Şeyxi əl-Həsən (vəfatı 242) isə Əbu Muhəmməd əl-Həsən bin Əli bin Muhəmməd əl-Huzəli ər-Reyhəni əl-Hulvani'dir. Onu da şeyxi Nueym bin Həmməd bin Muaviyə əl-Xuzai əl-Mərvazi'dir, çox sayda kitabı ilə tanınır. Hicri 228-ci ildə vəfat edib. Sufyan isə Məkkənin imamı Sufyan bin Uyeynə'dir. Bu şəxslərin hamısı siqa və etibarlı alimlərdir, hamısı hədis elminə xidmətləri ilə tanınırlar, ona görə də xəbərin sənədi səhihdir.

“əs-Sadiqa” adını vermişdir. “əl-Yərmukiyyə” səhifəsi adı ilə də zikr olunur. Bu səhifəsində həmçinin Əbu Bəkr’in xahişi ilə peyğəmbərimizin – aleyhissələm – ona öyrətdiyi hədisləri də toplamışdır. Orada eləcə də Ömər’in verdiyi fətvaları da qeyd etmişdir. İbn Sad “ət-Tabəqat” kitabında deyir: “**Mə’n bin İsa bizə xəbər verdi; İshaq bin Yəhyə bizə Mücahid’dən belə dediyini rəvayət etdi: “Abdullah bin Amr’ın yanında bir səhifə gördüm və onun barəsində soruşdum. Dedi: “Bu Sadiqa’dır, orada mənim peyğəmbərdən – salləllahu aleyhi va sələm – eşitdiklərim vardır ki, onlarda mənimlə onun arasında heç kim yoxdur.**”[311] Bu sözlərini belə anlamaq olar ki, həmin yazıda peyğəmbərdən – aleyhissalətu vassələm – rəvayət etdiklərini bir-başa peyğəmbərin özündən eşitmişdir. Abdullah bin Amr – radiyallahu anhu – yazdığı “əs-Sadiqa” kitabına çox böyük önəm verirdi. əd-Dərimi deyir: “**Muhəmməd bin Said bizə xəbər verdi; Şərik bizə Leys’dən, o da Mücahid’dən, o isə Abdullah bin Amr’dan – radiyallahu anhumə - belə dediyini xəbər verdi: “İki şeydən başqa heçnə mənə həyatı sevdirmir: “əs-Sadiqa” və “əl-Vaht”. əs-Sadiqa’ya gəldikdə o, mənim Allahın elçisindən – salləllahu aleyhi va sələm – yazdığım səhifədir. əl-Vaht isə Amr bin əl-As’ın sədəqə verdiyi torpaqdır ki, üzərində yaşardı.**”[312] əl-Vaht torpağı bu günə qədər də eyni adı qoruyub saxlayıb və Taif bölgəsi bu günə qədər oranın bulağından sulanır.

## Amr bin Şueyb’in nüsxəsi

Abdullah bin Amr bin əl-As’ın bu nüsxəsi daha sonrakı nəsillərə keçmişdir, daha dəqiq desək öz ailəsi vasitəsi ilə hədis imamlarına yetişmişdir. Bu nüsxəni nəvəsi Şueyb bin Muhəmməd hifz etmiş, yazmış və öyrətmişdir, belə ki, Şueybi böyüdən də elə babası Abdullah bin Amr olub. Həmin məşhur nüsxəni babasının tərbiyəsindən çıxmış nəvənin alması çox təbiidir. Ondan isə bu nüsxəni hədis imamlarına ötürən oğlu Amr bin Şueyb olub. İmam Malik “əl-Mu-

311. “ət-Tabəqat əl-Kubra”, 4/262

312. “Sünən əd-Dərimi”, (513)

vatta" kitabında bir çox ravi vasitəsi ilə bu nüsxədən bəzi hədisləri rəvayət edir. Eləcə də İmam Əhməd bu nüsxədəki hədisləri ona çatan isnadlarını zikr edərək "əl-Müsnəd" kitabına almışdır.

Bu nüsxədən nəvəsi Şueyb'dən başqaları da hədis rəvayət ediblər. Onların arasında Safvan bin Suleym, Ata əl-Xorasani, Əbu Səbra, Əbu Qabil, Əbu Raşid əl-Hubrani də vardır. Lakin Şueyb məhz Abdullah'ın səhifəsini saxladığı üçün xüsusi diqqət ona ayrılmışdı. Bu səhifəni də Şueyb'dən rəvayət edən oğlu Amr olub. İslam alimləri hələ o zaman bu səhifənin Abdullah bin Amr'dan gəldiyini təsdiq edirdilər. Böyük sufi alim Şeyxul-İslam Əbu İsmail əl-Hərəvi (vəfatı hicri 481) deyir: "**əl-Qasim bin Said bizə xəbər verdi: Əhməd bin Suleyman bin Fəris bizə xəbər verdi: Əhməd bin Muhəmməd bin Davud əl-Fəqih'i belə deyərkən eşitdim: Zəkəriyyə bin Yəhyə Zəkkər'i belə deyərkən eşitdim: "Əhməd bin Saleh'dən soruşdular: "Amr bin Şueyb'in atasından, onun da babasından rəvayət etdiyi səhihdirmi?" Dedi: "Əgər Amr'dan rəvayət edən etibarlıdırsa bəli! Çünki bu rəvayətlərin bəzisi eşitmək yolu ilədir, bəzisi isə Səhifədir və Abdullah ailəsi ittifaq ediblər ki, bu, (həqiqətən də) Abdullahın – Allah ondan razı olsun! – səhifəsidir.**"[313] Əbu İsa ət-Tirmizi deyir: "**Muhəmməd bin İsmail (əl-Buxari) dedi:** "**Əhmədi, İshaqı – və bu ikisindən başqalarını da zikr etdi – Amr bin Şueyb'in hədisini sübut olaraq gətirərkən gördüm.**"[314] ət-Tirmizi bunu öz şeyxi əl-Buxari'dən qısa şəkildə zikr edib. Əbu İsmail əl-Hərəvi bunu tam sənədi ilə Muhəmməd bin Suleyman bin Faris'dən belə rəvayət edir: "**(Muhəmməd bin Suleyman bin Faris dedi) Muhəmməd bin İsmail əl-Buxari'ni belə deyərkən eşitdim: "Əhməd bin Hənbəl'i, Əli bin Abdilləhi, əl-Humeydi'ni və İshaq bin İbrahim'i Amr bin Şueyb'in atasından, onun da babasından rəvayət etdiyi hədisi sübut olaraq gətirərkən gördüm.**"[315] Bu alimlər rəvayət üzrə ən mütəxəssis alimlər sayılırlar və nüsxələri də gözəl tanıyırdılar. Bu bir daha təsdiqləyir ki, Abdullahın ailəsində qalan səhifəyə etimad çox güclü idi.

---

313. "Zəmmul-Kələm va Əhlihi", 1/57;

314. "Sunən ət-Tirmizi", 1/425;

315. "Zəmmul-Kələm va Əhlihi", 1/57;

Amr bin Şueyb ixtiyarındakı səhifədən hədisləri yazaraq başqalarına da göndərərmiş. Bunu bəzən xüsusi münasibətə görə edər, bəzən də ümumi fayda üçün yayardı. Nueym bin Həmməd deyir: "**Ömər bin Said bin Əbi Huseyn mənə xəbər verdi ki, Amr bin Şueyb, Abdullah bin Abdirrahmən bin Əbi Huseyn'ə onun ölmüş oğluna görə baş sağlığı vermək məqsədi ilə məktub yazdı və o məktubunda zikr etdi ki, atası Şueyb bin Muhəmməd'i babası Abdullah bin Amr bin əl-As'dan belə dediyini rəvayət edərkən eşitdi: "Mömin qulun yer əhlindən sevdiyi bir kimsəsi ölərsə, o da səbr edərsə və Rəbbinin əmr etdiyi kimi deyərsə və (bununla) savab umarsa Allah ona cənnətdən başqa bir mükafata razı olmaz!**"[316]

## Əbu Musa əl-Əşari

Peyğəmbərimizin – aleyhissalətu vassələm – səhabələri içində elminə və fiqhinə görə seçilən səhabələrdən biri də Əbu Musa Abdullah bin Qeys bin Suleym əl-Əşari olmuşdur. Bu səciyyəvi mərtəbəsinə görə peyğəmbərimiz onu və Muazı Zəbid və Adən kimi ərazilərə vali təyin etmişdi. Ömər xəlifə olduğu dövrdə isə Kufə və Basra şəhərlərində valilik edir. Xüsusən Basra şəhərindəki alimlər miras aldıqları elmin önəmli bir hissəsini bu səhabəyə borcludurlar. Osmanın zamanında Kufəyə vali olmuş və Tustər şəhərini fəth etmişdir. Hicri əllinci ildə - bəzi alimlərə görə isə bundan öncə - vəfat edib. Basra və Kufə şəhərlərində olarkən insanlara peyğəmbərin – aleyhissalətu vassələm – sünnətini öyrətmişdir. Əbu Musa əl-Əşari'nin özünün hədis yazdığına dair bir məlumatımız yoxdur. Əksinə hədisləri yazmağa mənfi yanaşdığını görürük. Lakin Allaha şükürlər olsun ki, onun peyğəmbərdən – aleyhissələm - rəvayət etdiyi hədisləri yazmış və nüsxələrdə bizə çatdırmış nəsillər olub. O nəslin bir nümayəndəsi də Əbu Musa'nın öz oğludur.

---

316. "əz-Zuhdu var-Raqaiq libnil-Mubərak vaz-Zuhd li Nueym", 2/27; Ömər bin Said bin Əbi Huseyn etibarlı bir ravidir. Bu hədis həsən hökmündədir.

## Əbu Burdə'nin nüsxəsi

Əbu Burdə tabii nəslinin alimlərindəndir və səhabə Əbu Musa əl-Əşari'nin oğludur. Əbu Musa Basra şəhərində vali ikən Əbu Burdə dünyaya gəlmişdir. Əsl adı haqqında alimlərimiz fikir ayrılığındadırlar, bəziləri adının Haris, digərləri isə Amir olduğunu deyirlər. əl-Həccəc bin Yusuf'un zamanında Kufədə qazi olaraq çalışıb. Tarixi qaynaqlar bizə xəbər verir ki, Əbu Burdə atasının hədislərini yazmış, lakin daha sonra atası o hədisləri silməyi əmr etmişdir. əl-Xatib əl-Bəğdədi deyir: "**Əbu Ömər Abdulvahid bin Muhəmməd bin Abdilləh bin Mubdi əl-Bəzzəz bizə xəbər verdi; əl-Qadi Əbu Abdilləh əl-Hüseyn bin İsmail əl-Məhəmili bizə imla deyərək rəvayət etdi; İbn Muslim bizə rəvayət etdi; Ravh, yəni İbn Əsləm bizə rəvayət etdi; Əbu Talha bizə Ğaylən bin Cərir'dən, o da Əbu Burdə'dən belə dediyini rəvayət etdi: "Atamdan çox sayda kitab yazdım, onları (daha sonra) sildi və dedi: "Bizdən bizim öyrəndiyimiz kimi öyrən!**"[317] Görünür ki, Əbu Musa oğlunun hədis rəvayətində yazıya etimad etməsini xoş qarşılamamış, əksinə hədisləri əzbərləyərək rəvayət etməsini tələb etmişdir. Eyni xəbəri İbn Abdilbərr də qeyd edir və deyir: "**(İbn Əbi Şeybə) dedi: "Vaki bizə Talha bin Yəhyə'dən, o da Əbu Burdə'dən belə dediyini xəbər verdi: "Atamdan böyük bir kitab yazdım və dedi: "Kitablarını mənə gətir." Mən onları ona gətirdim və götürüb onları yudu.**"[318] Həmçinin "əs-Sünən" kitabının müəllifi əd-Dərimi deyir: "**Əsəd bin Musə bizə xəbər verdi; Şubə bizə Əbu Musə'dən, o da Humeyd bin Hiləl'dən, o isə Əbu Burdə'dən rəvayət etdi ki, o, atasının hədislərini yazardı. Bir dəfə Əbu Musa bunu görmüş və onları silmişdir.**"[319] Bu üç fərqli isnad ilə bizə çatmış tarixi xəbər təsdiqləyir ki, bir səhabə övladı öz atasından eşitdiyi hədisləri qələmə alardı və biz təkrar-təkrar görəcəyik ki, bu hal o dövr üçün qeyri-adi bir hal olmayıb. Lakin Əbu Musa'nın oğlunun yazdıqlarını sildir-

---

317. "Təqyidul-İlm", səh: 32;

318. "Cəmi' Bəyənil-İlmi va Fədlihi", 1/276;

319. "Sunən əd-Dərimi", 1/421 (489)

məsinin səbəbi nə idi? Əbu Muhəmməd əl-Həsən bin Abdirrahmən ər-Raməhurmuzi (vəfatı hicri 366) deyir: “**Abdullah bin Əli bin Mehdi bizə rəvayət etdi; Abdullah bin Said əl-Kindi əl-Əşəc bizə rəvayət etdi; Əbu Musa'nın azadlı qulu Xalid bin Nəfi Said bin Əbi Burdə'dən rəvayət edərək dedi: “Mən Əbu Musa'dan hədis eşitdikdə qalxardım və yazardım. Qalxıb getmək halları çoxaldıqda dedi: “Ey övladm, tez-tez qalxıb gedirsən.” Dedim: “Mən səndən eşitdiyim bu sözləri yazıram.” Dedi: “Gətir onları.” Onları gətirdim və özünə oxudum, dedi: “Bəli, Allahın elçisindən – salləllahu aleyhi va səlləm - bu cür eşitmişəm, lakin qorxuram ki, (sonradan) ondan bir şeylər əksilər və nəsə artırılar.” Buna görə də bir tuluq istədi, içinə su tökdü və bu kitabları onların içinə ataraq onları sildi.**”[320] Əbu Musa'nın yazıya deyil hafizəyə etibar etməsinin səbəbi budur ki, onun nəzərində yazıya etibar etmək doğru deyildi, çünki başqa əllər yazını təhrif edə bilərdi. Hərflərdə hərəkə və nöqtə sisteminin inkişaf etmədiyi və yayğın olmadığı bir zamanda bu təhrifin mümkün olduğunu başa düşmək çətin olmamalıdır. Əbu Musa'nın yazını riskli görməsini bu mənada qəbul etmək daha münasibdir. Üstəlik bu və buna bənzər xəbərlərdən öyrənirik ki, o dövrün sünnət alimləri bu hədisləri xüsusi önəm ilə əzbərləyirdilər. Hədisləri əzbərləmək hələ də bu günə qədər ən doğru yol hesab olunur.

Bu, heç də o anlama gəlmir ki, Əbu Musa əl-Əşari heç bir hədisin yazılmasına izn verməyib, bu sadəcə olaraq onu göstərir ki, Əbu Musa – Allah ondan razı olsun! – hədis rəvayətində yazıya yox, hafizəyə etibar etməyi şərt görürdü. Biz bilirik ki, Əbu Musa əl-Əşari özü də hədis yazmışdır. İmam Əhməd bin Hənbəl “əl-Müsnəd” kitabında deyir: “**Muhəmməd bin Cəfər bizə rəvayət etdi; Şubə bizə Əbut-Təyyəh'dən rəvayət etdi; Mənə qara, uzun bir nəfər – və Əbut-Təyyəh onu vəsf etməyə başladı – rəvayət etdi ki, o, İbn Abbas ilə birlikdə Basra şəhərinə gəldi və Əbu Musa'ya yazdı. Bunun üzərinə Əbu Musa da ona yazdı ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – gedirdi və divarın yanında yumşaq bir yerə çökdü və ayaq yoluna çıxdı. Sonra dedi: “İsrail oğullarından biri ayaq yoluna çıxdıqda sidiyindən bir şey palta-**

320. “əl-Muhəddis əl-Fəsil”, səh: 384

**rına düşşəydi onu axtarıb tapardı, sonra qayçı ilə kəsərdi.**”[321] Beləliklə də məlum olur ki, Əbu Musa hədisin özünün yazılmasına etiraz etmirdi, lakin rəvayətdə yalnız yazıya etimad edilməsinə qarşı idi. Əbu Musa’dan da peyğəmbərin – aleyhissalətu vassələm – hədislərini dövrünün böyük imamları eşidiblər və yazıblar. Oğlu Əbu Burdə bu baxımdan xüsusilə seçilir; onun atasından rəvayət etdikləri o dövrdə dövlət proqramı tərəfindən də xüsusi maraqla qarşılanıb. əl-Bəğandi əs-Sağir adı ilə tanınan böyük hədis alimi Əbu Bəkr Muhəmməd bin Muhəmməd bin Süleyman bin əl-Həris əl-Əzdi əl-Vasiti (vəfatı hicri 312) Ömər bin Abdilaziz’in rəvayət etdiyi hədisləri cəm edən kitabında deyir: “**İbrahim bin Abdilləh bin Hətim bizə rəvayət etdi; Yəhyə bin Suleym bizə rəvayət etdi; Abdullah bin Xuseym bizə Talha bin Ubeydilləhin övladlarından birindən belə dediyini rəvayət etdi: “Ömər bin Abdilaziz’in yanında idim və onun yanına Əbu Burdə bin Əbi Musə daxil oldu və ona atasından, onun da Allahın elçisindən – salləllahu aleyhi va sələm – rəvayət etdiyi hədisləri rəvayət etməyə başladı. Ömər dəftər və mürəkkəb qabı gətirilməsini buyurdu və onun hədislərini yazdı…**”[322] Talha bin Ubeydilləh’in övladlarından biri ilə qəsd olunan Talha bin Yəhyə bin Talha bin Ubeydilləh’dir, etibarlı, güvənilən bir alimdir, səhabə Talha bin Ubeydilləh’in nəvəsidir.

Bildiyimiz budur ki, Əbu Burdə’nin yazdığı nüsxələr onun ailəsi tərəfindən qorunulmuş və nəvəsi Bureyd bin Abdilləh’ə qədər çatmışdır və daha sonra Bureyd’dən bu nüsxələri çox sayda alim yazaraq köçürüblər. Məşhur hədis tənqidçisi İbn Adiy deyir: “**Bureyd bin Abdilləh bin Əbi Burdə’nin atasından, onun vasitəsi ilə babasından rəvayət etdiyi nüsxələr vardır ki, ondan bir nüsxəni Əbu Usəmə rəvayət edir və o, Bureyd’dən rəvayət olunmuş ən uzun nüsxədir. Ondan həmçinin Əbu Yəhyə əl-Həmməni də bir nüsxə, eləcə də Əbu Zuheyr Abdurrahmən bin Mə’n bir nüsxə və Əbu Muaviyə əd-Darir bir nüsxə rəvayət edir və başqaları da rəvayət edirlər. Mən onun (yəni Bureydin) hədislərini nəzərdən keçirdim və onların arasında inkar edə**

321. “Musnəd Əhməd”, 32/306; Muəssəsətur-Risələ

322. “Musnədu Ömər bin Abdilaziz”, səh: 117 (62-ci hədis)

**biləcəyim bir hədis belə görmədim.**”[323] Burada sonuncu cümlə üzərində durmağa dəyən bir cümlədir. İbn Adiy kimi bir alimin kitabını analiz edən hər bir kəs bilir ki, İbn Adiy kitabında çox sayda hədisi ələ alaraq onların bir çoxunu inkar edib. Bu inkarın üzərində durduğu ən əsas meyar bir hədisin yalnız bir nəfər tərəfindən bizə ötürülməsi və o kəsin müasirləri tərəfindən tənqid edilməsidir. Əgər Bureyd'in öz babasının nüsxəsindən rəvayət etdiyi hədislər arasında heç bir hədisi inkar edə bilməyibsə bu yalnız onu göstərir ki, o hədislərin hər biri başqa kanallarla da rəvayət edilib. Başqa sözlə desək nüsxələrdəki hədislərin hamısını dəstəkləyən paralel rəvayətlər vardır.

əl-Hafiz Əbul-Həsən Əli əd-Dəraqutni (h. 306-385) Bureyd bin Abdilləh bin Əbi Burdə'nin babası Əbu Burdə'dən, onun da öz atası Əbu Musa əl-Əşari'dən rəvayət etdiyi qırx hədisi bir kitab halında toplamışdır. Kitab Muhəmməd bin Abdilkərim bin Ubeyd tərəfindən zamanımızda təhqiq edilmiş və çap olunmuşdur.

## Abdullah bin Məs'ud

Əbu Abdirrahmən Abdullah bin Məsud bin Ğafəl bin Həbib əl-Huzəli – radiyallahu anhu – mühacirlərdəndir, səhabələrin ən fəqihlərindən hesab olunur. Kufəlilər xüsusilə onun fətvalarını izləməyə üstünlük veriblər. Əbu Hureyra, İbn Abbas, İbn Ömər, İmran bin Huseyn, Ənəs bin Malik, Cabir bin Abdilləh, Əbu Umamə kimi səhabələr ondan hədis rəvayət ediblər. Ən məşhur tələbələri'nin Alqamə, əl-Əsvad və Məsruq olduğu bilinir. İki “əs-Sahih” kitabında müştərək olaraq ondan altmış dörd hədis rəvayət edilib, əl-Buxari isə tək olaraq iyirmi bir, Muslim isə tək olaraq otuz beş hədis rəvayət edib. Abdullah bin Məsud peyğəmbərin – salləllahu aleyhi va səlləm – vəfatından sonra İslamın fəthlərində iştirak etmiş və Şam fəth edildikdən sonra Hims şəhərində məskunlaşır. Ancaq Ömər'in göstərişi ilə müəllim olaraq Kufəyə köçür və orada yaşayanlara dini öyrətmək

323. “əl-Kəmil fi Duafə ər-Ricəl”, 2/246-247;

üçün çalışır. Osmanın xəlifəyi dönəmində Kufədən alaraq Mədinəyə gətirir və orada xəstələnərək hicri 32-ci ildə vəfat edir.

Abdullah bin Məsud'un hədis yazmağa qarşı olduğunu iddia ediblər və bu barədə bəzi xəbərlər nəql olunub. Həqiqətdə İbn Məsud'dan gələn xəbərləri bir mənalı başa düşmək doğru deyildir və əslində İbn Məsur hədis yazmağa qarşı olmayıb. İbn Əbi Şeybə deyir: "**Əbu Muaviyə bizə əl-Aməş'dən, o da Cami bin Şəddəd'dən, o isə əl-Əsvad bin Hiləl'dən belə dediyini rəvayət edir: "Abdullah (bin Məsud)a bir səhifə gətirdilər, içində hədis var idi. Su gətirib onu sildi, sonra yudu və yandırılmasını əmr etdi. Sonra dedi: "(Bu səhifədən) kimdəsə olduğunu bilən bir kimsəyə Allahı xatırladıram ki, mənə onun xəbərini versin! Allaha and olsun ki, onun Dərul-Hind'də olduğunu bilsəm ona çataram. Sizdən əvvəlki Kitab əhli buna görə həlak oldu; hətta Allahın kitabını arxalarına atdılar, sanki bilmirlər.**"[324] Bu xəbərin zahirindən anlaşılan məna budur ki, Abdullah bin Məsud səhifələrə hədislərin yazılmasına qarşı idi. Amma digər xəbərlərə nəzər salmadan sadəcə bu xəbər ilə kifayətlənmək doğru olmazdı. Digər xəbərlər üçün baxsaq görərik ki, əd-Dərimi "əs-Sünən" kitabında deyir: "**Əhməd bin Abdilləh bin Yunus bizə xəbər verdi; Əbu Zubeyd bizə rəvayət etdi; Huseyn bizə Murra əl-Həmədəni'dən belə dediyini rəvayət etdi: Əbu Qurra əl-Kindi Şam torpaqlarından bir kitab ilə gəldi. Onu gətirib Abdullah bin Məsuda – radiyallahu anhu – verdi. (Abdullah) onun içindəkilərə baxdı və ləyən gətirilməsini istədi. Sonra su istədi, (kitabı) onun içində isladıb həll etdi və dedi: "Sizdən öncəkilər öz kitablarını tərk edib (başqa) kitablara tabe olduqları üçün həlak oldular." Huseyn dedi: Bunun üzərinə Murra dedi: "Amma əgər (kitabda) Qurandan və ya sünnətdən yazılmış olsaydı onu pozmazdı, lakin Kitab əhlinin kitablarından idi.**"[325] Bu xəbərin şahidliyindən öyrənmiş olduq ki, Abdullah bin Məsudun sildiyi səhifə peyğəmbərin – aleyhissalətu vassələm – hədisi deyildi, lakin əvvəlki qövmlərdən qalmış bir kitab idi.

324. "Musannəf İbn Əbi Şeybə", 5/315

325. "Sünən əd-Dərimi", 1/424;

Bunun əksini, yəni onun hədisləri yazmağın leyhinə olduğunu sübut edən xəbərlər varid olub. İmam İbn Əbi Şeybə deyir: "**Əbu Usəmə bizə Mis'ar'dan, o da Mə'n (bin Abdirrahmən)dən belə dediyini rəvayət etdi: "Abdurrahmən bin Abdilləh (bin Məs'ud) mənə bir kitab çıxarıb göstərdi. Mənə and içdi ki, bu, atasının öz əli ilə yazdığı yazısıdır.**"[326] Beləliklə də İbn Məsud'un özündən sonra bir yazı tərk etdiyini öyrənmiş oluruq. Bu yazıda peyğəmbərdən – salləllahu aleyhi va sələm – eşitdiyi hədisləri qeyd edib. İbn Əbi Şeybə deyir: "**Həfs bizə Mucəlid'dən, o da əş-Şabi'dən, o da Abdurrahmən bin Abdilləh (bin Məs'ud) dan rəvayət etdi ki, "o, bir şey eşitdikdə onu yazardı.**"[327]

## Əli bin Əbi Talib

Əhlul-Beytin imamını, peyğəmbərimizin – salləllahu aleyhi va səlləm - əmisi oğlunu, sevgili qızı Fatimə'nin həyat yoldaşını, möminlərin əmirini tanımayan müsəlman bəlkə də yoxdur. Ədaləti, şücaəti, imanı və təqvası ilə seçilən bu mübarək şəxsiyyət cənnətlə müjdələnmiş on səhabədən biridir, Allah dostudur və dörd raşidi xəlifədən dördüncüsüdür. Hicri 40-cı ildə azmış xarici firqəsinin nümayəndəsi tərəfindən şəhid edilib.

Əli – radiyallahu anhu – fiqhi, hökm kəsməkdə dəqiqliyi, ictihadlarında isabəti ilə tanınır. Özündən əvvəlki xəlifələrin yanında əvəz edilməz məsləhətçi kimi yer almışdı. Vaxtının əsas hissəsini siyasi problemləri həll etmək və ümmətin birliyini qorumağa çalışmaq üçün sərf etdiyini nəzərə alsaq ondan bizə nə üçün çox miqdarda hədisin gəlib çatmadığını başa düşmək olar. Bununla belə Əlinin öz üzərində gəzdirdiyi bir səhifəsi var idi. İmam əl-Buxari deyir: "**Muhəmməd bin Sələm bizə rəvayət etdi; Vaki bizə Sufyan'dan, o da Mutarrif'dən, o da əş-Şabi'dən, o isə Əbu Cuheyfə'dən belə dediyini rəvayət etdi: "Əli bin Əbi Talib'ə dedim: "Sizdə bir**

326. "Musannəf İbn Əbi Şeybə", 5/313;

327. "Musannəf İbn Əbi Şeybə", 5/314;

**kitab varmı?" Dedi: "Xeyr, Allahın kitabından, müsəlmana verilmiş fəhmdən və bu səhifədəkindən başqa heç nə." Dedim: "Bəs bu səhifədəki nədir?" Dedi: "Qan pulu, əsirlərin azad edilməsi və bir müsəlmanın kafirə görə öldürülməyəcəyi...**"[328] Xəbərlərə əsasən Əli bu səhifəni lülə şəklində bükülmüş olaraq qılıncının dəstəyindən asaraq daşıyardı.

Əli bin Əbi Talib'in bəzi hallarda hədis yazdırdığını da bilirik. İbn Sad "ət-Tabəqat əl-Kubra" kitabında yazır: "**Muslim bin İbrahim bizə xəbər verdi: əl-Munzir bin Sə'ləbə bizə rəvayət etdi: İlbə bin Əhmər bizə rəvayət etdi ki, Əli bin Əbi Talib insanlara xütbəsində xitab edərək dedi: "Kim (məndən) bir dirhəmə elm alar?" əl-Haris əl-A'var da bir dirhəmə səhifələr aldı, sonra onları götürüb Əlinin yanına gəldi və çox miqdarda elm yazdı.**"[329] əl-Haris əl-A'var təxminən hicri 65-ci ildə vəfat edib, lakin Əli bin Əbi Talib'dən yazdığı yazı sonrakı nəsillərin əlinə keçib.[330] Onlardan biri Abdul-Alə bin Amir əs-Sə'aləbi idi.[331] İmam Əhməd bin Hənbəl onun haqqında danışarkən deyir: "**Onun əlinə əl-Haris əl-A'varın kitabı düşmüşdü.**"[332]

328. "Sahih əl-Buxari", (111)

329. "ət-Tabəqat əl-Kubra", 6/168; İbn Sad'ın şeyxi Muslim bin İbrahim hicri 130-ci ilin ətrafında Basra şəhərində anadan olmuş və oranın musnidi sayılan Əbu Amr Muslim bin İbrahim əl-Əzdi əl-Fərahidi'dir. əz-Zəhəbi onu "imam, hafiz, siqa" olaraq vəsf edir. əl-Munzir bin Sə'ləbə isə Basra əhlindən Əbun-Nədr əl-Munzir bin Sə'ləbə bin Hərb əl-Quta'i əl-Abdidir. İmam Əhməd deyir: "Siqadır, İlbə bin Əhmər'dən Xorasanda ikən (hədis) eşitmişdir." əl-Munzir bu xəbəri İlbə bin Əhməd əl-Yəşkuri'dən rəvayət edir. O da əslən basralıdır, Əli bin Əbi Talib'dən hədis dinləmişdir, siqadır.

330. əl-Haris əl-Avar alimlər tərəfindən şiddətli tənqidlə üzləşib. Əksər alimlər onun zəif olduğunu deyiblər, hədislərində xətaların olduğuna diqqət çəkiblər.

331. Kufəli olan bu ravi bizim hədis alimlərimiz tərəfindən tənqid olunub. Tənqid olunmasının səbəbi isə budur ki, başqalarının rəvayət etmədiyi xəbərləri rəvayət etməsi, eyni şeyi birdən çox adama nisbət etməsi olmuşdur. Bununla belə hədis səhifələrinə maraq göstərən biri idi və bir xəbərə əsasən həm də Muhəmməd əl-Hənəfiyyə'dən gəlmiş bir səhifəni də əldə etmişdir. Həmin səhifənin həqiqətdə Muhəmməd əl-Hənəfiyyə'yə aid olmadığını deyiblər və buna görə də alimlərimiz Abdulalə bin Amr'ın rəvayətlərinə əhəmiyyət verməyiblər.

332. "əl-İləlu va Mərifətur-Ricəl", 3/435; "əd-Duafə əl-Kəbir", əl-Uqeyli, 3/57; "əl-Cərh

## Əlinin qəzası

Əli bin Əbi Talib'in sözlərini özündə daşıyan səhifələrin mövcud olduğu tarixdən məlumdur. Bunlardan bəziləri hələ ondan sonra haqqında aşırı inanclara sahib bəzi qruplar tərəfindən formalaşmışdı. Tarixi xəbərlərin ifadə etdiyinə əsasən o dövrdə "Əlinin qəzası" adı ilə tanınan yazılı səhifə və ya səhifələr mövcud idi. "Qəza" ilə Əli bin Əbi Talib'in verdiyi hökmlər qəsd olunur, amma bu hökmlərin içində hədislərin olması çox təbiidir. İmam Muslim "əs-Sahih" kitabında deyir: "**Davud bin Amr əd-Dabbi bizə rəvayət etdi; Nafi' bin Ömər bizə İbn Əbi Muleykə belə dediyini rəvayət edir: "İbn Abbas'a yazaraq ondan mənə bir kitab yazmasını və (məsləhət görmədiklərini) məndən gizlətməsini istədim. Dedi: "(Onun üçün) nəsihət edici övlad olacam; onun üçün seçdiklərimi yazacam və (bəzi şeyləri) ondan gizlədəcəm." (İbn Əbi Muleykə) dedi: "Bunun üzərinə Əlinin hökmlərinin gətirilməsini istədi və ondan bəzi şeyləri yazmağa başladı. Oradan bəzi şeylərlə qarşılaşdıqda deyərdi: "Allaha and olsun ki, Əli bununla hökm verməmişdir, ancaq onun azmış olması istisnadır.**"[333] Əlidən sadir olmuş və yaxud da ona nisbət olunan bu hökmlər və rəvayətlər hazır bir kitab halında mövcud idi və biz bunu təqdim etdiyimiz hədisdən anlaya bilirik. Lakin İbn Abbas oradan bir çox şeyi inkar etmiş və onların Əlidən sadir olmasını qeyri-mümkün hesab etmişdir. Bu xəbərdən sonra gələn rəvayətdə İmam Muslim deyir: "**Amr ən-Naqid bizə rəvayət etdi; Sufyan bin Uyeynə bizə Hişəm bin Huceyr'dən, o da Tavus'dan belə dediyini rəvayət edir: "İbn Abbasın yanında içində Əlinin – radiyallahu anhu - hökmləri olan bir kitabı gətirdilər və bir miqdarından başqa qalan hissəsini sildi." Sufyan bin Uyeynə (bir miqdar sözünü dedikdə) qoluna işarə etdi. Həsən bin Əli əl-Hulvani bizə rəvayət etdi; Yəhya bin Adəm bizə rəvayət etdi; İbn İdris bizə əl-Aməş'dən, o da Əbu İshaq'dan belə dediyini rəvayət etdi: "Əlidən – radiyallahu anhu – sonra o şeyləri ortaya çıxardıqlarında Əlinin yoldaşlarından biri dedi:**

---

vat-Tədil", İbn Əbi Hətim, 6/26;

333. "Sahih Muslim", 1/13 (7)

**“Allah onları yox etsin. Necə bir elmi korladılar!** ”[334] Əgər bir dirsək uzunluğunda yazıdan başqa qalan hissəni pozubsa bu ona dəlalət edir ki, həmin səhifə lülə şəklində bükülmüş dəri səhifə olub. Ona görə də İmam ən-Nəvəvi bu sözlərin şərhində deyir: “**Zahir olan budur ki, o kitab lülə halında bükülmüş uzun bir vərəqdir.**”[335] İçində Əliyə nisbət olunmuş batil hökmlər və rəvayətləri İbn Abbas rədd etmiş, onların Əli bin Əbi Talib’dən sadir olmadığını bəyan etmişdir.

Əlinin hədislərindən və hökmlərindən səhih olanların yazılmasını istəyən İbn Əbi Muleykə isə (vəfatı hicri 117) İbnuz-Zubeyr’in əhdində Məkkədə qazi çalışmış Abdullah bin Ubeydilləh bin Əbi Muleykə əl-Quraşi ət-Teymi’dir. Zamanının barmaqla göstərilən imamlarından, fəqihlərindən idi. Əlbəttə ki, bu iş üçün Əlinin doğma əmisi oğlu Abdullah bin Abbas’dan daha münasib, əhliyyət sahibi birini tapa bilməzdi. Qarşıda biz Əbu Abdirrahmən əl-Hubuli’nin hədislər kitabı ilə Abdullah bin Amr’ın yanına gəldiyini və ondan həmin hədislər kitabını yoxlamasını tələb etdiyini zikr edəcəyik.

## Hucrun səhifəsi

Əbu Abdirrahmən Hucr bin Adiy bin Cəbələ əl-Kindi səhabələrdən biridir və peyğəmbərin – salləllahu aleyhi va səlləm – ömrünün sonunda onun yanına bir nümayəndəlik tərkibində gəlmiş və ona iman etmişdir. Lakin elmini əsasən səhabələrdən öyrənmişdir. Xüsusilə Əli bin Əbi Talibə bağlı bir şəxs olub və tarixdə onun haqqını müdafiə etməklə tanınıb. Siffin döyüşündə Əli bin Əbi Talib’in əmiri olub. Hicri 51-ci ildə Müaviyə’nin əmri ilə qətl edilərək öldürülüb.

İbn Sad deyir: “**Yəhyə bin Abbad bizə xəbər verdi: Yunus bin Əbi İshaq bizə rəvayət etdi; dedi: Umeyr bin Qumeym bizə rəvayət etdi; dedi: Hucr bin Adiy əl-Kindi’nin bir qulamı mənə rəvayət etdi; dedi: “Mən sənin oğlunun ayaq yoluna daxil olduğunu və dəstəmaz almadığını gördüm.” Dedi: “Taxçadan səhifəni mənə ötür!” Bunun üzərinə oxumağa**

334. Eyni mənbə, (7)

335. “Şərhun-Nəvəvi alə Muslim”, 1/83;

**başladı: "Bismillahir-Rahmənir-Rahim. Bu, mənim Əli bin Əbi Talibdən zikr edərkən eşitdiyimdir ki, "təharət imanın yarısıdır."**[336] Bu kitabın Əli bin Əbi Talib'in sözlərini və hədislərini toplayan bir səhifə olması möhtəməldir, çünki Hucr bin Adiy məhz iki səhabədən xüsusilə elm öyrənməklə tanınıb. Onlardan biri Əli bin Əbi Talib, digəri isə Ammar bin Yasir'dir. Lakin Ammar hələ Əlinin xilafəti dövrünün əvvəllərində öldürülmüşdü.

## Muaz bin Cəbəl

Əbu Abdirrahmən Muaz bin Cəbəl bin Amr bin Əvs əl-Xazraci Mədinədə on səkkiz yaşında olarkən islamı qəbul etmiş və Aqabə beyətində gənc yeniyetmə olaraq iştirak etmişdi. Hicri 17 və ya 18-ci ildə otuz səkkiz yaşında ikən vəfat edib. Muaz gənc yaşlarına baxmayaraq elmə xüsusi həvəs göstərmiş bir səhabə idi. Peyğəmbərin – salləllahu aleyhi va səlləm – "**Quranı dörd nəfərdən, Abdullah bin Məsud, Əbu Hüzeyfənin mövlası Səlim, Ubeyy bin Kəb və Muaz bin Cəbəldən öyrənin**"[337] deməsi onun Quranı gözəl bildiyini göstərir. Bir başqa hədisdə Allahın elçisi – aleyhissələm – onu səhabələrin içində "**halalı və haramı ən yaxşı bilən**"[338] olaraq vəsf edir. Birdən çox yerdən gəlmiş rəvayətlərdən öyrənirik ki, Muaz bin Cəbəl hədisləri yazıb və kitab halında saxlayıb. Abdurrazzəq əs-San'ani deyir: "**Mə'mər bizə İbn Tavus'dan, o da atasından belə dediyini xəbər verdi: "Muaz bin Cəbəl'in kitabında belə yazılıdır: "Kim bir torpağı girov götürərsə o, peyğəmbərin – salləllahu aleyhi va səlləm – həcc ilindən hesabı götürərək səmərəsini girov sahibinə verməlidir.**"[339] əl-Həkim ən-Nisəburi deyir: "**Əbu Əli əl-Huseyn bin Əli əl-Hafiz bizə xəbər verdi: Cəfər bin Əhməd bin Sinən bizə rəvayət etdi: Əhməd bin**

336. "ət-Tabəqat əl-Kubra", 6/220; İbn Əbi Şeybə'nin "əl-Musannəf" kitabında bunu Umeyr bin Qumeym əvəzinə Əbu Leyla əl-Kindi rəvayət edir. Umeyr məchuldur ravi hesab olunur, lakin Əbu Leyla əl-Kindi tabiinin böyüklərindəndir, siqadır. Hər ikisindən bunu rəvayət edən İmam Əbu İshaq əs-Səbi'idir.

337. "Sahih əl-Buxari", (3758, 3806, 3808, 4999); "Sahih Muslim", (2464)

338. "Musnəd Əhməd", 20/252; "Musannəf Abdirrazzəq", 11/225;

339. "Musannəf Abdirrazzəq", 8/245;

**Sinən bizə rəvayət etdi: Abdurrahmən bin Mehdi bizə rəvayət etdi: Sufyan bizə Amr bin Osman'dan, o da Musa bin Talha'dan belə dediyini rəvayət etdi: "Bizdə Muaz bin Cəbəl'in peyğəmbərdən – salləllahu aleyhi va sələm – kitabı vardır ki, "o, yalnız buğda, arpa, kişmiş və xurmadan zəkat götürdü.**"[340] Bu ikinci xəbəri həmçinin Abdurrazzəq "əl-Musannəf" kitabında Sufyan əs-Səvri'dən, o da Abdullah bin Osman'dan, o isə Musa bin Talha'dan rəvayət edib. Hər iki rəvayət göstərir ki, Muaz özündən sonraya bir kitab buraxmışdır və bu kitabda peyğəmbərdən – aleyhissalətu vassələm – hədislər və müxtəlif hökmlər vardır. Bu kitabın həm yəmənli Tavusda olduğunu, həm də mədinəli və sonra Kufə şəhərinə yerləşmiş Musa bin Talha bin Ubeydilləh'də olduğunu görürük.

## Zeyd bin Səbit

Səhabələrdən yazı ilə məşğul olmuş şəxsiyyətlərdən biri də Zeyd bin Sabit olub. Zeyd bin Sabit bin əd-Dahhək – Allah ondan razı olsun! – Xazrəc qəbiləsinə aid ənsarlı idi. Səhabələrin içində miras və Quran üzrə alim olaraq tanınırdı. Peyğəmbərin – aleyhissalətu vassələm – vəhy katiblərindən biri olub. Peyğəmbər Mədinəyə hicrət etdikdə Zeyd bin Səbit hələ on bir yaşında ikən iman gətirərək müsəlman oldu. Yüksək zəkası ilə diqqət çəkdiyi üçün Allahın elçisi – salləllahu aleyhi va sələm – ondan suryanicə öyrənməyi tələb edir. Yəhudilər ona məktub yazdıqda peyğəmbər üçün məktubu oxuyan, həmçinin yəhudilərə məktub yazmaq ehtiyacı olduqda onu yazan Zeyd olurdu. Zeyd bin Səbit fəqih səhabələrdən biri hesab olunur. Kufə əhli Abdullah bin Məsud'un məzhəbini izlədiyi halda mədinəlilər Zeyd bin Səbit'in məzhəbinə tabe olurdular. O, hicri 45-ci ildə 67 yaşında Müaviyənin xəlifəliyi dövründə vəfat edib. Vəfat edib dəfn edildikdə İbn Abbas "**bu gün çoxlu miqdarda elm dəfn edildi**" demişdir.

Tarixi qaynaqlardan biz Zeydin özündən sonra miras haqqında bir əsər tərk etdiyini bilirik. Cəfər bin Burqan deyir: "**əz-Zuhri'ni**

340. "əl-Mustədrak aləs-Sahiheyn", 1/558 (1457);

**belə deyərkən eşitdim: "Əgər Zeyd bin Səbit miras kitabını yazmış olmasaydı o elmin insanların əlində yox olacağını düşünərdim."**[341] Bu kitabı İbn Xayr əl-İşbili (h. 502-575) "əl-Fəhrasə" kitabında zikr edir və o kitabın şeyxlərindən aldığı isnadını qeyd edir. Bu isnad Zeydin oğlu Xaricə bin Zeyd'dən başlayır. Görünür ki, bu kitab onun oğlu Xaricə vasitəsi ilə böyük alim Əbuz-Zinəd'in əlinə keçib, hətta onu şərh edib. Said bin Mənsur "əs-Sünən" kitabında deyir: "**Abdurrahmən bin Əbiz-Zinəd bizə atasından, o da Xaricə bin Zeyd bin Səbit'dən rəvayət etdi ki, "bu miras hökmlərinin mənalarının hamısı və əslləri Zeyd bin Səbit'dəndir və Əbuz-Zinəd bunu Zeyd bin Səbit'in izahlarına görə təfsir etmişdir.**"[342] əl-Beyhəqi bunu Muhəmməd bin Bəkkər vasitəsi ilə rəvayət edir. Həm Said bin Mənsur, həm də Muhəmməd bin Bəkkər bu kitabı Abdurrahmən bin Əbiz-Zinəd vasitəsi ilə əldə ediblər. Bu sözlərdən anlaşılır ki, Əbuz-Zinəd o kitabı sadəcə nəql etməmiş, həm də ona şərh yazmışdır. Əbuz-Zinəd həm də "əl-Fuqahə əs-Səb'a" adlı kitabı ilə də tanınır. Həmin kitabda Mədinə'nin yeddi fəqihinin rəylərini toplayıb.

## Müaviyə bin Heydə

Müaviyə bin Heydə bin Müaviyə əl-Quşeyri əl-Bəsri peyğəmbərimizin – aleyhissalətu vassələm – səhabələrindən biridir. Basrada yerləşmiş və orada yaşamışdır. Xorasanın fəthində iştirak edib. Özündən sonra bir nüsxə tərk edib və həmin nüsxəni ondan oğlu Həkim bin Müaviyə rəvayət edir. Ondan isə oğlu Bəhz bin Həkim rəvayət etmişdir və nüsxə daha çox Bəhz bin Həkim'in nüsxəsi kimi tanınır. Bəhz'dən başqaları da Həkim bin Müaviyə vasitəsi ilə səhabə Müaviyə bin Heydə'dən hədislər rəvayət ediblər. Lakin nüsxə olaraq rəvayət olunan hədislər nəvəsi Bəhz vasitəsi ilə ötürülüb. Alləmə İbnus-Saləh "əl-Muqaddimə" kitabında deyir: "**Bəhz bin Həkim atasından, onun vasitəsi ilə babasından; bu is-**

341. "əl-Mərifə vat-Tərix", 1/486;

342. "Sünən Said bin Mənsur", 1/44 (5);

**nad ilə böyük həsən bir nüsxə rəvayət edib və onun babası Müaviyə bin Heydə əl-Quşeyri'dir.**"[343] İbnus-Saləh bununla həmin nüsxəyə işarə edir və gördüyümüz kimi nüsxənin etibarlı, həsən bir nüsxə olduğunu deyir. İbn Nəsirid-Din əd-Diməşqi deyir: "**Hər iki halda da bu, gözəl bir nüsxədir və Yəhyə bin Main'dən Bəhz bin Həkim'in atasından, ondan da babasından rəvayət etdiyi haqqında soruşdular və dedi: "Əgər Bəhz'dən rəvayət edən siqadırsa o zaman bu, səhih bir isnaddır.**"[344] Görünür ki, mühəddislərin bu səhifədən xəbərləri olub və səhifə ən-Neysəburi (h. 321-405) "əl-Mustədrak" kitabında bu səhifəni zikr edərək deyir: "**Daha öncə Bəhz bin Həkim'in səhifəsi haqqında danışdıq ki, onu təkrar etməyə ehtiyac qoymadı...**"[345] Daha öncə qeyd etdiyi sözlər isə bunlardır: "**Bu hədisi Sufyan bin Said, hər iki Həmməd, Abdulvaris bin Said, İsrail bin Yunus və imamlardan başqaları Bəhz bin Həkim'dən rəvayət edirlər və mən nəql imamlarının əksəriyyəti arasında Bəhz bin Həkim'in adilliyi və hədislərinin toplanacağı barəsində bir ixtilafın olduğunu bilmirəm. Onu əl-Buxari "əl-Cami əs-Sahih" kitabında zikr edir.**"[346] Daha sonra əl-Hakim kitabında Bəhz bin Həkim'in səhifəsindən kənar rəvayət yolları ilə eyni hədisi Müaviyə bin Heydə'dən rəvayət edir və bununla səhifənin içindəki hədislərin etibarlı olmasına dair əlavə dəlillər təqdim etmiş olmur.

## Sa'd bin Ubədə

Sa'd bin Ubədə əl-Ənsari cahiliyyə dövründə ərəb dilində yazı yazanlardan olub və hicri 15-ci ildə vəfat edib. Qaynaqlar bizə xəbər verir ki, Sa'd özündən sonra bir yazı tərk etmişdir. İmam Əbu İsa ət-Tirmizi "əl-Cami" kitabında bir şahidin şahidliyinə və and içməyə əsaslanaraq hökm verməyin keçərliliyi ilə bağlı peyğəmbərdən – salləllahu aleyhi va səlləm – xəbər zikr etdikdən sonra deyir: "**Rabi'a**

343. "Muqaddimətu İbnis-Saləh", səh: 315;

344. "Tənvirul-Fikra", səh: 26;

345. "əl-Mustədrak aləs-Sahiheyn", 1/214 (432)

346. "əl-Mustədrak aləs-Sahiheyn", 1/108 (142)

**dedi: Sa'd bin Ubədə'nin oğullarından biri mənə xəbər verdi və dedi: "Sa'dın kitabında/yazısında gördük ki, peyğəmbər – salləllahu aleyhi va sələm – and ilə birlikdə şahidə əsaslanaraq hökm vermişdir.**"[347] Sa'dın oğlu deyildikdə qəsd olunan əslində onun nəvəsidir. Bunu biz İmam Əhmədin "əl-Musnəd" kitabındakı rəvayətindən daha aydın görürük: "**...Rabi'a bin Əbi Abdirrahmən'dən, o da İsmail bin Amr bin Qeys bin Sad bin Ubədə'dən, o da atasından ki, onlar Sad bin Ubədənin kitablarında və ya kitabında (belə yazıldığını) tapıblar ki...**"[348] Sad'ın kitabını saxlayan Amr bin Qeys bin Sad və onun qardaşları olublar, yəni Sad bin Ubədə'nin nəvələri atalarından onlara miras qalmış hədis kitabında babalarının yazdıqları hədisləri görüblər. Bunu təsdiqləyən digər xəbəri İmam əş-Şafi verir. əl-Beyhəqi deyir: "**əş-Şafi (kitablarından birində) dedi: "Said bin əl-Muttalib (bizə) Said bin Amr'dan, o da atasından belə dediyini zikr etdi: "Sad bin Ubədə'nin kitabında (yazıldığını) gördük ki, Allahın elçisinin – salləllahu aleyhi va sələm – Amr bin Həzmə bir and ilə birlikdə şahidə əsaslanaraq hökm verməyi əmr etdiyinə Sad bin Ubədə şahid olub.**"[349] Sad bin Ubədə'nin cahiliyyə zamanında yazı yazan kəslərdən olması və onun Mədinədə qəbiləsinin böyüklərindən olması hədisləri yazmağı onun üçün çox təbii bir hala çevirir.

Bu tapılmış kitabların Mədinə əhli arasında məşhur olduğunu deyə bilərik. İbn Hibban "əs-Siqat" kitabında deyir: "**İsmail bin Amr bin Şurahbil bin Said bin Sad bin Ubədə babasından rəvayət edir və o, Sad bin Ubədənin kitablarından ibarət tapıntının sahibi Mədinə əhlindən olan Said bin Amr'ın qardaşıdır. Ondan Rabi'a bin Əbi Abdirrahmən rəvayət edir.**"[350] İbn Hibbanın bunu təqdim etmək şəklindən hiss etmək olur ki, sözü gedən kitab işin əhlinə məlum idi və bu gün bu kanal ilə bəzi rəvayətlər məşhur hədis kitablarında mövcuddur. Aydın olur ki, hədis imamları o kitabla tanış olublar və içindəki hədisləri öz kitablarına alıblar.

347. "Sünən ət-Tirmizi" (1343)

348. "Musnəd Əhməd", 37/125; (ər-Risələ)

349. "Mərifətus-Sunən val-Əsər", 14/289; "Musnəd əş-Şafi", səh: 150 (726)

350. "əs-Siqat", 6/28;

## Abdullah bin Əbi Əvfə

Abdullah bin Əbi Əvfə peyğəmbərin – aleyhissalətu vassələm – mübarək səhabələrindən biridir. Atası Əbu Əvfə də səhabədir və əsl adı Alqamə bin Xalid bin əl-Haris əl-Əsləmidir. Hudeybiyyə'də iştirak etmiş, "ridvan" beyətində peyğəmbərə beyət etmişdir. Xeybər döyüşündə və ondan sonrakı döyüşlərdə yer almışdır. Allahın elçisi – aleyhissələm – vəfat etdikdə Kufəyə köçür və orada qalır. Abdullah Kufədə ölmüş ən sonuncu səhabə hesab olunur. Məşhur rəyə görə orada hicri 86-cı ildə vəfat edib.

Abdullah bin Əbi Əvfə hədis yazan səhabələrdən sayıla bilər. İmam əl-Buxari "əs-Sahih" kitabında Səlim Əbun-Nədr'ə - və o, Ömər bin Ubeydullah'ın azadlı qulu və katibi idi - çatan isnadını zikr edərək ondan belə dediyini rəvayət edir "**Abdullah bin Əbi Əvfə ona (yəni Ömər bin Ubeydullaha) yazdı və mən (onun yazdığını) oxudum ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – onunla qarşılaşdığı günlərdən birində günəşin zeniti keçməyini gözlədi və sonra insanların qarşısında xütbə verərək dedi: "Ey insanlar, düşmən ilə qarşılaşmağı təmənni etməyin və Allahdan salamatçılıq diləyin! Amma onlarla qarşılaşsanız səbr edin və bilin ki, cənnət qılıncların kölgəsi altındadır.**"[351] Ömər bin Ubeydilləh ət-Teymi müsəlman sərkərdələrdən idi, Basraya valilik etmiş siyasətçilərdən olub. Səlim Əbun-Nədr onun katibi olaraq çalışıb və Abdullah bin Əbi Əvfə'nin ağasına necə hədis yazdığına və o hədisi özü şəxsən məktubdan oxuduğuna şahidlik edir.

## Səmura bin Cundub

Səmura – radiyallahu anhu – kiçik səhabələrdən sayılır. İslam fəthlərindən sonra Basra şəhərində məskən salmışdır. Basrada və Kufədə vali olaraq çalışıb. Hicri 57-ci ildə və ya 58-ci ildə vəfat edib. Vəfat etmədən öncə öz övladlarına vəsiyyət yazıb və bu vəsiyyətdə peyğəmbərdən – aleyhissalətu vassələm – hədislər rəvayət etmişdir.

351. "Sahih əl-Buxari" (2965-2966)

Daha sonra bu yazı "Səmura'nın nüsxəsi" və ya "Səmura'nın səhifəsi" olaraq məşhurlaşıb. Bu səhifəni Səmura'nın ailəsi saxlayıb və rəvayət ediblər. Bunu Səmura'dan rəvayət edən oğlu Süleyman bin Səmura'dır, Süleymandan rəvayət edən Xubeyb bin Süleyman'dır. Xubeyb'dən rəvayət edən isə əmisi oğlu Cafər bin Sa'd bin Səmura'dır. İbn Sa'd "ət-Tabəqat" kitabında deyir: "**Mərvan bin Cafər bin Sa'd bin Səmura bin Cundub əl-Fəzəri; Əbu Bəkr bin Ayyəş'dən rəvayət edir və onda Səmura'nın oğullarına vəsiyyəti var idi.**"[352] Bu isnad Səmura'nın vəsiyyətinin ən yayğın olan isnadıdır, əl-Bəzzər müsnədində bu isnad ilə yetmiş, ət-Tabərani isə "əl-Mucəm əl-Kəbir" kitabında yüzə yaxın hədis rəvayət edir. Lakin Cafər bin Sa'd və Xubeyb bin Süleyman'ın halı məchul olduğu üçün, haqlarında kifayət qədər məlumat olmadığı üçün bu isnada alimlərimiz etibar etməyiblər. Lakin Səmura'nın vəsiyyəti zamanında tanınmış və qəbul edilmiş bir nəsihət olmuşdur. Böyük tabii alim Muhəmməd bin Sirin deyir: "**Səmura'nın oğullarına yazdığı risaləsində çoxlu elm vardır.**"[353] Görünür ki, Muhəmməd bin Sirin və başqaları bu nüsxə ilə tanış olublar və içindəki hədislərdən xəbərdar olublar.

Bu nüsxədən hədis rəvayət edən yalnız oğlu Süleyman olmayıb, başqaları da hədis rəvayət ediblər. Onlardan biri əl-Həsən bin Yəsər əl-Basri'dir; hicri 110-cu ildə vəfat edib. Saləhuddin əl-Alə'i onun, yəni əl-Həsən əl-Basri'nin Səmuradan rəvayəti haqqında danışarkən deyir: "**Onun Səmura bin Cundub'dan rəvayətinə gəldikdə isə "Sahih əl-Buxari"də ondan "aqiqa" hədisini eşitdiyi keçir. Ondan böyük bir nüsxə rəvayət edib ki, əksəriyyəti dörd "sünən" kitabında yer alır. Əli bin əl-Mədini'yə görə onların hamısını (Səmura'dan şəxsən özü) eşidib. Həmçinin ət-Tirmizi də bunun bənzərini əl-Buxari'dən nəql edir. Yəhyə bin Said əl-Qattan və sayları çox olan bir qrup alim isə kitabdan rəvayət etdiyini deyiblər. Bu isə onunla arasında bir qopuqluq olduğunu gərəkdirməz.**"[354] əl-Alə'nin bu sözlərini Əbu Zura əl-İraqi "Tuhfətut-Tahsil"də, İbn Həcər də "Təhzibut-Təhzib" kitabında olduğu kimi zikr edir və təsdiqləyirlər.

352. "ət-Tabəqat əl-Kubra", 6/417;

353. "əl-İstiy'ab fi Mərifətil-Əshəb", 2/653;

354. "Cəmi'ut-Təhsil", səh: 165;

əl-Həsən əl-Basri'dən savayı bu nüsxəni Səmura'dan rəvayət edənlərdən biri də Raşid bin Sa'd əl-Məqrai əl-Himsi'dir; hicri 108-ci ildə vəfat edib və siqa ravi sayılır. əl-Beyhəqi səhih isnad ilə zikr edir ki, Səvr bin Yezid dedi: "**(Raşid bin Sa'd) mənə Səmura bin Cundub'dan – radiyallahu anhu - bir kitab/yazı verdi ki, (orada yazılana görə) peyğəmbər – salləllahu aleyhi va səl-ləm – demişdir...**"[355] Bu hədisi əl-Beyhəqi həm əl-Həsən əl-Basri'nin ötürdüyü nüsxədən, həm də Raşid bin Sa'dın nüsxəsindən rəvayət edir. Bu isə öz növbəsində ona dəlalət edir ki, hər iki alim eyni nüsxəni əldə ediblər.

## Əbu Əyyub əl-Ənsari

Əbu Əyyub Xalid bin Zeyd bin Kuleyb əl-Ənsari peyğəmbərin – salləllahu aleyhi va səlləm – mübarək səhabələrindən biridir. Aqabə beyətində iştirak etmiş və ondan sonra bütün döyüşlərdə peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanında döyüşmüşdür. Allahın elçisi Mədinə şəhərinə hicrət etdikdə öz evi tikilənə qədər Əbu Əyyub'un evində bir müddət qonaq qalıb. Hicri 52-ci ildə Yezid bin Müaviyə'nin ordusunda Konstantinopola qarşı hərbi yürüşdə xəstələnərək vəfat edib.

Onun hədislərini nəvəsi Əyyub bin Xalid bin Safvan bin Əvs bin Cəbir əl-Ənsari əl-Mədəni toplayıb və bu alim daha çox Əyyub bin Xalid bin Əbi Əyyub əl-Ənsari adı ilə tanınır. Əbu Əyyub əl-Ənsari onun ana tərəfdən babasıdır. Əyyub bin Xalid bu hədisləri atasından, o da Əbu Əyyub əl-Ənsari'dən eşidib və öz nüsxəsinə köçürüb. Daha sonra İmam Əhməd bu nüsxədəki hədisləri özünün "əl-Müsnəd" kitabına daxil edib və ümumən 112 hədisdən ibarətdir. Deyə bilərik ki, bu nüsxə İmam Əhməd bin Hənbəl'in əlində olub.

355. "əs-Sunən əl-Kubra", 9/599;

## Başqa misallar

Yuxarıda qeyd etdiklərimizdən ziyadə bir də məktublaşmalar əsnasında yazılmış hədislər olub. İstək qarşılığında səhabələr hədisləri yazaraq göndəriblər. Bu yazışmalar səhabələrin özləri arasında baş verdiyi kimi dövlət başçıları ilə onlar arasında və ya tələbələri ilə onlar arasında da baş vermişdir.

İmam əl-Buxari deyir: "**Muhəmməd bin Sinən bizə rəvayət etdi: Fuleyh bizə rəvayət etdi: Abdə bin Əbi Lubəbə bizə əl-Muğira bin Şu'bə azadlı qulu Varrad'dan rəvayət etdi ki, Muaviyə əl-Muğira'ya yazdı: "Mənə peyğəmbərin – salləllahu aleyhi va səlləm – namazdan sonra nə dediyini yaz göndər!" əl-Muğira da mənə bunları imla etdi: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – namazdan sonra (belə deyərkən) eşitdim: "Lə iləhə illəllah, vahdəhu lə şərikə ləh, Allahummə lə məni'a limə ə'teyt, va lə mu'tiyə limə mənə'tə, va lə yənfə'u zəl-cəddi minkəl-cədd" İbn Cureyc deyir: "Abdə mənə xəbər verdi ki, Varrad bunu ona xəbər verdi, sonra Muaviyə'nin yanına getdim və onu insanlara bu sözü deməyi əmr edərkən eşitdim.**"[356] Bu, bir səhabənin, həm də dövlət başçısının tələbi üzərinə hədisin yazılmasına misaldır.

Bir başqa misalda Fatimə bint Qeys peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – necə üç dəfə boşanmış qadının qalacağı yer və xərcləri ilə bağlı verdiyi hökmü bizlərə xəbər vermişdir və bunu məşhur səhabə Abdurrahmən bin Auf'un oğlu Əbu Sələmə'yə rəvayət edib. İmam Əhməd "əl-Musnəd" kitabında bu rəvayəti isnadı ilə qeyd etdikdən sonra rəvayətin sonunda deyir: "**Əbu Sələmə dedi: "(Fatimə) bu hədisini mənə imla etdi və onu öz əlimlə yazdım.**" [357]Muslim'in "əs-Sahih" kitabında isə Əbu Sələmə deyir: "**Bunu onun ağzından yazı olaraq yazdım.**"[358]

İmam Əhməd və başqalarının rəvayət etdiyinə əsasən ən-Nu'mən bin Bəşir rəvayət edir ki, "**Aişə deyib: Allahın elçisi – salləllahu**

356. "Sahih əl-Buxari", 6615;

357. "əl-Musnəd", 45/319;

358. "Sahih Muslim", 1480;

**aleyhi va səlləm – Osman bin Affən'i yanına çağırdı, sonra Allahın elçisi – salləllahu aleyhi va səlləm – ona yaxınlaşdı və biz Allahın elçisini – salləllahu aleyhi va səlləm – gördükdə bir-birimizə yaxınlaşdıq. Ona dediyi sözlərin axırıncısı bu oldu ki, çiyninə vurdu və dedi: "Ay Osman, Allah – azzə və cəllə - ola bilsin ki, sənə bir köynək geyindirdi, ona görə də əgər münafiqlər onu çıxarmanı istəsələr mənimlə görüşənə qədər onu çıxarma!**" Bu sözünü üç dəfə təkrarlayır. ən-Nu'mən bin Bəşir deyir: "**Bunu Müaviyə bin Əbi Sufyan'a xəbər verdim və mənim xəbər verməyimdən razı olmadı və möminlərin anasına məktub yazıb – "onu mənə yaz!" – deyərək xahiş etdi və (Aişə) bunu məktub olaraq ona yazdı.**"[359]

359. "əl-Musnəd", 41/113;

# SƏHABƏLƏRDƏN SONRAKI DÖVR

Səhabələrdən sonrakı dönəm bəzi xüsusiyyətlər ilə səciyyələndirilə bilər. Bu dönəm artıq səhabələrdən rəvayət olunan hədislərin sinifləndirilməsi və dəqiqləşdirilməsi dönəmidir. Bu dövrdə müxtəlif növ kitablar ortaya çıxır və sistematik şəkildə hədislərin sənədləri və mətnləri tənqid olunmağa başlayır. Həmçinin hədis raviləri də tənqidçilərin süzgəcindən keçməli olur və nəticədə "ricəl" elmi adlandırdığımız yeni bir fənn ortaya çıxır.

Burada təkcə səhabələrin tələbələrinin fəaliyyəti deyil, həmçinin onlardan sonra yaşamış alimlərin, imamların rolu da qeyd ediləcək. İlk öncə səhabələrə tələbəlik etmiş ən məşhur alimlər və onların bu sahədə verdikləri töhfələr haqqında danışacağıq. Onlardan bəziləri ilə artıq səhabələr haqqında danışdıqda tanış olduq, çünki səhabələrin kitablarını yazanlar, köçürənlər və nəhayət nəql edənlər onlardır. Ona görə də nəql etdikləri nüsxələr onların öz adları ilə tanınıb məşhurlaşıb.

Bu bölmə də həm də biz artıq ayrı-ayrı şəhərlərin elm mərkəzləri olaraq seçildiyinin də şahidi olacağıq. Şəhərlərin bir-birilərindən bəzi xüsusiyyətlərə görə fərqləndiyini, bu fərqliliklərin daha sonrakı nəsillərə necə təsir etdiyini də görəcəyik.

## Kitabların miras keçməsi

Səhabələrin elmini kitablara köçürmüş tələbələr əlbəttə ki, o kitabları növbəni alan nəsillərə tərk ediblər. Bu kitablardan bir çoxu

dövrünün ən mütəxəssis, ən bariz hədis alimlərinin əlinə keçib. Bu barədə tarixdə misallar çoxdur və bu misalların hər biri bizim üçün əvəzsiz məlumatlar daşıyır.

Bu məqsədlə ilk öncə İbn Sirin'in tərk etdiyi kitabın aqibətini zikr edək. Əbu Hureyra'nın hədislərini toplamış və onları kitab halına salmış tələbələri arasında basralı alim Muhəmməd bin Sirin'in də adını çəkmişdik. Onun yazdığı kitab Əli bin əl-Mədini'nin ixtiyarında olub. İmam Yaqub əl-Fəsəvi "əl-Mə'rifə vat-Tərix" kitabında deyir: "**Əli bin əl-Mədini dedi: "Muhəmməd bin Sirin'in övladlarından bir nəfər yanıma Muhəmməd bin Sirin'in Əbu Hureyra'dan (yazdığı) kitabı ilə gəldi və içindəki hədislərdən Hişəm'in mərfu olaraq rəvayət etdikləri də (orada) mərfu olaraq rəvayət edilmişdi. Əvvəli belə başlayırdı: Bu, Əbu Hureyra'nın bizə rəvayət etdikləridir... Əbul-Qasim belə dedi ... Əbul-Qasim belə dedi ... Orda var idi. Dedi: "Qədim bir perqamentdə yazılmış bir kitab idi və Yəhyə bin Sirin onu saxlayırdı, çünki Muhəmməd (bin Sirin ömrünün sonlarında) yanında hansısa bir kitabın olmasını doğru görmürdü. Peyğəmbərin – salləllahu aleyhi va səlləm – hədisini bitirdikdə onun altında "bu, Əbu Hureyra'nın hədisidir" sözü yazılır və ikisi arasında fasilə qoyduqdan sonra yazılır: "Əbu Hureyra belə dedi...". (Əli bin əl-Mədini) dedi: "Hər onuncu hədisdən sonra dairə şəklində nöqtələr var idi. Muhəmməd (bin Sirin) tədlis etməzdi.**"[360] Bunu kitabında bizə nəql edən Yaqub bin Sufyan əl-Fəsəvi hicri 277-ci ildə vəfat edib və Əli bin əl-Mədini isə hicri 161-ci ildə doğulub və 234-cü ildə vəfat edib. Yəhyə bin Sirin isə Muhəmməd bin Sirin'in qardaşı olub və qardaşı Muhəmməddən öncə vəfat edib. Bu nüsxənin daha sonra onun övladlarının ixtiyarına keçdiyi aşkardır. Həmçinin diqqət etmək lazımdır ki, Əli bin əl-Mədini nüsxədəki hədislərin dəqiqliyini yoxlamaq üçün onları Muhəmməd bin Sirin'in ən etibarlı tələbəsi, böyük alim Hişəm bin Həssən'in (vəfatı hicri 146) öz müəllimi İbn Sirin'dən rəvayət etdikləri

360. "əl-Mə'rifə vat-Tərix", 2/54-55;

ilə yoxlayıb və onların üst-üstə düşdüklərini təsdiqləyib. Burada şifahi rəvayətlər ilə yazılı qaynaqların bir-birini təsdiqlədiyinin, dəstəklədiyinin şahidi oluruq. Oxuduğumuz bu sətrlərdəki tarixi şahidlik özündə dəyəri ölçülməyən məlumatlar daşıyır. Görürük ki, hələ ilk əvvəldə hədislər yazılarkən müəyyən qaydalara riayət olunurdu. Peyğəmbərin – aleyhissalətu vassələm – sözünü onun səhabəsinin sözündən ayırmaq üçün fasilələr qoyulur, hədisləri bölmək üçün dairələrdən istifadə olunurdu. Bu dairələrdən istifadə ilkin hədis kitablarında yayğın olub. Əbu Muhəmməd ər-Raməhurmuzi (hicri 360) isnadını qeyd edərək əl-Əsmai'nin belə dediyini zikr edir: "**İbn Əbuz-Zinəd bizə rəvayət edərək dedi: "Atamın kitabında belə yazılıb: Bu, mənim Abdurrahmən bin Hurmuz əl-Arac'dan eşitdiyim hədislərdir." (İbn Əbuz-Zinəd) dedi: "Hər dəfə bir hədis qurtardıqda bir dairə cızıb" və sonra dedi: "Bütün kitab belədir.**"[361] Abdurrahmən bin Hurmuz əl-Arac Əbu Hureyra'nın ən məşhur tələbələrindən biridir. İmam Malik "əl-Muvatta" kitabında Əbuz-Zinəd vasitəsi ilə əl-Arac'dan çox sayda hədis rəvayət edib. Əbuz-Zinəd adı ilə tanınan ravi Əbu Abdirrahmən Abdullah bin Zəkvan əl-Mədəni'dir, İbn Abbas hələ sağ ikən təxminən hicri 64 və ya 65-ci ildə anadan olub və 130-cu ildə 66 yaşında ikən vəfat edib. Ənəs bin Malik'dən, Əbu Umamə bin Səhl, Əbən bin Osman, Urva bin əz-Zubeyr, Said bin əl-Museyyəb, Abdurrahmən bin Hurmuz əl-Arac, Xaricə bin Zeyd bin Səbit, əl-Qasim bin Muhəmməd kimi alimlərdən elm alıb. Daha çox Abdurrahmən əl-Arac'dan rəvayət etməklə tanınıb və oğlunun xəbər verdiyi kimi ondan bir kitabı, bir səhifəsi olub. Səhifəni vəsf edərkən hər bir hədisin sonunda çevrə çəkildiyini zikr edir. Ümumiyyətlə o dövrdəki əksər hədis kitablarında hədisi növbəti hədisdən ayırmaq üçün bu cür işarələr istifadə edirdilər.

361. "əl-Muhəddis əl-Fəsil beynər-Ravi val-Va'i", səh: 606; İsnadını bu şəkildə təqdim edir: "Muhəmməd bin Atiyyə əş-Şəmi bizə rəvayət etdi: Əbu Hətim əs-Sicistəni bizə rəvayət etdi: əl-Əsmai bizə rəvayət etdi..." Əbu Hətim Səhl bin Muhəmməd bin Osman əs-Sicistəni (172-255) haqqında əz-Zəhəbi "imam, alləmə" sözlərini işlədir.əl-Əsmai isə məşhur ərəb dili alimi Əbu Said Abdulməlik bin Qureyb əl-Əsmai əl-Bəsri'dir. Hicri 120-ci illərdə doğulub və 215-ci ildə vəfat edib. Doğru sözlü, etibarlı biri kimi tanınıb. ər-Raməhurmuzi'nin şeyxi İbn Atiyyə haqqında bir məlumat tapa bilmədim.

*Şəkil 5: Misirdən tapılmış qədim hədis əlyazması, Duke Universiteti, 806 recto. Şəkildə altından qırmızı xətt çəkilmiş dairələr hədis səhifələrində, kitablarında iki hədisi ayırmaq üçün istifadə edilmiş işarələrdir.*



Daha bir misal İmam Ata bin Əbi Rabah'ın kitabının keçdiyi yoldur. Əbu Muhəmməd Ata bin Əbi Rabəh bin Safvan böyük tabii alimlərdəndir, hicri 27-ci ildə, yəni Osmanın xəlifə olduğu dövrdə anadan olub və 114-cü ildə Məkkədə vəfat edib. Çox sayda səhabədən elm almışdır, bu səhabələrin arasında Aişə, Ummu Sələmə, Ummu Həni, Əbu Hureyra, İbn Abbas, Həkim bin Hizəm, Rafi bin Xadic, Zeyd bin Ərqam, Zeyd bin Xalid əl-Cuhəni, Safvan bin Umeyyə, İbnuz-Zubeyr, Abdullah bin Amr, İbn Ömər, Cabir bin Abdilləh, Müaviyə, Əbu Said əl-Xudri kimi tanınmış və tanınmamış səhabələr vardır. Dövrünün ən böyük alimlərindən sayılır və Məkkədə yaşamış, orada imamlıq, müftilik etmişdir. Hətta İbn Abbas'ın sağlığında Ata insanlara fətva verərdi.

İbn Əbi Rabəh'in səhabələrdən eşitdiklərini yazdığına dair sabit tarixi xəbərlər vardır. Həmçinin onun özü də məşhur bir şəxsiyyət olduğu üçün ondan hədis yazan tələbələri çox olub və ona fövqəladi bir maraq olub. əd-Dərimi deyir: "**əl-Valid bin Şucə bizə xəbər verdi; Muhəmməd bin Şueyb mənə xəbər verdi; Hişəm bin əl-Ğaz bizə xəbər verərək dedi: "Ata bin Əbi Rabəh'ə sual verilərdi və verdiyi cavablar onun qarşısında yazılırdı.**"[362] Vermək istədiyimiz misala gəldikdə isə bunu bizə İmam İbn Əbi Hətim nəql edəcək. Abdurrahmən bin Əbi Hətim ər-Razi bizim zamanımıza qədər gəlib çatmış kitabında deyir: "**Saleh bizə xəbər verdi; Əli (bin əl-Mədini) bizə xəbər verdi və dedi: "Sufyandan soruşdum: "Zəkəriyyə bin İshaq məgər Ata'dan elm almayıbmı?" Dedi: "Xeyr." Sufyana dedilər: "Onlar səndən belə dediyini nəql edirlər ki, Zəkəriyya bin İshaq deyib: "Ata bizə bir səhifə çıxarıb göstərdi." Bunun üzərinə Sufyan dedi: "Xeyr, sadəcə olaraq (Zəkəriyya) mənə ondan gələn bir səhifəni göstərdi - o qədər də böyük deyildi - və dedi: "Bunu mənə Yaqub bin Ata verdi və dedi: "Buradakıları atam peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrindən eşitmişdir." Orada Amr'dan və başqalarından eşitdiyim şeyləri gördüm və gördüm ki, eşitdiklərimizdən elə şeylər var ki, onlar o səhifədə yox idi.**"[363] Bu tarixi xəbər özündə çox dəyərli məlumat daşıyır. Bu xəbərin isnadındakı şəxslər tarixdə tanınmış böyük alimlərdir. Saleh, İmam Əhməd bin Hənbəl'in oğludur, öz çapında etibarlı bir hədis alimi olub. Əli isə böyük imam, tanınmış alim Əli bin əl-Mədini'dir. Əli bin əl-Mədini bu sualı əslən kufəli olan, öz dövründə Məkkənin imamı hesab edilmiş Sufyan bin Uyeynə'yə verir və diqqət etməliyik ki, bu suallar Sufyana hədis məclisində verilir və Sufyandan bəzi məlumatlar dəqiqləşdirilir. Sufyanın dediklərindən anlaşılır ki, Zəkəriyya bin İshaq ona bir dəftər, başqa sözlə yazılı vərəqlər göstərib və Sufyan onun həcminə diqqət çəkərək çox böyük olmadığını da xatırladır. Zəkəriyya bin İshaq da məkkəli alimlərdəndir, ravi olaraq alimlər onu güvənilən, etibar olunan ravilərdən sayıblar. Hicri 150-ci illərdə vəfat edib və Ata bin Əbi Rabəh'dən hədis eşitmişdir. Sufyan

362. "Sunən əd-Dərimi", (523)

363. "əl-Cərh vat-Tadil", 1/39;

bin Uyeynə xəbər verir ki, Zəkəriyya ona və digərlərinə Ata bin Əbi Rabəh'in hədislərini özündə ehtiva edən yazılı vərəqlər göstərib, lakin əlavə edir ki, bu səhifəni o, Ata'nın özündən yox, Ata'nın oğlu Yaqubdan alıb. Biz bu xəbərdən həm də öyrənirik ki, Sufyan bin Uyeynə o səhifənin, o dəftərin içindəkiləri araşdırmaq imkanı əldə edib və yaxından incələyib. O səhifənin içindəkilərin həqiqətən də Ata bin Əbi Rabəh'dən olduğunu təsdiqləyərək əlavə edir ki, içindəki hədisləri o, Amr bin Dinar və başqaları vasitəsi ilə Ata bin Əbi Rabəh'dən eşidib, beləliklə də "Sufyan bin Uyeynə - Amr bin Dinar – Ata bin Əbi Rabəh" kanalı ilə və yaxud da "Sufyan bin Uyeynə - İbn Cureyc – Ata bin Əbi Rabəh" kanalı ilə şifahi və ya yazılı şəkildə rəvayət olunmuş hədislər ilə "Sufyan bin Uyeynə - Zəkəriyya bin İshaq – Yaqub bin Ata – Ata bin Əbi Rabəh" kanalı ilə gəlmiş yazılı dəftər bir-birini dəstəkləmiş olur. Qeyd edək ki, Amr bin Dinar özü də Ata bin Əbi Rabəh'dən sonra Məkkənin imamı sayılıb və özü də İbn Abbas, Cabir bin Abdilləh, İbn Ömər, Ənəs bin Malik kimi səhabələrdən hədis eşidib. Bu tarixi misal bir daha təsdiq edir ki, böyük imamlarımız əllərinə keçən yazılı mənbələri şeyxlərindən eşitdikləri rəvayətlər ilə sınaqdan keçirərək qiymətləndirərdilər. Bundan öncə Əli bin əl-Mədini'nin necə Muhəmməd bin Sirin'in səhifəsini incələdiyinin şahidi olduq. Əgər yazılı qaynaqlar ilə şifahi qaynaqlar bir-birilərini dəstəkləyirsə bu rəvayətlərin güclülüyündə, tutarlılığında şəkk olmamalıdır.

Başqa bir misal Yəhyə bin Said əl-Qattan'ın əlinə keçmiş səhifələrdir. Yaqub əl-Fəsəvi deyir: "**Əli (bin əl-Mədini) dedi: "Yəhyə dedi: "Zəkəriyya mənə üç səhifə çıxarıb verdi: (onlardan biri) Sad bin İbrahim və başqa şeyxlərindən (yazdığı) səhifə, (digəri) Cabirdən gələn səhifə idi və (üçüncüsü) Amir'dən olan səhifə idi. Onları ona geri qaytardım və dedim: "Əzbərdən bildiklərini mənə rəvayət et!" O, "Girov qoyulmuş heyvan (ödəmə qarşılığı) minilər" hədisində "Amir bizə rəvayət etdi" dedi.**"[364] Burada Yəhyə adı ilə zikr olunan böyük müsəlman alim Yəhyə bin Said bin Fərrux əl-Qattan ət-Təmimi'dir. Hicri 120-ci ildə anadan olub və 198-ci ildə vəfat edib. Hişəm bin Urva, Ata bin əs-Səib, əl-Aməş, Humeyd ət-Tavil, Sufyan əs-Səvri, Şubə, Said

364. "əl-Mə'rifə vat-Tərix", 2/156;

bin Əbi Arubə, Süleyman ət-Teymi kimi kəslərdən və sayları çox olan digər hədis ravilərindən elm öyrənmişdir. Zəkəriyyə isə Kufənin qazisi Əbu Yəhyə Zəkəriyyə bin Əbi Zəidə əl-Həmədəni'dir və hicri 149-cu ildə vəfat etmiş etibarlı, güvənilən bir hədis ravisidir. Bu xəbərdən öyrənirik ki, Zəkəriyyada üç ayrı səhifə mövcud idi və bu səhifələrdən birində birdən çox şeyxindən eşitdiyi hədisləri yazmışdı. Yəhyə bizə o şeyxlərdən birinin adını zikr edir. O, Əbu İshaq Sad bin İbrahim bin Abdirrahmən bin Auf əl-Quraşi əz-Zuhri əl-Mədəni'dir. Məşhur səhabə Abdurrahmən bin Auf'un nəvəsidir. Hicri 127-ci ildə 72 yaşında vəfat edib. Səhabələrdən Abdullah bin Ömər və Cabir bin Abdilləhi görüb, Abdullah bin Cəfər bin Əbi Talib və Ənəs bin Malik kimi səhabələrdən isə hədis eşidib. Bu rəvayətdə Zəkəriyyə'nın digər şeyxlərinin adı çəkilmir. Kitabda daha öncə Yəhyə bin Said əl-Qattan'ın bu hekayəsini başqa məzmunda zikr etmişdik. Əbu Davud əs-Sicistəni deyir: "**əl-Həsən bin əs-Sabbəh və İbn Yəhyə bizə rəvayət etdi ki, Əli (bin əl-Mədini) onlara rəvayət edib: "Yəhyə bin Said (əl-Qattan)a dedim: Zəkəriyyə – yəni İbn Əbi Zəidə - kitabını (tələbələrə) verərdi?" Dedi: "Bəli, mənə əş-Şa'binin kitabını çıxardı və ondan yazdım. Sonra mənə başqa kitablar da çıxardı onları geri çevirdim, ordan heç bir şey yazmaq istəmədim. Bu, Sad bin İbrahim və Firas'ın kitabı idi.**"[365] Mədinədə qazi kimi çalışmış fəzilət sahibi alim Sad bin İbrahim əz-Zuhri'nin adı öncəki rəvayətdə keçir. Burada Firas adı ilə zikr olunan Əbu Yəhyə Firas bin Yəhyə əl-Muktib əl-Həmədəni əl-Kufi isə (vəfatı hicri 129) etibarlı hədis alimlərindəndir. Hər ikisi də Zəkəriyyə bin Əbi Zəidə'nin şeyxlərindəndir. Hər iki xəbəri birləşdirdikdə başa düşürük ki, Yəhya əslində Amir əş-Şa'binin hədislərini yazır, digərlərini isə geri çevirir, onları Zəkəriyyə'nın əzbərindən eşitməyi tərcih edir.

İkinci səhifə isə Cabir bin Abdilləh'in səhifəsi olaraq məşhurlaşmış səhifədir. Daha əvvəl o səhifə haqqında məlumat vermişdik və onun Süleyman əl-Yəşkuri'nin Cabir'dən eşidib topladığı hədislərdən ibarət olduğunu demişdik. Amir isə İmam əş-Şa'bidir. Əbu Amr Amir bin Şərahil bin Abd əl-Həmdəni əş-Şa'bi xəlifə Ömər bin əl-Xattab'ın zamanında doğulub və hicri 100-cü ildə vəfat edib. Sad

365. "Suələt Əbi Ubeyd əl-Əcurri", səh: 184;

bin Əbi Vaqqas, Said bin Zeyd, Əbu Musa əl-Əşari, Adiy bin Hətim, Usəmə bin Zeyd, Əbu Məsud əl-Bədri, Əbu Hureyra, Əbu Said əl-Xudri, Aişə, İbn Ömər, İmran bin Huseyn, əl-Muğira bin Şubə, Abdullah bin Amr, Cərir bin Abdilləh, İbn Abbas, Səmura bin Cundub, ən-Numən bin Bəşir, əl-Bəra bin Azib kimi səhabələrdən hədis eşitmiş böyük bir imamdır. Heç şübhəsiz ki, əş-Şabi'nin yazdığı hədislər çox əvəzsiz tarixi bir vəsiqə sayılmalıdır. Yəhyə bin Said əl-Qattan üçün Cabir'in və əş-Şabi'nin səhifələrini əldə etmək və oradakı hədisləri o kitabları daşıyan Zəkəriyya'dan eşitmək hədisləri dəqiqləşdirmək üçün möhkəm bir qaynaqdır. Əli bin əl-Mədini'nin burada bir hədisi zikr etməsindəki fayda budur ki, Zəkəriyya hədisi bir başa əş-Şabi'nin özündən eşidib.

əz-Zuhri'nin kitabına İmam Əhməd bin Hənbəl'in vaqif olması da bir başqa misal ola bilər. İbn Əbi Hətim ər-Razi deyir: "**Əli bin Əbi Tahir mənə yazaraq xəbər verdi: əl-Əsram dedi: "Əbu Abdilləh Əhməd bin Hənbəl dedi: "Şueybin kitablarına nəzər saldım və onları mənə onun oğlu çıxarıb göstərdi. Gördüm ki, orada elə gözəllik və səhihlik var idi ki, mənə görə gənclərdən kimsə şəkil və səhihlik baxımından onun mislini yazmağı bacara bilməz.**"[366] Əbu Davud da bunu təsdiqləyərək deyir: "**Əhmədi belə deyərkən eşitdim: "Şueyb bin Əbi Həmzə'nin kitablarını gördüm, gördüm ki, səhihləşdirilmiş kitablardır, demək olar ki, ondan heç bir şey əksik deyildi.**"[367] Əbu Davud bir başqa yerdə Şueybin oğlu haqqında soruşaraq deyir: "**Əhməddən Bişr haqqında bir başqa dəfəsində də soruşdum və dedi: "Ondan yetmişə qədər hədis yazdım, özü hədis sahibi deyildi, lakin atasının kitabları onda idi.**"[368] Tarixçi alim Əbu Zur'a əd-Diməşqi də buna şahidlik edərək deyir: "**Əhməd bin Hənbəl mənə xəbər verərək dedi: "Şueyb'in kitablarını gördüm və onları "zəbt" olunmuş, qeyd olunmuş kitablar olaraq gördüm" və çox təriflədi.**"[369] Şueybin kitabları həqiqətdə

366. "əl-Cərh vat-Tədil", 4/345; Çap olunmuş kitabda sonuncu cümlə fərqli verilib, lakin bu cümləni biz digər qaynaqlarla müqayisə edərək bu şəkildə təqdim etmişik.

367. "Suələtu Əbi Davud", səh: 263 (rəq: 297)

368. "Suələtu Əbi Davud", səh: 266 (rəq: 306)

369. "Tərixu Əbi Zur'a əd-Diməşqi", səh: 433;

əz-Zuhri'dən yazdığı kitablardır, çünki Şueyb əməvi idi və xəlifənin tələbi ilə əz-Zuhri'nin hədislərini onun üçün yazırdı və xəlifənin övladlarına öyrədirdi. "Zəbt" olunmuş deyildikdə qəsd olunan budur ki, rəvayətlərdə keçən önəmli sözlərin oxunuşu dəqiqləşdirilib. Kitabın gözəlliyini anlamaq çətin olmamalıdır, çünki Şueyb sultanın yanında əz-Zuhri'yə katiblik edirdi. Bəzi xəbərlərə görə Şueyb əz-Zuhri'dən o kitablarda 1700-ə yaxın hədis yazmışdı və İmam Əhməd "əl-Musnəd" kitabında Bişr bin Şueyb – Şueyb bin Əbi Həmzə - əz-Zuhri kanalı ilə on beş hədis zikr edib və bu gün həmin hədisləri çap olunmuş "əl-Musnəd" kitabında oxumaq mümkündür.

Möminlərin anası Məymunə bint əl-Haris'in azadlı köləsi, böyük tabii imam, Mədinənin yeddi fəqihindən biri Əbu Əyyub Süleyman bin Yəsər (34-107) və onun tələbəsi kiçik tabiindən sayılan Əbu Abdilləh Bukeyr bin Abdilləh bin əl-Əşəcc əl-Quraşi'nin (vəfatı 127) misalı  da bura aid edilə bilər. Bukeyr elm məclislərində hədis yazmış böyük alimlərdən olub. əs-Səib bin Yezid, Əbu Uməmə bin Səhl, Mahmud bin Ləbid kimi kiçik səhabələrdən hədis rəvayət edib. Bukeyrin özündən sonra tərk etdiyi kitab İmam Malikə qədər çatıb. İmam Əhməd bin Hənbəl deyir: "**Həmməd (bin Xalid) əl-Xayyat'ı belə deyərkən eşitdim: "Məxramə bin Bukeyr kitablar çıxardı və dedi: "Bunlar atamın kitablarıdır və mən atamdan hədis dinləməmişəm.**"[370] Həmməd əl-Xayyat İmam Malik'in tələbələrindən sayılır. Görünür ki, Məxramə atasının kitablarını İmam Malik'in məclisinə gətirib. O kitabların arasında Süleyman bin Yəsər'in hə'islərini özündə cəm etmiş kitab da vardır, o dövrün alimləri o kitabı Süleymanın kitabı olaraq tanıyırdılar. İbn Həcər deyir: "**əl-Məymuni Əhməd (bin Hənbəldən belə dediyini) rəvayət edir: "Malik Məxramə'nin kitabını götürdü və ona nəzər saldı. (Malik öz kitabında) harda – "mənə Süleyman bin Yəsərdən çatıb" deyirsə bil ki, o, Məxramə'nin kitabındandır, yəni atasından, o da Süleymandan rəvayət edir.**"[371] İbn Adiy əl-Curcəni deyir: "**Əli (bin əl-Mədini) dedi: "Məxramə'nin öz atasından Süleymanın kitabını dinlədiyini güman etmirəm. Ola bilsin ki, az bir şey dinləyib və mən Mədinə şəhərində elə**

370. "əl-İləlu va Mərifətur-Ricəl", 2/173;

371. "Təhzibut-Təhzib", 10/70;

**bir nəfər ilə qarşılaşmadım ki, Məxramə bin Bukeyrdən onun hansısa hədisində - "atamı eşitdim" – dediyini mənə xəbər versin.**"[372] Süleymanın kitabı deyildikdə nəyin qəsd edildiyini dəqiq təsəvvür edə bilmirik; bu, Süleyman bin Yəsər'in özünün yazdığı hədislər olduğu kimi, Bukeyrə imla etdiyi hədislər də ola bilər, eləcə də Bukeyrin şeyxi Süleymanın kitablarından hazırladığı nüsxə ola bilər. Hər bir halda kitablarının arasında Süleyman bin Yəsər'in rəvayətlərini daşıyan bir kitabın olduğunu bilirik və bu kitab İmam Malik'in ixtiyarında olub.

əl-Hafiz İbn Həcər deyir: "**Abbas bin Abdilazim Əli bin əl-Mədini'nin belə dediyini nəql edir: Muaz bin Hişəmi belə deyərkən eşitdim: "Atam Qatədə'dən on min hədis eşidib." Sonra bizə atasından bu miqdara yaxın kitablar çıxardı və bunun üzərinə dedi: "Bu qədərini (atamdan) dinləmişəm, bunları isə dinləməmişəm." Beləliklə də ayırmağa başladı.**"[373] On min hədis ilk təsəvvürdə çox şişirdilmiş bir rəqəm kimi səslənir, lakin o dövrdə "hədis" deyildikdə bununla hər bir ayrı isnadı qəsd etdiklərini, həmçinin "hədis" deyildikdə peyğəmbərin sözü ilə yanaşı, səhabələrin və məşhur tabii imamların sözlərini də qəsd etdiklərini nəzərə alsaq etiraf etməliyik ki, on min heç də çox böyük bir rəqəm deyildir. İmam Əhməd bin Hənbəl öz "əl-Musnəd" kitabını yeddi yüz əlli min rəvayətin arasından seçib və əl-Hafiz əs-Suyuti'nin dediyinə əsasən bu gün "əl-Musnəd" kitabında qırx minə yaxın hədis vardır və o hədislərdən on mini mətn baxımından təkrarlanır, yalnız isnad baxımından fərqlənirlər. Bu mənada bir şeyxdən on min hədis eşitmək və onları yazmaq adi bir hal sayılır. Misal üçün "əl-Musannəf" kitabının sahibi Abdurrazzəq əs-San'ani deyir: "**Mə'mər (ər-Raşid) dən on min hədis yazdım.**"[374] əl-Xaləf bin Təmim deyir: "**Sufyan əs-Səvri'dən on min və ya buna yaxın miqdarda hədis**

372. "əl-Kəmil fi Duafə ər-Ricəl", 8/176; İbn Adiy bunu – İbn Həmməd – Muhəmməd bin Yaqub – Əli bin əl-Mədini kanalı ilə rəvayət edir. İbn Həmməd (224-310) Əbu Bişr Muhəmməd bin Əhməd bin Həmməd əd-Dəvləbi'dir. İmamdır, etibarlıdır. Muhəmməd bin Yaqub isə Əbu Cəfər Muhəmməd bin Yaqub bin əl-Fərac əl-Fəraci əs-Sufi'dir, hicri 270-ci ildən sonra vəfat edib. Əli bin əl-Mədini'nin tələbələrindəndir. Salehdir, hədisləri həsən dərəcəsindədir.

373. "Təhzibut-Təhzib", 10/197;

374. "Siyər Əaləmin-Nubələ", 6/475;

**eşitdim.**"[375] Kitabın əvvəlində qeyd etdiyimiz kimi Muaz bin Hişəm əd-Dəstuvai məşhur mühəddis, hədis imamı Hişəm bin Əbi Abdilləh əd-Dəstuvai'nin oğludur. Muaz özü hədis rəvayətində güclü olmayıb, ona görə də öz müasirlərinə on minə yaxın hədisə sahib olduğunu dedikdə buna təəccüblənirdilər. İbn Adiyy əl-Curcəni deyir: "**əs-Səci bizə rəvayət etdi; Abbas (bin Abdilazim) əl-Anbəri'ni belə deyərkən eşitdim: Əli bin əl-Mədini'ni belə deyərkən eşitdim: "Muaz bin Hişəmi Məkkədə belə deyərkən eşitdim: "Məndən on min (hədis) var." Biz bunu inkar etdik və onunla istehza etdik. Amma Basra şəhərinə gəldikdə bizə dediyi miqdara yaxın atasından qalma kitablar çıxardı və dedi: "Bu qədərini dinləmişəm, bu qədərini dinləməmişəm və ayırd etməyə başladı.**"[376]

## Dövlət proqramı

Daha öncə Əbu Hureyra və onun hədislərinin yazılması haqqında danışdıqda Misirin valisi Abdulaziz bin Mərvan'ın necə Kəsir bin Murra'ya səhabələrin rəvayətlərini yazmasını əmr etdiyini qeyd etmişdik. Eləcə də atası Mərvan bin əl-Həkəm'in bir başa Əbu Hureyra'nın hədislərini yazdırdığına şahid olmuşduq. Lakin bu rəsmi cəhdlər heç bir şəkildə geniş bir dövlət proqramı hesab edilə bilməz. Bu cür hallar əməvi dövründə qeyri-adi bir hal deyildi. əl-Xatib əl-Bağdadi isnadı ilə birlikdə rəvayət etdiyi xəbərdə Həssən bin Əbi Sinan'ın belə dediyini rəvayət edir: "**əl-Ənbər əhlindən bir nümayəndəliyin tərkibində Vasit şəhərinə əl-Həccəc'in yanına yola düşdüm ki, onun üzərimizə təyin etdiyi valisi İbnur-Rafil haqqında şikayət edək. Onun divanına daxil oldum və gördüm ki, yaşlı bir kişi oturub və ətrafında insanlar toplaşın ondan (dediklərini) yazırlar. Onun kim olduğunu soruşdum. Dedilər ki, Ənəs bin Malik'dir. Onunla qarşılaşdım və mən soruşdu: "Sən haralısan?" Dedim: "əl-Ənbər şəhərindənəm. Əmirin yanına şikayət etmək üçün gəlmişik." Dedi: "Allah**

375. "əl-Muhəddis əl-Fasil beynər-Ravi val-Vai", səh: 385;

376. "əl-Kəmil fi Duafə ər-Ricəl", 8/183;

**sənə bərəkət versin!" Dedim: "Ey Allahın elçisinin xadimi, Allahın elçisindən – salləllahu aleyhi va səlləm – eşitdiyin bir hədisi mənə rəvayət et!" Dedi: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Bacardığın qədər yaxşılıqları əmr et və pisliklərdən çəkindir!" Yoldaşlarım məni tələsdirdilər, ona görə də ondan bu hədisdən başqa heç bir şey eşidə bilmədim.**"[377] Əbul-Alə Həssən bin Əbi Sinan bin Əvfə əl-Ənbəri ət-Tanuxi'nin bizlərə nəql etdiyi bu xəbərdən beyinlərimizdə belə bir mənzərə canlanır. Dövlətə məxsus divanda, yəni rəsmi qeydlərin aparıldığı dəftərxanada peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrindən biri oturmuş və ondan eşitdiyi hədisləri dəftərxana işçilərinə, ola bilsin onlarla yanaşı elm adamlarına imla edir. Şübhəsiz ki, belə bir məclis dövlət təşəbbüsü sayılmalıdır. Çox təəssüf ki, Həssən bin Sinan bizə bu barədə daha detallı məlumatlar ötürməyib. Bu məclisin yalnız bir dəfə baş tutduğunu, yoxsa bir neçə silsilədən ibarət olduğunu bilmirik.

Amma tam bir şəkildə dövlətin həyata keçirdiyi geniş miqyaslı bir proqramı biz xəlifə Ömər bin Abdilaziz'in vaxtında görə bilirik. Əbu Həfs Ömər bin Abdilaziz bin Mərvan bin əl-Həkəm səkkizinci əməvi xəlifəsidir. Hicri 61-ci ildə Mədinə şəhərində anadan olub. Ana tərəfdən Ömər bin əl-Xattab'ın soyundandır. Hicri 87-ci ildə xəlifə əl-Valid bin Abdilməlik onu Mədinə şəhəri üzərində vali təyin edir. 91-ci ildə Taif şəhərinin də əmirliyini ona verir və beləliklə də Hicazın əmiri olur. Daha sonra vəzifəsindən azad edilir və Dəməşq şəhərinə köçür. Süleyman bin Abdilməlik xəlifə olduqda onu özünə yaxınlaşdırdı, onu özünə vəzir və müstəşar etdi. Tezliklə onun vəliəhdi təyin olunur və hicri 99-cu ildə Süleyman vəfat etdikdə Ömər bin Abdilaziz xəlifə olur. Xəlifə olduqda özündən öncəki əməvi sultanlarının törədiyi cinayətləri və zülmləri aradan qaldırmaq üçün böyük bir

377. "Tərixu Bəğdəd", 9/171;Həssən bin Əbi Sinan daha öncə ailəsi ilə birlikdə xristian dininə mənsub olublar, lakin sonra İslamı qəbul ediblər. Fars, suryani və ərəb dillərini yaxşı bildiyi üçün qazi olaraq çalışmış Rabi'ah bin Əbi Abdirrahmən'in yanında katib işləmiş, tərcümə işləri ilə məşğul olmuşdur. Hicri 60-cı ildə doğulmuş və 180-ci ildə vəfat etmişdir, yəni 120 il yaşamışdır. Övladları bunu Ənəs bin Malik'in onun üçün dua etməsi ilə əlaqələndirirlər. Bu hekayəni ondan nəvəsi İshaq bin Bəhlul rəvayət edir və İshaq bin Bəhlul məşhur hafiz alimdir, siqadır, etibarlıdır. Ondan isə bunu oğulları və nəvələri nəql edirlər və əl-Xatib əl-Bağdadi kitabında bu xəbəri bir neçə isnad ilə İshaq bin Bəhlul'dan rəvayət edir.

çalışma başladır. Bəzi valiləri dəyişir, şuranı bərpa edərək alimlərin nüfuzunu artırır. Bu səbəblə onu beşinci raşid xəlifə adlandırıblar. Çox təəssüf ki, Ömər yalnız iki il və beş ay xəlifə ola bildi. Bəzi xəbərlərə görə vərəm xəstəliyindən ölüm. Zəhərlənməyinə dair xəbərlər də tarix kitablarında keçir.

Ömər bin Abdilaziz'in – Allah ona rəhmət etsin! – xəlifəliyi dövründə gördüyü işlərdən biri də peyğəmbərin – salləllahu aleyhi va səlləm – sünnətini yazıb toplamaq olub.  Bunun üçün o, Mədinə, Məkkə və digər şəhərlərdə yaşayan sünnət alimlərinə yazaraq hədisləri toplamağı onlara əmr edir. Bu alimlərin başında məşhur imam İbn Şihəb əz-Zuhri dururdu. İbn Əbi Xeysəmə rəvayət etdiyi bir xəbərdə deyir: "**Zuhrilərin azadlı köləsi, Ənəsin evindəki katiblərin müəllimi Said bin Ziyad dedi: İbn Şihəbi mən Sad bin İbrahimə belə deyərkən eşitdim: "Ömər bin Abdilaziz bizə sünnətləri toplamağı əmr etdi və biz onu dəftərlərə yazdıq. Beləliklə də o, hakimiyyətinin keçərli olduğu hər bir əraziyə bir dəftər göndərdi.**"[378] İmam Malik deyir: "**Yəhyə bin Said bizə xəbər verdi ki, Ömər bin Abdilaziz (Mədinənin alimi) Əbu Bəkr bin Amr bin Həzm'ə yazdı: "Bax Allahın elçisinin – salləllahu aleyhi va səlləm – hədisindən və ya sünnətindən və ya Amra (bint Abdirrahmən'in) hədisindən və ya bənzər xəbərlərdən nə varsa onlara mənə yaz! Çünki mən elmin tükənməsindən və alimlərin yox olmasından qorxuram.**"[379] Eyni şəkildə Məkkədə İbn Cureyc'ə hədisləri toplamağı əmr etmişdi. Bu barədə varid olmuş xəbərlər çoxdur və tarixi qaynaqlarda müxtəlif səhifələrdə öz əksini tapır. Eləcə də kitabımızda daha əvvəl qeyd etdiyimiz xəbərdən öyrəndik ki, Ömər bin Abdilaziz öz hüzurunda Əbu Burda'nın atası böyük səhabə Əbu Musa əl-Əşari'dən öyrəndiyi hədisləri yazmağı əmr etmişdi. Əməvi hakimlərinin kitablar üçün ayırılmış bir

378. "ət-Tərix əl-Kəbir", 2/247; İbn Əbi Xeysəmə bunu Əbu İshaq İbrahim bin əl-Munzir bin Abdilləh – Əbu Yəhyə Mə'n bin İsa bin Yəhyə - Said bin Ziyəd sənədi ilə rəvayət edir. Həm İbrahim bin əl-Munzir, həm də Mə'n bin İsa mötəbər alimlərdir. Mə'n bin İsa "əl-Muvatta" kitabını rəvayət edənlərdən biridir, İmam Malik'in tələbələrindən olub. Said bin Ziyəd isə Cuheynə bin Zəhra'nın mövlası sayılan, əl-Muktib və əl-Muəzzin ləqəbləri ilə tanınan ravidir. İbn Hibban'dan başqa kiminsə onu siqa saydığını bilmirəm.

379. "Muvatta Məlik", səh: 330; Muhəmməd əş-Şeybəni'nin rəvayəti

xəzinəsi də var idi və kitabda daha öncə bu barədə bəzi məlumatlar zikr olundu.

Ömər bin Abdilaziz'in vəfatından sonra hansısa dövlət başçısının bu cür geniş çapda sünnəti toplamağı əmr etdiyini bilmirik. Bəzi xəlifələrdən dar çərçivədə xüsusi tələblərin olduğu məlumdur. Misal üçün Hişam bin Abdilməlik xəlifə olduqda İbn Şihəb əz-Zuhri'dən tələb edir ki, oğullarına hədisləri öyrətsin və bu tələbin üzərinə əz-Zuhri onlara dörd yüz hədis imla edir. Bunu Yaqub bin Sufyan əl-Fəsəvi tarixində zikr edir.[380] Həmçinin xəlifə Əbu Cafər əl-Mənsur'un İmam Malik'dən "əl-Muvatta" kitabını yazmasını tələb etməyi haqqında bəzi xəbərlər gəlib.

## Basra məktəbi

Burada fayda olaraq əlavə etməyimiz lazımdır ki, hədis yazmaqda Basra məktəbi digər şəhərlərdən seçilirdi. Basrada hədis məclislərində hədislərin yazılmasına təşviq olunur, hədis yazmayanlar isə şiddətlə qınanırdı. Ona görə də Basranın ən böyük imamları özlərindən sonra çox sayda kitab buraxıblar. Hişəm əd-Dəstuvai da basralı idi. Özündən sonra bir dəvə yükü miqdarında kitab buraxmış Əbu Qiləbə də əslən basralı idi. Basranın bu imamlarından biri də Əbu Muhəmməd Ravh bin Ubədə bin əl-Alə əl-Qeysi (vəfatı hicri 205) olub. Hişəm bin Həssən, İbn Cureyc, Said bin Əbi Arubə, Malik, Sufyan kimi imamlardan hədis öyrənib və yazıb. İbn Əbi Hətim ər-Razi kitabının müqəddiməsində deyir: "**Atamı belə deyərkən eşitdim: Basra şəhərinə Ravh bin Ubədə'nin əmisi oğlu Malik bin Sad'ın yanına gəldik və dedik: "Bizə hədislərini çıxar." O da bizə iki və ya üç cüz çıxarardı. Biz də ona dedik: "Bizə torba dolusu kitablar çıxar ki, hamısına baxa bilək!" Şeyx də belində daşıyaraq bizə torba dolusu kitablar çıxardı və qarşımıza qoydu. Biz də ondan çox sayda kitab yazdıq və sonra mən Ravh'ın və başqalarının yazdığı kitablardan iyirmi cüz götürdüm və soruşdum: "Olar ki, bunları (borca) götürüm və baxım?" Dedi: "Apar, amma vaxt hazırlayaq ki, mənzilinə**

380. "əl-Mə'rifə vat-Tərix", 1/640;

**gəlib (kitabdakı hədisləri) orada sənə rəvayət edim.” Mən də ona gəlməsi üçün bir gün vəd edim. Elə oldu ki, bir səbəb çıxdı və tezdən bir şeyxin yanına getməli oldum. Bu şeyx (yəni Malik bin Sad) gəldi və oturub bizi gözlədi. Zöhrə az qalana qədər oturub gözlədi və biz də o vaxt gəldik. Bizdə olan yazılı hədisləri ona verdik və bizim üçün oxudu.**”[381] Malik bin Sad həqiqətdə hədis sahəsində böyük bir avtoritet sayılmır, lakin Basra şəhərindəki mühit onun kimi hədis ravilərinə hədis kitablarını toplamaq imkanı tanıyardı.

Buna görə də bablara uyğun olaraq hədisləri toplayıb kitab halına gətirən ilk alimlərin Basra şəhərindən çıxdığı deyilib. Əbu Muhəmməd ər-Raməhurmuzi (vəfatı hicri 360) deyir: “**Bildiyim qədər ilə ilk dəfə bablara ayırıb kitab yazan Basrada ər-Rabi’ bin Sabih olub, sonra orada Said bin Əbi Arubə və əl-Abd deyə çağırılan Xalid bin Cəmil idi, Yəməndə Mə’mər bin Raşid, Məkkədə İbn Cureyc, Kufədə Sufyan əs-Səvri, Basrada Həmməd bin Sələmə idi…**”[382] Xalid bin Cəmil haqqında kitablarda xüsusi bir məlumat tapa bilmədim, lakin məzmundan anlaşılır ki, o da Basra şəhərindən olub. əl-Bəzzər deyir: “**Xalid bin Cəmil basralıdır.**”[383] ər-Rabi hicri 160-cı ildə, Said isə 156-cı ildə vəfat edib. İbn Həcər də “Fəthul-Bəri” kitabının əvvəlində ər-Raməhurmuzi’nin dediklərini təsdiqləyərək buyurur: “**Bunu ilk dəfə toplayan ər-Rabi’ bin Sabih və Said bin Əbi Arubə və başqaları olublar, hər bir babı ayrı (bir kitab) olaraq yazardılar…**”[384] İlk müsnəd kitablarını yazmış Əbu Davud ət-Tayəlisi, Musəddəd bin Musərhəd, Əli bin əl-Mədini də basralıdırlar. Məşhur “ət-Tabəqat əl-Kubra” kitabının sahibi Muhəmməd bin Sad da Basra şəhərindəndir. Eyni şəkildə bir başqa tabəqat kitabının sahibi Xalifə bin Xayyət də bu mədrəsənin yetirməsidir.

Bundan sonra tabiin təbəqəsi adlandırdığımız səhabələrə tələbəlik etmiş nəslin nümayəndələrindən misallar gətirəcəyik. Bu misallar bizə o dövrün alimlərinin hədisləri geniş bir surətdə yazdıqlarını sübut edəcək.

381. “əl-Cərh vat-Tədil”, 1/362;
382. “əl-Muhəddis əl-Fasil beynər-Ravi val-Va’i”, səh: 611;
383. “əl-Bəhr əz-Zəxxar”, 9/52;
384. “Fəthul-Bəri”, 1/6;

## Urva bin əz-Zubeyr

Urva bin əz-Zubeyr haqqında nə qədər yazsaq haqqını verə bilməyəcəyimizə inanırıq. Peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – bibisi Safiyyə'nin oğlu və həvarisi əz-Zubeyr bin əl-Avvam'ın oğlu Urva Əbu Abdilləh əl-Quraşi əl-Əsədi Mədinənin yeddi fəqihindən biridir. Anası da Əbu Bəkrin qızı Əsmadır. Atası əz-Zubeyr'dən az bir şey rəvayət edib, çünki atası vəfat etdikdə yaşı az idi. Anası Əsma'dan və xalası Aişə'dən, üstəlik Əli bin Əbi Talib, Said bin Zeyd, Səhl bin Əbi Həsmə, Cabir bin Abdilləh, peyğəmbərin nəvələri əl-Həsən və əl-Huseyn, Muhəmməd bin əl-Məsləmə, Əbu Humeyd, Əbu Hureyra, İbn Abbas, Zeyd bin Səbit, Əbu Əyyub əl-Ənsari, əl-Muğira bin Şubə, Usəmə bin Zeyd, Müaviyə, Amr bin əl-As, oğlu Abdullah bin Amr, Ummu Həni bint Əbi Talib, Abdullah bin Ömər, Həkim bin Hizəm, Qeys bin Sad bin Ubədə və adlarını burada zikr etmədiyimiz çox sayda səhabə ilə qarşılaşmış, onlardan elm öyrənmiş və hədis rəvayət etmişdir. Lakin xüsusən xalası Aişə bint əs-Siddiq'dən çox faydalanıb, onun fiqhini mənimsəyib. Hicri 23-cü ildə doğulub və 94-cü ildə vəfat edib.

Urva bin əz-Zubeyr ilk kitab yazan alimlərimizdəndir. Peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – həyatı ilə bağlı bir kitab yazıb. Bu, onun yazıya nə qədər əhəmiyyət verdiyinin bir göstəricisidir. əl-Xatib əl-Bəğdadi isnadı ilə rəvayət edərək deyir: "**Muhəmməd bin əl-Munzir mənə babası Hişəm bin Urva'dan, o da atasından belə dediyini rəvayət etdi: "Aişə - radiyallahu anhə - mənə dedi: "Ey oğlum, mənə xəbər çatıb ki, sən məndən hədis yazırsan, sonra qayıdırsan və bir daha yazırsan." Ona dedim: "Səndən bir şey eşidirəm, sonra qayıdıram və onu başqasından eşidirəm." (Aişə) dedi: "Mənada bir fərq görürsənmi?" Dedim: "Xeyr." Dedi: "O zaman bunda heç bir problem yoxdur.**"[385] Urva üçün Aişədən hədis yazmaq daha asan idi, çünki xalası idi və başqalarında olmayan imkana sahib idi. Urva hədisləri yazmağa və onları dəqiqləşdirməyə həris olduğu üçün Aişədən eşitdiklərini yazdıqdan sonra eyni hədisi başqa səhabələrdən də dəqiqləşdirərək yazardı. Aişə də onun bu cür etməyinə razılıq verir.

385. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 205; əl-Xatib'in Muhəmməd bin əl-Munzir'ə qədər

Bu xəbər həm də onu göstərir ki, Aişənin rəvayət etdikləri ilə digər səhabələrin rəvayət etdikləri bir-birini təsdiqləyirdi.

əl-Xatib əl-Bağdadi bir başqa kitabında isnadını qeyd edərək deyir: "**Musa bin Uqbə, Urva bin əz-Zubeyr'dən belə dediyini rəvayət edir: "Mən hədisləri yazdım, daha sonra isə onları sildim. Arzu edərdim ki, malımı və övladımı fəda verərdim də amma o yazdıqlarımı silməzdim.**" Bunu rəvayət etdikdən sonra əl-Xatib izahat gətirərək deyir: "**Görürsən ki, daha əvvəl bizim zikr etdiyimiz kimi (rəvayətdə) yazıya əsaslanmağı xoş qarşılamaması səbəbi ilə Urva hədisləri kitabından silmişdir. Lakin yaşlaşdıqda, hafizəsi zəiflədikdə onu silməyinə peşman olmuş və silməmiş olmasını təmənni etmişdir ki, halı dəyişdikdə, hafizəsi qarışdıqda yazdığına qayıda bilmək imkanı olsun.**"[386]

Buna baxmayaraq Urva bin əz-Zubeyr'in sira mövzusunda yazdığı kitabı daha sonrakı nəsillərə keçmişdir. İmam əl-Beyhəqi "Mərifətus-Sunən val-Əsər" kitabında Urva bin əz-Zubeyr'in kitabına sahib olduğunu bildirir. Bu kitabı ondan əz-Zuhri, Əbul-Əsvad, Hişəm bin Urva, Yəhyə bin Urva və başqaları rəvayət ediblər. Hişəm bin Urva atasından yazdığı hədisləri yazılı şəkildə saxlayıb. Yaqub əl-Fəsəvi tarix kitabında deyir: "**İbrahim bin əl-Munzir bizə rəvayət etdi; dedi: Yəhyə bin əz-Zubeyr bin Abbəd bin Həmzə bin Abdilləh bin əz-Zubeyr bizə rəvayət etdi: Hişəm bin Urva'dan atasının hədislərini tələb etdim. O da mənə bir dəftər çıxardı və**

çatan sənədi belədir: "Əbul-Qasim əl-Əzhəri bizə xəbər verdi; Əli bin Ömər əl-Hafiz bizə rəvayət etdi: Əhməd bin Muhəmməd bin Səlm bizə rəvayət etdi: əz-Zubeyr bin Bəkkər bizə rəvayət etdi." Əbul-Qasim əl-Əzhəri (355-435) Ubeydullah bin Əbil-Fəth əs-Sayrafi əl-Bəğdədi'dir. əl-Xatib əl-Bəğdədi onu "sidq" ilə vəsf edir. Əli bin Ömər əl-Hafiz (306-385) məşhur alim İmam Əbul-Həsən əd-Dəraqutni'dir. Əhməd bin Muhəmməd bin Əhməd bin Səlm isə (?-327) Əbul-Həsən əl-Muxarrami əl-Katib'dir, əd-Dəraqutni onu "siqa" olaraq vəsf edir. əz-Zubeyr bin Bəkkər (172-256) tarixçi alimdir, Məkkənin qazisi olub. İttifaq ilə etibarlı biridir. Muhəmməd bin əl-Munzir də isnaddan məlum olduğu kimi Hişəm bin Urva'nın nəvəsidir. əd-Dəraqutni onu təvsiq edib.

386. "Təqyidul-İlm", səh: 64; əl-Xatib bunun isnadını bu cür verir: "əl-Həsən bin Əbi Bəkr bizə xəbər verdi: Əhməd bin İshaq bin Neyxab ət-Tibi bizə xəbər verdi; əl-Həsən bin Əli bin Ziyəd bizə rəvayət etdi; Əbu Nueym Dirar bin Surad bizə rəvayət etdi; Zeyd bin Hubəb bizə Əbu Mə'şərdən, o da Musa bin Uqbə'dən, o isə Urva bin əz-Zubeyr'dən belə dediyini rəvayət edir" Əbu Nueym Dirar bin Surad kufəlidir, çox şiddətli tənqid olunmuş bir ravidir, hətta Yəhya bin Main onu yalanda ittiham edib.

**dedi: "Buradakılar atamın hədisləridir, onları düzəltmişəm, içindəkiləri yaxşı bilirəm. Ona görə də məndən elə bu şəkildə qəbul elə və onların dedikləri kimi - "ərz etmədən olmaz" - demə!**"[387] Bunu İbn Əbi Xeysəmə də tarix kitabında belə zikr edir: "**İbrahim bin əl-Munzir əl-Hizəmi bizə rəvayət etdi: "Yəhyə bin əz-Zubeyr bizə xəbər verdi; dedi: "Hişəm bin Urva mənə içində hədislər olan bir dəftər verdi və dedi: "Bunlar atamın hədisləridir, onun özündən eşitmişəm. Sən də məndən elə bu cür qəbul elə. Onların dedikləri kimi sən də - "onları sənə ərz etmədən götürmürəm" – demə! Bunları məndən qəbul elə, çünki mən düzəlişləri etmişəm və özünə ərz etmişəm.**"[388] İbn Əbi Xeysəmə bir başqa yerdə deyir: "**əz-Zubeyr bin Bəkkər bizə rəvayət etdi: Yəhyə bin əz-Zubeyr mənə xəbər verdi; dedi: "Hişəm bin Urva'dan mənə öz hədisini verməsini və mənə onu rəvayət etməsini istədim. Mənə özünə aid bir səhifə verdi və dedi: "Bu, səhifəmdir, onu ərz etmişəm, düzəlişlər etmişəm və bunu məndən götür, onların dedikləri kimi demə!**"[389] Bu tarixi xəbərlər Urva bin əz-Zubeyr'in bir şəxsiyyət kimi hədisləri yazmağa önəm verdiyini göstərir.

## Abdurrahmən bin A'iz

Abdurrahmən bin A'iz əl-Əzdi əs-Suməli əl-Himsi tabiin nəslinin böyüklərindəndir, hətta bəziləri xəta edərək onun səhabələrdən olduğunu güman edib. Ömər, Əli, Muaz, Əbu Zərr kimi səhabələrdən hədis rəvayət edib. Deyilənə görə əl-Həccac'a qarşı üsyan etmiş alimlərin arasında Abdurrahmən bin A'iz də var idi. əl-Cəməcim günü əsir alınır və insanlar arasındakı hörmətinə görə əl-Həccac tərəfindən əfv edilir. Çox saylı tarixi xəbərlər bizə onun hədisləri

387. "ət-Tərix val-Marifə", 2/822-823; Burada onların dedikləri kimi "ərz etmədən olmaz" sözü ilə o dövrdə yayğın olan metoda işarə etmişdir. Çünki o zaman hədisləri yoxlayan və dəqiqləşdirən alimlər, bu sahənin müəllimləri şeyxdən eşidilmiş hədisləri ona ərz etmədən rəvayət etməyə icazə vermirdilər. Hişəm bin Urva da bunun zəruri olmadığını bildirir.

388. "ət-Tərix əl-Kəbir", 1/252;

389. "ət-Tərix əl-Kəbir", 2/312;

yazdığını söyləyir. əz-Zəhəbi onun haqqında deyir: "**Vəfat etdikdə özündən sonra çoxlu səhifələr və kitablar tərk etdi.**"[390] Bu kitablar Hims əhli arasında çox məşhur idi. əz-Zəhəbi başqa bir kitabında deyir: "**Yəhyə bin Cabir (onun haqqında) dedi: "Elm daşıyanlardan idi və o elmi səhabələrdən və başqalarından toplayardı.**"[391] Yaqub əl-Fəsəvi (vəfatı hicri 277) deyir: "**əl-Valid (bin Utbə) dedi: Bəqiyyə (bin əl-Valid) bizə rəvayət etdi: Səvr bin Yezid mənə rəvayət edərək dedi: "Hims əhli İbn A'izin kitablarını götürərdilər və orada əhkamla bağlı bir şey tapdıqda onu məscidin qapısına vurardılar, çünki kitablarından qane idilər və hədisindən razı idilər.**"[392] ər-Raməhurmuzi'nin kitabında rəvayət etdiyinə əsasən Abdurrahmən bin A'iz deyib: "**Muaz bin Cəbəl'dən olan bir nüsxədə tapdıq ki, peyğəmbər – salləllahu aleyhi va səlləm - ərləri evdə olmayan qadınların evlərinə daxil olmağı qadağan etdi.**"[393] Bu xəbər göstərir ki, Abdurrahmən bin Aiz Muaz bin Cəbəlin kitabından xəbərdar idi və içindəkilərə çıxışı olub. Daha öncə də kitabımızda Muaz bin Cəbəl'in nüsxəsi haqqında danışmışdıq. İbn Hibban onun haqqında deyir: "**Xalid bin Abdilləh əl-Qasri'nin zamanında İraqa gəldi və ondan iraqlılar, Kufə əhli və Basra əhli (hədis) yazdılar...**"[394]

## Xilas bin Amr əl-Həcri'nin səhifəsi

Xilas bin Amr əl-Həcri basralı siqa bir ravidir, səhabələrdən elm öyrənmişdir. Əli, Ammar, Aişə, Əbu Hureyra kimi səhabələrdən rəvayətləri vardır. Əlidən rəvayət etdiklərini Əlinin özündən eşitməsi, yoxsa Əlidən qalmış kitabdan götürməsi mübahisəlidir. əz-Zəhəbi "əs-Siyər" kitabında deyir: "**Onun Əlidən rəvayəti onun əlinə keçmiş bir kitabdır.**"[395] İbn Sad deyir: "**Yaşlı idi, çoxlu hədis rəvayət edərdi və onda bir səhifə var idi ki, oradan rəvayət**

390. "Siyər Əaləmin-Nubələ", 4/488
391. "Tərixul-İsləm", 2/1132;
392. "əl-Mərifətu vat-Tərix", 2/383
393. "əl-Muhəddis əl-Fəsil", səh: 498;
394. "Məşəhiru Uləmə əl-Əmsar", səh: 183
395. "Siyər Əaləmin-Nubələ",

**edərdi.**"[396] əl-Buxari də "ət-Tərix əl-Kəbir" kitabında deyir: "**Xilas bin Amr əl-Hicri; Ammardan və Aişədən eşidib. Ondan Qatədə və Malik bin Dinar rəvayət edib. Əbu Hureyra'dan və Əli'dən səhifə olaraq rəvayət edib və Əbu Rafi'dən rəvayət edib.**"[397] İmam əl-Beyhəqi deyir: "**Bu, Əlidən gəlmiş ən səhih rəvayətdir, bununla bağlı hədis üzrə alimlər deyirlər: "Xilas Əlidən rəvayət etdiklərini bir səhifədən götürüb." Bunu Yəhyə bin Main və digər hafizlər deyiblər.**"[398] Maraqlıdır ki, Xiləs bin Amr ümumilikdə etibarlı bir ravi hesab edilir. Əli bin Əbi Talib'dən hədislər rəvayət edir və əksər alimlərimiz deyirlər ki, Xilas'ın Əlidən rəvayətləri onun özündən eşitdikləri deyildir, lakin əlindəki bir kitabdandır.[399] Diqqət etmək lazımdır ki, Xilas'ın özünü etibarlı hesab etsələr də onun həmin kitabdan rəvayət etməyinə etibar etməyiblər. Bu isə öz növbəsində bizim mühəddis alimlərimizin hədis qəbulunda şiddətli olduqlarını göstərir.

## əl-Həsən əl-Basri

əl-Həsən bin Yəsər əl-Basri sünnət əhlinin alimlərindən və imamlarından biridir. İlk basra məktəbinin bəlkə də ən məşhur alimi hesab olunur. Əbu Said kunyəsi ilə tanınır. Ömər bin əl-Xattab'ın xəlifəliyinin sonuna iki il qalmış, hicri 21-ci ildə Mədinə şəhərində anadan olub. Anasının adı Xayra'dır və möminlərin anası Ummu Sələmə'nin mövlası olub. Rəvayətə görə Ummu Sələmə Həsənin anasını iş arxasınca göndərərmiş və Həsən Ummu Sələmə'nin yanında qalarmış. Körpə ağladıqda onu sakitləşdirmək üçün Ummu Sələmə döşünü verərmiş. Körpə ikən Ummu Sələmə onu səhabələrin yanına çıxararmış və onun üçün dua edərdilər. Ömər bin əl-Xattab'ın yanına gətirmiş və onun üçün "**Allahım, onu dində fəqih et**

396. "ət-Tabəqat əl-Kubra", 7/149;

397. "ət-Tərix əl-Kəbir", 3/228;

398. "Mərifətus-Sunən val-Əsər", 8/237;

399. Əksər alimlərimiz deyiblər ki, Xilas hədisləri Əlidən eşitməyib. İbn Həcər bunu inkar etmir, lakin "Fəthul-Bəri" kitabında (6/437) bunun təəccüblü olduğuna işarə edərək deyir: "Onun Ammar (bin Yasir)dən hədis eşitməyi sabit olubsa və Əlinin mühafizə ordusunda xidmət edibsə necə olur ki, onun Əlidən hədis eşitməsi imkansız olur?!"

**və onu insanlara sevdir!**" duasını etmişdir. Osman ilə - radiyallahu anhu – birlikdə məscidə gedər və onun xütbələrini dinləyərmiş.

İmran bin Huseyn, əl-Muğira bin Şubə, Abdurrahmən bin Səmura, Səmura bin Cundub, Əbu Bəkra əs-Səqafi, ən-Numən bin Bəşir, Cabir bin Abdilləh, Cundub əl-Bəcəli, İbn Abbas, Amr bin Təğləb, Mə'qil bin Yəsər, əl-Əsvad bin Səri, Ənəs bin Malik və daha çox sayda səhabədən hədis rəvayət edir. Lakin adları keçən çox səhabədən mürsəl olaraq rəvayət edir. Ondan isə İbn Avn, Humeyd ət-Tavil, Səbit əl-Bunəni, Məlik bin Dinər, Hişəm bin Həssən, Cərir bin Həzim, ər-Rabi bin Sabih və daha çox sayda məşhur alimlər və şeyxlər hədis rəvayət ediblər.

əl-Həsən əl-Basri'nin hədis yazmağa, yazılı hədisləri toplamağa əhəmiyyət verdiyini və özünün də kitablarının olduğunu tarixi qaynaqlardan öyrənə bilirik. Basra şəhərinin alimlərindən Yəhyə bin Said əl-Qattan deyir: "**Onun Səmura'dan hədislərinin bir kitab olduğunu eşitdik.**"[400] Möhtəmələn burada qəsd olunan daha öncə haqqında sözü keçən vəsiyyət kitabıdır ki, onu Səmura bin Cundub övladlarına tərk etmişdi. Bu onu göstərir ki, əl-Həsən mövcud kitabları toplayardı. İbn Cərir ət-Tabəri onun haqqında danışarkən deyir: "**Lakin rəvayətlərində mürsəl çoxdur, məchul kəslərdən və (həmçinin) ona çatmış bir qövmə aid səhifələrdən – ki, (o səhifələri) həm özlərindən, həm də başqaları vasitəsi ilə onlardan öyrənib – çoxca rəvayət edir.**"[401] Burada ət-Tabəri həmin səhifələri əldə etməyinin iki ayrı yolunu qeyd edərək "*əxazəhə minhum va anhum*" deyir. "Minhum" ona dəlalət edir ki, əl-Həsən əl-Basri həmin səhifə sahiblərinin bir başa özlərindən alıb köçürüb, "anhum" isə kitabları tapdığını ifadə edir, bir başa sahiblərindən almayıb. Tələbəsi əl-Aməş isə deyir: "**əl-Həsən dedi: "Bizim kitablarımız var; onlara qayıdıb baxırıq.**"[402] İbn Sad "ət-Tabəqat" kitabında deyir: "**Yəhyə bin Əbi Bukeyr dedi: Həmməd bin Sələmə bizə Humeyd (ət-Tavil)dən rəvayət etdi ki, o, əl-Həsən'in kitablarını götürdü, onların üzünü köçürdü və sonra ona geri qaytar-**

400. "Siyər Əaləmin-Nubələ", 4/567;

401. "əl-Muntəxab min Zeylil-Muzəyyəl", səh: 125;

402. "əl-Muhəddis əl-Fəsil", səh: 371;

**dı.**”[403] Məhz tələbələrindən bəzi kəslərin əl-Həsən əl-Basri'nin hədislərini toplayıb yazması nəticəsində onun rəvayət etdiyi hədisləri bizim zamanımıza qədər gəlib çatıb. Onun bizim zamanımıza qədər gəlib çatmış bəzi kitabları mövcuddur, onların çoxu əlyazma halındadır. İbnun-Nədim (vəfatı hicri 384) qarşılaşdığı kitablar arasında ona aid iki kitabın adını çəkir. O iki kitabdan biri təfsir kitabıdır, digəri isə “Adədu Əyil-Quran”[404] adlanır və adından da məlum olduğu kimi Quran ayələrinin sayı haqqındadır. Alman oriyentalist Hellmut Ritter (1892-1971) onun “ər-Risələ fil-Qadar” haqqında daha bir əsərini nəşr edib[405] və məlumata əsasən bu risalə xəlifə Abdulməlik'ə rədd olaraq yazılıb. Yəmənə köçmək istəyən məkkəli bir dostunu bu fikrindən çəkindirmək üçün Məkkənin fəziləti haqqında toplayıb yazdığı və ona göndərdiyi xəbərləri özündə cəm edən “Fədailu Məkkə vas-Səkəni fihə” adlı kitabı zamanımızda Professor Səmmi Məkki əl-Ani tərəfindən nəşr olunub. Lakin əksər kitablarının bizə çatmamağının səbəbi onları yandırması olub. İbn Sad “ət-Tabəqat” kitabında deyir: “**Musa bin İsmail bizə xəbər verdi; dedi: Səhl bin Huseyn bin Muslim əl-Bəhili bizə rəvayət etdi; dedi: “Abdullah bin əl-Həsən bin Əbil-Həsən'ə adam göndərdim ki, mənə atasının kitablarını göndərsin. Mənə xəbər göndərdi ki, “(atası) qocaldıqda dedi: “(Kitablarımı) mənim üçün topla!” Mən də topladım və onlarla nə edəcəyini bilmirdim. Onları ona gətirdim və xidmətçiyə dedi: “Təndiri yandır!” Sonra yalnız bir səhifədən başqa onların hamısının yandırılmasını əmr etdi.” (Oğlu) onu mənə göndərdi. Bundan sonra onun özü ilə qarşılaşdım və (göndərdiyim) elçinin xəbər verdiyinin eynisini mənə şifahi olaraq xəbər verdi.**”[406]

---

403. “ət-Tabəqat əl-Kubra”, 7/173;

404. Bax: “əl-Fihrist”, səh: 57;

405. Alman dilində “Studien zur Geschichte der islamischen Frömmigkeit” (İslam zahidliyinin tarixi haqqında araşdırma) adı altında nəşr olunub.

406. “ət-Tabəqat əl-Kubra”, 7/174

## Məkhul əş-Şəmi

Səhabələrə tələbəlik etmiş və hədislərini yazmış alimlərə daha bir misal Məkhul ola bilər. Məkhul bin Abdilləh Şam torpaqlarının yetişdirdiyi ən məhsuldar alimlərdən sayılır. Hicri 112-ci ildə vəfat etmiş bu alim Ənəs bin Malik, Vasilə bin əl-Əsqa' və Əbu Hind əd-Dəri kimi səhabələrdən hədis eşidib. Özündən sonra kitab tərk etdiyi də bilinir. Əbu Zur'a əd-Diməşqi tarix kitabında yazır: "**Mən Əbu Mushir'in Məkhul'un tələbələri arasından üç nəfərə üstünlük verdiyini görürdüm. (Onlar) Süleyman bin Musa, Yezid bin Yezid bin Cəbir və əl-Alə bin əl-Haris idi. Əbu Mushir bizə rəvayət etdi ki, Said bin Abdilaziz ona deyib ki, Məkhul'un həcc barəsindəki kitabını (tələbəsi) əl-Alə bin əl-Həris'dən alıb.**"[407] Burada adı keçən Said bin Abdilaziz Dəməşq şəhərinin müftisi olmuş Əbu Muhəmməd Said bin Abdilaziz bin Əbi Yəhyə ət-Tənuxi'dir. Hicri 90-cı ildə doğulub və 160-cı ildə vəfat edib. Çıxaracağımız nəticə budur ki, Məkhul həcc ilə bağlı hədisləri bir arada toplayan bir kitab və ya dəftər yazıb və tələbəsi əl-Alə bin əl-Həris şeyxindən o kitabı təslim alıb, öyrənib və öz növbəsində tələbəsi Said bin Abdilaziz'ə ötürüb.

## Said bin Cubeyr

Əbu Muhəmməd Said bin Cubeyr bin Hişəm əl-Əsədi əl-Valibi imam və böyük təfsir alimidir. İbn Abbas'ın ən məşhur tələbələrindən biridir. Təfsir elmini də məhz ondan öyrənib. Səhabələrdən həmçinin Abdullah bin Muğaffəl, Aişə, Adiyy bin Hətim, Əbu Musa əl-Əşari, Əbu Hureyra, Abdullah bin Ömər, Abdullah bin əz-Zubeyr, əd-Dahhak bin Qeys, Ənəs bin Malik, Əbu Said əl-Xudri'dən hədis rəvayət edib. Said bin Cubeyr əl-Həccac bin Yusuf əs-Səqafi'yə qarşı üsyan etmiş alimlərdən biri idi və buna görə Məkkədə həbs edilərək hüzuruna gətirildikdə əl-Həccac onun öldürülməsinə qərar verir və hicri 95-ci ildə şəhid edilir.

407. "Tərixu Əbi Zur'a əd-Diməşqi", səh:394-395;

Said bin Cubeyr hədis yazmağa böyük əhəmiyyət vermiş alimlərdən idi. İbn Sad deyir: "**Abdulaziz bin əl-Xattab əd-Dabbi bizə xəbər verdi: Yaqub bizə Cafər'dən, o da Said (bin Cubeyr)dən belə dediyini rəvayət etdi: "İbn Abbas'ın yanına gələrdim və ondan yazardım."**[408] Yenə buyurur: "**Affən bizə xəbər verdi; Şubə bizə Əyyub'dan, o da Said bin Cubeyr'dən belə dediyini rəvayət edir: "İbn Ömərdən soruşduqlarımı bir səhifədə yazardım, əgər bunu bilsəydi mənimlə arasını ayıracaq bir səbəb olardı." Bir gün ondan "iylə" haqqında soruşdum və dedi: "Sən deyəsən "İbn Ömər dedi", "İbn Ömər dedi" demək istəyirsən." Dedim: "Bəli, biz sənin sözünlə razıyıq və qaneyik.**"[409] İbn Ömər'in ona qəzəblənəcəyindən ehtiyat etməsinin səbəbi hədis yazması deyildi, lakin İbn Ömər'in fətvalarını yazması idi. İbn Ömər – radiyallahu anhu – onun öz sözlərinin yazılmasını istəməzdi.

Hətta hədisə olan marağı o qədər şiddətli idi ki, eşitdiyi hədisi əldən qaçırmamaq üçün onu dərhal münasib gördüyü bir yerə yazardı. Sonra yazdığı yerdən vərəqlərə köçürərdi. İmam əd-Dərimi deyir: "**Muhəmməd bin Said bizə xəbər verdi: Şərik bizə Tariq bin Abdirrahmən'dən, o da Said bin Cubeyr'dən belə dediyini bildirdi: "İbn Ömər'dən və İbn Abbas'dan – radiyallahu anhumə - gecə vaxtı hədis eşidərdim və onu yəhərin əl tutma taxtasında yazardım.**"[410] İbn Əbi Şeybə "əl-Musannəf" kitabında deyir: "**İbn Numeyr bizə Osman bin Həkim'dən, o da Said bin Cubeyr'dən rəvayət etdi ki, "o, İbn Abbas ilə bir yerdə olardı, beləliklə də ondan hədis eşidərdi və onu yəhərin əl tutma taxtasında yazardı. Mənzil başına çatıb düşdükdə köçürərdi.**"[411] İbn Sad deyir: "**Affən bin Muslim bizə xəbər verdi: Vuheyb bizə rəvayət etdi; dedi: Əyyub bizə Said bin Cubeyr'dən belə dediyini rəvayət etdi: "Kufədə əgər bir şey barəsində ixtilaf etsəydik onu öz yanımda (bir şeyə) yazardım və İbn Ömər ilə qarşılaşdıqda ondan sorardım.**"[412]

408. "ət-Tabəqat əl-Kubra", 6/257;

409. Eyni mənbə, 6/258;

410. "Sunən əd-Dərimi", (512)

411. "Musannəf İbn Əbi Şeybə", 5/314;

412. "ət-Tabəqat əl-Kubra", 6/258;

Said bin Cubeyr təfsir biliklərinə görə müasirləri arasında barmaq ilə göstərilən alimlərdən olduğu üçün əməvi hakimi Abdulməlik bin Mərvan'ın tələbi ilə o, bir təfsir kitabı yazır. Çox ehtimal ki, o təfsir kitabında İbn Abbas'dan və digər səhabələrdən eşitdiyi təfsirləri toplamışdır. Həmin təfsir kitabının əməvilərin divanında saxlanıldığını bilirik. Bu barədə kitabın əvvəllərində İbn Əbi Hətim ər-Razi'dən sitat gətirmişdik.

## Mücahid bin Cəbr

Əbul-Həccəc Mücahid bin Cəbr əl-Məkki əl-Məxzumi qarilərin və təfsir alimlərinin imamı sayılır. Tarixi qaynaqlarda doğum tarixi olaraq hicri 21-ci il göstərilir. Sözündə etibarlı, elmində dərin biliklərə vaqif olmuş biridir. Xüsusən təfsir və qiraət elmlərində müasirləri arasından seçilir, hətta təfsir elmində Said bin Cubeyr'dən də məşhur idi. Ən çox səhabə İbn Abbas'ın yanında tələbəlik edib; quranı, təfsiri, fiqhi ondan öyrənib. Həmçinin Əbu Hureyra, Aişə, Sad bin Əbi Vaqqas, Abdullah bin Ömər, Cabir bin Abdilləh və Əbu Said əl-Xudri kimi səhabələrin yanında da tələbəlik etmişdir. Quranı İbn Abbasa üç dəfə ərz etmiş və hər ayənin üzərində dayanaraq onun nazil olma səbəblərini, ayələr ilə bağlı izahları sormuşdur. O da Said bin Cubeyr ilə birlikdə Məkkədən əl-Həccac'ın hüzuruna gətirilib və həbsə atılıb. əl-Həccac ölənə qədər həbsdə qalıb və sonra çıxarılıb. Mücahid Məkkədə səcdədə olarkən vəfat etmişdir və ölüm tarixi üzərində fərqli məlumatlar vardır, lakin məşhur olan budur ki, hicri 103-cü ildə ölüb.

Mücahidin yazıya verdiyi dəyəri biz onun yazdığı təfsir kitabından anlayırıq. Quranın təfsirini o, İbn Abbas'dan tam şəkildə öyrənib. Təfsir alimi İbn Cərir ət-Təbəri isnadını zikr edərək deyir: "**İbn Əbi Muleykə dedi: "Mücahidi İbn Abbas'dan Quranın təfsirini soruşarkən gördüm və onun yanında lövhələri var idi və İbn Abbas ona "yaz!" deyərək yazdırardı." (İbn Əbi Muleykə) dedi: "Ta ki, təfsirin tamamını soruşdu.**"[413] Bu gün təfsir kitab-

413. "Təfsirut-Təbəri", 1/90 (107); Şakir təhqiqi. İbn Cərir ət-Təbəri bunun isnadını bu şəkildə zikr edir: "Əbu Kureyb bizə rəvayət etdi; dedi: Talq bin Ğannəm bizə Osman

larını açdıqda çox yerdə ayələrin təfsiri haqqında Mücahidin sözlərini nəql edirlər.

Quran, qiraət, təfsir və fiqh bilikləri ilə yanaşı Mücahid çoxlu hədis rəvayət etməklə də məşhurdur. Hədisləri kitablarına yazan alimlər arasında adı zikr olunur. əl-Xatib əl-Bağdadi deyir: "**İbn Razqaveyh bizə xəbər verdi: Osman bin Əhməd bizə xəbər verdi: Hənbəl bizə xəbər verdi: Əhməd bin Abdilməlik bizə rəvayət etdi: Zuheyr bizə rəvayət etdi: Əbu Yəhyə əl-Kunəsi bizə rəvayət edərək dedi: "Mucahid məni özü ilə otağına götürərdi və kitablarını mənim üçün çıxarardı və mən onlardan köçürərdim.**"[414] Bu kitablarının arasında səhabə Cabir'in səhifəsinin də olduğu deyilir. İbn Sad deyir: "**Əbu Bəkr (bin Ayyaş)dən başqaları isə deyiblər: "Onlara görə Mücahid (hədislərdən bir hissəsini) Cabir'in səhifəsindən rəvayət edirdi.**"[415] Yəni alimlərin rəyi bu olub ki, Mücahidin ixtiyarında Cabirin səhifəsi olub və o səhifədən Cabirin hədislərini rəvayət edib. Daha əvvəl qeyd etmişdik ki, Cabirin məşhur səhifəsini tələbəsi Süleyman əl-Yəşkuri Məkkədə olarkən yazmışdı və Mücahid məkkəli alimlərdəndir, səhifənin onda olması ehtimalı aşkardır.

Mücahid'in təfsir kitabını ondan çox sayda elm əhli öyrənərək rəvayət ediblər. İbn Hibban kitabında İbn Əbi Nəcih haqqında danışarkən deyir: "**Abdullah bin Əbi Nəcih əs-Səqafi...Ata və Tavus'dan rəvayət edir, ondan isə Varqa bin Ömər əl-Yəşkuri və Hicaz əhli rəvayət edir. 131 və ya 132-ci ildə ölüb. Yəhyə əl-Qattan dedi: "İbn Əbi Nəcih təfsiri Mücahid'dən eşitməyib." Əbu Hatim dedi: "İbn Əbi Nəcih və İbn Cureyc hər ikisi də əl-Qasim bin Əbi Bəzzə'nin Mücahid'dən təfsirdə rəvayət etdiyi kitaba baxıblar və Mücahiddən – ondan eşit-**

---

əl-Məkki'dən, o da İbn Əbi Muleykə'dən rəvayət etdi..." Əbu Kureyb burada Muhəmməd bin əl-Alə bin Kureyb'dir, hicri 247-ci ildə vəfat edib. İbn Həcər "ət-Təqrib" kitabında "siqadır, hafizdir" deyir. Talq bin Ğannəm bin Talq bin Muaviyə (?-211) haqqında İbn Sad "siqadır, doğru sözlüdür" deyir. Osman əl-Məkki'yə gəldikdə isə onun Osman bin əl-Əsvad bin Musa əl-Məkki (?-150) olması mümkündür. Siqadır, hafizəsində möhkəmdir. İbn Əbi Muleykə isə hicri 117-ci ildə vəfat etmiş böyük bir alimdir, imamdır. Etibarlı və güvənilən bir kəsdir.

414. "Təqyidul-İlm", səh: 128;

415. "ət-Tabəqat əl-Kubra", 5/467;

**mədən – bir başa rəvayət ediblər.**"[416] İbn Əbi Xeysəmə tarixində deyir: "**Əli bin əl-Mədini dedi ki, Yəhyə bin Said'i Mücahid'in təfsir kitabını zikr edərkən eşitdim və dedi: "İbn Əbi Nəcih onu Mücahid'dən eşitməyib, kitabının hamısı əl-Qasim bin Əbi Bəzzə üzərində dayanır.**"[417] Ondan təfsir kitabını yazan və öyrənən Varqa bin Ömər əl-Yəşkuri olub. İbn Əbi Xeysəmə deyir: "**Varqa dedi: Təfsir kitabının bir hissəsini mən İbn Əbi Nəcih'ə oxudum, bir hissəsini də o mənə oxudu və İbn Əbi Nəcih dedi: "Bu, Mücahid'in təfsiridir.**"[418] əl-Qasim bin Əbi Bəzzə haqqında İbn Hibban söz açarkən deyir: "**əl-Qasim bin Əbi Bəzzə; kunyəsi Əbu Asim'dir... 114 və ya 115-ci ildə vəfat edib. Mücahid'dən təfsir kitabını əl-Qasim bin Əbi Bəzzə'dən başqa heç kim eşitməyib və əl-Həkəm (bin Uteybə), Leys bin Əbi Səlim, İbn Əbi Nəcih, İbn Cureyc və (Sufyan) bin Uyeynə (Mücahidin təfsirini) onun kitabından götürüblər və Mücahidin özündən eşitməyiblər.**"[419] Bu nəqldən anlaşılır ki, Mücahid'in təfsir kitabı əl-Qasim bin Əbi Bəzzə vasitəsi ilə çox sayda alimə keçib və onun kitabından öyrəniblər. Bu alimlərin arasında ibn Cureyc və Sufyan bin Uyeynə kimi məkkəli alimlər olub. Həmçinin anlayırıq ki, təfsir kitabını Mücahiddən başdan sona qədər dinləyib yazan tək İbn Əbi Bəzzə olub. Əbu İshaq İbnul-Cuneyd'in (vəfatı hicri 260) öz müəllimi Yəhya bin Main'ə verdiyi suallar arasında bu sual da var. İbnul-Cuneyd deyir: "**Yəhya bin Mainə dedim: Yəhya bin Said əl-Qattan iddia edir ki, İbn Əbi Nəcih təfsir kitabını Mücahid'dən eşitməyib, onu sadəcə olaraq əl-Qasim bin Əbi Bəzzə'dən götürüb." Yəhya bin Main dedi: "(Sufyan) bin Uyeynə də bu cür deyir. Bunun doğru yoxsa batil olduğunu bilmirəm. Sufyan bin Uyeynə iddia etdi ki, Mücahid təfsir kitabını əl-Qasim bin Əbi Bəzzə üçün yazmışdı və onu Mücahid'dən əl-Qasim'dən başqa heç kim eşitməyib.**"[420] Digər xəbərlərə də nəzər saldıqda anlayırıq ki, Mücahid öz təfsir kitabını məkkəli alimlərdən İbn Əbi Bəzzə'yə imla edərək yazdırıb.

---

416. "əs-Siqat", 7/5;
417. "ət-Tərix əl-Kəbir", 1/231;
418. "ət-Tərix əl-Kəbir", 1/240;
419. "əs-Siqat", 7/331;
420. "Suələt İbn Cuneyd", səh: 343;

## Əbu Qiləbə'nin kitabları

Əbu Qiləbə basralı Abdullah bin Zeyd əl-Cərmi'dir, babasının adında ixtilaf vardır, bəzi qaynaqlara görə Amr, bəzilərinə görə isə Amir'dir. Doğum tarixi qeyd olunmur. Alimlər onu "şeyxul-islam", "imam", "hidayət imamı" kimi ləqəblər ilə vəsf edirlər. Əbu Hureyra, Ənəs bin Malik, Məlik bin əl-Huveyris, Huzeyfə bin əl-Yəmən, Səmura bin Cundub, Abdullah bin Abbas, Müaviyə, Səbit bin əd-Dahhək kimi səhabələrdən hədis rəvayət etmişdir, lakin rəvayətlərinin çoxu Ənəs bin Malik və Məlik bin əl-Huveyris'dəndir. Ondan da Basra'nın və başqa şəhərlərin alimləri hədis qəbul ediblər. Onların arasında Sabit əl-Bunəni, Qatədə, Asim əl-Əhval, Əyyub əs-Səxtiyəni və başqaları var. Əbu Qiləbə hədisləri yazmağı əhəmiyyət vermiş alimlərimizdəndir. ər-Raməhurmuzi deyir: "**Yusuf bin Yaqub bizə rəvayət etdi; Muhəmməd bin Ubeyd bizə rəvayət etdi; Həmməd bin Zeyd bizə Əyyub'dan (belə dediyini) rəvayət etdi: "Əbu Qiləbə və Əbul-Məlih elmi yazardılar.**"[421] Ona görə də o dövrdə Əbu Qiləbə'nin səhifəsi elm məclislərində tanınırdı və etibar qazanmışdı. Abbas əd-Dəvri deyir: "**Yəhyə (bin Main)i belə deyərkən eşitdim: Qatədə ... Əbu Qiləbə'dən eşitməyib, o sadəcə olaraq Əbu Qiləbə'nin səhifəsindən rəvayət edib.**"[422] Yəhyə bin Main Qatədə'nin ondan hədis eşitmədiyini, lakin onun səhifəsindən rəvayət etdiyini deyir, bu, səhifənin tanınmış bir səhifə olduğuna dəlalət edir. Başqaları Qatədə'nin həm ondan bizzat eşitdiyini, həm də səhifəsindən götürdüyünü deyirlər. Əbu Qiləbə hicri 104-cü ildə vəfat etmişdir.

İbn Asəkir "Tərixu Diməşq" kitabında isnadı ilə birlikdə rəvayət edir: "**Yunus bin Abdilalə dedi: "Malikin tələbəsi Əşhəb mənə xəbər verdi: Malik dedi: "İbnul-Museyyəb və əl-Qasim vəfat etdilər, (özlərindən sonra) kitablar buraxmadılar. Əbu Qiləbə öldü, mənə çatan xəbərə görə özündən sonra bir qatır yükü miqdarında kitablar buraxmışdır.**"[423] Tarixçi alim əz-Zəhəbi deyir: "**Həmməd bin Zeyd dedi: "Əbu Qiləbə Şamda**

421. "əl-Muhəddis əl-Fasil", səh: 371;

422. "Tərixu İbn Main", 4/100 (3354)

423. "Tərixu Diməşq", 28/296;

**xəstələndi və bütün kitablarını Əyyuba vəsiyyət edərək buyurdu: "Əgər sağdırsa (kitabları ona verin), yoxsa yandırın." Əyyub onun gətirilməsi üçün adam göndərdi və bir dəvə yükünün yarısı qədər kitab gətirildi.**"[424] Bu gün hədis kitablarında çox sayda hədisin isnadına nəzər saldıqda görəcəyik ki, o hədisləri basralı alimlərdən Həmməd bin Zeyd və ya Həmməd bin Sələmə şeyxləri Əyyub əs-Sixtiyəni'dən, Əyyub isə Əbu Qiləbə'dən rəvayət edir. Bu isnadın əksər hallarda kitab vasitəsi ilə olduğunu bilirik.

Əbu Yalə əl-Məvsili deyir: "**Xalifə bin Xayyət əl-Usfuri bizə rəvayət etdi: Yezid bin Zurey' bizə rəvayət etdi: Həccəc əs-Savvaf bizə rəvayət edib dedi: "Əbu Qiləbə'nin əmisi oğlu, babam Müaviyə'nin kitabında oxudum ki, o kitab Əbu Qiləbə'nin kitablarından biridir və orada belə yazıldığını gördüm: "Bu, Muhəmməd bin Sabit'in əl-Muğira bin Şubə'dən Allahın elçisinin – salləllahu aleyhi va səlləm – verdiyi bir hökmü xatırlamasını istədiyi hədisdir: "Qan pulu varislər arasında Allahın kitabına görə mirasdır.**"[425] Bu gözəl nümunədə biz Əbu Qiləbə'nin kitabının əmisi oğlu Müaviyə'yə keçdiyini, o kitabın daha sonra nəvəsi Həccəc əs-Savvaf'ın zamanına qədər gəldiyini görürük.

## Əyyub əs-Səxtiyəni'nin kitabları

Əyyub əs-Səxtiyəni adı ilə tanınmış alim Əbu Bəkr Əyyub bin Keysən Əbi Təmimə əl-Anəzi əs-Səxtiyəni'dir. İbn Abbas'ın vəfat etdiyi hicri 68-ci ildə anadan olub. Səhabələrdən Ənəs bin Malik ilə qarşılaşıb, amma ondan hədis rəvayət etməyib. Elmi fəaliyyəti əsasən Basra şəhərində olub. Hicri 131-ci ildə şəhərdə yayılmış taun xəstəliyində altmış üç yaşında vəfat edib.

Tarixi xəbərlər onu göstərir ki, Əyyub əs-Səxtiyəni tələbələrinə Əbu Qiləbə'nin kitablarını öyrətməyə davam edib. əl-Xatib əl-Bağdadi deyir: "**Muhəmməd bin əl-Huseyn əl-Qattan bizə xəbər verdi: Abdullah bin Cəfər bin Durustuveyh bizə xəbər verdi:**

424. "Tərixul-İsləm", 3/193;

425. əl-Busiri, "İthəful-Xiratil-Məhəra", 4/192;

**Yaqub bin Sufyan bizə rəvayət etdi: Süleyman bin Hərb dedi: Həmməd dedi: "Cərir bin Həzim, Əbu Qiləbə'nin kitablarından birini Əyyub'un yanında oxudu. Dedi: "Bunların hamısını Əbu Qiləbə'dən eşitmişəm; içindəkilərdən bəzilərini əzbərdən bilirəm, bəzilərini isə əzbər bilmirəm." (Süleyman bin Hərb) dedi: "Həmməd bəzən bizə bir şey rəvayət edərdi və biz bunun üzərinə deyərdik: "Bu, kitabda olan rəvayətlərdəndir.**" Buna görə də biz bu gün sünnət kitablarında Cərir bin Həzim'in bəzi rəvayətləri bir başa Əbu Qiləbə'dən, bəzilərini də Əyyub vasitəsi ilə rəvayət etdiyini görürük. İmam əl-Buxari "ət-Tərix əl-Kəbir" kitabında deyir: "**Əbu Saleh əl-Hərisi'dən, o da ən-Nu'mən bin Bəşir'dən, o isə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – (belə dediyini rəvayət edir) : "İki ayə var ki, onlar oxunan evdə şeytan olmaz." Mu'allə dedi: "Vuheyb bizə Əyyub'dan (belə dediyini) rəvayət etdi: "Əbu Qiləbə'nin kitabında tapdım ki, ən-Nu'mən'dən, o da peyğəmbərdən – salləllahu aleyhi va səlləm –" eynisini rəvayət edir.**"[426] Bu hədis səhihdir və bu hədis fərqli ləfz ilə eyni mənada "əs-Sahih" kitabında keçir.

İmam Əhməd bin Hənbəl deyir: "**Suleyman bin Hərb bizə rəvayət etdi: Həmməd bin Zeyd dedi: "Əyyub mənə Əbu Qiləbə'nin kitablarından bir kitab verdi və onun içində Ömərin valisinə yazdığı məktub da var idi...**"[427] Daha sonra o məktubun içində yazılanı nəql edir. Bu xəbərin bizə verdiyi məlumatdan aydın olur ki, Əyyub əs-Səxtiyəni o kitabları öz tələbələrinə faydalanmaq üçün verib. Hətta İmam əl-Buxari "əs-Sahih" kitabında Əbu Qiləbə'nin bu kitabından hədis rəvayət edir. əl-Buxari deyir: "**Arim bizə rəvayət etdi: Həmməd (bin Zeyd) bizə rəvayət etdi: Əyyuba Əbu Qiləbə'nin kitablarından birindən oxudular – onların içində eləsi var idi ki, onu şifahi rəvayət etdi, eləsi də var idi ki, kitabdan oxudu və bu, kitabdandır – ki, Ənəs dedi ki, "Əbu Talha və Ənəs bin Nədr onu (yəni Ənəs bin Maliki) damğaladılar və Əbu Talha onu özü əli ilə damğaladı." Abbas bin Mənsur Əyyub'dan, o da Əbu Qiləbə'dən, o isə Ənəsdən belə dediyini (rəvayət edərək) dedi: "Allahın elçi-**

426. "ət-Tərix əl-Kəbir", 9/43; Dəiratul-Məarifil-Usməniyyə

427. "əl-İləl va Mərifətur-Ricəl", 2/199;

**si – salləllahu aleyhi va səlləm - ənsardan olan bir ev əhlinə zəhərli heyvanların dişləməsinə və qulaq ağrılarına görə ruqyə etməyə izn verdi...**”[428] Bu hədisdə Ənəs bin Malik’in plevrit xəstəliyinə görə damğalandığı zikr olunur. Əbu Talha və Ənəs bin Nədr birlikdə damğalasa da damğanı basan Əbu Talha olub. Biz bilirik ki, Əbu Qiləbə səhabə Ənəs bin Malik’in tələbələrindən olub və kitabında bu hadisəni qeyd edib. Əgər düşünsək Əbu Qiləbə’nin özündən sonra tərk etdiyi kitabların basralılar üçün, ümumilikdə isə ümmət üçün nə qədər əhəmiyyətli olduğunu anlayarıq.

əl-Xatib əl-Bağdadi “əl-Kifəyə fi İlmir-Rivayə” kitabında Həmməd bin Zeydə çatan isnad ilə onun belə dediyini rəvayət edir: “(**Əyyub) dedi: “Muhəmmədə dedim: “Əbu Qiləbə’nin kitabları haqqında fikrin nədir? Onlar gəlib çatıblar mənə, onlardan rəvayət edimmi?” Dedi: “bəli.” Sonra bundan bir qədər sonra dedi: “Nə əmr edirəm, nə də qadağan edirəm.**” Burada adı keçən Muhəmməd məşhur alim Muhəmməd bin Sirin’dir. Muhəmməd bin Sirin’in ömrünün son mərhələsində hədis yazmaq işini tərk etdiyini daha öncə zikr etmişdik. Bu xəbərdən anlamaq olur ki, İbn Sirin başqalarının hədis kitablarından hədis rəvayət etməklərində bir problem görmür. Bu xəbəri zikr etdikdən sonra əl-Xatib deyir: “**Burda deyilməlidir ki, Əyyub həmin kitabları (Əbu Qiləbə’dən) eşitmişdi, lakin onları əzbərləməmişdi. Buna görə də oradan rəvayət etməklə bağlı Muhəmməd bin Sirin’dən rəyini öyrənmək istəmişdir.**”[429]

Əyyub əl-Ənsari’dən bu kitabları yazanlar arasında İsmail bin Uleyyə olub. Əbu Zur’a əd-Diməşqi deyir: “**Əbu Nueymi eşitdim: Onun yanında Həmməd bin Zeyd və İbn Uleyyə’nin sözü keçdi və Həmməd’in Əyyub’dan (hədisləri) əzbərlədiyini, İbn Uleyyə’nin isə yazdığını zikr etdilər. Bunun üzərinə (Əbu Nueym) dedi: “Sənə zəmanət verirəm ki, kitaba qayıdıb (rəvayətini) dəqiqləşdirməyən kəs xətadan qorunulmayıb.**”[430] İbn Uleyyə’nin yazdığı hədislərin hamısı Əbu Qiləbə’nin kitablarından deyildir, bir hissəsi Əbu Qiləbə’nin, bir hissəsi də Əyyub’un öz yaz-

428. “Sahih əl-Buxari”, 5719;

429. “əl-Kifəyə fi İlmir-Rivayə”, səh: 352;

430. “Tərixu Əbi Zur’a əd-Diməşqi”, səh: 467;

dığı kitablardandır. Əyyubun kitablarını yazmış daha bir alim Abdussaməd əl-Anbəri olub. Yaqub əl-Fəsəvi deyir: "**Əli (bin əl-Mədini) dedi: Abdussaməd (bin Abdilvaris əl-Anbəri) dedi: "Mən Əyyub ölənə qədər ondan (hədisləri) mürəkkəb ilə yazmadım, o, sözlərlə tələffüz edirdi. Öldükdə onları mürəkkəblə yazdım.**"[431] Əgər Əyyub öldükdən sonra sağlığında eşitdiyi hədisləri yazıbsa bunu Əyyub'un kitablarından köçürməklə edə bilib. Əyyub vəfat etdikdən sonra kitabları tələbələrində qalıb.

## Tavus bin Keysən'in nüsxəsi

İbn Abbasın ən xas tələbələrindən biri də yəmənli Əbu Abdirrahmən Tavus bin Keysən əl-Farisi olub. Əsli fars olan bu məşhur alim Osmanın xilafəti dönəmində və ya ondan öncə anadan olub. Zeyd bin Səbit, Aişə, Əbu Hureyra, Zeyd bin Ərqam, İbn Abbas, Cabir bin Abdilləh, Suraqa bin Məlik, Safvan bin Umeyyə, Abdullah bin Ömər, Abdullah bin Amr bin əl-As kimi səhabələrdən elm öyrənib. Onun haqqında İbn Abbas deyib: "**Mən Tavus'un cənnət əhlindən olduğunu zənn edirəm.**"[432]

İbn Abbasın digər tələbələri kimi Tavus da hədisləri yazıb. Tavus'un da özündən sonra kitablar tərk etdiyini bilirik. əd-Dəraqutni deyir: "**Muhəmməd bin İsmail bizə rəvayət etdi; İshaq bin İbrahim bizə xəbər verdi; Abdurrazzəq bizə xəbər verdi; İbn Cureyc bizə xəbər verdi; İbn Tavus mənə atasından xəbər verərək dedi: "Atamda bir kitab var ki, orada qan pulu haqqında yazılıb, o barədə peyğəmbərə - salləllahu aleyhi va səlləm – vəhy gəlib. Allahın elçisi – salləllahu aleyhi va səlləm – qan pulu və ya zəkat haqqında hər nə hökm veribsə yalnızca haqqında vəhy gəldiyi üçündür və hamısı da o kitabda yazılıdır.**"[433] Burada Tavus'un oğluna atasından keçmiş kitabın Muaz bin Cəbəl'in məşhur kitabı olması da ehtimaldır, çünki qan pulu və zəkat əhkamını peyğəmbərimiz – aleyhissalətu vassələm

431. "əl-Mərifətu vat-Tərix", 2/130;

432. "Tərixul-İsləm", 3/65;

433. "Sünən əd-Dəraqutni", (3142)

– yazdıraraq Muaz bin Cəbəl ilə birlikdə Yəmən əhlinə göndərmişdi. Tavusun yəmənli olduğunu və kitabın içindəkilərin qan pulu, zəkat hökmləri ilə bağlı olduğuna diqqət etsək həmin kitab olması ehtimalının güclü olduğunu qəbul etməliyik.

Tavus elmini tələbələrinə də yazdırardı. Bu barədə bizə Abdullah bin Əhməd xəbər verərək deyir: "**Atam mənə rəvayət etdi; dedi: Musa bin Davud bizə rəvayət etdi; dedi: Tavusun köləsi Əmətullah bizə rəvayət etdi; dedi: "Leys bin Əbi Suleym'i Tavusun yanında böyük lövhələrə yazarkən gördüm və Tavus ona imla edirdi.**"[434]

Tavus bin Keysən hicri 106-cı ildə həcc ibadətində ikən vəfat edir. Həmin il əməvi xəlifəsi Hişəm bin Abdilməlik də həcdə idi və Tavusun cənazəsini o qıldırır.

## Miqsəm bin Bucra

Abdullah bin əl-Həris bin Nəvfəl'in mövlası, yəni azadlı köləsi olmuş Əbul-Qasim Miqsəm bin Bucra tabiin təbəqəsindəndir. O da İbn Abbas'ın tələbələrindən biridir və onun yanından ayrılmadığı üçün ona "İbn Abbasın mövlası" adını veriblər. Muhəmməd bin Sad onun hicri 101-ci ildə vəfat etdiyini deyir.

Yaqub əl-Fəsəvi deyir: "**əş-Şubə dedi: "əl-Həkəm (bin Uteybə əl-Kindi) Miqsəm'dən dörd hədis eşidib..., qalanı isə kitabdır.**"[435] Bunu əş-Şubə'dən həmçinin Əli bin əl-Ca'd əl-Cəvhəri (vəfatı hicri 230) "əl-Musnəd" kitabında rəvayət edir: "**Saleh bin Əhməd bizə rəvayət etdi: Əli (bin əl-Mədini) mənə rəvayət etdi: Yəhyanı belə deyərkən eşitdim: Şubə deyərdi: "əl-Həkəm (bin Uteybə)nin Miqsəmdən hədisləri bir kitabdandır, beş hədis istisnadır." Yəhyadan soruşdum: "Şubə onları saydı?" Dedi: "Bəli." Yəhyaya dedim: "Onlar hansılardır?" Dedi: "Vitr hədisi, qunut hədisi, boşamaq hökmü barəsindəki hədis, heyvanlardan öldürülənin mislində cəza, zövcəsi ilə**

434. "əl-İləl va Mərifətur-Ricəl", 1/260 (377)
435. "əl-Mərifətu vat-Tərix", 2/584;

**heyzli halda cinsi əlaqədə olan kişinin hədisi.” Yəhya dedi: “Oruclunun hicəmə etdirməsi hədisi səhih deyildir.**”[436] İbn Əbi Xeysəmə də bunu kitabında Əli bin əl-Mədini’dən nəql edir.

## Xalid bin Mə’dən

Əbu Abdilləh Xalid bin Mə’dən ibn Əbi Kərib əl-Kələ’i əl-Himsi şamlı alimlərdəndir. əz-Zəhəbi onu “Şam əhlinin şeyxi” adlandırır. İbn Hibban onun yetmişə yaxın səhabə ilə qarşılaşdığını deyir. Ənəs bin Malik, Səvbən, Cubeyr bin Nufeyr, Rafi bin Xudeyc, Ubədə bin Samit, Abdullah bin Ömər, Əbu Hureyra, Abdullah bin Amr və başqalarından hədis rəvayət etmişdir. Ölüm tarixi üzərində fərqli məlumatlar vardır. Bəzi qaynaqlara görə hicri 103-cü ildə, digərlərinə görə isə hicri 104-cü ildə vəfat edib.

Xalid zahid bir şəxsiyyət kimi tanınıb, lakin zahidliyinə baxmayaraq aldığı elmi yazıya köçürməyə də vaxt ayırmışdır. İmam Əhməd bin Hənbəl deyir: “**Yezid bin Abdi Rabbih bizə rəvayət etdi; dedi: Bəqiyyə (bin əl-Valid)i belə deyərkən eşitdim: “Bəhir bin Sad bizə rəvayət edərək dedi: “Xalid bin Mə’dən qədər elmə hörmət edən birini görmədim; onun elmi səhifələrdə idi.**”[437] Bu rəvayəti əz-Zəhəbi “Təzkiratul-Huffəz” kitabında zikr edərkən deyir: “**Bəhir (bin Sad) dedi: “Elmə onun qədər bağlı birini görmədim, elmi düymələri və düymə deşikləri olan bir kitabın içində idi.**”[438] Xalidin topladığı hədislər kitab formasında tələbəsi Bəhir bin Sad’a keçmişdir. Bundan sonra Bəhir bin Sad’ın kitabı olaraq tanınıb və o dövrün alimləri tərəfindən xüsusi maraq görmüşdür. əz-Zəhəbi deyir: “**Bəhir bin Sa’d Hims şəhərindəndir, hafizdir, Əbu Xalid kunyəsi ilə çağırılır. əs-Səhuli əl-Kəla’idir. Onun Xalid bin Mə’dəndən gələn bir nüsxəsi vardır.**”[439] Bəhir bin Sad’dan bu kitabı öyrənərək köçürən Bəqiyyə bin əl-Valid olub. Bəqiyyə bin əl-Valid’ə yoldaşlıq etmiş Şubə həmin kitabı

436. “Musnəd İbnil-Ca’d”, səh: 62 (317);

437. “əl-İləlu va Mərifətir-Ricəl”, 2/339;

438. “Təzkiratul-Huffəz”, 1/72;

439. Eyni mənbə: 1/132;

Bəqiyyə'dən dinləmişdir. İbn Adiy "əl-Kəmil fi Duafə ər-Ricəl" kitabında deyir: "**Həyva dedi: "Bəqiyyə'ni belə deyərkən eşitdim: "Bəhr bin Sad'ın kitabını Şubəyə oxuduqda dedi: "Ey Əbu Yəhməd, əgər bu kitabı səndən eşitməsəydim ölmüşdüm.**"[440] Şubə daha sonra israr ilə Bəqiyyə'dən həmin kitabı ona hədiyyə etməsini istəmişdir. İbn Adiy deyir: "**Abdullah bin Muhəmməd bin Sələm bizə rəvayət etdi: İbn Musaffə'ni belə deyərkən eşitdim: "Bəqiyyəni belə deyərkən eşitdim: "Şubə məndən Bəhir bin Sad'ın hədisini ona hədiyyə etməmi istədi.**"[441] İbn Asəkir tarixində isnadı ilə rəvayət edir: "**Bəqiyyə dedi: "Şubə mənimlə Bağdadda qarşılaşdı və dedi: "Səninlə qarşılaşmasaydım ölərdim. Bəhir bin Sad'ın kitabı səninlədir?" Dedim: "Xeyr." Dedi: "Geri döndükdə onu (mənim üçün) yaz, möhürlə və mənə göndər!**"[442] Yenə bizə gəlmiş çox saylı xəbərlərdən bilirik ki, Bəqiyyə həqiqətən də Bəhir bin Sad'ın kitabını Şubə üçün yazaraq göndərir, lakin kitab Şubəyə çatmadan öncə o ölür. Bir də fikir verək ki, kitablara da möhür vurmaq adəti mövcud idi. Biz bu kitabda başqa yerdə məkkəli alim İbn Cureyc'in kitablarını kiməsə göndərdikdə möhürlə işarələdiyini görəcəyik.

## İkrimə'nin nüsxəsi

Xüsusilə İbn Abbas'dan, ümumilikdə isə çox sayda səhabədən hədis yazmış kəslər arasında Mücahid bin Cəbr'i daha əvvəl zikr etdik. İbn Abbas'ın daha bir məşhur tələbəsi İkrimə olub. Əbu Abdilləh İkrimə bin Abdilləh əslən məğrib torpaqlarındakı bərbər qəbilələrindəndir və müsəlmanların əlinə kölə olaraq keçib. Ona görə də İkrimə əl-Bərbəri adı ilə də tanınır. Öncə Huseyn bin Əbil-Hurr əl-Anbəri'nin köləsi idi və Əli bin Əbi Talib tərəfindən Basra şəhərinə vali təyin edildikdə onu İbn Abbasa hədiyyə edir. Daha sonra İbn Abbasın köləsi olub və İbn Abbas ölənə qədər kölə olaraq qalıb. Daha sonra oğlu Əli bin Abdilləh onu satır, lakin buna görə ona - "**atanın elmi-**

440. "əl-Kəmil fi Duafə ər-Ricəl", 2/264;

441. Eyni mənbə

442. "Tərixu Diməşq", 10/336;

**ni satdın!**" – deyərək qınadıqları üçün geri qaytarır və azad edir. İlk müəllimi də əlbəttə ki, İbn Abbas olub. İbn Abbas'ın onun ayağını bağlayaraq ona Quran və sünnəti öyrətdiyini xəbərlərdə oxuya bilirik. Daha sonra İkrimə bunu minnətdarlıq hisləri ilə xatırlayacaqdı.

Digər səhabələrdən də hədis eşidib və rəvayət edib. Onların arasında Aişə, Əbu Hureyra, İbn Ömər, Abdullah bin Amr, Uqbə bin Amir, Əli bin Əbi Talib, Safvan bin Umeyyə, Cabir bin Abdilləh, Əbu Said əl-Xudri, Əbu Qatədə və başqaları yer alır. Çoxlu səfərlər etmiş biridir. Hicaza, Şama, İraqa, Yəmənə və Xorasana səfərlər etmiş, həmçinin Misirə və Şimali Afrika ölkələrinə yol salmışdır. Lakin ömrünün sonunda Mədinə şəhərində yaşamış və orada hicri 105-ci ildə vəfat etmişdir. Bəzi alimlər – və bunların arasında Əli bin əl-Mədini, Əbu Hətim ər-Razi kimiləri vardır - İkrimə'ni İbn Abbas'ın tələbələri arasında ən elmli tələbəsi hesab ediblər. Bu zəngin elmini yazıya köçürməsi də onun elmə verdiyi qiymətdən xəbər verir.

İmam Muhəmməd bin İsmail əl-Buxari tarix kitabında Amr bin Abdilləh haqqında danışarkən deyir: "**Əli (bin əl-Mədini) dedi: Hişəm (bin Yusuf)dan Amr bin Abdilləh haqqında soruşdum; Mə'mər ondan (hədis) rəvayət edibmi?" Dedi: "O, Amr bin Abdilləh bin əl-Əsvar'dır və İkrimə onun atasının yanında yerləşmişdi. Onu Amr Bərq deyib çağırırdılar." Hişəm dedi: "Umeyyə bin Şibl mənə dedi: "(Amr bin Abdilləh) sadəcə olaraq İkrimə'yə aid olan bir kitabı oğurlamış və onun üzünü köçürmüşdü, sonra İkrimə'dən (içindəki hədisləri) soruşmağa başlamışdı. İkrimə də onun kitabından köçürdüyünü bildikdə ona dedi: "Bildim ki, sənin buna çatacaq dərəcədə əqlin yoxdur.**"[443] İkrimə'nin Yəmənə səfər etdiyini və özü ilə içində hədislər yazdığı kitab daşıdığını bu səhih tarixi xəbərdən öyrənmiş oluruq. Kitabın içində çox sayda hədislərin olduğunu da söyləməyimiz mümkündür, çünki bir kitabı onun müəllifi yanında öyrənmək çətin gəldikdə onu oğurlayarlar, yoxsa az sayda hədisi bir şeyxin yanında öyrənmək əziyyətinin insanı kitab oğurlamağa vadar etməsi nadir bir hal olmalıdır.

İkrimə'nin kitabını onun məclisində ondan öyrənmiş bəzi tələbələri rəvayət edərək sonrakı nəsillərə ötürüblər. İbn Hibban əl-Busti

443. "ət-Tərix əl-Kəbir", 6/345; Mahmud Xalil təhqiqi

deyir: "**Abdulaziz bin Faid əl-Adəni Əbu Ömər, Yəmən əhlindəndir. əl-Həkəm bin Əbən vasitəsi ilə İkrimə'dən bir nüsxə rəvayət edir və bunu ondan Abdulməlik bin Abdirrahmən əz-Ziməri rəvayət edir.**"[444] Əbu İsa əl-Həkəm bin Əbən əl-Adəni etibarlı bir ravidir və İkrimə Yəməndə olarkən onun yanında tələbəlik etmiş, onun hədislərini yazmışdır. Ondan da çox sayda alim hədis alıb.

İkrimə'dən hədis yazanlar çox olublar. Əyyub əs-Səxtiyəni deyir: "**Əgər (İkrimə) mənim nəzdimdə etibarlı biri olmasaydı ondan hədis yazmazdım.**"[445] Bu, Əyyubun onun hədislərini yazdığına dəlalət edir. əz-Zəhəbi deyir: "**Sələmə bin Vahran, İkrimə'dən bir nüsxə rəvayət edir, ondan da Zəm'ah bin Saleh rəvayət edir.**"[446] əz-Zəhəbi bir başqa yerdə Osman bin Ğiyəs haqqında danışarkən deyir: "**İbnul-Mədini dedi: "Yəhyə bin Said (əl-Qattan) ı belə deyərkən eşitdim: "Osman bin Ğiyəsdə İkrimə'dən kitablar var idi...**"[447] Ümumiyyətlə İbn Abbasın ən məşhur tələbələri müəllimləri kimi hədis yazmağa önəm veriblər. İkrimə də istisna deyildi.

## Əbu Bəkr ibn Həzm

Əbu Bəkr bin Muhəmməd bin Amr bin Həzm əl-Ənsari əl-Xazraci – rahmətullahi aleyhi – zamanının ən elmli alimlərindən sayılır. Mədinə şəhərinin bir müddət əmiri olub, daha sonra qazisi olaraq çalışıb. Ömər bin Abdilaziz sünnəti toplamaq çalışmalarına başladıqda bu işi digərləri ilə yanaşı Əbu Bəkrə də tapşırmışdı. Atası Muhəmməd'dən, Abbəd bin Təmim, Salman əl-Əğarr, Abdullah bin Qeys bin Məxramə və başqalarından hədis eşidib. İmam Malik qeyd edir ki, Mədinə şəhəri üzərindən ondan başqa ənsarlı bir əmir olmayıb. Hicri 120-ci ildə vəfat etdiyi deyilib.

444. "əs-Siqat", 8/394-395;

445. İbn Cərir ət-Təbəri, "əl-Muntəxab min Zeylil-Muzəyyəl", səh: 122;

446. "Mizənul-İtidəl", 2/193;

447. "Təhzibut-Təhzib", 7/147;

əd-Dərimi “əs-Sunən” kitabında deyir: “**İsmail bin İbrahim Əbu Mə’mər bizə Əbu Damra’dan, o da Yəhyə bin Said’dən, o isə Abdullah bin Dinar’dan belə dediyini rəvayət etdi: “Ömər bin Abdilaziz – rahiməhullah – Əbu Bəkr bin Muhəmməd bin Amr bin Həzm’ə yazaraq buyurdu: “Səndə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – hədisindən və Amra’nın hədisindən sabit olan nə varsa mənə yaz, çünki mən elmin zəifləyib yoxa çıxmasından qorxuram.**”[448] Burada adı keçən Amra möminlərin anası Aişə’nin himayəsində böyümüş Amra bint Abdirrahmən bin Sad bin Zurara əl-Ənsariyyə’dir, çoxlu hədis rəvayət etmiş bir qadındır. Ömər bin Abdilaziz onun hədislərinin yazılmasını Əbu Bəkr bin Muhəmmədə tapşırmışdı. İmam Malik bin Ənəs deyir: “**Bizdə Mədinədə heç kimdə Əbu Bəkr bin Muhəmməd bin Amr bin Həzm qədər qaziliklə bağlı elm yox idi. Onu Ömər bin Abdilaziz təyin etmişdi və ona məktub yazaraq ondan Amra bint Abdirrahmən və əl-Qasim bin Muhəmməd’dən elm yazıb ona göndərməsini tələb etdi. Mədinə üzərində Əbu Bəkr bin Həzm’dən başqa bir ənsarlı əmir olmamışdı və bir qazi idi.**”[449] Burada Amra ilə yanaşı əl-Qasim bin Muhəmməd’in elmi ilə bağlı göstəriş əlavə edilir. əl-Qasim bin Muhəmməd isə Əbu Bəkr’in nəvəsidir və Mədinədəki yeddi fəqihdən biri sayılır. Onun hədis rəvayət etmək və onları yazdırmaq baxımından çox ehtiyatlı və dəqiq olmasına dair xəbərlər varid olub. Əbu Muhəmməd ər-Raməhurmuzi isnadını zikr edərək Talha bin Abdilməlik əl-Əyli’nin belə dediyini rəvayət edir: “**əl-Qasim’in yanına gəldim və ondan bəzi şeylər haqqında soruşdum və soruşdum: “Yazımmı?” Dedi: “Bəli!” Sonra oğluna – “onun yazdığına bax ki, mənim dediyimdən artıq bir şey yazmasın!” – deyərək buyurdu. Dedim: “Ey Əbu Muhəmməd, mən əgər yalan danışmaq istəsəydim sənin yanına gəlməzdim.” O da dedi: “Mən bunu qəsd etmədim, qəsdim sadəcə budur ki, əgər bir şeyi yazmağı unutsan (oğlum) səhvini düzəltsin!**”[450] Bu əmanətə sadiqliyi çox təəssüf

---

448. “Sunən əd-Dərimi”, (504)

449. İbn Əbi Hətim, “əl-Cərh vat-Tədil”, 9/337;

450. “əl-Muhəddis əl-Fəsil beynər-Ravi val-Va’i”, səh: 539; ər-Raməhurmuzi’nin isnadı belədir: “Abdullah bin Əli bizə rəvayət etdi; Əbu Said əl-Əşəcc bizə rəvayət etdi; Yunus bin Bukeyr bizə İbn İshaq’dan, o da Talha bin Abdilməlik’dən belə dediyini rə-

ki, bəziləri görməməzlikdən gəlirlər. Lakin həqiqət budur ki, hədis alimlərimiz sünnət əmanətini bu qədər ciddiyyət ilə qoruyublar.

## İbn Şihəb əz-Zuhri

əz-Zuhri bu münasibətlə zikr edə biləcəyimiz ən xas şəxsiyyətlərdən biridir, çünki sünnətin yazılmasındakı xidmətləri əvəz olunmazdır. Uzun adı Əbu Bəkr Muhəmməd bin Muslim bin Ubeydilləh bin Abdilləh bin Şihəb əz-Zuhri əl-Quraşi olan bu imam 50-ci və ya 51-ci ildə anadan olub və 124-cü ildə vəfat edib. Abdullah bin Ömər, Cabir bin Abdilləh, Ənəs bin Malik, Səhl bin Sad, Mahmud bin ər-Rabi, Mahmud bin Ləbid kimi səhabələrdən hədis rəvayət edib.

İmam əz-Zuhri peyğəmbərin – aleyhissalətu vassələm – hədislərini yazıya köçürən, onları tələbələrinə yazdıraraq öyrədən alimlərdən biri idi. Ömər bin Abdilaziz'in dövründə dövlətin dəstəyi ilə kütləvi şəkildə hədisləri toplayıb yazmağa başlayıb. Ona görə də bəziləri məhz əz-Zuhri'nin hədisləri kütləvi şəkildə toplamış ilk kəs olduğunu deyiblər. İmam İbn Abdilbərr deyir: "**əz-Zubeyr dedi: Əbu Ğaziyyə və başqaları mənə Abdurrahmən bin Əbiz-Zinəd'dən, o da atasından belə dediyini rəvayət etdi: "Biz (yalnız) halal və haramı yazıya köçürərdik, İbn Şihəb isə eşitdiyi hər bir şeyi yazırdı. Ona ehtiyac olduqda bildim ki, o, insanların ən elmlisidir.**"[451]

əz-Zuhri'nin bilikləri hər zaman tələb olunub və hətta rəsmi dairələr onun elmindən pay qazanmaq, beləliklə də şöhrətlərinə şöhrət qatmaq üçün yanına tələbəlik etməyə gəlirdilər. İbn Sad deyir:

---

vayət etdi..." Talha bin Abdilməlik etibarlıdır, İmam Malik'in şeyxidir və "əl-Muvatta" kitabında ondan bir hədis rəvayət edir. İbn İshaq isə (85-151) "Sira" kitabının sahibi Muhəmməd bin İshaq bin Yəsərdir. Yunus bin Bukeyr (?-199) isə Əbu Bəkr Yunus bin Bukeyr bin Vasil əl-Həmməl'dir, etibarlı və doğru sözlüdür. Ondan bunu rəvayət edən Əbu Said Abdullah bin Said bin Huseyn əl-Əşəcc əl-Kindi əl-Kufi'dir. (?-257) Böyük bir imam və yazıçı alimdir. ər-Raməhurmuzi'nin şeyxi Abdullah bin Əli möhtəmələn "əl-Muntəqa fis-Sunən" kitabının sahibi Əbu Muhəmməd Abdullah bin Əli bin əl-Cərud ən-Nisəburi'dir (230-307) və onun haqqında elm əhli etibar və sidq'dən başqa bir şey söyləməyib.

451. "Cəmi'u Bəyənil-İlmi va Fədlihi", 1/321 (416);

“**Mə’mər dedi: İbrahim bin əl-Valid’i - əməvilərdən bir nəfəri - əz-Zuhri’dən soruşarkən eşitdim və elmdən bir kitabı ona ərz etdi və dedi: “Bunu səndən rəvayət edə bilərəmmi, ey Əbu Bəkr?” Dedi: “Bəli, sizə onu məndən başqa kim rəvayət edəcəkki?!” (Mə’mər) dedi: “Əyyub (əs-Sixtiyəni)ni də ona elmi ərz edərkən, onu da ona icazə verərkən gördüm.**”[452] Əməvilərdən bir nəfər ilə qəsd etdiyinin əl-Valid bin Yezid olması mümkündür, çünki Abdurrazzəq əs-San’ani deyir: “**Mə’məri belə deyərkən eşitdim: “Biz əz-Zuhri’dən çox hədis yazdığımızı düşünərdik Bu əl-Valid ölənə qədər belə idi, o öldükdə xəzinəsindən heyvanların üzərinə yüklənmiş əz-Zuhri’nin elmindən olan dəftərlərin çıxdığını gördük.**”[453] Ola bilsin ki, həmin şəxs əl-Valid bin Yezid deyil, başqası idi. Əməvi hökmdarları əz-Zuhri’dən hədis yazmaqda maraqlı idilər, çünki o dövrdə ən şərəfli və hörmətli işlərin başında hədis öyrənmək dururdu. Ona görə də əməvilər əz-Zuhri’dən xeyli hədis yazıblar. Şəmsuddin əz-Zəhəbi bu xəbəri “Tərixul-İsləm” kitabında zikr etdikdən sonra deyir: “**Ondan Mərvan ailəsi üçün yazılmış kitabları qəsd edir.**”[454] Xəlifə əl-Valid bin Yezid vəfat etdikdə onun xəzinəsindən çıxarılan kitabları həm özünün, həm də özündən əvvəlki əməvilərin yazdığını deməliyik, çünki həmin kitab xəzinəsi ondan öncə də mövcud idi.

Digər bir maraqlı məlumatı bizə Sufyan bin Uyeynə verir. əl-Humeydi öz şeyxi Sufyandan belə dediyini nəql edir: “**Məkkəli alimlər sadəcə Humeyd əl-Arac’ın Şamdan gətirdiyi və əz-Zuhri’dən yazılmış, sonra da İbn Hərhərə’nın əlinə keçmiş bir kitabdan götürüblər və məkkəlilər həmin kitabı İbn Şihəbə ərz edirdilər. Bizə gəldikdə isə biz bir-başa onun öz ağzından eşidirdik.**”[455] əz-Zuhri’dən hədis yazmış digər böyük alim Rabi’atu ər-Rəy’dir. İbn Adiy deyir: “**Muhəmməd bin Cəfər bin Həfs əl-İməm bizə rəvayət etdi; İbrahim bin Said bizə rəvayət**

452. “ət-Tabəqat əl-Kubra”, 5/353 (əl-İlmiyyə)

453. İbn Sad, “ət-Tabəqat əl-Kubra”, 2/389; İbn Əbi Xeysəmə, “ət-Tərix əl-Kəbir”, 2/252 (2735); Əbu Nueym, “Hilyətul-Əvliyə va Tabəqatul-Əsfiyə”, 3/361; İbn Abdilbərr, “Cəmi’u Bəyənil-İlmi va Fədlihi”, 2/1152; Əbu Musa əl-Mədini, “əl-Lətaif min Dəqaiqil-Məarif”, 1/261;

454. “Tərixul-İsləm”, 3/499;

455. “Musnəd əl-Humeydi”, 1/369 (382);

**etdi; Şəbəbə bizə rəvayət etdi: Varqa mənə dedi: "Rabi'atur-Rəy'in kitablarında gördüm ki, əz-Zuhri'dən, o da Süleyman bin Ərqam'dan, o da əl-Həsən'dən (rəvayət edir).**"[456] Eləcə də Abdurrahmən bin Xalid bin Musəfir əl-Fəhmi əl-Misri ondan hədis yazmış kəslər arasında sayılır. İmam Yəhyə bin Main onun haqqında danışaraq deyir: "**Misirdən idi və onda əz-Zuhri'dən bir kitab var idi ki, içində iki yüz və ya üç yüz hədis var idi və əl-Leys (bin Sad) o hədisləri ondan rəvayət edirdi.**"[457] Təsəvvür edin ki, əz-Zuhri'dən yazılmış iki yüz hədisi özündə cəm etmiş bir kitab İmam əl-Leys bin Sad'ın ixtiyarında olub və əl-Leys o hədisləri Abdurrahmən bin Xalid vasitəsi ilə əz-Zuhridən rəvayət edib. əl-Leys hədisdə dəqiq olan alimlərdən sayılır və kitabdan hədisləri rəvayət etməsi onların doğruluğuna şahid etməsi deməkdir.

Muhəmməd bin Abdilləh əl-Həkim ən-Neysəburi (vəfatı hicri 405) "Mərifətu Ulumil-Hədis" kitabında deyir: "**Abdurrahmən bin Həmdən əl-Cəlləb bizə Həmədan şəhərində xəbər verdi; dedi: İbrahim bin Nəsr bizə rəvayət etdi; dedi: Əbul-Valid ət-Tayəlisi bizə rəvayət etdi və dedi: "Rəy əhlindən olan və Əşras adlanan bir şeyxim mənə rəvayət etdi və dedi: "Muhəmməd bin İshaq bizim yanımıza gəldi və İshaq bin Raşid'dən bizə rəvayət edərdi. (Sonra) İshaq bin Raşid (özü) bizim yanımıza gəldi və "bizə əz-Zuhri rəvayət etdi", "bizə əz-Zuhri rəvayət etdi" deməyə başladı. Mən ona dedim: "Sən əz-Zuhri ilə harada qarşılaşmısan?" Dedi: "Onunla qarşılaşmamışam, lakin Qüds şəhərindən yolum düşmüşdü və orada ona aid bir kitab tapdım.**"[458] İshaq bin Raşid alimlər qatında etibar olunan bir rəvayətçidir, lakin alimlər onun əz-Zuhri'dən rəvayət etdiklərini qəbul etməyiblər. Qəbul etməməklərinin səbəbi isə onun həmin kitabı əz-Zuhri'yə ərz etmədən oradan rəvayət etməsinə görə idi. Nəzərə almalıyıq ki, İshaq bin Raşid əz-Zuhri'nin sağ olduğu dövrdə yaşayıb. Bu bizə bir daha onu göstərir ki, o dövrdə alimlər hədis rəvayət edənlərin rəvayətlərini ciddi şəkildə tənqid ediblər. əz-Zuhri'nin kitabından rəvayət etməsinə baxmayaraq bir başa əz-Zuhri'nin özü

---

456. "əl-Kəmil fi Duafə ər-Ricəl", 4/234;

457. "Təhzibut-Təhzib", 6/156;

458. "Mərifətu Ulum əl-Hədis", səh: 110;

ilə qarşılaşmadığı üçün, rəvayətləri ondan eşitmədiyi üçün qəbul etməyiblər. Digər tərəfdən bu nəql bizə əz-Zuhri'nin o dövrdə yazılı kitablarının olduğunu xəbər verir. Ola bilsin ki, həmin kitab əz-Zuhri'nin məşhur "əl-Məğazi" kitabıdır. Ayrıca bir hədis kitabı olması da mümkündür.

əz-Zuhri bəzi hallarda güvəndiyi və etibar etdiyi şəxslərə öz hədis səhifələrini verərdi. İbn Abdilbərr'in isnadı ilə zikr etdiyi xəbərdə İmam əl-Əvzai deyir: **"əz-Zuhri də mənə bir səhifə verdi və dedi: "Bunu məndən rəvayət elə!**"[459] Eləcə də o səhifələrdən birini əz-Zuhri digər böyük alim İbn Cureyc'ə verib və İbn Cureyc özü deyir: "**əz-Zuhri'dən bir şey eşitməmişəm, sadəcə əz-Zuhri mənə bir cüz verdi, onu yazdım və onun üçün mənə icazə verdi.**" [460]Yəni əz-Zuhri ona kiçik kitab verib və o kitabdakı hədisləri əz-Zuhri'nin adından rəvayət etməyə icazə verib.

əz-Zuhri'dən onun kitablarını əsas rəvayət edənlərin başında Şueyb bin Əbi Həmzə durur. Şueybdən isə bu kitabları öyrənənlərin başında Əbul-Yəmən əl-Həkəm bin Nəfi gəlir. əl-Xalili deyir: "**Şueybin nüsxəsini imamlar əl-Həkəm'dən rəvayət edirlər...**"[461] Şueyb bin Əbi Həmzə'nin bir növ əz-Zuhri'nin katibi olduğunu deyə bilərik. Bunu İmam Yəhyə bin Məin təsdiqləyərək deyir: "**Şueyb bin Əbi Həmzə, əz-Zuhri'dən sultan üçün imla olaraq yazdı və o, bir katib idi.**"[462] Daha əvvəl imla ilə qiraət arasında fərqin olduğunu demişdik. Burada biz əz-Zuhri'nin kitablarını imla etdiyini və sultanlara göndərdiyini görürük.

əz-Zuhri'dən hədis yazmış alimlərdən biri də Ubeydullah bin Ömər olub. Yaqub əl-Fəsəvi deyir: "**Yəhyə bin Said (əl-Qattan) dedi: "Ubeydullah bin Ömər dedi: İbn Şihəb gəldikdə yanına getdim, lakin mənə qarşılıq vermədi və mən ona dedim: "Mənim atalarım səninlə belə davranmırdılar." Dedi: "Sən kimsən?" Mən də ona nəsəbimi söylədim. Bu zaman razılıq verdi və mən də Malik'in yanına getdim, onun kitabını**

459. "Cəmiu Bəyənil-İlmi va Fadlihi", 2/1155;
460. İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 5/357-358;
461. "İkməlu Təhzibil-Kəməl", 4/111;
462. "Tərixu İbn Məin", səh: 42;

**götürdüm. Bunun üzərinə dedi: "Kitabı dinləmək lazımdır." Biz də bir hissəsini dinlədik, digər hissəsi qaldı.**"[463] Ubeydullah bin Ömər (h. 70-147) nəsəb cəhətdən Ömər bin əl-Xattab'ın nəsəbindəndir və uzun adı Əbu Osman Ubeydullah bin Ömər bin Həfs bin Asim bin Ömər bin əl-Xattab əl-Quraşi əl-Adəvidir. əz-Zuhri onun babalarından hədis öyrənən tələbələrdən biri idi və Ubeydullah əz-Zuhri'nin ona eyni dərəcədə qarşılıq vermədiyini gördükdə ona bu həqiqəti xatırlatmış və əz-Zuhri'nin diqqətini özünə cəlb etməyi bacarmışdı. Buradan görürük ki, əz-Zuhri'nin hədislərini İmam Malik bin Ənəs'dən götürərək əz-Zuhriyə ərz edir. əl-Fəsəvi buyurur: "**əl-Abbas bizə rəvayət etdi və dedi: Abdurrazzəq bizə rəvayət etdi; dedi: Ubeydullah bin Ömər mənə dedi: Mən, Yəhya və Malik, İbn Şihəbdən yalnız ərz etmək yolu ilə hədis öyrənmişik və (kitabı) Malik bizim üçün oxuyardı və gözəl qiraəti var idi.**"[464] Osman bin Miktəl bizə Ubeydullah bin Ömər'in belə dediyini rəvayət edir: "**İbn Şihəb mənə bir səhifə verdi və dedi: "İçindəkiləri köçür və məndən rəvayət et...**"[465]

İbn Hibban deyir: "**Muhəmməd bin Ziyəd bin Mərvan əl-Yəşkuri Nəccar əhlindən olan bir sünnət və fəzilət sahibidir. Osman bin Abdirrahmən əl-Vaqqasi'dən, o da əz-Zuhri'dən bir nüsxə rəvayət edir. Ondan isə Cəfər bin Davud ər-Rab'i ən-Nəccəri rəvayət edir.**"[466] Beləliklə də əz-Zuhri'dən hədis səhifəsi almış digər şəxsin Osman bin Abdirrahmən əl-Vaqqasi olduğunu öyrəndik. Onun kimi əz-Zuhri'dən nüsxə rəvayət edən bir başqası Əbu

463. "əl-Mərifətu vat-Tərix", 3/158;

464. "əl-Mərifətu vat-Tərix", 3/158;

465. "əs-Siqat", 8/452; İbn Hibban bu xəbərin isnadını bu cür təqdim edir: "Ömər bin Muhəmməd əl-Həmdəni mənə öz kitabından rəvayət etdi; Muhəmməd bin Davud bin Nəciyə bizə rəvayət etdi; Ziyəd bin Yunus bizə rəvayət etdi; Osman bin Məktəl bizə Ubeydullah bin Ömər'dən rəvayət etdi..." Ömər bin Muhəmməd əl-Həmdəni (223-311) böyük hafiz Əbu Həfs Ömər bin Muhəmməd bin Buceyr əl-Həmdəni əs-Səmərqandi'dir. əz-Zəhəbi onu "imam, hafiz, səbt" olaraq vəsf edir. Muhəmməd bin Davud bin Nəciyə (vəfatı 251) isə Əbu Abdilləh Muhəmməd bin Davud bin Rizq bin Davud bin Nəciyə bin Umeyr əl-İskəndərani'dir. İmam ən-Nəsəi onu şeyxləri arasında zikr edir və "siqa" olduğunu deyir. Ziyəd bin Yunus (vəfatı 221) Əbu Sələmə Ziyəd bin Yunus bin Said bin Sələmə əl-Hədrami əl-İskəndərani'dir. İbn Yunus əl-Misri tarixində onu zikr edir və deyir: "səbt və siqa ravilərdən biridir." Osman bin Miktəl misirlidir və İbn Hibban onun haqqında "müsəlmanların siqalarından və mutqinlərindən biridir" deyir.

466. "əs-Siqat", 9/47;

Amr Abdurrahmən bin Nəmr əl-Yəhsəbi'dir. İbn Adiy əl-Curcəni deyir: "**Bu Abdurrahmən bin Nəmr'in əz-Zuhri'dən birdən çox nüsxəsi vardır ki, içindəki hədislər müstəqimdir.**"[467] Deməli əl-Curcəni həmin nüsxəni görüb, onunla tanış olub, içindəki hədisləri nəzərdən keçirib və o hədislərin həqiqətən də əz-Zuhri'dən rəvayət edilmiş hədislər olması qənaətinə gəlib. "Musnədul-Bəzzər" kitabının sahibi Əbu Bəkr Əhməd bin Amr əl-Bəzzər (vəfatı hicri 292) kitabında bir neçə yerdə deyir: "**Abdullah bin Şəbib bizə rəvayət etdi; dedi: Əhməd bin Muhəmməd bin Abdilaziz bizə rəvayət etdi; dedi: atamın əz-Zuhri'dən kitabında tapdım ki...**"[468] əz-Zuhri'nin özünün kitablarının və ondan yazılmış kitabların çox olması heç kəsdə şübhə doğurmur. O kitabların bir çoxu əz-Zuhri'nin qardaşı oğlunda olub. Əli bin əl-Mədini ilə Abdurrahmən bin Mehdi arasında keçən dialoqdan bunu görə bilirik. İbn Əbi Hətim deyir: "**Saleh (bin Əhməd) bizə xəbər verdi: Əli (bin əl-Mədini) bizə xəbər verdi; dedi: "Abdurrahmənə - yəni İbn Mehdi'yə - dedim: "əz-Zuhri peyğəmbərdən – salləllahu aleyhi va sələm – namazda gülmək barəsində bir şey rəvayət edibmi?" Abdurrahmən dedi: "Bir nəfər mənə rəvayət etdi ki, o, bu hədisi İbn Şihəbin qardaşı oğlunun yanında əz-Zuhri'nin kitablarında görüb...**"[469] Bunu həmçinin İbn Adiy də təsdiqləyərək deyir: "**Bu, onun əmisindən rəvayət etdiyi bir nüsxədir ki, xəbərlərinin hamısı müstəqimdir və əz-Zuhri'nin qardaşı oğlundan onun əmisi əz-Zuhri'dən rəvayət etdiyi nüsxəni Yaqub bin İbrahim bin Sad rəvayət edir. əz-Zuhri'nin qardaşı oğlundan (həmçinin) Muhəmməd bin İshaq rəvayət edir və onun hədisində hansısa bir problem görməmişəm.**"[470] əz-Zuhri'nin hədis nüsxəsini qardaşı oğlu Muhəmməd, ondan isə İmam Əbu Yusuf Yaqub bin İbrahim bin Sad bin İbrahim bin Abdirrahmən bin Auf əz-Zuhri (vəfatı hicri 208) rəvayət edir. Əli bin əl-Mədini, Yəhyə bin Main, Əhməd bin Hənbəl kimi hədis nəhəngləri bu imamla eyni zamanda yaşayıblar və əz-Zuhri'nin qardaşı oğlundan gələn bu nüsxə böyük imamların zamanına qədər çatıb.

---

467. "əl-Kəmil fi Duafə ər-Ricəl", 5/478;

468. "Musnəd əl-Bəzzər", 14/300 (7913) və 18/186 (172)

469. "əl-Cərh vat-Tədil", 1/260;

470. "əl-Kəmil fi Duafə ər-Ricəl", 7/365;

ət-Təbərani deyir: “**Əhməd bin Muhəmməd bin Yəhyə bizə rəvayət etdi; dedi: atam mənə öz atasından belə dediyini rəvayət etdi: Sələmə bin Amr əl-Qadi mənə rəvayət etdi; dedi: əz-Zuhri’ni divanında öz əl yazısı ilə belə dediyini gördüm: “Nəfi mənə İbn Ömər’dən belə dediyini rəvayət etdi: Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: “Sizdən kim cüməyə gələrsə qoy qüsl alsın!**”[471] Sələmə bin Amr əl-Uqeyli Dəməşqin qazisi olub və Yəhyə bin Həmzə onun haqqında “**Dəməşq əhlindən siqa biri idi**” deyir.[472] əz-Zəhəbi’nin “Tərixul-İslam” kitabındakı məlumata görə hicri 171 ilə 180-ci illər arasında vəfat edib. Sələmə bin Amr’ın əz-Zuhri’nin kitablarını tapmasını İbn Asəkir tarixində digər sənədlərlə də təsdiqləyir. Xüsusilə də bu kitabların əz-Zuhri’nin öz əl yazısı ilə yazıldığını qeyd edir. Bu isə “vicədə” dediyimiz rəvayət yolunun bir misalıdır.

Əslində tarixi qaynaqlarda keçən əz-Zuhri’dən hədis yazmış kəslərin adları bizim burada yazdıqlarımız ilə məhdudlaşmır. Şeyx Mustafa əl-Azami kitabında əz-Zuhri’dən hədis yazmış 51 ravinin adını zikr edir və onların arasında Musa bin Uqbə, Malik bin Ənəs, Mə’mər bin Raşid, Muhəmməd bin İshaq, əl-Leys bin Sad, İbn Cureyc, əl-Əvzai, Sufyan bin Uyeynə, Sufyan əs-Səvri, Rabi’atur-Rəy, Əyyub əs-Səxtiyəni kimi böyük imamların adlarını da çəkir.

## Əbu Abdirrahmən əl-Hubuli

Əbu Abdirrahmən Abdullah bin Yezid əl-Məafiri əl-Hubuli əslən misirlidir. Səhabələrin tələbələrindən sayılır. Cabir bin Abdilləh, Abdullah bin Ömər, Abdullah bin Amr bin əl-As, Uqbə bin Amir əl-Cuhəni, Əbu Zər əl-Ğifəri, Əbu Said əl-Xudri kimi səhabələrdən hədis eşitmiş və elm öyrənmişdir. Alimlərin nəzərində əl-Hubuli etibarlı, güvənilən bir kimlikdir. Tarixçi İbn Yunus “Tərixu Misir” kitabında onu “**saleh və fəzilətli bir şəxs**” kimi vəsf edir. Həmçinin tarixçilər qeyd edirlər ki, Əndəlüs torpaqlarına daxil olub, hətta Qurtuba əhlindən gələn tarixi xəbərlərə görə əl-Hubuli ömrünün son

471. “əl-Mucəm əl-Əvsət”, 1/19 (46)

472. İbn Asəkir, “Tərixu Diməşq”, 22/107;

günlərini orada keçirmiş və orada dəfn olunmuşdur. Hicri 100-cü ildə vəfat etdiyi deyilir.

əl-Hafiz İbn Həcər "Fəthul-Bəri" kitabında deyir: "**Lakin Əbul-Qasim İbn Məndəh'in "əl-Vasiyyə" kitabında əl-Buxari kanalı ilə onun Əbu Abdirrahmən əl-Hubuli'yə qədər çatan səhih sənədi ilə (bir rəvayət) gördüm ki, o, içində hədislər olan bir kitab ilə Abdullah'ın yanına gəldi və dedi: "Bu kitabın içindəkilərə bax; onlardan tanıdığın nəsə varsa saxla qalsın, tanımadığın varsa sil getsin!**"[473] əl-Hubuli'nin ərz etdiyi kitabın yalnız bir səhabədən eşitdiyi, yoxsa çox sayda səhabədən eşitdiyi hədislərdən ibarət olduğunu bilmirik, bu barədə tarixi xəbərdə ətraflı məlumat keçmir. Lakin hər bir halda əl-Hubuli'nin yazdığı hədisləri bir səhabəyə ərz etdiyini görürük. Burada Abdullah ilə qəsd olunan səhabənin kim olduğu da zikr olunmur. İbn Həcər deyir: "**Buradakı Abdullahın ibn Ömər bin əl-Xattab olması möhtəməldir, çünki əl-Hubuli ondan hədis eşidib və İbn Amr bin əl-As olması da möhtəməldir, çünki əl-Hubuli ondan rəvayət etməklə məşhurdur.**"[474] Bədruddin əl-Ayni etiraz edir və onun Abdullah bin Məs'ud olması ehtimalının daha güclü olduğunu deyir, çünki səhabə dövründə Abdullah deyildikdə ilk ağla gələn İbn Məsud idi. İbn Həcər bu etirazın doğru olmadığını ifadə edərək buyurur: "**Bu fənnin əhlindən nəql edərək əl-Xatib deyib: "Əgər bir misirli "Abdullahdan" deyərsə qəsdi Abdullah bin Amr bin əl-As'dır və bir kufəli "Abdullahdan" deyərsə qəsdi Abdullah bin Məsud'dur." əl-Hubuli isə misirlidir.**"[475] Önəmli olan budur ki, Abdullah səhabədir və əl-Hubuli əlindəki hədis kitabını ona ərz edir.

## Yəhyə bin Əbi Kəsir

Əbu Nəsr Yəhyə bin Əbi Kəsir ət-Tai əl-Yəməmi'ni əl-Hafiz əz-Zəhəbi kitabında "imam, hafiz" olaraq vəsf edir. Əbu Kəsir atasının kunyəsidir və atasının əsl adının Saleh olduğu deyilir. Əbu

473. "Fəthul-Bəri", 1/154

474. Eyni mənbə:

475. "İntiqadul-İtirad", 1/119;

Uməmə əl-Bəhili və Cabir bin Abdilləhdən mürsəl olaraq rəvayət edir, lakin Ənəs bin Malik'dən hədis eşitmişdir. Bu da onu tabii təbəqəsinə daxil edir. əz-Zəhəbi onun çoxlu elm topladığını, sayılıb-seçilən bir alim olduğunu deyir. Hicri 129-cu ildə vəfat edib.

Hədis kitablarına nəzər saldıqda görürük ki, Yəhyə bin Əbi Kəsir elmi yazılı şəkildə toplayanlardan olub. Bu yazdıqlarını xüsusən Hişəm bin Əbi Abdilləh əd-Dəstuvai'yə göndərərdi. Buna bəzi misallar verməkməqsədə uyğundur. Əbu Davud ət-Tayəlisi deyir: "**Hişəm (əd-Dəstuvai) bizə rəvayət etdi: Yəhyə bin Əbi Kəsir mənə Abdullah bin Əbi Qatədə'dən, o da atasından belə dediyini rəvayət edərək yazdı: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Namaza iqamə verilibsə məni görməyənə qədər qalxmayın!**"[476] İmam Əhməd deyir: "**İsmail bizə rəvayət etdi: Hişəm bizə xəbər verdi; dedi: Yəhyə bin Əbi Kəsir İkrimə'dən, o da Ömər'dən rəvayət edərək yazdı...**"[477] İmam Muslim "əs-Sahih" kitabında deyir: "**Zuheyr bin Hərb bizə rəvayət etdi: İsmail bin İbrahim bizə Hişəmdən, yəni əd-Dəstuvai'dən belə dediyini rəvayət etdi: Yəhyə bin Əbi Kəsir mənə Yə'lə bin Həkim'dən, o da Said bin Cubeyr'dən, o da İbn Abbas'dan rəvayət edərək yazdı...**"[478]

Yəhyə bin Əbi Kəsir həmçinin öz dövründə mövcud olan yazılı sünnəti də toplamaqdan geri qalmamışdır. İmam əl-Beyhəqi "əs-Sunən əl-Kubra" kitabında Hişəmə qədər çatan səhih isnad ilə onun belə dediyini rəvayət edir: "**Yəhyə bin Əbi Kəsir dedi: "Yəhyə bin Said mənə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – Amr bin Həzmə yazdığı və Əbu Bəkr bin Muhəmməd bin Amr bin Həzmin ixtiyarında olan kitabın bir nüsxəsini yazıb göndərdi və gördüm ki, orada yazılıb...**"[479] Daha sonra

476. "Musnəd Əbi Davud ət-Tayəlisi", 1/508 (602)

477. "əl-Musnəd", 3/437;

478. "Sahih Muslim", (1473)

479. "əs-Sunən əl-Kubra", 8/148; əl-Beyhəqi deyir: "Əbul-Huseyn bin Bişran əl-Adl bizə Bağdadda xəbər verdi: Əbu Cəfər Muhəmməd bin Amr ər-Razzəz bizə bildirdi: Yəhyə bin Cəfər bizə rəvayət etdi: Vahb bin Cərir bizə bildirdi: Hişəm bizə rəvayət etdi..." İbn Bişran (328-415) əl-Beyhəqi, əl-Xatib kimi alimlərin şeyxidir və "doğru sözlü" olaraq vəsf edilib. Əbu Cəfər ər-Razzəz (251-339) haqqında əl-Həkim ən-Nisəburi və əl-Xatib əl-Bəğdədi "etibarlıdır" deyiblər. Yəhyə bin Cəfər isə Əbu Zəkəriyyə Yəhyə bin Cəfər

həmin kitabda keçən “qan pulu” məsələlərindən bir qədər zikr edir. Beləliklə də Amr bin Həzm’in kitabından bir nüsxə Yəhyə bin Said əl-Ənsari’də olub və onu köçürərək Yəhyə bin Əbi Kəsirə göndərib.

İmam Əhməd deyir: “**Abdussaməd bizə rəvayət etdi: Hərb (bin Şəddəd) bizə rəvayət etdi; dedi: Yəhyə (bin Əbi Kəsir) dedi: “Əbu Səlləm’dən rəvayət etdiyim hər bir şey sadəcə bir kitabdır.**”[480] Bununla Yəhyə bin Əbi Kəsir’in qəsd etdiyi budur ki, Əbu Səlləm’dən rəvayət etdikləri ondan özünün eşitdikləri deyildir, lakin Əbu Səlləm’in ona göndərdiyi kitabdır. Əbu Səlləm isə Məmtur əl-Həbəşi’dir, Huzeyfə, Səvbən, Əli, Əbu Zərr, Əbu Uməmə əl-Bəhili, ən-Numən bin Bəşir kimi səhabələrdən hədis rəvayət edib. Hicri 100 və 110-cu illər arasında vəfat edib. əz-Zəhəbi deyir: “**(Əbu Səlləm) öz rəvayət etdiklərindən olan hədisləri Yəhyə bin Əbi Kəsirə yazaraq göndərmişdi.**”[481] Aşkar olan budur ki, Yəhyə bin Əbi Kəsir hədisi yazmağa, kitabları toplamağa əhəmiyyət verdiyi üçün Əbu Səlləm öz yazdıqlarını ona göndərmişdi.

## Racə bin Həyva

Səhabələrə tələbəlik etmiş və onların hədislərini yazmış kəslərdən biri də Şam torpaqlarının övladlarından Əbu Nəsr Racə bin Həyva bin Cərval əl-Kindi əl-Əzdi’dir. Babası Cərval bin əl-Əhnəf’in səhabə olduğu deyilib. Muaz bin Cəbəl, Əbud-Dərdə, Ubədə bin Samit kimi səhabələrdən mürsəl olaraq hədis rəvayət edib və həmçinin Abdullah bin Amr, Müaviyə, Əbu Said əl-Xudri, Cabir bin Abdilləh, Əbu Uməmə əl-Bəhili, Mahmud bin ər-Rabi və başqa səhabələrdən hədis eşitmişdir. Ondan isə əz-Zuhri, Qatədə, Humeyd ət-Tavil və başqaları hədis rəvayət ediblər. Hicri 112-ci ildə vəfat edib.

İmam əd-Dərimi deyir: “**Racə bin Həyva dedi: “Hişəm bin Abdilməlik öz valisinə yazaraq ona məndən bir hədis barədə**

bin A’yən əl-Buxari əl-Bikəndi’dir, hicri 243-cü ildə vəfat edib. əz-Zəhəbi onu “hüccət” olaraq vəsf edir. Vahb bin Cərir isə Əbul-Abbas əl-Əzdi’dir, doğru sözlüdür, 206-cı ildə vəfat edib.

480. “əl-İləlu va Mərifətur-Ricəl”, səh: 195 (344)

481. “Siyər Əaləmin-Nubələ”, 4/356;

**soruşmasını əmr etdi." Racə deyir: "O hədis məndə yazılı şəkildə olmasaydı onu artıq unutmuşdum.**"[482] Bu xəbərin şahidliyi ilə deyə bilərik ki, Racə bin Həyva və onun kimi səhabələrə tələbəlik etmiş böyük alimlər hədisləri əzbərləmək ilə yanaşı onları yazardılar. Racə'nin yazdığının tək bir hədisdən ibarət olduğunu yoxsa əlinin altında bir kitab olduğunu bu xəbərdən anlamaq olmur. Amma bir hədis olmasında xüsusi bir məna yoxdur və zamanının adətinə müvafiq olaraq əlində bir kitabın olduğunu söyləməyimiz daha münasibdir.

## Süleyman ət-Teymi

Racə bin Həyva'nın halına müvafiq olaraq burada Süleyman bin Tarxan ət-Teymi'ni xatırlamaq yerinə düşür. Əbul-Mutəmər Süleyman bin Tarxan ət-Teymi əl-Bəsri məşhur səhabə Ənəs bin Malik'in tələbələrindən biri olub. Həmçinin muxadram[483] kateqoriyasından olan Əbu Osman ən-Nəhdi'dən, eləcə də Yezid bin Abdilləh bin əş-Şixxir, Tavus bin Keysən, Əbu Micləz, Səbit əl-Bunəni, Qatədə, əl-Aməş və daha çox sayda alimdən hədis rəvayət edib. əz-Zəhəbi onu "şeyxul-islam" olaraq vəsf edir və hicri 143-cü ildə Basra şəhərində 97 yaşında vəfat etdiyini qeyd edir.

əl-Buxari "əs-Sahih" kitabında Süleyman ət-Teymi vasitəsi ilə hədis rəvayət edir. əl-Buxari deyir: "**Abdullah bin Muhəmməd bizə rəvayət etdi: Arim bizə rəvayət etdi: əl-Mutəmər bin Süleyman bizə atasının belə dediyini rəvayət edir: Əbu Təmimə'ni Əbu Osman ən-Nəhdi'dən rəvayət edərkən eşitdim ki, Əbu Osman ona Usamə bin Zeyd'dən – radiyallahu anhumə - rəvayət etmişdir: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – məni götürərdi, sonra dizi üstünə oturdardı və**

482. "Sunən əd-Dərimi", (522). əd-Dərimi bunu bu isnad ilə rəvayət edir: "əl-Valid bin Şucə bizə xəbər verdi: Muhəmməd bin Şueyb bin Şəbur mənə rəvayət etdi: əl-Valid bin Süleyman bin Əbis-Səib mənə bildirdi ki, Racə bin Həyva ona rəvayət edərək deyib...". İsnadı səhihdir.

483. "Muxadram" İslamdan əvvəlki dövrdə doğulmuş, lakin İslamı daha gec bir dövrdə qəbul etmiş kəslərə deyilir, bu kəslər İslam gəlmədən öncə doğulmuş olsalar belə peyğəmbəri görərək iman gətirmədikləri üçün, daha sonra iman gətirdikləri üçün səhabə sayılmırlar, onları "muxadram" adlandırırlar.

**əl-Həsən'i digər dizinə oturdardı, sonra hər ikimizi də qucaqlayardı və deyərdi: "Allahım, bu ikisinə rəhm et, çünki mən onlara rəhm edirəm.**" əl-Buxari bunu rəvayət etdikdən sonra başqa bir kanal ilə belə bir məlumatı rəvayət edir: "**Əli (bin əl-Mədini)dən: dedi: Yəhya (bin Said əl-Qattan) bizə rəvayət etdi: "Süleyman (ət-Teymi) bizə Əbu Osman'dan rəvayət etdi." (Süleyman) ət-Teymi dedi: "Bununla bağlı qəlbimə şəkk düşdü və özlüyümdə dedim: "(Görəsən) mənə bunu əslində bu şəkildə rəvayət ediblər, bunu heç də Əbu Osman'ın özündən eşitməmişəm. Sonra yazdıqlarıma baxdım və gördüm ki, o, mənim yazılarımda ondan eşitdiklərim arasında yazılıb.**"[484] Burada Muhəmməd bin İsmail əl-Buxari bizə Süleyman ət-Teymi'nin eyni hadisəni həm bir başa Əbu Osman ən-Nəhdi'dən, həm də Əbu Təmimə vasitəsi ilə Əbu Osman ən-Nəhdi'dən rəvayət etdiyini iki ayrı sənəd ilə göstərir. Aşkar olan budur ki, Süleyman ət-Teymi bu hədisi hər iki cür eşidib, bir dəfə bir başa Əbu Osman ən-Nəhdi'dən, digərində isə onun tələbəsi Əbu Təmimə vasitəsi ilə eşidib. Lakin daha sonra bu hədisi Yəhyə bin Said əl-Qattan'a rəvayət etdikdə qəlbinə şübhə düşür, həqiqətən də bir başa Əbu Osmanın özündən eşidib eşitmədiyində şəkk edir. Daha sonra yazısına baxdıqda görür ki, Əbu Osmanın özündən eşidib.

Bu xəbər də Racə bin Həyvada olduğu kimi Süleyman ət-Teymi'nin də hədislərini yazdığını göstərir və bu cür unutqanlıq və ya şübhə ilə qarşılaşdıqlarında yazdıqlarına əsaslanaraq hədislərini dəqiqləşdirərmişlər.

## Digər misallar

Bəzi şəxsiyyətlər və onların hədis yazmaq fəaliyyətləri haqqında təfsilatlı məlumatlar təqdim olundu. Burada həm birinci əsrdən, həm də ikinci əsrin ilk yarısından ümumi misalları bir arada zikr edəcəyik və yuxarıda təsvir etdiyimiz mənzərinin digər misallarda da təsdiqini tapdığını göstərəcəyik.

484. "Sahih əl-Buxari", (6003)

Yəhyə bin əl-Cəzzər əl-Urani kufəli hədis ravilərindəndir. Əli bin Əbi Talib, İbn Abbas, Ummu Sələmə, Aişə və digər səhabələrdən hədis rəvayət edir. Təqribən hicri 80-ci ildə vəfat edib. əl-Xatib əl-Bağdadi isnadını zikr edərək deyir: "**Harun bin Said əl-Əyli deyir: "Əyyub bin Suveyd'dən Şubə'nin nə üçün əl-Həsən bin Umara'nı tənqid etdiyini soruşdum. Dedi: "Deyirdi ki, əl-Hakəm bin Uteybə heç vaxt Yəhyə əl-Cəzzər'dən üç hədisdən başqa bir şey rəvayət etməyib. Lakin əl-Həsən əl-Hakəm vasitəsi ilə Yəhya'dan çoxlu hədis rəvayət edir." Bunu əl-Həsən bin Umara'ya dedim və dedi: "əl-Hakəm Yəhya'dan hədislərini bir kitab formasında mənə verdi ki, onları əzbərləyim. Mən də əzbərlədim.**"[485]

İbn Həcər deyir: "**Abdulməlik bin Həbib əl-Əzdi - əl-Kindi də deyirlər – Əbu İmran əl-Cəvni əl-Bəsri alimlərdən biridir. (Səhabə) İmran bin Huseyni görüb... və Abdullah bin Rabəh əl-Ənsari'dən kitab olaraq rəvayət edib...**"[486] Abdullah bin Rabəh əl-Ənsari təxminən 90-cı ilin civarında vəfat edib. Basralı alimlərdəndir, səhabələrdən elm alıb və onun yazdığı hədisləri Abdulməlik bin Həbib əl-Əzdi (hicri 128-ci ildə vəfat edib) rəvayət edir. Burada kitab olaraq qəsd olunan budur ki, Abdullah bin Rabəh hədisləri yazaraq Əbu İmran Abdulməlik bin Həbib əl-Əzdi əl-Cəvni'yə göndərərmiş. İmam Əhməd "əl-Musnəd" kitabında deyir: "**Abdurrahmən bin Mehdi bizə rəvayət etdi: Həmməd bin Zeyd bizə Əbu İmran əl-Cəvni'dən belə dediyini rəvayət etdi: "Abdullah bin Rabəh mənə yazaraq Abdullah bin Amr'dan rəvayət edir...**"[487] İmam Muslim bunu "əs-Sahih" kitabında Əbu Kəmil Fudeyl bin Huseyn əl-Cəhdəri'dən, o da Həmməd bin Zeyd'dən rəvayət edir.

485. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 112; "Tərixu Bəğdəd", 8/322; Əhməd bin Əbi Cəfər əl-Qati'i – Muhəmməd bin əl-Muzaffər əl-Hafiz – Əli bin Əhməd bin Süleyman – Harun bin Said əl-Əyli kanalı ilə rəvayət edir. Harun bin Said bin əl-Heysəm əl-Əyli (170-253) siqa və fəzilətli bir alimdir. Əli bin Əhməd bin Süleyman (220-317) Allən əl-Misri ləqəbi ilə tanınır, kunyəsi Əbul-Həsən'dir. İbn Yunus tarix kitabında onu "siqa, çoxlu hədis rəvayət edən" biri kimi vəsf edir. Tələbəsi İbnul-Muzaffər isə (286-379) Əbul-Huseyn Muhəmməd bin əl-Muzaffər bin Musa əl-Bəzzəz əl-Bəğdədi'dir. Böyük yazıçı alimdir, əd-Dəraqutni onun haqqında – "siqa, məmun" – deyib. Əhməd bin Əbi Cəfər əl-Qati'i isə (367-441) Əbul-Həsən Əhməd bin Muhəmməd bin Əhməd əl-Atiqi'dir. əl-Xatib əl-Bağdadi'nin şeyxidir və haqqında "doğru sözlüdür" deyir.

486. "Təhzibut-Təhzib", 6/389;

487. "əl-Musnəd", 11/405-406;

İmam Əhməd deyir: "**Əbu Bəkr əl-Hənəfi bizə rəvayət etdi: Ömər bin İshaq bin Yəsər bizə rəvayət edərək dedi: "(Əmim) Ata bin Yəsər'ə aid bir kitabda Ata bin Yəsər ilə birlikdə oxudum: "Dedi: Peyğəmbərin – salləllahu aleyhi va səlləm – zövcəsi Meymunə'dən xuflara məsh çəkmək barəsində soruşdum...**"[488] Əbu Muhəmməd Ata bin Yəsər (h. 29-103) Mədinə şəhərində Osmanın xəlifəliyi dövründə doğulub. Abdullah bin Məsud kimi səhabələrdən hədis eşidib. Rəvayətdən də anladığımız kimi Meymunə'dən də hədis eşidib.

Nəfi bin Əbi Nueym Quran ravilərindən biridir. Hicri 70-ci illərdə Abdulməlik bin Mərvan'ın xəlifə olduğu dövrdə anadan olub. Quranın rəvayətlərindən biri onun adı ilə bağlıdır və o, Quranı Əbu Hureyra'nın tələbəsi Abdurrahmən bin Hurmuz əl-Arac'a, həmçinin Əbu Cəfər Yezid bin əl-Qa'qa, Şeybə bin Nisah, Muslim bin Cundəb əl-Huzəli və Yezid bin Rumana oxuyub və onlardan öyrənib. Onlar isə Ubeyy bin Kə'b və Zeyd bin Səbit'in tələbələrindən öyrəniblər. Nəfi bununla yanaşı həm də hədis rəvayət edən olub, hafizəsinə görə tənqid olunub, çünki hafizəsindən rəvayət etdikdə xətalar edərmiş. Amma yazılı şəkildə bəzi nüsxələr köçürüb və nəql edib. əz-Zəhəbi deyir: "**İbn Adiy "əl-Kəmil" kitabında dedi:** "**Onun (Abdurrahmən) əl-Arac'dan bir nüsxəsi var və (içində) təxminən yüz hədis var. Onun bir də Əbuz-Zinəd'dən başqa bir nüsxəsi vardır.**"[489] Əbuz-Zinəd məhz əl-Arac'ın ən məşhur tələbəsi olaraq tanınır. Haqqında daha öncə məlumat vermişdik. Nəfi özü də əl-Arac'ın tələbələrindəndir. Görünür ki, həm müəllimindən yazdığı bir nüsxəyə sahib olduğu kimi həm də tələbə yoldaşının da yazdığı nüsxəni köçürmüşdür. Nəfi' hicri 169-cu ildə vəfat edib. əl-Arac 117-ci ildə, İbnuz-Zinəd isə 130-cu ildə vəfat edib. Nəfi'nin nəql etdiyi nüsxələr hicri ikinci əsrin nümunələrindən sayılır.

İbn Əbi Xeysəmə tarix kitabında deyir: "**əz-Zubeyr bin Bəkkər mənə dedi: "Bəkkər bin Muhəmməd bin Cərast'a oğlunu göndərdim ki, mənə Hişəm bin Urva'dan və Musa bin Uqbə'dən eşitdiklərini göndərsin ki, onların üzünü köçürüm**

488. "əl-Musnəd", 44/410;

489. "Siyər Əaləmin-Nubələ", 7/338;

**və onları ona ərz edə bilim. O da mənə adam göndərdi ki, (mənə rəvayət etdi deyərək) rəvayət etməyəcəyimə söz verim və (əlavə etdi: ) "ərz etmək bizdə rəvayət etmək kimidir, lakin sənə başqasına vermədiyimi verəcəm. Sənə iki kitab göndərirəm, onların üzlərini köçür və onların ikisini də ərz et. Sonra mənim bu iki kitabımı məndən (mənə rəvayət etdi deyərək) rəvayət et. Bu halda məkruh olmayacaq; çünki mən Hişəm bin Urva'nın məclisində iştirak edirdim və İbn Cureyc onun yanında içində onun hədislərindən olan bir səhifə ilə gəldi və dedi: "Ey Əbul-Munzir, bunları səndən rəvayət edimmi? Hişəm onu vərəqlədi, sonra ona dedi: "Bunları mənim adımdan rəvayət et!" Beləliklə də Hişəm buna İbn Cureyc üçün razı oldu və İbn Cureyc də Hişəm'dən razı oldu.**"[490] Bu xəbərdən anlaşılır ki, Hişəm bin Urva və Musa bin Uqbə'nin hədisləri Bəkkər bin Muhəmməd'də kitab şəklində mövcud olub. Əbu Bəkr İbn Əbi Xeysəmə (h. ?–279) əsli indiki Türkmənistan ərazisində yerləşən Nisə məntəqəsindən olan tarixçi bir alimdir. Digər böyük tarix və nəsəb alimi mədinəli əz-Zubeyr bin Bəkkər'dən (h. 172-256) bunu nəql edir. Bəkkər bin Muhəmməd bin Cərast əl-Mədəni isə hicri 181-190-cı illər arasında vəfat etmiş Quran və ərəb dili alimidir. Musa bin Uqbə'dən (h. ?-141) və Hişəm bin Urva'dan (h. 61-146) hədis yazıb, onlara tələbəlik edib. Biz burada artıq hicri üçüncü əsrdə fəaliyyət göstərmiş iki alim arasındakı yazışmaya şahidlik edirik. əz-Zubeyr bin Bəkkər bir tarixçi alimə xas olduğu kimi kitabları toplamağa etina göstərmişdir. Həmçinin məkkəli tarixçi Əbu Abdilləh Muhəmməd bin İshaq əl-Fəkihi (272-ci ildən sonra vəfat edib) buyurur: "**Bizə bunu əz-Zubeyr bin Əbi Bəkr rəvayət etdi; dedi: İbn Əbi Nəmir'in kitablarından olduğunu zikr edən bir kitabda tapdım…**"[491] İbn Əbi Nəmir'in özündən sonra kitablar tərk etdiyini öyrənmiş oluruq. İbn Əbi Nəmir isə hicri 140-cı ildən öncə vəfat etmiş Əbu Abdilləh Şərik bin Abdilləh əl-Mədəni'dir. Səhabələrdən Ənəs bin Malik'dən hədis rəvayət edib.

Abdullah bin Əhməd deyir: "**Davud bin Amr bizə rəvayət etdi; dedi: Abdurrahmən bin Mehdi'ni belə xatırlayarkən**

490. İbn Əbi Xeysəmə, "ət-Tərix əl-Kəbir", 1/251 (865)

491. əl-Fəkihi, "Əxbəri Məkkə", 3/183;

**eşitdim: "Sufyan əs-Səvri Basra şəhərində bizim yanımızda gizlənərkən mənim əlimdə dəridən dəftər gördü və dedi: "Bu nə dəftərdir?" Dedim: "Burda bir şeyxin dəftəridir, adına əl-Əsvad bin Şeybən deyirlər. Əbu Nəufəl bin Əbi Aqrab'dən rəvayət edərdi." Dəftərə baxdı və dedi: "O şeyxin yanına getmək istədikdə mənə xəbər ver!**"[492] Bu misalda keçən dəftər çox ehtimal ki, əl-Əsvad bin Şeybən'in məclisində yazılmış hədis dəftəridir. Kitab da deyə bilərik. Əbu Nəufəl bin Əbi Aqrab isə səhabə övladıdır və atasından peyğəmbərin – salləllahu aleyhi va səlləm – hədislərini eşidib. Həmçinin Aişə, İbn Abbas, Abdullah bin Ömər, Abdullah bin Amr, Əsma bint Əbi Bəkr'dən hədis rəvayət etmişdir. Ondan isə əl-Əsvad bin Şeybən, Şu'bə bin əl-Həccəc, Abdulməlik bin Cureyc kimi alimlər hədis rəvayət ediblər. Bu gün sünnət kitablarında keçən və Əbu Nəufəl bin Əbi Aqrab'dən rəvayət olunan hədislər əsasən əl-Əsvad bin Şeybən vasitəsi ilə rəvayət olunub. Əbu Davud ət-Tayəlisi, İshaq bin Rahaveyh, Əhməd bin Hənbəl müsnəd əsərlərində, əl-Buxari "əl-Ədəb əl-Mufrad" kitabında onun hədislərini yalnız əl-Əsvad bin Şeybən yolu ilə rəvayət edirlər.

Daha bir misal Abdulhəmid bin Bəhram'dandır. İmam Yəhyə bin Main deyir: "**Onda bir bəis yoxdur və onda bir səhifə var idi.**"[493] Hafiz əz-Zəhəbi deyir: "**Abdulhəmid bin Bəhram əl-Fəzəri əl-Mədəini mühəddis; Şəhr bin Həvşəb'in tələbəsi olub. Şəhr'dən gözəl bir nüsxə rəvayət edib... Əhməd bin Hənbəl dedi: "Onun Şəhr'dən hədisləri muqaribdir və onların sayı yetmişdir; onu sanki bir surə kimi əzbər bilirdi.**"[494] Burada adı keçən Şəhr bin Həvşəb səhabə xanım Əsma bint Yezid əl-Ənsariyyə'nin azadlı köləsi Əbu Said Şərh bin Həvşəb əl-Əş'ari əş-Şəmi'dir. Əsma bint Yezid, Aişə, İbn Abbas, Abdullah bin Amr, Ummu Sələmə, Əbu Said əl-Xudri və başqa səhabələrdən hədis dinləyib. Osmanın xilafəti dövründə anadan olub, bəzilərinə görə hicri 100-cü ildə, bəzilərinə görə isə 111 və ya 112-ci ildə vəfat edib. Abdulhəmid bin Bəhram isə əz-Zəhəbi'nin dediyinə əsasən ondan hicri 98-ci ildə hədis yazıb. İbn Bəhram özü təxminən hicri 170-ci ildən öncə

492. "əl-İləl va Mərifətur-Ricəl", 3/482
493. "Min Kələmi Əbi Zəkəriyyə Yəhyə bin Main fir-Ricəl", (96)
494. "Siyər Əaləmin-Nubələ", 7/335;

vəfat edib. Yetmiş hədisdən ibarət olan bu səhifə hicri birinci əsrin nümunəsi sayıla bilər, çünki birinci əsrin sonlarında yazılıb.

İbn Adiy deyir: "**Bu Usamə bin Zeyd'dən (Sufyan) əs-Səvri və bir qrup siqalar (hədis) rəvayət edirlər. Ondan İbn Vəhb saleh bir nüsxə rəvayət edir və İbn Vəhb'dən bu nüsxəni Hərmələ, Harun bin Said, ər-Rabi' bin Süleyman və İbn Vahb'ın qardaşı oğlu rəvayət edirlər.**"[495] Əbu Zeyd Usamə bin Zeyd əl-Leysi əl-Mədəni hicri 153-cü ildə vəfat edib. İbn Adiy həmin nüsxəni hansı isnad ilə əldə etdiyini də kitabında zikr edir.

əl-Xatib əl-Bağdadi isnadını qeyd edərək İsmayıl bin Uleyyə'nin belə dediyini rəvayət edir: "**Yezid ər-Rişk'dən dörd hədis eşitdim. Öz kitabından rəvayət edirdi və (öz-özümə) dedim: "Bu, (hədislərini) əzbərdən bilmir". Ona görə də ona rəğbət göstərmədim. (Sonra) Şubə gəldi, beləliklə də onun Muazə əl-Adəviyyə'dən yazdığı kitablarını köçürdü.**"[496] ər-Rişk ləqəbi ilə tanınmış Əbul-Əzhər Yezid bin Əbi Yezid əd-Dubə'i tabiin təbəqəsindən sayılır. əz-Zəhəbi'nin "Tərixul-İsləm" kitabında dediyinə əsasən hicri 130-cu ildə öldüyü söylənib. Muazə əl-Adəviyyə də tabiin nəslinin alim qadınlarındandır. Ummus-Sahbə Muazə bint Abdilləh əl-Adəviyyə əl-Basriyyə olaraq tanınır. Əli bin Əbi Talib, Aişə, Hişəm bin Amir və başqalarından hədis eşidib. Hicri 83-cü ildə vəfat edib. Muazə əl-Adəviyyə qadın müəlliflərdən sayılmalıdır, çünki hədisləri yazdığı bir kitab ilə tanınıb. Gördüyümüz kimi həmin kitabı Yezid ər-Rişk ondan köçürüb. O dövrdə qadınların yazı yazması qeyri adi bir hal deyildi. Hətta peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – xanımlarının bir hissəsinin yazı yazdığını bilirik.

495. "əl-Kəmil fi Duafə ər-Ricəl", 2/78;

496. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 229; əl-Xatib'in isnadı belədir: "Əbu Nueym əl-Hafiz bizə xəbər verdi: İbrahim bin Muhəmməd bin Yəhyə əl-Muzəkki bizə rəvayət etdi: Muhəmməd bin İshaq əs-Sərrac bizə xəbər verdi; dedi: Muəmməl bin Hişəmi belə deyərkən eşitdim: İsmayıl bin Uleyyə'ni belə deyərkən eşitdim." İbn Uleyyə (110-193) Əbu Bişr İsmayıl bin İbrahim bin Miqsəm əl-Əsədi'dir, imamdır, hüccətdir. Əbu Hişəm Muəmməl bin Hişəm əl-Yəşkuri (? – 250) basralı alimdir, siqadır. Əbul-Abbas Muhəmməd bin İshaq bin İbrahim bin Mihran əs-Sərrac əs-Səqafi ən-Nisəburi (216-313) haqqında "imam, hafiz, siqa, şeyxul-islam" kimi vəsfləri işlədir. İmam Əbu İshaq İbrahim bin Muhəmməd bin Yəhyə bin Səxtaveyh ən-Nisəburi əl-Muzəkki (295-362) öz ölkəsinin şeyxi və mühəddisi olub. əl-Xatib əl-Bağdadi onun haqqında – "siqa, hafizəsində möhkəm və çox rəvayət edən biri idi" – demişdir. Əbu Nueym əl-Hafiz isə (336-430) "Hilyətul-Əvliya" kitabının müəllifi yazıçı alim Əbu Nueym əl-Əsbəhəni'dir.

Hicri ikinci əsrdə həmçinin böyük və tanınmış imamlar, alimlər hədis kitablarını toplayır və müxtəlif mövzularda kitablar yazırdılar. Bura biz əl-Əvzai, Malik, Əbu Hənifə və tələbələrini, əş-Şafi'i və İmam Əhmədi və başqalarını aid edə bilərik. İbn Abdilbərr deyir: "**Xaləf bin əl-Qasim bizə xəbər verdi; Abdurrahmən bin Ömər bizə rəvayət etdi; Əbu Zura bizə rəvayət etdi; dedi: Safvan bin Saleh və əl-Valid bin Utbə mənə rəvayət etdilər ki, onlar Ömər bin Abdilvahidi belə deyərkən eşidiblər: "əl-Əvzai mənim kitabıma baxıb dedi: "Onu məndən rəvayət elə!" Safvan bin Saleh mənə rəvayət etdi; Ömər bin Abdilvahid bizə əl-Əvzai'dən rəvayət etdi: "Yəhyə bin Əbi Kəsir mənə bir səhifə verdi və dedi: "Bunu məndən rəvayət elə!" əz-Zuhri də mənə bir səhifə verdi və dedi: "Bunu məndən rəvayət elə!**"[497]

Əslən Herat şəhərindən olan, lakin Nişapur şəhərində məskən salmış böyük mühəddislərindən Əbu Said İbrahim bin Tahmən əl-Xurasəni də hədisləri yazan alimlərdən idi. İbrahim bin Tahmən deyir: **"Mədinəyə gəldim və orada (hədis) yazdım. Sonra Kufə şəhərinə gəldim və Əbu Hənifənin evinə getdim, ona orada salam verdim. Mənə dedi: "Orada kimdən hədis yazdın?" Adlarını çəkdim. Soruşdu: "Malik bin Ənəs'dən bir şey yazdınmı?" Dedim: "Bəli." Dedi: "Ondan yazdıqlarını gətir!" Mən də onları gətirdim. Sonra qirtas və mürəkkəb tələb etdi, beləliklə mən ona imla etməyə başladım və o yazırdı.**"[498] Bu maraqlı xəbər bizə Əbu Hənifə'nin – rahmətullahi aleyh – dövrünün digər

497. "Cəmiu Bəyənil-İlmi va Fadlihi", 2/1155;

498. İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 1/3-4; İbn Əbu Hətim deyir: "Əbu Bəkr əl-Cərudi Muhəmməd bin Nədr ən-Nisəburi bizə rəvayət etdi; dedi: Əhməd bin Həfsi belə deyərkən eşitdim: Atamı belə deyərkən eşitdim: İbrahim bin Tahməni belə deyərkən eşitdim: ..." və sonra yuxarıda zikr etdiyimiz mətni qeyd edir. Əbu Bəkr Muhəmməd bin Nədr əl-Cərudi ən-Nisəburi (vəfatı hicri 291) haqqında əz-Zəhəbi "hafiz, mutqin" deyir. İbn Əbi Hətim özü onu "hafizlərdən bir saduqdur" deyərək vəsf edir. Həmçinin fiqhdə hənəfi olub. Əhməd bin Həfs isə hicri 258-ci ildə vəfat etmiş Əbu Əli Əhməd bin Həfs bin Abdilləh əs-Suləmi ən-Nisəburi'dir. əl-Buxari'nin "əs-Sahih" kitabındakı ravilərindəndir. ən-Nəsəi onu şeyxləri arasında zikr edir və deyir: "Onda bir bəis yoxdur, nisəburludur, saduqdur." Nisəburda qazi kimi çalışıb. Atası isə Əbu Amr Həfs bin Abdilləh bin Raşid əs-Suləmi də (130-209) Nisəburda qazi olub və İbrahim bin Tahmən'in yanında katiblik edib, hədislərini yazıb və ondan böyük bir nüsxə rəvayət edir. O da həmçinin əl-Buxari'nin ravilərindəndir. ən-Nəsəi onun haqqında "onda bir bəis yoxdur" deyir və İbn Hibbən onu siqa ravilər arasında zikr edir.

imamı Malik bin Ənəs'dən hədislərini köçürdüyünü sübut edir. Dörd məzhəb imamının hamısının hədis yazdığını deyə bilərik. İbrahim bin Tahmən isə hədis ravilərindəndir. Həfs bin Abdilləh bin Raşid onun katibi olub və İbrahim bin Tahmən'in hədislərini yazardı. İbrahimdən böyük bir nüsxə yazıb və rəvayət edib, ondan da bunu oğlu Əhməd rəvayət edir və bu nüsxə bu gün əz-Zahiriyyə kitabxanasında saxlanılır.[499]

## İlk sira ədəbiyyatı

Səhabələrdən sonrakı dönəmin özəlliklərindən biri də budur ki, bu dövrdə artıq sira ədəbiyyatı formalaşmağa başlamışdı. İlk sira kitablarını kimin yazdığı bu günə qədər mübahisəlidir. İbn Hişəm "sira" kitabında deyir: "**İbn İshaq dedi: Yezid bin Əbi Həbib əl-Misri mənə rəvayət etdi ki, o, bir kitab tapdı və içində Allahın elçisinin – salləllahu aleyhi va səlləm – ölkələrə, ərəblərin və əcəmilərin krallarına göndərdikləri, səhabələrini göndərərkən onlara dediyi sözlər yazılı idi. Beləliklə də onu Muhəmməd bin Şihəb əz-Zuhri'yə göndərdim və onu tanıdı.**"[500] əz-Zuhri oradakı hədisləri tanıdığını qeyd etməklə o hədislərin doğruluğuna şahidlik etmiş olur. Çünki hədisləri tanımağın yolu onları başqa etibarlı kəslərdən eşitməklə mümkündür.

İmam Əhməd deyir: "**Abdurrazzaq bizə rəvayət etdi: Mə'mər bizə rəvayət etdi; dedi: Osman əl-Cəzəri mənə Miqsəm'dən xəbər verdi... Mə'mər dedi: "Ona Osman əl-Muşəhid deyib çağırırlar. Ondan "məğazi" mövzusunda iki kitab yazdım və onları məndən bir nəfər borca aldı və götürüb getdi. Ondan öncə heç vaxt kitab borca verməmişdim.**"[501] Bu da erkən bir dövrdə "məğazi" mövzusunda kitabların yazıldığını sübut edən daha bir xəbərdir.

İlkin dönəmdə yazılmış hədis və sira ədəbiyyatının bir çox nümunəsi bizim zamanımıza qədər gəlib çatıb. İbn Şihəb əz-Zuhri'nin (51-124) "əl-Məğazi" kitabı, İmam Malik bin Ənəs'in (93-179) "əl-Muvatta" kitabı, Ma'mər bin Raşid'in (96-153) "əl-Cami" kitabı, Ye-

499. Azami, "Dirasət fil-Hədisin-Nəbəvi", səh: 224;

500. "Siratu İbn Hişəm", 2/607;

501. "əl-İləlu va Mərifətur-Ricəl", 2/590;

zid bin Əbi Həbib, İbn Cureyc, Sufyan bin Uyeynə kimi alimlərin nüsxələri sözünü etdiyimiz bu hədis ədəbiyyatından bəzi misallardır. “əl-Məğazi” kitabları peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – həyatını, onun mübarizəsini, döyüşlərini əhatə edən rəvayətləri özündə cəm edir. İlk “məğazi” kitabı Xəlifə Osman bin Affan’ın oğlu Əbən bin Osman tərəfindən yazılıb, lakin günümüzə qədər gəlib çatmayıb. Əbən’in nə zaman vəfat etdiyi mübahisəlidir. Bir rəyə görə Əbən təxminən əl-Valid bin Abdilməlik’in hakimiyyəti dövründə (hicri 86-96) vəfat edib. Digər rəyə - və məşhur olan budur – görə o, hicri 105-ci ildə vəfat edib. İbn Asəkir “Tərixu Diməşq” kitabında Muhəmməd bin Ömər əl-Vaqidi’yə çatan isnadı ilə onun belə dediyini rəvayət edir: “**Yəhyə bin əl-Muğira bin Abdirrahmən bizə atasından xəbər verdi ki, onda Allahın elçisinin “döyüşlərindən” başqa yazılı heç bir hədis yox idi və onu Əbən bin Osman’dan götürmüşdü. O kitab ona çoxca oxunurdu və onu öyrənməyi bizə əmr edərdi.**”[502] Bu xəbəri Muhəmməd bin Sad təsdiqləyir və deyir: “**Muhəmməd bin Ömər dedi: ... (əl-Muğira bin Abdirrahmən) etibarlı biri idi, az hədis rəvayət edərdi, amma Allahın elçisinin – salləllahu aleyhi va səlləm – qəzavatı (məğazi) müstəsna idi; onu Əbən bin Osman’dan götürmüşdü. O (kitab) onun üçün çox oxunardı və bizə onları öyrənməyi əmr edərdi.**”[503] Buradan başa düşürük ki, Əbən bin Osman’ın “əl-Məğazi” adı ilə tanınan bir kitabı olub və tələbəsi əl-Muğira bin Abdirrahmən’də ondan bir nüsxə mövcud idi. əl-Muğira isə öz növbəsində onu oğluna və ya başqalarına oxutdurardı.

Həmçinin digər böyük səhabə əz-Zubeyr bin əl-Avvam’ın oğlu Urva bin əz-Zubeyr də ilk “məğazi” yazanlar arasında sayılır və hicri 93-cü ildə vəfat edib. İmam əz-Zəhəbi tarix kitabında Əbul-Əsvad əl-Mədəni haqqında danışarkən deyir: “**Əbul-Əsvad Misirdə yerləşdi və orada Urva bin əz-Zubeyr’in “əl-Məğazi” kitabını rəvayət etdi.**”[504] Əbul-Əsvad isə Muhəmməd bin Abdirrahmən bin Nəvfəl əl-Əsədi’dir, “Yetimu Urva” (Urva’nın yetimi) ləqəbi ilə tanınır, çünki uşaq çağından atası tərəfindən Urvaya vəsiyyət edilmiş və

502. “Tərixu Diməşq”, 60/72;

503. “ət-Tabəqat əl-Kubra”, 5/210;

504. “Siyər Əaləmin-Nubələ”, 6/292;

onun tərbiyəsi altında böyümüşdür. Urva'nın kitabı günümüzə qədər gəlib çatmasa da onun içindəki rəvayətlər səpələnmiş şəkildə fərqli kitablarda mövcuddur və Şeyx Muhamməd Mustafa əl-Azami əməl sərf etmiş və Əbul-Əsvad'ın ondan rəvayətlərini bir kitabda toplamışdır. Urva'nın tələbəsi və ondan ən çox təsirlənmiş böyük alim və imam İbn Şihab əz-Zuhri isə daha geniş bir "məğazi" kitabının müəllifidir və özündən sonra gəlmiş və eyni mövzuda yazmış alimlər üçün əsas geniş material toplamış kəs olaraq tanınır. əz-Zuhri'nin tələbələri arasından Muhəmməd bin İshaq və Musa bin Uqbə də "məğazi" mövzusunda kitablar yazıblar ki, həmin kitablar da bu günümüzə qədər gəlib çatıb. Muhəmməd bin İshaq bin Yəsər'ın (80-151) "əl-Məğazi" kitabı günümüzə qədər tam şəkildə gəlib çatmayıb, onun natamam əlyazmaları hələ də mövcuddur. Üstəlik İbn Hişam "əs-Sira" kitabında İbn İshaqın kitabını ixtisar etmişdir. əz-Zuhri'nin digər tələbəsi isə Musa bin Uqbə də müəllimi kimi səhabələrlə qarşılaşmış bir zatdır, hicri 141-ci ildə vəfat edib.

# GÜNÜMÜZDƏ ÇAP OLUNMUŞ HƏDİS KİTABLARI

Bu gün qədim hədis kitabları dünyanın müxtəlif kitabxanalarında əlyazma şəklində tapılır, təhqiq olunur və çap olunur. Sözünü etdiyimiz hədis kitabları Əhmədin "əl-Müsnəd", əl-Buxari və Muslim'in "əs-Sahih", Əbu Davud, ət-Tirmizi, İbn Məcə kimi alimlərin "əs-Sünən" kitablarının yazılı qaynaqları hesab olunurlar. Bu kiçik hədis cüzlərinin daşıdığı hədislər böyük hədis toplularında da mövcud olduğu üçün əsas önəm böyük hədis kitablarına yönəlmişdi. Lakin o kiçik hədis kitablarının əlyazmaları bu gün belə tozlanmış halda qədim kitabxanalarda tapılıb üzə çıxarılır. Kitabımızın bu hissəsində bu yöndə bəzi nümunələri ələ alacağıq və ətraflı söz açacağıq.

## Papirus tapıntılar

1880-ci ildə Misirin Fəyyum bölgəsində yerli kəndlilər on min ədəd papirus materialı tapırlar və bunların üç mini ərəb dilində yazılmış idi. Arxeoloqlar daha sonra bunu "Fəyyumun ilk tapıntısı" adlandırırlar. Kəndlilər tapdıqlarının çoxunu muzeylərə və şəxsi kolleksionerlərə satdılar. Bunların bir çoxu daha sonra "Samlung der Papyrus Erzherzog Rainer" (Erçherçoq Rayner adına Papirus Kolleksiyası) adı ilə tanınan kolleksiyanın tərkibinə daxil olur və bu gün Vyanada Avstriya Milli Kitabxanasında saxlanılmaqdadır. Bu gün dünyanın ən böyük ərəb papirus kolleksiyası orada yerləşir. Bu gün dünyanın ən böyük ərəb papirus kolleksiyası orada yerləşir.[505] "İkinci Fəyyum tapıntıları" isə dörd il sonra, yəni 1884-cü ildə baş verdi və ardından

505. Bu gün dünyanın ən böyük ərəb papirus kolleksiyası orada yerləşir.

Grenfell və Hunt adlı arxeoloqların indi əl-Minyə adlı bölgədə üzə çıxardıqları tapıntılar gəldi. Birinci Fəyyum tapıntıları və eləcə də digər tapıntıların çoxu tullantı məkanlarından tapılıb və Misirdə bu, adi bir hal idi. Kəndlərin kənarlarında insanların əsrlər boyunca atdıqları zibillər və tullantılar üçün xüsusiləşdirilmiş yerlər mövcud idi və bu kimi yerlərə "kəvm" deyirdilər. Hərfi mənada "təpəlik" mənasına gələn bu kəvmlər bir neçə təbəqədən ibarət olur, ən altında artıq çürümüş tullantılar yer alır. Üst qata "əşf", alt qatına isə "sibəx" deyirlər və kəndlilər üçün burada maraqlı olan "sibəx" qatı idi, çünki onu gübrə kimi istifadə edirdilər. Fəyyum tapıntıları da kəndlilərin sibəx çıxarmaq məqsədi ilə apardıqları kiçik qazıntı işlərində ortaya çıxıb və əgər o dövrdə Misirdə avropalı arxeoloqların bu cür qədim tapıntılara maraqlarının olduğu bilinməsəydi kəndlilər o tapıntılara bir əhəmiyyət verməzdilər. Bəlkə də bu şəkildə nə qədər tapıntı daha əvvəlki dövrlərdə kəndlilər tərəfindən məhv edilib, biz burada yalnız güman edə bilirik.[506] Çox təəssüf ki, sonrakı qazıntılarda papirus materialında yazılmış qədim əlyazmalar həddindən ziyadə az miqdarda tapılıb. Buna baxmayaraq tapılmış minlərlə papirusun çox hissəsi nəinki araşdırılmayıb, heç kataloqlaşdırılmayıb.[507] Bu deyilənlərin işığında yeni kəşflərin bizləri gözlədiyini söyləyə bilərik.

Ümumiyyətlə ilk dəfə ərəb dilində papirusu fransız yəhudisi şəqrşünas Baron Antoine Sylvestre de Sacy (1758-1838) 1825 və 1831-ci illərdə çap edib. Ondan sonra altmış il ərzində ərəb dilində papiruslar araşdırılıb çap edilməyib. Yalnız altmış il sonra Joseph Karabacek "Der Papyrusfund von el-Feijum" (əl-Fəyyum'dan Papirus Tapıntısı) adı ilə həm ərəb, həm yunan, həm də qibti dilindəki papirusları nəşr edir. Papiroloqlar "ərəb papirologiyasının" hazırkı halının məhz Karabacek'ə borclu olduğunu vurğulayırlar, çünki kəndlilərdən və arxeoloqlardan onları alaraq toplayan o olub. Miladi təqvim ilə iyirminci əsrin birinci yarısında Nabia Abbott'un çalışmaları ərəb papirologiyasını yeni bir səviyyəyə qaldırdı, lakin Abbott'un dövründə bu sahəyə maraq həddindən artıq az idi. Ancaq iyirmi

506. Misirşünas və papiroloq Sir Eric Gardner Turner (1911-1983) "Greek Papyri" kitabında (səh: 21) deyir: "...çox minlərlə, bəlkə milyonlarla mətn məhv edilib."

507. M. Malczycki, "Literary Papyri From The University Of Utah; Arabic Papyrus and Paper Collection", səh: 23;

birinci əsrə qədəm qoyduqdan bəri bu sahəyə marağın artdığını görürük. Princeton Universitetinin iki məzunu Petra Sijpesteijn və Lennart Sundelin 2002-ci ildə "Ərəb Papirologiyası üzrə Beynəlxalq Cəmiyyət" (ISAP, International Society for Arabic Papyrology) qururlar və bu gün Cəmiyyətin üzvlərinin sayı yüzdən çoxdur.

Bu papirus materialının çoxu parçalanmış və ağır zərər görmüş haldadır. Ərəb papirologiyası ilə məşğul olanlar onları oxumaqla yanaşı, çatışmayan hissələrini digər qaynaqlarla tutuşduraraq bərpa edirlər. Bəzən kiçik bir parçanın üzərində çalışaraq tam şəkildə onu bərpa etmək və ya mümkün olduğu qədəri ilə bərpa etmək aylar sürə bilir. İşin çətinliyi və bu sahə üzrə heç bir rəsmi tədrisin olmadığını nəzərə alsaq nə üçün onların çoxunun hələ də araşdırılmadığını başa düşmək olur.

Şəkillərini təqdim etdiyimiz bu papirus parçaları Utah universitetində, Marriott kitabxanasında Əziz Atiyyə adına olan papirus kolleksiyasında saxlanılır. Qeyd edək ki, ən qədim kitablar ya taxta lövhələrdə, ya da papirus kağızlarında yazılardı. Zamanımızda kəşf edilmiş papirus materiallarını oxumaq xüsusi biliklər tələb edir. Bu papirus parçaları qərbli akademiklərin yazdıqları akademik çalışmalarda mövcuddur. Bu çalışmalarda bəzi fraqmentlərin mətnlərinin bərpa edilməsi üçün əmək sərf edilib. Orada biz paleoqrafik biliklərə əsasən əlyazmaların tarixini müəyyən etmək cəhdləri ilə də qarşılaşırıq. Bu bölmədə biz papirus materiallarındakı mətnlərin təqdimində həmin çalışmalardan istifadə etdiyimizi etiraf etməliyik. Bəzi yerlərdə onların etdikləri xətalar ilə rastlaşdıqda öz düzəlişlərimizi də qeyd etmişik.

*Şəkil 6: Papirus Or.P521, Utah universiteti*



Şəkildə onuncu sətrdə biz müəllifin isnadında "mənə rəvayət etdi əl-Musənnə bin əs-Sabbəh'dən, o da Amr bin Şueyb bin Muhəmməd'dən..." sözlərini görə bilərik. Musənnə bin əs-Sabbəh isə hicri 149-cu ildə vəfat edib. Bu və digər səbəblərə görə William Matthews Malczycki bu papirus materialının yazıldığı dövrü ikinci əsrin ikinci yarısına aid etmişdir.[508] Müəllifin kimliyi haqqında Malczycki heç bir məlumat vermir. Lakin bu fraqmentin ikinci əsrin birinci yarısından olması da mümkündür, çünki tələbənin bunu İbnus-Sabbəh'in sağlığında yazması da mümkündür.

Digər papirus parçası (Or.P205) isə ikinci əsrin əvvəllərinə nisbət edilmiş və namazın qılınma şəkli ilə bağlı olan bir parçadır. Bunu ikinci əsrin əvvəllərinə aid etmək Malczycki'nin qənaətidir, digər tərəfdən Karim Samji bunu ikinci əsrin ikinci yarısına yerləşdirir.[509] Burada tarixi müəyyən etmək palioqrafiya ustalarının nəzərindəki fərqlilikdən asılı olaraq fərqlənə bilər. Bu mətnin qədimliyinə dəlalət edən tərəflərdən biri də burada təkbirin "Allahu Huva Əkbər" ləfzi

508. "Literary Papyri From The University Of Utah; Arabic Papyrus And Paper Collection", səh: 170,

509. Karim Samji, "Studies In Arabic Literary Papyri", səh 44;

ilə verilməsidir. Bunun ilk əsrlərə aid olması lazımdır, çünki sonrakı əsrlərdə qərar tapmış və günümüzə qədər gəlib çatmış məzhəblər yalnız "Allahu Əkbər" ləfzini doğru sayırlar.

*Şəkil 7: Namazın keyfiyyəti, birinci hissə. Papirus Or. P205*



Papirusun yuxarı hissəsi şəkildə görüldüyü kimi tamdır, lakin aşağı hissəsi tarixin dişləri arasında yeyilib gedib. Buna baxmayaraq mətnin əsas hissəsini oxumaq mümkündür.

## Həmməm bin Munəbbih'in səhifəsi

Həmməm bin Munəbbih haqqında kitabımızın əvvəlində bir qədər məlumat verdik. Burada onun bizim zamanımıza qədər gəlib çatmış məşhur səhifəsi, daha dəqiq desək müəllimi Əbu Hureyra'nın hədislərinin bir hissəsini özündə toplamış kiçik kitabı haqqında danışacağıq. Səhifə tarix kitablarından bilindiyi kimi ilk yazıldığı dövrdən orta əsrlərə qədər məşhur olub, tanınıb və qaynaq kimi istifadə edilib. əz-Zəhəbi kitabında Həmməm haqqında deyir: "**San'a şəhərindəndir, mühəddisdir, rəvayətdə çox dəqiqdir, kunyəsi Əbu Uqbə'dir. Əbu Hureyra'dan yazdığı "səhih səhifənin" müəllifidir və o, təqribən 140 hədisdir.**"[510] Müasir dövrümüzdə bunu ilk dəfə 1953-cü ildə əlyazma halından hazırlayıb çapa verən

510. "Siyər Əaləmin-Nubələ", 5/311;

Muhəmməd Həmidullah əl-Hindi əl-Heydərabadi olub. Həmidullah bu çap üçün biri Dəməşqdəki "əz-Zahiriyyə" kitabxanasında, digəri isə Berlində olan iki əlyazmadan istifadə etmişdi. Sonra 1985-ci ildə Doktor Ruf'at Fəvzi bunu bir daha çap elədi və bu səfər "Darul-Kutubil-Misriyyə" kitabxanasından tapdığı üçüncü əlyazma'nı da istifadə etdi. əz-Zahiriyyə kitabxanasındakı əlyazmanı yazan bu sözləri ilə başlayır: "**Şeyx əl-İmam əl-Əcəll əl-Əvhəd əl-Həfiz Təcuddin Bəhaul-İsləm Bədi'uz-Zəmən Əbu Abdilləh Muhəmməd bin Abdirrahmən bin Muhəmməd bin Məsud əl-Məsudi əl-Bəndəhi – Allah onu müvəffəq etsin və ona öz eyiblərini göstərsin! – ən-Nəsiriyyə əs-Saləhiyyə mədrəsəsində - Allah onu vəqf edənin mülkünü qalıcı etsin! – 577-ci ildə zul-qadə ayının 26-sı öz eşitdiyinin əslindən bizə oxuyaraq**[511] **rəvayət etdi; dedi: Etibarlı şeyx əs-Saleh Əbul-Xayr Muhəmməd bin Əhməd bin Muhəmməd bin Ömər əl-Muqaddər əl-Əsbəhəni ona oxunularaq – və mən dinləyirdim – bizə xəbər verdi;**[512] **dedi: Şeyx Əbu Amr Abdulvahhab bin Əbi Abdilləh Muhəmməd bin İshaq bin Muhəmməd bin Yəhyə bin Məndəh əl-Əsbəhəni bizə xəbər verdi; dedi: atam əl-İmam Əbu Abdilləh Muhəmməd bin İshaq bizə xəbər verdi; dedi: Əbu Bəkr Muhəmməd bin əl-Huseyn bin əl-Həsən ibn Xalil əl-Qattan bizə xəbər verdi; dedi: Əbul-Həsən Əhməd bin Yusuf əs-Suləmi bizə rəvayət etdi; dedi: Abdurrazzəq bin Həmməm bin Nəfi əl-Himyəri bizə Mə'mərdən, o da Həmməm bin Munəbbih'dən belə dediyini rəvayət etdi: Bu, Əbu Hureyra'nın bizə Allahın elçisi Muhəmməd'dən – salləllahu aleyhi va səlləm – rəvayət etdiləridir...**" Həmməm əslən farsdır, lakin Yəməndə məskən salmış farslardandır. Qardaşı Vəhb bin Munəbbih də məşhur alim olub. İmam Əhməd deyir: "**Müharibələrdə iştirak edən biri idi və (müharibə üçün getdiyi ölkələrdən) qardaşı Vəhb üçün kitablar alardı. Mədinədə olarkən Əbu Hureyra'nın məclisində oturdu və ondan hədislər eşitdi. (O qədər yaşa dolmuşdu ki, hətta) qara bayraqlıların zamanına yetişmişdi və (qocalıqdan) qaşları**

511. Bunun anlamı budur ki, Şeyx əl-Bəndəhi öz şeyxindən dinlədiyi əlyazmadan oxuyub.

512. Yəni məclisdə başqa bir tələbə əlyazmanı şeyxə, müəllimə oxuyub və əl-Bəndəhi də məclisdə dinləyib.

**gözlərinin üstünə tökülürdü. O, bir isnad ilə gəlmiş təxminən 140 hədisdir, lakin ayrı-ayrı kitablara yayılıb.**"[513] Həmməm yəmənli olduğu kimi o səhifəni ondan dinləyib köçürən Mə'mər bin Raşid də yəmənli idi. əl-Mizzi deyir: "**Əbul-Həsən əl-Məymuni dedi: Əhməd bin Hənbəli Həmməm'in səhifəsi haqqında belə deyərkən eşitdim: "Mə'mər onun zamanına yetişmişdi, o isə qocalmışdı və qaşları gözlərinin üstünə düşürdü. Qara bayraqlıların günlərinə yetişmişdi. Həmməm özü onun üçün (səhifəsini) oxuyurdu, lakin yorulduqda Mə'mər onu götürüb qalan hissəsini ona oxuyardı. Abdurrazzaq onlardan hansını onun oxuduğunu, hansının isə ona oxunduğunu bilmirdi.**"[514] Həmməm'in məşhurluğuna dəlalət edəcək daha bir tərəf budur ki, ondan hədis eşidib rəvayət edənlər çox olub. Məkkənin imamı Sufyan bin Uyeynə deyir: "**On il Həmməm'in hacılar ilə birlikdə (həccə) gələcəyini gözlədim.**" [515]Mə'mər bin Raşid də tanınmış alimlərdən olub, hədis yazanlardan biridir və "əl-Cami" adlı geniş bir hədis kitabı yazıb. Onun etibarlə bir alim olmasında ittifaq ediblər. Abdurrazzaq da böyük yəmənli imamdır, Mə'mər bin Raşid'in tələbələrindən olub. "əl-Musannəf" adlı bir hədis kitabını toplayıb. Bu səhifəni Abdurrazzaqdan rəvayət edən Əhməd bin Yusuf əs-Suləmi isə Nişapur şəhərinin böyük mühəddislərindən Əbul-Həsən ən-Nisəburi'dir. əz-Zəhəbi onun haqqında deyir: "**Adilliyi və möhtərəmliyi barəsində ittifaq edilib. Səksən iki ilə yaşadı və 264-cü ildə vəfat etdi.**"[516] Əlyazmanın sənədindəki növbəti ravi, yəni əs-Suləmi'dən bu səhifəni eşidib nəql edən şəxs Əbu Bəkr Muhəmməd bin əl-Huseyn əl-Qattan'dır. Əbu Abdilləh əl-Hakim deyir ki, Nişapur şəhərində ən güclü sənədlərə malik olan alim idi.[517] Hicri 332-ci ildə vəfat edib. Ondan bu səhifəni dinləyib nəql edən isə Əbu Abdilləh Muhəmməd bin İshaq bin Məndəh'dir. Elm almaq üçün və kitabları toplamaq üçün çoxlu səfərlər etmişdir və hətta əz-Zəhəbi deyir: "**Bu ümmətdə onun dinlədiyi qədər (elm) dinləmiş və onun**

513. "Təhzibul-Kəməl", 30/300;
514. "Təhzibul-Kəməl", 30/299;
515. əl-Buxari, "ət-Tərix əl-Əvsət", 2/33;
516. "Təzkiratul-Huffəz", 2/111;
517. "Tälxis Tərixi Neysəbur", səh: 70;

**topladığı qədər (kitab) toplamış birinin xəbəri bizə çatmayıb.**"[518] Hicri 395-ci ildə vəfat edib. Ondan isə bu səhifəni nəql edən oğlu Əbu Amr Abdulvahhab'dır. İbnul-İməd əl-Hənbəli onun haqqında "**siqadır, çoxlu rəvayət sahibidir**" deyir.[519] Hicri 475-ci ildə vəfat edib. Abdulvahhab'dan səhifəni nəql edən tələbəsi Əbul-Xayr Muhəmməd əl-Əsbəhəni'dir. Onun haqqında da İbnul-İməd "**siqa idi, çoxlu rəvayət edən idi**" deyir.[520] Hicri 559-cu ildə ölüb. Ondan da bu səhifəni rəvayət edən sonuncu ravi Əbu Abdilləh Muhəmməd bin Abdirrahmən əl-Məsudi əl-Bəndəhi'dir. Hicri 522-ci ildə anadan olub və 584-cü ildə Dəməşq şəhərində vəfat edib.

Bu sənəd "əz-Zahiriyyə" kitabxanasındakı əlyazmanın sənədi idi. "Darul-Kutubil-Misriyyə" kitabxanasındakı əlyazmanın sənədi isə onun əvvəlində bu şəkildə qeyd olunur: "**Şeyx əl-İmam əl-Hafiz ət-Təqi Əbu Bəkr Muhəmməd bin Əli bin Yasir əl-Ənsari Mosul şəhərində ona oxumaq surəti ilə - və mən qulaq asırdım, o da təsdiqləyirdi – bizə xəbər verdi; dedi: əl-İmam əl-Hafiz Zahir bin Tahir bin Muhəmməd əş-Şəhəmi əl-Mustəmli ona oxumaq surəti ilə bizə xəbər verdi; dedi: Bizə seyxlərdən Əbu Bəkr Muhəmməd bin əs-Saffər, Əbu Bəkr Əhməd bin Əli bin Xaləf əl-Ədib əş-Şirazi və Əbul-Həsən Əli bin Əhməd bin Muhəmməd ən-Nəməqi əl-Qassal xəbər verdilər.**

**Və (həmçinin) Şeyx əz-Zəki Əbul-Muzaffər Abdulkərim bin Xaləf bin Tahir əş-Şəhhəmi ona oxumaq surəti ilə bizə xəbər verdi: Əbu Bəkr Əhməd bin Xaləf əş-Şirazi bizə xəbər verdi:**

**Dedi: (Həmçinin) bizə Şeyx əl-İmam Əbul-Fədl Muhəmməd bin Əhməd bin Əbil-Fədl Əhməd bin Cəfər əl-Məhiyəni əl-Mərvazi Mərv şəhərində ona oxumaq surəti ilə xəbər verdi: Əbu Bəkr Əhməd bin Xaləf və Əbu Sad Abdurrahmən bin Mənsur bin Ramiş xəbər verdilər;**

**Bunların hamısı dedi: Bizə Ustaz əl-İmam Əbu Tahir Muhəmməd bin Muhəmməd bin Məhmiş əz-Ziyədi ona oxu-**

518. "Təzkiratul-Huffəz", 3/158;
519. "Şəzəratuz-Zəhəb", 5/321;
520. "Şəzəratuz-Zəhəb", 6/312;

**maq surəti ilə xəbər verdi: Əbu Bəkr Muhəmməd bin əl-Huseyn bin əl-Həsən bin əl-Xalil əl-Qattan ona oxumaq surəti ilə - və o təsdiqlədi – bizə xəbər verdi: Əhməd bin Yusuf əs-Suləmi bizə rəvayət etdi: Abdurrazzəq ibn Həmməm bizə rəvayət etdi: Mə'mər bin Raşid əs-San'ani bizə Həmməm bin Munəbbih'dən belə dediyini xəbər verdi: Bunlar Əbu Hureyranın bizə Allahın elçisi Muhəmməddən – salləllahu aleyhi va səlləm – rəvayət etdikləridir...**" Daha sonra hədisləri zikr edir.

Həmməm bin Munəbbih'in səhifəsi həmçinin Əbul-Xayr Əhməd bin İsmail əl-Qazvini'nin "Kitəbus-Sərd val-Fərd" adlı səhifələr toplusunda da mövcuddur və bu kitab da Şeyx Muhəmməd Həmidullah tərəfindən çap olunub və ingilis dilinə tərcümə olunub. Lakin müstəqil şəkildə çap olunmuş səhifədən fərqli olaraq əl-Qazvini'nin məcmusunda hədislərin sıralaması fərqlidir. Əbul-Xeyr kitabında Həmməm'in səhifəsinin isnadını belə zikr edir: "**Əbu Muhəmməd əl-Muvaffəq İbn Said ibn əl-Muvaffəq ən-Nisəburi mətni ona oxumağımla mənə xəbər verdi və bu 534-cü ilin cumədəl-ulə ayında idi; həmçinin Əbu Nəsr Muhəmməd bin Abdilləh əl-Arğiyəni öz kitabında oxuyaraq bizə xəbər verdi: hər ikisi də dedi: Əbu Ali əl-Həsən ibn Əbil-Qasim Muhəmməd bin Muhəmməd Həmuyəh əs-Saffər 466-cı ilin zul-qadə ayında bizə rəvayət etdi: Əbu Sad Abdurrahmən bin Həmdən bin Muhəmməd ən-Nəsravi 425-ci ildə bizə rəvayət etdi: Əbu Muhəmməd Abdullah bin Muhəmməd bin Ziyəd əs-Sindi 366-cı ildə rəcəb ayında bizə rəvayət etdi: əməl sahibi fəqih Əbu Muhəmməd Abdullah bin Muhəmməd bin Abdirrahmən bin Şiruyəh əl-Mədini və həmçinin anamın babası Əbu Muhəmməd Əhməd ibn İbrahim bin Abdilləh bin Əbi Nəsr bizə rəvayət etdi: hər ikisi də dedi: Əbu Yaqub İshaq ibn İbrahim ibn Məxləd əl-Hənzəli əl-Mərvazi bizə rəvayət etdi: Abdurrazzəq ibn Həmməm bin Nəfi əs-San'ani bizə rəvayət etdi: Mə'mər bizə rəvayət etdi: Həmməm bin Munəbbih bizə rəvayət etdi...**"[521]

Beləliklə də qarşımızda bu səhifənin üç ayrı isnadının olduğunu görürük və görürük ki, Abdurrazzəq'dən bu səhifəni Əbu Yaqub İs-

521. "Kitəbus-Sərd val-Fərd", səh: 7;

haq bin İbrahim əl-Hənzəli və Əhməd bin Yusuf əs-Suləmi rəvayət edir. Həmçinin Abdurrazzəq'dən bunu rəvayət edənlərdən bir başqası da İmam Əhməd bin Hənbəldir, səhifənin içindəki bütün hədisləri rəvayət edib. Əlavə edək ki, bunu Mə'mər bin Raşid'dən rəvayət edən təkcə Abdurrazzəq olmayıb. Abdullah bin əl-Mubərak və Abdulalə bin Abdilalə də Mə'mərdən bu hədisləri eşidib rəvayət ediblər.

Bu səhifənin içindəki bəzi hədislərə nəzər salsaq və onları digər kitablardakı hədislər ilə müqayisə etsək görəcəyik ki, bu hədisləri Əbu Hureyra'dan başqa tələbələri də rəvayət ediblər və hətta başqa səhabələr rəvayət ediblər. Misal üçün səhifənin 7-ci hədisində Əbu Hureyra deyir: "**Cümə günü bir saat vardır ki, ona müvafiq olan müsəlman namaz qılıb Rəbbindən bir şey istəyərsə mütləq onu ona verər.**" Bu xəbəri Əbu Davud ət-Tayəlisi müsnədində Həmməd → Qeys bin Sa'd → Muhəmməd bin İbrahim əl-Quraşi → Əbu Sələmə → Əbu Hureyra yolu ilə, həmçinin daha qısa olaraq Yezid bin İbrahim → Muhəmməd bin Sirin → Əbu Hureyra yolu ilə, eləcə də Həmməd bin Sələmə → Əyyub əs-Sixtiyəni → Muhəmməd bin Sirin → Əbu Hureyra yolu ilə rəvayət edir. İshaq bin Rahaveyh bunu Kulsum bin Muhəmməd → Ata əl-Xurasəni → Əbu Hureyra yolu ilə rəvayət edir. İmam Əhməd müsnəd kitabında bunu Yezid bin Harun → Muhəmməd → İyad bin Dinar → Əbu Hureyra yolu ilə, Abdurrazzəq əs-San'ani → Mə'mər bin Raşid → Muhəmməd bin Ziyəd → Əbu Hureyra yolu ilə, İbrahim bin Xalid → Rabbəh bin Zeyd → Mə'mər bin Raşid → əz-Zuhri → Said bin əl-Museyyəb → Əbu Hureyra yolu ilə, Musa bin Davud → İbn Ləhi'ah → Əbuz-Zubeyr → Cabir bin Abdilləh → Əbu Hureyra yolu ilə, həmçinin Yezid bin Harun → Hişəm bin Həssən → Muhəmməd bin Sirin → Əbu Hureyra kanalı ilə, eləcə də Sureyc və Yunus → Fuleyh bin Suleyman → Said bin əl-Haris → Əbu Sələmə → Əbu Hureyra və Affən → Həmməd bin Sələmə → Qeys bin Sad → Muhəmməd bin İbrahim ət-Teymi → Əbu Sələmə → Əbu Hureyra yolu ilə rəvayət edir. İmam əl-Buxari "əs-Sahih" kitabında bu hədisi Musəddəd → Bişr bin əl-Mufəddal → Sələmə bin Alqamə → Muhəmməd bin Sirin → Əbu Hureyra yolu ilə, həmçinin Musəddəd → İsmayıl bin İbrahim → Əyyub əs-Sixtiyəni → Muhəmməd bin Sirin → Əbu Hureyra yolu ilə və rəvayət edir. İmam Malik "əl-Muvatta" kitabında bunu Yezid bin Abdilləh bin əl-

Həd → Muhəmməd bin İbrahim ət-Teymi → Əbu Sələmə → Əbu Hureyra yolu ilə, həmçinin Əbuz-Zinəd → əl-Arac → Əbu Hureyra yolu ilə rəvayət edir. İsmail bin Cəfər isə Muhəmməd bin İbrahim → Əbu Sələmə → Əbu Hureyra kanalı ilə rəvayət edir. Bu hədis üstəlik Abdullah bin Sələm, Əbu Said ə-Xudri və başqa səhabələrdən də səhih və həsən yollar ilə rəvayət edilib. Deyə bilərik ki, bu hədisin Əbu Hureyra'dan sabit olmasında şəkk yoxdur, çünki bunu ondan Əbu Sələmə, Həmməm bin Munəbbih, Muhəmməd bin Sirin, Abdurrahmən əl-Arac, İbn Ziyad, Said bin əl-Museyyəb, İyad bin Dinar və həttа səhabə Cabir bin Abdilləh eşidib rəvayət ediblər.

16 nömrəli hədisdə isə Əbu Hureyra deyir: "**Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Oruc qalxandır. Sizdən biriniz bir güc oruc olarsa cahillik etməsin, söyüş söyməsin! Əgər bir nəfər onunla döyüşərsə və ya söyərsə qoy desin: "Mən orucam! Mən orucam!**" İmam Malik "əl-Muvatta" kitabında bu hədisi Əbuz-Zinəd → əl-Arac → Əbu Hureyra kanalı rəvayət edir. İbn Vəhb "əl-Cami" kitabında bunu Ənəs bin İyad əl-Leysi → əl-Haris bin Abdirrahmən → əmisi Abdullah bin əl-Muğira → Əbu Hureyra kanalı ilə, həmçinin əl-Qasim bin Abdilləh → əl-Alə bin Abdirrahmən → atası Abdurrahmən bin Yaqub → Əbu Hureyra yolu ilə, eləcə də əl-Qasim bin Abdilləh → Suheyl bin Əbi Saleh → atası Əbu Saleh əz-Zeyyət → Əbu Hureyra kanalı ilə rəvayət edir. əl-Buxari bu hədisi "əs-Sahih" kitabında Muhəmməd bin Rafi → Abdurrazzəq → İbn Cureyc → Ata bin Əbi Rabəh → Əbu Saleh əz-Zeyyət → Əbu Hureyra kanalı ilə rəvayət edir. əl-Humeydi müsnədində bu hədisi Sufyan bin Uyeynə → Əbuz-Zinəd → əl-Arac → Əbu Hureyra kanalı ilə rəvayət edir. İbnul-Ca'd müsnədində bunu Qurran bin Təməm → İbn Əbi Zib → Aclən → Əbu Hureyra yolu ilə rəvayət edir. İmam Əhməd isə "əl-Musnəd" əsərində bunu Yezid bin Harun → Muhəmməd bin İshaq → Musa bin Yəsər → Əbu Hureyra yolu ilə, Sufyan bin Uyeynə → Əbuz-Zinəd → əl-Arac → Əbu Hureyra yolu ilə, Yezid bin Harun → Muhəmməd bin İshaq → Əbuz-Zinəd → əl-Arac → Əbu Hureyra yolu ilə, həmçinin Bəhz bin Əsəd → Səlim bin Həyyən → Said bin Minə → Əbu Hureyra kanalı ilə, eləcə də Affən → Abdulvaris → Əli bin Zeyd → Said bin əl-Museyyəb → Əbu Hureyra yolu ilə və Yəhyə bin Said → İbn Əbi Zib → Aclən → Əbu Hureyra yolu ilə rəvayət edir. İmam

Əhməd həmçinin bunu Ravh bin Ubədə → İsrail bin İshaq əs-Səbi'i → Əbu Həsin → Əbu Saleh əz-Zeyyət → Əbu Hureyra və əlbəttə ki, Abdurrazzəq – Mə'mər bin Raşid → Həmməm bin Munəbbih → Əbu Hureyra kanalı ilə rəvayət edir. Bu hədis digər səhabələrdən də rəvayət olunub.

## Yezid bin Əbi Həbib'in nüsxəsi

Əbu Racə Yezid bin Suveyd Əbi Həbib əl-Əzdi əl-Misri öz zamanında Misirin alimi və müftisi olub və Misirdə ilk dəfə halal və haram mövzusunda danışmış alimlərdən olub. Hicri 53-cü ildə doğulmuş və hicri 128-ci ildə vəfat etmişdir. Yezid bin Əbi Həbib bəzi səhabələrdən və əksər hallarda səhabələrə tələbəlik etmiş alimlərdən eşitdiyi hədisləri səhifələrə yazmış, onları günümüzə qədər ötürmüşdür. İbn Əbi Həbib'in bizə tərk etdiyi bu miras bu gün Həmzə Əhməd əz-Zeyn tərəfindən təhqiq olunmuş və toplanmış "Əhədisuş-Şuyux əl-Kibər" adlı hədis toplusunun içərisində "Cüz'ü Yezid bin Əbi Həbib" adı altında çap olunub. Bu nüsxə əlyazma şəklində Dəməşqdəki əz-Zahiriyyə kitabxanasında mövcuddur.

Yezidin nüsxəsini bir çox alim rəvayət edib, lakin bunu ondan rəvayət edənlər içərisində ən etibarlı, ən elmlisi Misirin imamı əl-Leys bin Sad olub. Əbul-Haris əl-Leys bin Sad bin Abdirrahmən əl-Fəhmi hicri 94-cü ildə doğulub və 175-ci ildə vəfat edib. əl-Leys bin Sad'dan savayı bu nüsxəni köçürüb yayan digər misirli alim Abdullah bin Ləhi'ah bin Uqbə əl-Hədrami əl-Uduli[522] (h. 96-174) olub.

Yezidin hədislərinin bir hissəsini özündə cəm etmiş bu nüsxə bu sözlərlə başlayır: "**İki şeyx, aş-Şeyx əl-Əmin Əbu Muhəmməd Hibətullah bin Əhməd bin Muhəmməd əl-Əkfəni və aş-Şeyx Əbul-Qasim Yəhyə bin Bətriq bin Bişr ət-Tarasusi 520-ci ilin cumədəl-axira ayının 24-ü cümə günü onlara oxumaq surəti ilə və Əbu Muhəmməd Abdulkərim bin Həmzə bin əl-Xadir**

522. Nabia Abbott qeyd edir ki, Heidelberg papirus kolleksiyası içində Abdullah bin Ləhi'ahın rəvayətlərini toplamış səhifə mövcuddur. Bu lülə formasındakı papirus səhifə 189 sm uzunluğundadır. Tarix baxımından ikinci əsrin sonlarına və ya üçüncü əsrin əvvəlinə aiddir. Bax: "Studies in Arabic Literary Papyri", 1/22. Bu səhifə 422 sətrdə 200-ə

**əs-Suləmi bizə xəbər verdilər; dedilər: Əbul-Həsən Muhəmməd bin Məkki bin Osman bin Abdilləh əl-Əzdi əl-Misri 457-ci ildə rabi'ul-əvval ayı Dəməşqdəki cami məscidində ona oxumaq surəti ilə bizə bildirdi; dedi: Siqa olan əl-Şərif Əbul-Qasim əl-Məymun bin Həmzə bin əl-Huseyn əl-Ələvi əl-Huseyni öz kitabından ona oxumaq surəti ilə, Xələf bin Muhəmməd bin Əli əl-Vasiti əl-Hafiz'in qiraəti ilə bizə xəbər verdi; dedi: Əbu Bəkr Əhməd bin Abdilvaris bin Cərir əl-Assəl 319-cu ildə muharram ayında bizə xəbər verdi; dedi: Əbu Musa İsa bin Həmməd Zuğbə 242-ci ildə bizə bildirdi: əl-Leys bin Sad bizə Yezid bin Əbi Həbib'dən xəbər verdi...**" Beləliklə də bu nüsxəni dinləyib köçürən onu üç şeyxdən dinləyib. Bunlar Əbu Muhəmməd Hibətullah bin Əhməd əl-Əkfəni, Əbul-Qasim Yəhyə bin Bətriq ət-Tarasusi və Əbu Muhəmməd Abdulkərim bin Həmzə əs-Suləmi'dir. əl-Əkfəni hicri 524-cü ildə səksən yaşında vəfat edib. İbn Bətriq ət-Tarasusi isə hicri 534-cü ildə vəfat edib, İbn Asəkir'in şeyxi və əl-Xatib əl-Bağdadi'nin tələbəsidir. Abdulkərim əs-Suləmi də İbn Asəkir'in şeyxlərindəndir ki, onun haqqında "siqa bir şeyx idi" deyir və hicri 526-cı ildə vəfat edib. Bu alimlərin hər üçü də bu nüsxəni Muhəmməd bin Məkki əl-Əzdi'dən rəvayət edirlər. əl-Əzdi misirli alimdir, lakin Dəməşqdə də elmi fəaliyyət göstərmişdir. əl-Kəttəni onun siqa olduğunu deyir. Hicri 461-ci ildə yetmiş altı yaşında vəfat edib. O öz növbəsində bu nüsxəni əş-Şərif əl-Məymun bin Həmzə əl-Ələvi'nin məclisində eşidib və köçürüb. əl-Ələvi hicri 392-ci ildə vəfat edib. əl-Ələvi də bu nüsxəni şeyxi Xələf bin Muhəmməd əl-Vasiti'dən eşidərək köçürüb. əl-Vasiti hicri 400-cü ildən sonra vəfat edib. əl-Vasiti də bu hədisləri şeyxi Əhməd bin Abdilvaris əl-Assəl'in məclisində eşidərək yazıb və əl-Assəl hicri 321-ci ildə doxsan yaşını keçdikdən sonra vəfat edib. O da bu hədisləri İsa bin Həmməd Zuğbə'dən yazıb. İsa bin Həmməd hicri 248-ci ildə vəfat edib. İsa da bu nüsxəni şeyxi əl-Leys bin Sad'dan götürmüşdür. əl-Leys bin Sad'dan bu nüsxəni rəvayət edənlər arasında ən etibarlısı və ən məşhuru İsa bin Həmməd Zəğbə olub. Ondan isə bu səhifədəki hədislər əl-Buxari və Muslim'in "əs-Sahih" kitablarına, digər alimlərin "əs-Sünən" kitablarına daxil olub.

yaxın hədis cəm edən bir kitabdır.

Bu nüsxədə Yezid bin Əbi Həbib rəvayətlərini bir çox yoldan rəvayət edir. Bu rəvayət kanalların arasında ən qısa yollar olaraq Yezid bin Əbi Həbib → Əbul-Xeyr → Uqbə bin Amir, Yezid bin Əbi Həbib → İbrahim bin Saleh bin Abdilləh → Abdullah bin Ömər, Yezid bin Əbi Həbib → Abdurrahmən bin Şəmməsə → Uqbə bin Amir, Yezid bin Əbi Həbib → Suveyd bin Qeys → Müaviyə bin Xudeyc, Yezid bin Əbi Həbib → Rabi bin Səbra → Səbra bin Mə'bəd əl-Cuhəni, Yezid bin Əbi Həbib → İrak bin Malik əl-Ğifəri → Aişə, Yezid bin Əbi Həbib → İrak bin Malik → Əbu Hureyra, Yezid bin Əbi Həbib → İbn Məxramə → Abdullah bin Ömər, Yezid bin Əbi Həbib → Səlim bin Abdilləh → Əbul-Cərrah Məvlə Umm Həbibə, Yezid bin Əbi Həbib → Səlim bin Əbi Səlim → Abdullah bin Amr bin əl-As, Yezid bin Əbi Həbib → Əbul-Xeyr → Said bin Yezid əl-Əvadi və başqalarını göstərmək olar.

Kitabdakı bu isnadlar onu göstərir ki, bir çox halda Yezid bin Əbi Həbib öz rəvayətlərini səhabələrdən onların tələbələri vasitəsilə götürmüşdür. Bu, şübhəsiz ki, hicrətin ilk əsrində yazılmış səhih hədislər toplusudur. Bu nüsxə ilə yaxından tanış olmaq üçün nüsxənin ən qısa sənədləri ilə bəzi hədisləri misal olaraq zikr edək və onları digər hədis kitablarında mövcud olan hədislər ilə müqayisə edək. Misal üçün nüsxənin 18-ci hədisində Yezid bin Əbi Həbib deyir: "**Əbul-Xayr'dən, o da Uqbə bin Amir'dən (rəvayət edir) ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Qadınların yanına daxil olmaqdan sizi çəkindirirəm." Ənsardan bir nəfər dedi: "Ey Allahın elçisi, ərinin qardaşı bəs?" Dedi: "Ərinin qardaşı ölümdür.**" Qeyd edək ki, İmam Əhməd "əl-Musnəd" kitabında bu hədisi Həccəc və Həşim → Leys bin Sad → Yezid bin Əbi Həbib → Əbul-Xayr Mərsəd bin Abdilləh əl-Yəzəni → Uqbə bin Amir kanalı ilə rəvayət edir. əd-Dərimi də bunu Yəhyə bin Bistam vasitəsi ilə Leys bin Sad'dan rəvayət edir. əl-Buxari "əs-Sahih" kitabında, ət-Tirmizi "əs-Sünən" kitabında, ən-Nəsəi "əs-Sunən əl-Kubra" kitabında bu hədisi Quteybə bin Said vasitəsi ilə Leys'dən rəvayət edirlər. İmam Muslim də "əs-Sahih" kitabında həm Quteybə, həm də Muhəmməd bin Rumh vasitəsi ilə əl-Leys'dən bu hədisi zikr edir. İbn Əbi Şeybə "əl-Musannəf" kitabında bunu Şəbəbə bin Səvvar yolu ilə əl-Leys bin Sad'dan gətirir. Buradan çıxan nəticə budur ki, bu hədisi əl-Leys

bin Sad'ın rəvayət etdiyi sabitdir. Çünki bu qədər alim bu hədisi əl-Leys'dən eşitdiklərini deyirlər. Onu da əlavə edək ki, bunu Yezid'dən rəvayət etməkdə əl-Leys tək qalmayıb. İmam Muslim "əs-Sahih" kitabında[523] Əbut-Tahir bin əs-Sərh vasitəsi ilə Abdullah bin Vəhb'dən, Əbu Avanə isə müsnədində[524] Yunus bin Abdil-Alə vasitəsi ilə Abdullah bin Vəhb'dən rəvayət edirlər ki, Abdullah bin Vəhb bu hədisi üç ayrı şəxs vasitəsi ilə Yezid bin Əbi Həbib'dən eşidib. Abdullah bin Vəhb bunu əl-Leys bin Sad'dan eşitdiyi kimi eləcə də Amr bin əl-Haris'dən və Həyva bin Şureyh'dən də eşitmişdir. Amr bin əl-Həris bin Yaqub Misirin digər böyük alimlərindəndir, lakin Mədinədə yerləşmiş və orada fəaliyyət göstərmişdir. Hicri 90-cı ildən sonra doğulub və hicri 147 və ya 148-ci ildə vəfat edib. Əbu Zur'a Həyva bin Şureyh bin Safvan ət-Tucibi bir başqa misirli alimdir və İbn Vəhb'in müəllimlərindən olub. Hicri 158-ci ildə vəfat edib. Beləliklə də bu hədisin Yezid bin Əbi Həbib'dən sabit olduğunu təsdiqləmiş oluruq.

Bir başqa misal olaraq 40-cı hədisdə İbn Əbi Həbib deyir: "**İrak'dan, o da Əbu Hureyra'dan belə dediyini (rəvayət etdi) ki, "Məğrib namazı kimi üç rükət vitr qılmayın! Beş və ya yeddi və ya on bir rükət vitr qılın!**" Bu xəbəri Yezid bin Əbi Həbib nüsxəsində İrak bin Məlik əl-Ğifəri vasitəsi ilə Əbu Hureyra'dan rəvayət edir. Qeyd edək ki, Əbu Abdilləh əl-Mərvazi "Qiyamul-Leyl" kitabında bu xəbəri Tahir bin Amr bin ər-Rabi bin Tariq → Amr bin ər-Rabi bin Tariq → əl-Leys bin Sad → Yezid bin Əbi Həbib → İrak bin Məlik → Əbu Hureyra kanalı ilə rəvayət edir.[525] ət-Tahavi "Şərhu Məanil-Əsər" kitabında deyir: "**Fəhd bizə rəvayət etdi; dedi: Abdullah bin Yusuf bizə rəvayət etdi; dedi: Bəkr bin Mudar bizə rəvayət etdi ki, Cəfər bin Rabia ona İrak bin Malik'dən, o da Əbu Hureyradan – radiyallahu anhu – belə dediyini rəvayət etdi: "Məğribə bənzəyərək üç rükət vitr qılmayın! Lakin beş və ya yeddi və ya doqquz və ya on bir rükət vitr qılın!**"[526] Beləliklə Yezid bin Əbi Həbib ilə yanaşı bunu Cəfər bin Rabia'nın da İrak bin Məlik'dən eşitdiyinə şahid olduq. Əbu Hu-

523. "Sahih Muslim", (2172);

524. "Musnəd Əbi Avanə", 3/17 (4033);

525. "Muxtəsar Qiyəmil-Leyl", səh: 300

526. "Şərh Məanil-Əsər", 1/292 (1739);

reyra'dan bu hədisi tələbələri arasından təkcə İrak bin Malik rəvayət etmir. İbn Hibban deyir: "**əl-Həsən bin Sufyan bizə xəbər verdi; dedi: Hərmələ bizə rəvayət etdi: İbn Vəhb bizə rəvayət etdi; dedi: Süleyman bin Biləl mənə Saleh bin Keysən'dən, o da Abdullah bin əl-Fədl'dən, o da Əbu Sələmə bin Abdirrahmən'dən və Abdurrahmən əl-Arac'dan, onlar da Əbu Hureyra'dan, o isə Allahın elçisindən – salləllahu aleyhi va səlləm – rəvayət etdilər ki, o, dedi: "Üç rükət vitr qılmayın! Beş və ya yüddi rükət qılın və məğrib namazına bənzətməyin!**"[527] Bu rəvayətlər bizə bu xəbəri Əbu Hureyra'dan üç tələbəsinin nəql etdiyini söyləməyə imkan verir. Yezid bin Əbi Həbib bunu onun bir tələbəsindən, Abdullah bin əl-Fədl isə digər iki tələbəsindən rəvayət etmişdir.

51 nömrəli hədisdə isə Yezid deyir: "**İrak'dan, o da Əbu Hureyra'dan (rəvayət edir) ki, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – belə deyərkən eşidib: "İnsanların ən şərlisi iki üzlü olandır ki, bunların yanına bir üzlə gəlir, digərlərinin yanına isə bir başqa üzlə gəlir.**" İmam Əhməd "əl-Musnəd" kitabında bu hədisi Haşim → Leys → Yezid bin Əbi Həbib → İrak bin Məlik → Əbu Hureyra kanalı ilə, əl-Buxari və Muslim isə "əs-Sahih" kitablarında bunu Quteybə → əl-Leys → Yezid bin Əbi Həbib → İrak → Əbu Hureyra kanalı ilə rəvayət edirlər.[528] İmam Malik "əl-Muvatta" kitabında bu hədisi Əbuz-Zinəd → Abdurrahmən əl-Arac → Əbu Hureyra kanalı ilə rəvayət edir.[529] əl-Hafiz əl-Bəzzər isə müsnədində bu hədisi Amr bin Əli və Yusuf bin Musa → Əbu Muaviyə və Cərir → əl-Aməş → Əbu Saleh əs-Səmmən → Əbu Hureyra kanalı ilə rəvayət edir. Həmçinin əl-Xaraiti bu hədisi "Məsəvi əl-Əxləq" kitabında Əli bin Hərb ət-Tai → Əbu Muaviyə və Yə'lə bin Ubeyd → əl-Aməş → Əbu Saleh → Əbu Hureyra yolu ilə rəvayət edir. Bu hədisi həmçinin Əbu Hureyra'dan Əbu Həzim və Said bin əl-Musəyyəb kimi tələbələrinin də rəvayət etdiyini görürük. Said bin əl-Museyyəb'dən isə İmam İbn Şihəb əz-Zuhri rəvayət edib. Bütün bunlar hədisin Əbu Hurey-

527. "Sahih İbn Hibban", 6/185 (2429);

528. "Musnəd Əhməd", 13/432 (8069); "Sahih əl-Buxari", (7179); "Sahih Muslim", (2526);

529. "əl-Muvatta", (2090) Əbu Musab rəvayəti ilə.

ra'dan sabit olmasında şəkk buraxmır və bizə qədər gəlib çatmış bu nüsxənin səhihliyini dəstəkləyir.

*Şəkil 8: Vəhb bin Munəbbih'in tarix kitabından bir parça; bu papirus parça Heidelberg kolleksiyasında (P.Heid. İnv.: Arab.23) saxlanılır.*



## Vəhb bin Munəbbih'in tarixi

Vəhb bin Munəbbih bir az öncə haqqında danışdığımız Həmməm bin Munəbbih'in qardaşıdır. Osmanın xilafəti zamanı hicri 34-cü ildə anadan olub. Səhabələrdən İbn Abbas, Əbu Hureyra, Əbu Said əl-Xudri, ən-Nu'mən bin Bəşir, Cabir bin Abdilləh, Abdullah

bin Ömər, Abdullah bin əz-Zubeyr, Ənəs bin Malik ilə qarşılaşmış və onlardan hədis eşitmişdir. Vəhb də qardaşı Həmməm bin Munəbbih kimi yazıya önəm verən kəslərdən olub. Bu gün tarix kitablarında, eləcə də təfsir kitablarında qədim kitablardan nəqllər keçir və bir çox halda o nəqllərin ondan gəldiyini görürük. Haqqında oxuduğumuzda formalaşan təsəvvür budur ki, tarixə və qədim qövmlərin özlərindən sonra tərk etdikləri kitablara sonsuz marağı olub. Yəhudi, nəsrani kitablarını, habelə fars qaynaqlarını oxuya biləcək hazırlığa sahib idi. Buradan başlayaraq oxuduğu, topladığı materialları ərəb dilində kitab halına salıb. Onun tarix sahəsində yazdığı kitabından bizim zamanımıza qədər bəzi parçalar çatıb və suriyalı xristian şərqşünas alim Raif Georges Khoury tərəfindən alman dilində tərcüməsi ilə birlikdə çap edilib. Khoury bu işində hicri 229-cu ildə yazılmış bir əlyazmaya əsaslanıb. Əlyazma papirus materialından ibarətdir, lakin tam deyildir. Khoury'nin çap etdiyi mətn iki hissədən ibarətdir; onun birinci hissəsi Samuel peyğəmbər və Davud peyğəmbər haqqındadır. İkinci hissə isə Aqabə beyəti, peyğəmbərin – aleyhissələm – meracı və Əbu Bəkr ilə Mədinəyə hicrəti haqqındadır. Khoury əlyazmadakı naqislikləri misirli alim Əbu Rifə'ah əl-Farisi'yə (vəfatı hicri 289) aid olan kitabın hicri altıncı əsrə aid əlyazmasını istifadə edərək bərpa etmişdir. Bu şəkildə qədim mənbələrdən istifadə edərək böyük hissəsi yeyilmiş əlyazmaları bərpa etməyin mümkün olması bir daha sübut edir ki, həmin kitablar rəvayət metodu ilə qorunulub.

Vəhb bin Munəbbih'in zamanımıza qədər gəlib çatmış kitablarından biri də "Kitəbut-Ticən fi Muluk Himyər" adı ilə təhqiq olunaraq çap edilib. Bu kitab məşhur tarix və sira alimi İbn Hişam'ın rəvayəti ilə tanınır. Vahid bir mövzu üzərindən yazılmamış bu kitabın içində tarixi xəbərlər və hədislər ilə yanaşı əfsanələr də yer alır. Bu səbəblə də bəziləri Vəhb bin Munəbbih'in bu əsərini ədəbiyyat nümunəsi hesab ediblər.

## İbn Cureyc'in nüsxəsi

Burada Məkkənin şeyxlərindən olan Abdulməlik bin Abdilaziz bin Cureyc əl-Quraşi əl-Əməvi tərəfindən yazılmış nüxsə haqqında

danışacağıq. İbn Cureyc Məkkədə elmi ilk dəfə yazılı şəkildə toplayan alimlərdən sayılır. Babası Cureyc Ummu Həbib bint Cubeyr əl-Əməvi'nin köləsi olub, əslən rumludur. Hicri 150-ci ildə vəfat etmişdir, yüz ilə yaxın bir ömür sürüb. Xəlifə Ömər bin Abdilaziz xilafət məqamına keçdikdə Mədinədə İbn Şihəb əz-Zuhri'yə hədisləri toplamağı əmr etdiyi kimi Məkkədə də İbn Cureyc'ə əmr etmişdi.

İbn Cureyc 18 ilə yaxın müddətdə Ata bin Əbi Rabah'ın yanında ondan ayrılmadan elm öyrənib və Atanın ölümündən sonra isə Amr bin Dinar'ın yanında doqquz il hədis eşidib. İbn Cureyc dövrünün ən çox elm yazan alimlərindən sayılır. Əbu Yusuf əl-Fəsəvi (vəfatı hicri 277) deyir: "**Muhəmməd bin Əbi Ömər bizə rəvayət etdi; Sufyan bizə rəvayət etdi; İbn Cureyc'i belə deyərkən eşitdim: "Heç kim elmi mənim kitablara yazdığım kimi yazmayıb.**"[530] İmam Əbu Davud əs-Sicistəni "əs-Suələt" kitabında deyir: "**Əhmədi belə deyərkən eşitdim: "Yəhya'nın İbn Cureyc'dən eşitdiyini onun kitablarından görərdim. (Yəhya) dedi ki, ondan elə bir nüsxəni köçürdüm ki, (İbn Cureyc) ondan dəfələrlə oxumuşdu.**"[531] Ibn Cureyc çox kəsdən hədis eşidib yazdığı kimi İbn Şihəb əz-Zuhri'nin də hədislərini yazmış və yazdıqlarını ona ərz etmişdir. İbn Əbi Xeysəmə deyir: "**İbrahim bin əl-Munzir əl-Hizəmi bizə rəvayət etdi; dedi: İbn Uyeynə bizə rəvayət edərək dedi: "İbn Cureyc və mən İbn Şihəb (əz-Zuhri)nin yanına daxil olduq və İbn Cureyc'də bir səhifə var idi. Bunun üzərinə İbn Cureyc dedi: "Mən bunu sənə ərz etmək istəyirəm.**"[532] Təxmin etmək çətin olmamalıdır ki, o səhifədəki hədislər əz-Zuhri'dən eşidib yazdığı hədislər olmalıdır. Bu bir qayda idi ki, tələbələr şeyxlərindən eşidib yazdıqları hədisləri şeyxlərinə ərz etmədən onları rəvayət etməyə icazə almırdılar. İbn Cureyc'in hədislərini topladığı şeyxlərindən bir digəri də Hişəm bin Urva olub. Əbu Yusuf əl-Fəsəvi deyir: "**Abdurrahmən bin İbrahim bizə rəvayət etdi; Şueyb bin İshaq bizə Hişəm bin Urva'dan belə dediyini rəvayət etdi: "İbn Cureyc mənim yanıma yazılı bir səhifə ilə gəldi və dedi: "Ey Əbul-Munzir, bu hədisləri səndən rəvayət edimmi?" Dedim:**

530. "əl-Mərifə vat-Tərix", 2/25;

531. "Suələt Əbi Davud", (540)

532. "ət-Tərixul-Kəbir", 1/251;

**“Bəli.” Bundan sonra durub getdi və məndən buna artıq bir şey barədə soruşmadı.**”[533] Bir başqa şeyxi də Nəfi idi. əl-Humeydi “əl-Musnəd” kitabında deyir: “**Sufyan (bin Uyeynə) bizə rəvayət etdi: İbn Cureyc bizə rəvayət edərək dedi: “Nəfi’nin yanına gəldim və mənə tərəf bir torba atdı, mən də üzərində oturdum və sonra mənə lövhələrimdə yazmaq üçün imla etdi…**”[534]

Bu böyük alim əksər hallarda hədislərini öz məclisində tələbələrinə imla edərək öyrədərdi, bəzən də özü ayrıca nüsxədə köçürərək göndərərdi. Əbu Yusuf əl-Fəsəvi deyir: “**İbrahim bin əl-Munzir bizə rəvayət etdi; Abdullah bin əl-Həris əl-Məxzumi bizə rəvayət edərək dedi: “İbn Cureyc öz hədislərindən seçərək (bəzi) hədisləri İbn Əbi Səbra’ya yazdı və üzərinə möhür vurdu.**”[535] Görünür ki, İbn Cureyc öz yazdıqlarının ona aid olduğunu göstərmək üçün möhürdən istifadə edirdi. Belə bir addım İbn Cureyc kimi çox yazan bir şəxsiyyət üçün qeyri-adi olmamalıdır. Onun yanında toplanan kitablar öz şeyxlərindən ayrı-ayrılıqda eşitdiyi səhifələr toplusu idi. Daha sonra bu səhifələrdən özü üçün ayrıca bir nüsxə yazması da mümkündür və belə etdiyi aşkardır. İbn Əbi Səbra da İbn Cureyc üçün hədis kitabı yazıb. İbn Sad deyir: “**Muhəmməd bin Ömər bizə xəbər verdi: Əbu Bəkr bin Abdilləh bin Əbi Səbra mənə rəvayət etdi; dedi: İbn Cureyc (mənə) dedi: “Mənə sünnət hədislərini yaz!” Beləliklə də onun üçün min hədis yazdım, sonra onları ona göndərdim. Onları nə mənə oxudu, nə də mən ona oxudum.” Muhəmməd bin Ömər deyir: “Bundan sonra İbn Cureyc’in bir çox hədisdə rəvayət edərək “Əbu Bəkr bin Əbi Səbra bizə rəvayət etdi” dediyini gördüm.**”[536]

İbn Cureyc’in bir başqa tələbəsi Əbu Muhəmməd Həccəc bin Muhəmməd əl-Avar haqqında əl-Xatib əl-Bağdadi bu məlumatları verir. O deyir: “**Əbu Abdilləh (Əhməd bin Hənbəl) dedi: “(Həccəc) kitabların hamısını özü İbn Cureyc’ə oxuyub, təfsir kitabı istisnadır, çünki onu İbn Cureyc’dən imla ola-**

533. “ət-Tərix val-Marifə”, 2/824;

534.. “Musnəd əl-Humeydi”, 1/533 (669)

535. “ət-Tərix val-Marifə”, 2/825;

536. “ət-Tabəqat əl-Kubra”, 5/492;

**raq eşidib...**”. əl-Xatib əlavə edir: “**Əbu Muslim əl-Mustəmli dedi: “Həccac əl-Avar (hicri) 190-cı ildə Bağdad şəhərində cəbhə şəhərinə yola düşürdü və o gəmidə ikən mən dərbul-hicəra (korpusun)də ondan soruşdum: “Ey Əbu Muhəmməd, sən bu təfsiri özün İbn Cureyc’dən eşitmisənmi?” Gördüm ki, gözləri çevrildi və dedi: “Təfsiri, bu uzun hədisləri və hamısını İbn Cureyc’dən eşitmişəm.**”[537] Xəbərlərə əsasən Həccac əl-Avar Basra şəhərində İbn Cureyc’in ən etibarlı tələbəsi kimi tanınırdı, ola bilsin ki, ondan yazdığı kitabların dəqiqliyinə görə bu şöhrətə nail olmuşdu.

Burada maraqlı bir hadisəni zikr etmək yerinə düşər və bu hadisə o dövrdə hədis rəvayətində alimlərin necə şeyxlərdən elm aldığını göstərdiyi kimi İbn Cureyc’in hədis yazmaqdakı hərisliyini də göstərir. əl-Humeydi müsnədində deyir: “**Sufyan (bin Uyeynə) bizə rəvayət etdi: Abdullah bin Əbi Bəkr bin Muhəmməd bin Amr bin Həzm bizə Abdulməlik bin Əbi Bəkr bin Abdirrahmən bin əl-Haris bin Hişəm’dən, o da Xalləd bin əs-Səib’dən, o isə atası əs-Səib bin Xalləd’dən belə dediyini rəvayət edir: “Allahın elçisi – salləllahu aleyhi va sələm – dedi: “Cibril – aleyhissələm – yanıma gəldi və dedi: “Səhabələrinə əmr et ki, ihlal edərkən səslərini qaldırsınlar” və ya “təlbiyə edərkən” dedi.**” əl-Humeydi bunu zikr etdikdən sonra bu hədislə bağlı maraqlı hadisəni zikr edərək deyir: “**Sufyan dedi: İbn Cureyc məndən bir hədis gizlətmişdi. Abdullah bin Əbi Bəkr yanımıza gəldikdə ona bunun xəbərini vermədim və əl-Mədinə’yə geri döndükdə bunu ona danışdım. Buna görə mənə dedi: “Ay təkgöz, bizdən hədisləri gizlədirsən və (hədisin) sahibi getdikdən sonra bizə xəbər verirsən?! Mən bu hədisi səndən rəvayət etməyəcəm. (İbn Cureyc sonra) Abdullah bin Əbi Bəkr’ə yazdı (və hədisi ondan soruşdu) və Abdullah bin Əbi Bəkr də ona yazıb göndərdi. İbn Cureyc o hədisi rəvayət etdikdə deyərdi: “Abdullah bin Əbi Bəkr mənə yazdı...”.**”[538] ət-Tabərani “əl-Mucəm əl-Kəbir“ kitabında bu hadisəni Bişr bin Musa vasitəsi ilə əl-Humeydi’dən rəvayət edir və orada

537. “Tərixu Bağdad”, 9/142-143;

538. “Musnəd əl-Humeydi”, (876)

axırda deyir: "**İbn Cureyc kitablarında bunu rəvayət etdikdə yazardı: "Abdullah bin Əbi Bəkr mənə yazdı..".**"[539] Bu hadisə gözəl bir nümunədir. Burada görə bilirik ki, hədis alimləri arasında hədis ən önəmli bir yeri tuturdu. Sufyana öz şeyxi İbn Cureyc'in ondan bir hədis gizlətməsi çox ağır gəldiyi üçün əvəzini çıxmaq istəmişdi. İbn Cureyc də bu hala qəzəblənir və həmin hədisi Sufyandan rəvayət etmək əvəzinə, arada vasitəçi götürmədən Abdullah bin Əbi Bəkr'dən yazılı şəkildə rəvayət edir. İbn Cureyc metodunda bu şəkildə hədisləri sahiblərinə məktub yazaraq öyrənmək nadir bir hal olmayıb. Bu gün hədis kitablarında bunun misallarını görə bilirik. İbn Cureyc'in tələbələrindən olan Abdurrazzəq "əl-Musannəf" kitabında deyir: "**İbn Cureyc bizə xəbər verdi: Abdullah bin Ziyad bin Səm'an mənə yazdı ki, Abdullah bin Abdirrahmən əl-Ənsari ona Nafi'dən, o da peyğəmbərin – salləllahu aleyhi va sələm – yoldaşı Ummu Sələmədən xəbər verdi ki, ...".**"[540]

İbn Cureyc'in səhifələri o zamanın elm əhli arasında tədavül edirdi və çox tələb olunurdu. Onu əldə etmək üçün şeyxlərin məclisində iştirak edərək şeyxlərin nüsxələrini dinləyərək köçürərdilər və sonra həmin şeyx vasitəsi ilə İbn Cureyc'dən rəvayət edərdilər. Əbu Zura ər-Razi'nin "əd-Duafə" kitabında belə bir xəbərlə qarşılaşırıq: "**Əbu Osman dedi: Muslim bin əl-Həccəc mənə Yəhyə bin Main'dən belə dediyini rəvayət etdi: "Hişəm bin Yusuf mənə dedi: "Mutarrif bin Məzin məndən İbn Cureyc'in kitabını dinlədi və o, bu gün o kitabı (bir başa İbn Cureyc'dən) rəvayət edir." Yəhya dedi: "Mən də getdim ondan kitabının nüsxəsini borca aldım və Hişəmin kitabı ilə tutuşdurdum və gördüm ki, yazısı eynidir.**"[541] Bu xəbərin arxasındakı məzmun çox maraqlıdır. Mutarrif bin Məzin yəmənli alimlərdəndir və məclislərində İbn Cureyc'dən hədis rəvayət edərmiş. Yəmənin qazisi, ən böyük alimlərindən biri olmuş Hişəm bin Yusuf əs-Sanani bu barədə rəvayət mütəxəssisi, hədis tənqidçisi İmam Yəhyə bin Main'ə xəbər verərək bildirir ki, Mutarrif heç də o kitabı İbn Cureyc'in özündən dinləyərək almayıb, lakin ondan alıb. Ona görə də Yəhyə bin Main

539. "əl-Mucəm əl-Kəbir", 7/142 (6627)

540. "əl-Musannəf", 7/236 (12952);

541. "Əbu Zur'a ər-Razi va Cuhuduhu fis-Sunnə ən-Nəbəviyyə", 2/423;

gedərək Mutarrifin kitabının bir nüsxəsini borca alaraq Hişəmin kitabı ilə tutuşdurur və eyni olduqlarını görür, heç bir hərfində fərqlənmədiyinə şahid olur. Buradan çıxan qərar çox maraqlıdır. Mutarrif'in əslində İbn Cureyc'in kitabında rəvayət etdikləri həqiqətən də səhih rəvayətlərdir, çünki kitabın İbn Cureyc'in kitabı olduğu sabitdir, heç bir şübhə yoxdur. Lakin buna baxmayaraq Yəhyə bin Main onu bu hala görə yalançı adlandırır və ondan hədis rəvayət etməyi, hədis öyrənməyi doğru görmür. Səbəbi isə Mutarrif'in həmin hədisləri Hişəm bin Yusuf'dan rəvayət etmək əvəzinə bir-başa İbn Cureyc'dən rəvayət etməsi olub. Bu bizə iki şeyi öyrədir. Birincisi o dövrdəki rəvayət mütəxəssisi adlandırdığımız alimlərin nə qədər kriteriyalarında sərt olduğunu göstərir. İkincisi isə hədis kitablarının necə geniş şəkildə tədavüldə olduğuna şahidlik edir.

Kitablarının tədavüldə olması və çox məşhurlaşması onların sonrakı əsrlərə qədər çatmasına zəmin sağlayıb. Zamanında "varraq", "nəssəx", "xəttat"[542] kimi çalışan və mirzəlik edən Əbul-Fərac İbnun-Nədim (vəfatı hicri 438) topladığı və qarşısına çıxan kitablar üçün "fihrist", yəni kataloq hazırlayıb. Onun bu kataloq xarakterli kitabı bu günümüzə qədər gəlib çatıb və çap olunub. Orada biz bu sətirləri oxuyuruq: "**Abdulməlik bin Abdilaziz bin Cureyc, Əsid bin Əbil-İs bin Umeyyə ailəsinin azadlı köləsidir və Əbul-Valid kunyəsi ilə çağırılır. 150-ci ildə vəfat edib və onun kitabları arasında "əs-Sunən" kitabı vardır ki, digər "sunən" kitablarının mühtəvası kimi o da təharət, oruc, namaz, zəkat və bunun kimi başlıqları ehtiva edir.**"[543] Onun kitabları arasında həmçinin İbn Abbasın hədislərini özündə ehtiva edən bir kitab da olub. İmam Əhməd bin Hənbəl deyir: "**İbn Cureyc (Mədinədə) Əbu Cəfərin yanına gəldi və ona dedi: "Sənin baban Abdullah bin Abbas'ın hədisini toplamışam. Onları mənim kimi başqa heç kim toplamayıb." Amma ona bir şey vermədi.**"[544] İbn Cureyc'in kitablarından biri bizim günümüzə qədər gəlib çatıb.

542. "Nəssəx" sadəcə əlyazmaların üzünü köçürənlərə deyildiyi halda "varraq" vərəqləri hazırlayan, onları kitab halına salan, cildləyən kəslərə deyilib. Xəttat isə gözəl yazısı olduğu üçün xüsusi gözəlliklə yazılar yazan kəsdir.

543. "əl-Fihrist", səh: 278;

544. "əl-İləl va Mərifətur-Ricəl", 2/312;

Bu nüsxənin əlyazması Dəməşqdəki “əz-Zahiriyyə” kitabxanasında 24-nömrəli toplunun içində tapılıb. Bu əlyazma Abdullah bin İbrahim ər-Raşid tərəfindən təhqiq olunub və “Cuz’u İbn Cureyc” adı ilə çap olunub. Həmzə Əhməd əz-Zeyn əl-Həsəni tərəfindən də “Əhədis əş-Şuyux əl-Kibər” adlı kitabın tərkibində təhqiq olunub. Bu kitabın əslini təşkil edən əlyazma İbn Asəkir adı ilə tanınan məşhur alim Əli bin əl-Həsən bin Hibətilləh əş-Şafi’i (h. 499-571) tərəfindən köçürülüb. Beləliklə də İbn Asəkir əlyazmasını yazarkən bu sözlər ilə başlayır: “**Şeyx əl-Fəqih əl-İmam Əbul-Həsən Əli bin əl-Muslim bin Muhəmməd bin Əli bin əl-Fəth bin Əli əs-Suləmi 519-cu ildə zul-qadə ayında ona oxumaq surəti ilə - və o, təsdiqlədi – bizə xəbər verdi; dedi: Əbul-Həsən Əhməd bin Abdilvahid bin Muhəmməd ibn Əbil-Hədid əs-Suləmi 465-ci ildə Dəməşqdəki evində ona oxumaq surəti ilə bizə xəbər verdi; dedi: babam Əbu Bəkr Muhəmməd bin Əhməd bin Osman ibn Əbil-Hədid əs-Suləmi ona oxumaq surəti ilə bizə xəbər verdi; dedi: Əbu Mərvan Abdulməlik bin Bəhr bin Şazan əl-Məkki 381-ci ildə ramazan ayında Misirdə Fustat şəhərində ona oxumaq surəti ilə bizə xəbər verdi; dedi: Muhəmməd bin İsmail əs-Saiğ bizə rəvayət etdi: Ravh bin Ubədə əl-Qeysi bizə xəbər verdi: İbn Cureyc bizə xəbər verdi.**”

İbn Cureyc’dən rəvayət edən Əbu Muhəmməd Ravh bin Ubədə bin əl-Alə əl-Qeysi əl-Basri’dir. Böyük alim və hafizdir, çoxlu hədis toplayıb. Hicri 205-ci ildə vəfat edib. Ondan isə bunu rəvayət edən Əbu Cafər Muhəmməd bin İsmail əs-Saiğ əl-Quraşi əl-Abbasi əl-Bağdadi olub. Hicri 276-cı ildə doxsan yaşlarında vəfat edib. İbn Əbi Hətim ər-Razi deyir: “**Ondan (hədis) dinlədim və o, saduqdur.**” Ondan bu hədisləri eşidən Misirin mühəddislərindən Abdulməlik bin Bəhr bin Şazan əl-Məkki’dir. İbn Yunus əl-Misri onun siqa olduğunu deyir. Hicri 334-cü ildə Misirdə vəfat edib. Ondan isə Dəməşq şəhərinin müsnidi Əbu Bəkr Muhəmməd ibn Əbil-Hədid əs-Suləmi rəvayət edir. 309-cu ildə anadan olub və 405-ci ildə vəfat edib. Abdulaziz əl-Kəttəni onun haqqında “**siqa və etibarlı idi**” deyir. Ondan isə nəvəsi Əbul-Həsən Əhməd ibn Əbil-Hədid rəvayət edir. Etibarlı və əsilzadə bir şəxs olub. Hicri 469-cu ildə vəfat edib. Bu cüzü daha sonra ondan Şamın müftisi Cəməlul-İsləm Əbul-Həsən

Əli bin əl-Muslim əs-Suləmi əl-Fəradi eşidib. İbn Asəkir'in şeyxi olub və İbn Asəkir onu "siqa, səbt" olaraq vəsf edir. Hicri 533-cü ildə zul-qadə ayında fəcr namazından sonra vəfat edib.

Bu nüsxənin içində 65 hədis yer alır. Biz bu nüsxəyə nəzər saldıqda görürük ki, İbn Cureyc bir çox hədisi səhabələrdən arada yalnız bir nəfər vasitəçi olmaqla rəvayət edib. İbn Cureyc → Ata bin Əbi Rabah → Abdullah bin Abbas, İbn Cureyc → Ata bin Əbi Rabah → Cabir bin Abdilləh, İbn Cureyc → Əbuz-Zubeyr Muhəmməd bin Muslim → Cabir bin Abdilləh, İbn Cureyc → Əbuz-Zubeyr → Əbu Said əl-Xudri, İbn Cureyc → İbn Şihəb əz-Zuhri → Ənəs bin Malik yolları bu rəvayət kanallarından bəziləridir. Gördüyümüz kimi arada təkcə bir ravi olmaqla səhabələrdən bu şəkildə xeyli hədis rəvayət edib. Hamısının da sənədləri səhihdir, sabitdir. Misal üçün bu cüzün daxilindəki on səkkizinci hədisdə İbn Cureyc deyir: "**Əbuz-Zubeyr mənə xəbər verdi ki, o, Cabir bin Abdilləh'dən belə dediyini eşidib: O da peyğəmbərdən – salləllahu aleyhi va sələm – belə dediyini eşidib: "Bir nəfərin yeməyi ikisinə yetər, iki nəfərin yeməyi dördünə yetər və dörd nəfərin yeməyi səkkiz nəfərə yetər.**" Bu hədisi İmam Əhməd "əl-Musnəd" kitabında[545] Vaki və Abdurrahmən bin əl-Mehdi → Sufyan əs-Səvri → Əbuz-Zubeyr → Cabir bin Abdilləh yolu ilə rəvayət edir.[546] İmam Əhməd həmçinin bu hədisi Əbu Muaviyə → əl-Aməş → Əbu Sufyan Talha bin Nafi → Cabir bin Abdilləh yolu ilə rəvayət edir. Bundan ziyadə Abdurrazzəq bunu "əl-Musannəf" kitabında Mə'mər bin Raşid → Əyyub əs-Sixtiyəni → Nəfi → Abdullah bin Ömər yolu ilə rəvayət edir.[547] İmam əl-Buxari "əs-Sahih" kitabında[548] bu hədisi Abdullah bin Yusuf və İsmail → Malik bin Ənəs → Əbuz-Zinəd → əl-Arac → Əbu Hureyra kanalı ilə rəvayət edir. ət-Tabərani "əl-Mucəm əl-Kəbir" kitabında bu hədisi Cəfər bin Əhməd əs-Səmi → Əbu Kureyb → Muxtər bin Ğassən → Qeys bin ər-Rabi → Əbu İshaq → Əbul-Əhvas → Abdullah bin Məsud yolu ilə rəvayət edir. Həmçinin başqa yolla Səmura bin Cundub'dan da rəvayət olunur. Beləliklə də bu hədisi Cabir bin Abdilləh,

545. "əl-Musnəd", 22/130;
546. "əl-Musnəd", 22/285;
547. "əl-Musannəf", 10/418;
548. "Sahih əl-Buxari", (5392)

Abdullah bin Ömər, Əbu Hureyra, Abdullah bin Məsur, Səmura bin Cundub kimi səhabələr rəvayət edirlər. Bu hədisin rəvayət kanalları bizim saydıqlarımızla məhdud deyildir. Biz burada sadəcə olaraq İbn Cureyc'in kitabında keçən bu hədisin digər hədis kitablarında təsdiqini tapdığını və səhihliyində şübhə buraxmadığını göstərmək üçün bəzi misallar zikr etdik.

Kitabdan 38-ci hədisdə İbn Cureyc deyir: "**İbn Şihəb'dən; dedi: Ənəs bin Malik mənə xəbər verdi ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: "Bir-birinizlə əlaqələri kəsməyib, bir-birinizə üz döndərməyin və bir-birinizə nifrət etməyin! Müsəlmana qardaşını üç gecədən artıq tərk etməsi halal deyildir!**" Bu hədisi həmçinin İbn Şihəb əz-Zuhri'dən Mə'mər bin Raşid "əl-Cami" kitabında,[549] Malik bin Ənəs "əl-Muvatta" kitabında[550] rəvayət edir. Eləcə də əl-Humeydi bunu müsnədində şeyxi Sufyan bin Uyeynə'dən, o da İbn Şihəb əz-Zuhri'dən rəvayət edir.[551] Bu hədisin bənzər sözləri Əbu Hureyra'nın ona yaxın tələbəsi tərəfindən rəvayət olunur.

## Musa bin Uqbə'nin "əl-Məğazi" kitabı

Musa bin Uqbə bin Əbi Ayyəş əl-Əsədi əl-Mitraqi məşhur "əl-Məğazi" kitabının sahibidir. Dəqiq doğum tarixi bizə məlum deyildir, lakin özü şahidlik edərək deyir: "**İbn Ömər Məkkədə ikən Nəcdə əl-Həruri'nin həcci ilində həcc elədim və gördüm ki, Səhl bin Sad mənim yanımdan sıraları arayaraq keçdi, minbərə söykəndi və imama gizlində bir şeylər söylədi.**"[552] Nəcdə əl-Həruri'nin həcci isə hicri 68-ci ildə baş verib, çox ehtimal ki, o il artıq həddi-büluğa çatmışdı. Vəfatına gəldikdə isə hicri 141-ci ildə vəfat edib. Musa'nın kitabı öz zamanında bəlkə də ən məşhur və ən etibarlı qaynaq hesab olunurdu. Malik bin Ənəs, Əhməd bin Hənbəl, Yəhya bin Main kimi alimlərin israrla o kitabı məsləhət görmələri

549. Abdurrazzəq, "əl-Musannəf", 11/167;

550. "əl-Muvatta", 5/1333, əl-Azami çapı

551. "Musnəd əl-Humeydi", 2/302 (1217);

552. "Təhzibut-Təhzib", 10/362;

buna dəlalət edir. Musa'nın kitabı ondan köçürülür və öyrədilirdi. İbn Sad onun qardaşı oğlu İsmail bin İbrahim haqqında danışarkən deyir: "**İsmail bin İbrahim bin Uqbə; o, Musa bin Uqbə'nin qardaşı oğludur... öz əmisi Musa bin Uqbə'dən "əl-Məğazi" kitabını rəvayət edərdi...**"[553]

Musa bin Uqbə'nin də "əl-Məğazi" kitabı çox təəssüf ki, tam şəkildə bütöv bir kitab olaraq bizim zamanımıza qədər gəlib çatmayıb, lakin bizə o kitabdan bir hissə gəlib çatıb. Onu Yusuf bin Qadi Şuhbə (vəfatı hicri 789) Musa bin Uqbə'nin kitabından seçərək yazıb və əlyazması Berlində Prussiya kitabxanasında saxlanılır. Alman oriyentalist Carl Eduard Sachau (1845-1930) 1905-ci ildə Berlindəki əlyazmadan istifadə edərək Musa bin Uqbə'nin "əl-Məğazi" kitabının kiçik bir hissəsini nəşr edir. Bu kitab əsrlər boyunca alimlər tərəfindən istifadə olunub, hətta hicri 930-cu ildə vəfat etmiş əd-Diyərbəkri "Tərixul-Xamis" kitabında ondan iqtibaslar edir. Böyük alim Əbu Bəkr əl-Beyhəqi deyir: "**Səhabələrdən Bədr döyüşündə iştirak edənlərin adları bizim yanımızda Urva bin əz-Zubeyr'in, əz-Zuhri'nin, Musa bin Uqbə'nin, Muhəmməd bin İshaq bin Yəsər'in və məğazi babında yazmış digər kəslərin kitablarında mövcuddur və bunların hamısına baxdım və onların kitablarından heç birində Əbu Qatədə'nin Bədr döyüşündə iştirak etdiyini görmədim.**"[554] əl-Beyhəqi hicri 458-ci ildə vəfat edib və bu sözləri aşkar şəkildə ifadə edir ki, Urva bin əz-Zubeyr, İbn Şihəb əz-Zuhri və Musa bin Uqbə'nin yazdıqları kitablar və başqa kitablar onun zamanında tədavüldə idi. Hicri 748-ci ildə vəfat etmiş Şəmsuddin əz-Zəhəbi deyir: "**Musa'nın "əl-Məğazi" kitabını (Dəməşqin rayonlardan biri olan) əl-Mizzə'də Əbu Nəsr əl-Farisi'yə oxudum.**"[555] İbn Həcər əl-Asqaləni'nin "Fəthul-Bəri" kitabında Musa bin Uqbə'nin "əl-Məğazi" kitabından sitatlar gətirməsi kitaba çıxışının olduğunu göstərir.

Daha sonra isə bu kitabın əlyazmaları tapılmaz hala gəlib və çox ehtimal ki, bunun səbəbi artıq "məğazi" mövzusunda daha müasir kitabların tədavülə keçməsi olmuşdur. İbn Qadi Şuhbə'nin seç-

553. "ət-Tabəqat əl-Kubra", 5/418;

554. "Mərifətus-Sunən val-Əsər", 2/428;

555. "Təzkiratul-Huffəz", 1/112;

diyi hədislər isə artıq "Əhədisu Muntəxabə min Məğazi Musa bin Uqbə" adı ilə və Şeyx Məşhur Al Salman'ın təhqiqi ilə çap olunub. Bu muntəxabda sadəcə 19 hədis yer alıb. Musa bin Uqbə'nin isnadları arasında qısa və uzun isnadlar vardır və onların arasından bəzi qısa isnadlar Musa bin Uqbə → Nafi → Abdullah bin Ömər, Musa bin Uqbə → Səlim bin Abdilləh → Abdullah bin Ömər, Musa bin Uqbə → İbn Şihəb əz-Zuhri → Ənəs bin Malik və Musa bin Uqbə → Abdullah bin əl-Fədl → Ənəs bin Malik şəklindədir. Bu qısa sənədləri 19 hədisin içərisindən seçdim.

Musa'nın "əl-Məğazi" kitabı həmçinin Muhəmməd Bəqşiş Əbu Malik tərəfindən fərqli kitablardan toplanaraq bir kitab şəklində də çap olunub. Başqa kitablarda Musa bin Uqbə'nin səhabədən rəvayət etdiyi başqa ən qısa sənədlərə misal olaraq Musa bin Uqbə → Kureyb → Usəmə bin Zeyd, Musa bin Uqbə → Kureyb → İbn Abbas, Musa bin Uqbə → Muhəmməd bin Amr bin Ata → İbn Abbas, Musa bin Uqbə → Saleh Məvla ət-Təv'əmə → İbn Abbas, Musa bin Uqbə → Abdullah bin Dinar → Əbu Hureyra, Musa bin Uqbə → Abdurrahmən əl-Arac → Əbu Hureyra, Musa bin Uqbə → Əbuz-Zubeyr Muhəmməd bin Muslim → Abdullah bin əz-Zubeyr, Musa bin Uqbə → Abdullah bin Amr əl-Əvdi → Abdullah bin Məsud, Musa bin Uqbə → Urva bin əz-Zubeyr → Aişə, Musa bin Uqbə → Əbu Abdilləh əl-Qarraz → Sad bin Əbi Vaqqas və başqalarını göstərmək olar.

## Mə'mər bin Raşid'in "əl-Cəmi" kitabı

Əbu Urva Mə'mər bin Əbi Amr Raşid əl-Əzdi olaraq tarixi qaynaqlarda zikr olunan bu şəxsiyyət İslam tarixində ilk geniş hədis kitablarından birini yazıb. "əl-Cami" adı ilə tanınan bu kitab bizim günümüzə qədər gəlib çatıb. Mə'mər özü əslən Basra şəhərindəndir, lakin Yəmənə köçmüş, orada məskən salmış və orada fəaliyyət göstərmişdir. Doğum tarixini əz-Zəhəbi hicri 95 və ya 96 olaraq qeyd edir. Yeniyetmə ikən əl-Həsən əl-Basri'nin cənazəsində iştirak edib.

əz-Zuhri, Amr bin Dinar, Həmməm bin Munəbbih, Əbu İshaq əs-Səbi'i, Sabit əl-Bunəni, Yəhyə bin Əbi Kəsir, Mənsur bin

əl-Mu'təmir, Süleyman əl-Aməş, Zeyd bin Əsləm, Əyyub əs-Sixtiyəni, Muhəmməd bin əl-Munkədir və onların müasirlərindən elm yazıb. Hicri 153-cü ildə vəfat edib. Tələbələrindən ən axırıncı ölən Muhəmməd bin Kəsir sayılır və əz-Zəhəbi onun 216-cı ildə vəfat etdiyini deyir.

Mə'mər bin Raşid'in "əl-Cami" kitabı çox əhəmiyyətli qaynaq hesab olunur, çünki tarixə nəzərən müəllifi ilk nəsilə yaxın bir zamanda yaşayıb. Hətta "əl-Muvatta" kitabından da öncə yazıldığı deyilir. İbn Səməra əl-Cə'di hicri 586-cı ildə yazıb bitirdiyi kitabında Mə'mər bin Raşid haqqında danışarkən deyir: "**Onun sünnət barəsində məşhur "əl-Cami" kitabı vardır ki, ona nisbət olunur və bu, Yəməndə yazılmış ən qədim kitablardandır. Hətta "əl-Muvatta" kitabından da qədimdir.**"[556] Mə'mər kitabında bir çox yerdə səhabə ilə arasında yalnız bir nəfəri qeyd edir. Daha öncə qeyd etmişdik ki, Həmməm bin Munəbbih'in Əbu Hureyra'dan yazdığı hədisləri Mə'mər köçürmüşdü. Həmçinin Sabit əl-Bunəni vasitəsi ilə bir çox səhabədən hədis rəvayət edir. Sabit əl-Bunəni isə Əbu Muhəmməd Sabit bin Əsləm əl-Bunəni'dir, Müaviyə xəlifə olduğu dövrdə doğulub və bir çox səhabə ilə qarşılaşıb, onlardan hədis eşidib. Qarşılaşdığı səhabələr arasında Ənəs bin Malik, Abdullah bin Ömər, Abdullah bin əz-Zubeyr, Əbu Bərzə əl-Əsləmi, Abdullah bin Muğaffəl əl-Muzəni və başqaları vardır. Dəqiq doğum tarixi üzərində fikir ayrılığı vardır, lakin hicri 120-ci illərdə vəfat edib. Mə'mər bin Raşid isə günümüzdə çap olunmuş "əl-Cami" kitabında ondan eşitdiyi çox sayda hədisi yazılı şəkildə bizlərə çatdırıb. Qatədə vasitəsi ilə isə İmran bin Huseyn, Ənəs bin Malik kimi səhabədən rəvayət edir. Qatədə isə səhabələrə tələbəlik etmiş böyük imam və alim Əbul-Xattab Qatədə bin Diamə əs-Sədusi'dir, hicri 61-ci ildə doğulub və hicri 118-ci ildə vəfat edib. Mə'mər özü deyir: "**On dörd yaşım olanda Qatədə'dən (hədis) eşitdim və o illərdə eşitdiyim elə bir şey yoxdur ki, sanki sinəmdə yazılmış olmasın!**"[557]

Dediyimiz kimi "əl-Cami" kitabı günümüzə qədər gəlib çatıb. Bu gün həmin kitab Abdurrazzəq'ın "əl-Musannəf" kitabının axırıncı

556. "Tabəqat Fuqahə əl-Yəmən", səh: 66;

557. "ət-Tərix əl-Əvsət", 2/115;

cildində çap olunub, çünki "əl-Cami" kitabını onun tələbəsi Abdurrazzəq əs-San'ani öz "əl-Musannəf" kitabına əlavə edib və o şəkildə tələbələrinə öyrədib. Abdurrazzəq özü ora bəzi rəvayətlər əlavə etsə də yekun olaraq "əl-Musannəf" kitabının sonuncu cildi "əl-Cami" olaraq tanınır. İbn Xayr əl-İşbili deyir: "**Mənə həmçinin Abdurrazzəq'in "əl-Musannəf" kitabına izafə olunmuş "əl-Cami" kitabını da rəvayət etdi və o, Mə'mərin camisidir.**"[558] Ona görə də Doktor Həbibur-Rahmən əl-Azami "əl-Musannəf" kitabını 1983-cü ildə çap etdikdə kitabın üzündə "Böyük hafiz Əbu Bəkr Abdurrazzəq bin Həmməm əs-San'aninin "əl-Musannəf" kitabı və onunla birlikdə İmam Mə'mər bin Raşid əl-Əzdi'nin "əl-Cami" kitabı" adını qeyd edib. Kitabı bir neçə əlyazma əsasında hazırlayıb, o əlyazmalardan bəziləri Dəməşqdəki "əz-Zahiriyyə" kitabxanasındandır, bir digəri isə İstanbuldakı Murad Molla nüsxəsidir. "əl-Cami" kitabı ayrıca bir əsər olaraq əlyazma şəklində mövcuddur. Mahmud Muhəmməd ət-Tanəhi deyir: "**O nəfis (tapıntılardan) öz gözümlə gördüyümdən biri hicri 153-cü ildə vəfat etmiş Mə'mər bin Raşid'in "əl-Cami" kitabından bir nüsxəsidir. Onun hədis barəsindəki bu kitabı İbn Səmərə'nın "Tabəqat Fuqahə əl-Yəmən" kitabında (səh: 66) dediyi kimi Malik'in "əl-Muvatta" kitabından daha qədimdir. Həmin nüsxə bir məğribli xətti ilə heyvan dərisi üzərində 364-cü ildə yazılıb. Mən onu Ankara Universitetində ədəbiyyat fakultəsinin kitabxanasında İsmayıl Said Efendi'nin kolleksiyasında gördüm...**"[559] Fuad Sezgin, Muhəmməd Mustafa əl-Azami də bu nüsxəni zikr edirlər, həmçinin bənzər bir nüsxənin İstanbulda Feyzullah Efendi kitabxanasında olduğunu da deyirlər.

## Malik bin Ənəs və "əl-Muvatta" kitabı

O, ümmətin hüccəti, hicrət yuvasının imamı Əbu Abdilləh Malik bin Ənəs bin Malik bin Əbi Amir bin Amr əl-Himyəri əl-Mədəni'dir. Əhlüs-sünnət'in etibarı və fəziləti üzərində ittifaq etdikləri dörd imamdan biridir. Hicri 93-cü ildə Mədinədən təxminən

558. "Fihrist İbn Xayr", səh: 169, Darul-Ğarb

559. "Məqalətul-Alləmə əd-Duktur Mahmud Muhamməd ət-Tanəhi", səh: 329;

üç yüz kilometr aralıda yerləşən bir kənddə dünyaya gəlib. Əslən yəmənlidir, lakin babası Malik bin Əbi Amir oradakı valilərin birinin zülmündən qaçaraq Mədinəyə köçüb. Babası da tabiin nəslinin nümayəndələrindəndir, Ömər, Talha, Aişə, Əbu Hureyra, Həssən bin Sabit kimi səhabələrdən hədis rəvayət etmişdir. Ondan isə oğulları Ənəs, Əbu Suheyl Nafi və ər-Rabi rəvayət edir. Hicri 112-ci ildə, yəni İmam Malik'in 19 yaşı olduqda vəfat edib. İmam Malik'in ilk müəllimləri Abdurrahmən bin Hurmuz əl-Arac və Rabiah bin Əbi Abdirrahmən olub. Həmçinin məşhur səhabə Abdullah bin Ömər'in azadlı köləsi Nafi'dən də (vəfatı hicri 117) tam şəkildə faydalanıb. əl-Qadi İyad deyir: "**Musab dedi: "Malik Nafi'ni evindən məscidə qədər aparardı və Nafinin gözü kor olmuşdu. (Yolda) ondan soruşardı, o da ona (hədis) rəvayət edərdi. Nafi'nin mənzili Bəqi qəbiristanlığının yanında idi.**"[560] İmam Malik'in digər şeyxləri arasında Humeyd ət-Tavil, İbn Şihəb əz-Zuhri, Əyyub əs-Sixtiyəni, Said əl-Məqburi, Suheyl bin Əbi Saleh və Abdullah bin Əbi Bəkr bin Həzm'in adlarını saymaq olar.

İmam Malik güclü hafizəyə malik biri idi. Hüseyn bin Urva'nın ondan rəvayət etdiyinə əsasən Malik deyib: "**əz-Zuhri bizim şəhərə gəldi və biz yanına getdik; Rabi'ah da bizimlə idi. Bizə 40-dan çox hədis rəvayət etdi. Sonra səhərsi gün yanına gəldik və dedi: "Bir kitaba baxın ki, sizə hədis rəvayət etdikdə görəsiniz ki, dünən rəvayət etdiklərimdən hansı orada var!" Rabi'ah ona dedi: "Sənin dünən rəvayət etdiklərini sənə (əzbərindən) təkrar söyləyə biləcək biri var burda." Dedi: "Kimdir o?" Dedi: "İbn Əbi Amir." Dedi: "Qoy desin!" Mən də bunun üzərinə ona oradan qırx hədis rəvayət etdim. əz-Zuhri dedi: "Məndən başqa bu cür əzbərlə bilən birinin qaldığını düşünmürdüm.**"[561] Bu xəbərdən həmçinin öyrənmiş oluruq ki, əz-Zuhri hədislərini tələbələrinə yazdırardı. İmam Malik də uşaqlıq çağından başlayaraq çox sayda hədis yazıb. əl-Qadi İyad deyir: "**Bəziləri ondan belə dediyini rəvayət ediblər: "Əlimlə yüz min hədis yazdım.**"[562] Əhməd bin Saleh deyir: "**Malikin kitablarının**

560. "Tərtibul-Mədərik va Təqribul-Məsəlik", 1/132;
561. "əl-İntiqa fi Fədail əs-Sələsətil-Əimmətil-Fuqahə", səh: 49;
562. "Tərtibul-Mədərik va Təqribul-Məsəlik", 1/137;

**əsllərinə baxdım və orada on iki minə yaxın hədis var idi.**”[563] İmam Malik'in kitablarının əslləri onun elm məclislərində müəllimlərindən eşidərək yazdığı hədis dəftərləri olmalıdır. Əhməd bin Saleh'in onun bütün dəftərlərini deyil də, onların bir hissəsini görməsi mümkündür. Abdullah bin Ömər də deyir: “**İbn Şihəb'dən mənim və Malik'in ərz edərək eşitdiklərimizin hamısında Malik (kitabdan) bizim üçün oxuyardı və gözəl qiraəti var idi.**”[564] Bu ona dəlalət edir ki, İmam Malik hədis dirasətində yazıdan geniş istifadə edərdi. Bu kitabda əvvəldən bəri isbat etdiyimiz məqam bu xəbərlərdə də təsdiqini tapır. Hədis məclislərində hədisləri yazmaq artıq o dövrdə bu məclislərin ayrılmaz bir adəti idi və bu adət elm məclisləri başlandığı dövrdən mövcud olub. Abdulaziz bin Abdulləh deyir: “**Malikdən Amr bin Dinar'dan hədis eşidib eşitmədiyini soruşdular. Dedi: “Onu hədis rəvayət edərkən gördüm və insanlar ayaq üstə durub yazırdılar. Mən isə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – hədisini ayaq üstə yazmağı xoş görmədim.**”[565] Onun elmə olan hərisliyi və bunun üçün istedadı gənc yaşlarından onu məşhur etmişdi. Əyyub əs-Sixtiyəni deyir: “**Nafi sağ olduğu zamanda Mədinəyə gəldim və Malik'in (orada elm) halqası var idi.**”[566] Musab deyir: “**Nafi sağ olanda Malik'in (elm) halqası var idi ki, Nafinin halqasından daha böyük idi.**”[567]

İmam Malik'in özündən sonra tərk etdiyi və fəziləti üzərində ümmətin ittifaq etdiyi “əl-Muvatta” adlı bir kitabı vardır. Bu kitabı dinləmək üçün elm tələb edənlər müsəlman coğrafiyasının fərqli bölgələrindən Mədinə şəhərinə gələrdilər. Bu kitabı Muhəmməd bin əl-Həsən əş-Şeybəni, Muhəmməd bin İdris əş-Şafi'i, Abdurrahmən bin Mehdi kimi böyük imamlar öyrəniblər. İmam Malik'in hədis məclisindəki üslubuna diqqət salsaq görəcəyik ki, o dövrdə yayğın olan təlim şəklini əks etdirir. Abdullah bin Əhməd deyir: “**Atama dedim: “Sənin “Abdurrahmən'ə Malik'dən rəvayət**

563. Eyni mənbə: 1/133;

564. Eyni mənbə

565. “Tərtibul-Mədərik va Təqribul-Məsəlik”, 1/135;

566. Eyni mənbə: 1/140;

567. Eyni mənbə: 1/141;

**etdiklərini oxudum" deyərək rəvayət etdiklərini özü eşidib yoxsa ərz edib?" Dedi: "Abdurrahmən (bin Mehdi) dedi: "Namaz kitabına gəldikdə onu Malikə özüm oxumuşam." Abdurrahmən dedi: "Kitabın qalan hissəsinə gəldikdə isə onu Malikə başqaları oxudular və mən öz kitabıma baxırdım.**"[568] Imam Malik'in məclisində kitabını oxuyan bir tələbəsi oturardı və adı Həbib olaraq tanınırdı. əl-Xatib əl-Bəğdadi'nin isnadı ilə rəvayət etdiyi xəbərdə Quteybə deyir: "**Hər məclisdə Malikə tərəf qalxıb soruşardım: "Həbib sənə oxuduğunu doğru oxudumu?" Deyərdi: "Bəli." Bunun üzərinə soruşardım: "Mən "Malik bizə rəvayət etdi" deyə bilərəmmi?" Deyərdi: "Bəli.**"[569] Bundan sonra əl-Xatib əl-Bağdadi daha bir xəbəri zikr edir. "**İbn Bukeyr dedi: "əl-Muvatta kitabını Malikə ərz etdiyimizdə Məğrib əhlindən bir nəfər ona dedi: "Ey Əbu Abdilləh, bunu səndən rəvayət edimmi?" Dedi: "Bəli." Dedi: "... və mən "Malik mənə rəvayət etdi" deyimmi?" Dedi: "Bəli! Vaxtımı sizin üçün ayırmadımmı, sizin kitabı mənə ərz etməyinizə qulaq asmadımmı, xətalarınızı və yalnışlarınızı düzəltmədimmi?! O zaman məndən başqa kim bunu rəvayət etmiş olacaq?! Bəli! Məndən rəvayət etdi və de: "Malik mənə rəvayət etdi".**" Kitabı ərz etmədən öncə əlbəttə ki, İmam Malikin dediklərini eşidib yazardılar. Əbu Musab deyir: "**Mə'n'i – yəni İbn İsa əl-Qazzaz'ı qapının kandarında oturmuş halda gördüm və Malikin tələffüz etdiyi elə bir şey yox idi ki, onu yazmasın.**"[570] Əhməd bin Yezid ər-Rayyəhi deyir: "**Biz Malik bin Ənəs'in yanında idik, (hədis) yazırdıq və İsmail bin Uleyyə iki ayağı üstə durmuş halda istimla edirdi.**"[571] Hədis məclislərində istimla edənin rolu ucadan oxuyaraq bütün tələbələrə mətni eşitdirmək idi. İmam Əli bin əl-Mədini deyir: "**Yəhya bin Said əl-Qattan'ı belə deyərkən eşitdim: "Sufyan ilə qarşılaşdıqdan iki il sonra Malik bin Ənəs ilə (yüz) otuz dördüncü ildə qarşılaşdım və o, daha gənc idi." Yəhya'ya dedim: "O sənə (hədisləri) özü imla edir-**

568. "əl-İləl va Mərifətur-Ricəl", 2/321;

569. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 309;

570. İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 1/26;

571. əl-Xatib əl-Bağdadi, "əl-Cəmi li Əxləqir-Ravi va Ədəbis-Səmi", 2/66; Əbu Sad əs-Səm'ani, "Ədəbul-İmlə val-İstimlə", səh: 391;

**dimi?" Dedi: "Mən onun qarşısında oturub yazırdım." (Əli) dedi: "Yəhya'nı (yenə) belə deyərkən eşitdim: "Bəzən İmran əl-Qasir'i İbn Əbi Arubə'nin yanında dizləri üstündə oturub lövhələrə yazarkən görürdüm**."[572]

İmam Malik tələbələrinin kitablarındakı xətaları bəzən özü düzəldərdi. əl-Qadi İyad deyir: "**İbn Vəhb'ə dedilər: "İbnul-Qasim sənə bəzi şeylərdə müxalifdir." Dedi: "İbnul-Qasim Malikin yanına qocaldığı vaxt gəlirdi, mən isə o hələ güclü bir gənc ikən gəlirdim. Kitabımı əlimdən alardı və onu oxuyardı. Olurdu ki, bəzən içində xəta tapırdı, qarşısından bir parçanı götürərdi, onu suda isladardı və (xətanı) silərdi və mənim üçün (orada) doğru olanı yazardı.**"[573] Əbu Nueym əl-Hələbi deyir: "**Malik bin Ənəs'in yanına daxil oldum və İsmail bin Saleh mənimlə birlikdə idi. (Malik) bükülmüş bir kitab çıxardı və dedi: "Bu, mənim kitabımdır. İçinə nəzər salmışam. Bunu məndən rəvayət et, belə ki, mən onu redaktə edib düzəltmişəm." İsmail ona dedi: "(Rəvayət edəndə) "Malik bin Ənəs bizə rəvayət etdi" deyəkmi?" Dedi: "Bəli.**"[574] Tələbəsi İbn Vəhb həmçinin deyir: "**Malik bin Ənəs'in yanında idim və yanında kisəsində "əl-Muvatta" kitabını daşıyan bir nəfər gəldi və dedi: "Ey Əbu Abdilləh! Bu, sənin "əl-Muvatta" kitabındır, onu köçürdüm, əsli ilə tutuşdurdum. Ona görə də mənə onu(n rəvayətinə) icazə ver!" Dedi: "Elədim." Dedi: "Necə deyim: "Malik bizə rəvayət etdi" yoxsa "Malik bizə xəbər verdi"?" Dedi: "Hansını istəyirsənsə söylə!**"[575] İmam Malik həm də uzaq ölkələrdən ona göndərilən məktublara da cavab verərdi. Tələbələri ona yazaraq bəzən onun məclisində eşitdikləri, lakin yazdıqları dəftərlərdə tapa bilmədikləri hədislər haqqında soruşardılar. İshaq bin İsa ət-Tabba' deyir: "**Malik bin Ənəs mənim ona yazdığım məktuba cavab verərək mənə yazdı: "Məktubun mənə çatdı, sənin yazından düşmüş bir hədisi zikr edirsən və məndən onun haqqında, Abdullah bin Ömərin hədisi**

572. "Təqyidul-İlm", səh: 145-146;

573. "Tərtibul-Mədərik va Təqribul-Məsəlik", 3/236;

574. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 333;

575. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 333;

**haqqında soruşursan və onun sənə yazıb göndərməmi istəyirsən. Mən sənin xətrini əziz tutmaq, ehtiyacını qarşılamaq və səni bütün xeyrə yönləndirməkdən başqa bir şey istəmirəm, çünki sən xətrini saxlamağı, aramızda sevginin qalmasını istədiyim, vəfasının və mənə sevgisinin doğruluğunu arzu etdiyim qardaşlarımdansan. Həmin hədisi tanıdım. Abdullah bin Ömər'in mövlası Nafi mənə rəvayət etdi ki, Abdullah bin Ömər bazarda ikən sidiyə çıxdı, sonra dəstəmaz aldı, üzünü, qollarını yudu və başına məsh çəkdi. Sonra məscidə qayıtdı, həmən bir cənazə üzərində namaz qılması üçün çağırıldı. Su gətirilməsini istədi və xuflarına məsh çəkdi. Sonra isə cənazə üzərində namaz qıldı." İshaq deyir: "Sonra Malik ilə qarşılaşdım, həmin hədis haqqında soruşdum və onu mənə necə yazmışdısa elə də rəvayət etdi. Üzüyünün də üstündə "həsbiyallahu va ni'məl-vakil" nəqş olunmuşdu.**"[576] Bütün bu xəbərlər İmam Malik'in müəllimlik və alimlik tərəflərini bizə sərgiləyir. Gənc yaşlarında hədisləri özü yazıb, yanına gələnlərin kitablarını oxuyub düzəlişlər edib, yaşlı vaxtlarında isə elm məclisində ondan hədis eşidib yazanların kitablarını ona ərz etməklərinə imkan verib, ərz etdiklərində qulaq asıb, xətalarını düzəldib. Üstəlik onu tərk edib getdikdən sonra bəzi tələbələrinin göndərdiyi məktubları qəbul edib, oxuyub onlara cavab yazıb. Bizim burada şahidlik etdiyimiz mənzərə budur ki, o dövrdə də bizim zamanımızda olduğu kimi elmi standartlar olub və dövrünün əksər alimləri, araşdırmacıları bu standartlara tabe olublar. İmam Malik və "əl-Muvatta" kitabı da istisna deyildir.

İmam Malik'in xüsusilə gənclik illərində, ümumiyyətlə isə bütün ömrü boyu yazdığı hədislərin sayı tələbələrinə rəvayət etdiyi və "əl-Muvatta" kitabına yerləşdirdiklərindən qat-qat çox olub. Bununla bağlı yuxarıda bəzi xəbərləri zikr etdik, hətta qeyd etdik ki, bəzilərinin rəvayət etdiyi xəbərə əsasən İmam Malik yüz min civarında hədisi öz əli ilə yazıb. Bir daha xatırladaq ki, o dövrdə hədis deyildikdə qəsd olunan isnadlar idi, yəni bir mətnin əgər beş ayrı isnadı varsa o dövrdə bu, beş ayrı hədis hesab olunurdu. Həmçinin hədis deyildikdə yalnız peyğəmbərin – aleyhissalətu vassələm – sözləri qəsd olunmurdu, həmçinin səhabələrin və tabiin təbəqəsinin ən məşhur üzvlərinin

576. "əl-Kifəyə fi İlmir-Rivayə", səh: 341;

də sözləri hədis hesab olunurdu. Yəhyə əl-Qattan deyir: “**Malik – rahiməhullah – vəfat etdikdə kitabları çıxarıldı və orada İbn Ömərdən bir fundaq**[577] **tapıldı, içindəki hədislərdən ikisindən başqa heç biri “əl-Muvatta” kitabında yox idi.**”[578] Onun öz oğlu deyir: “**Maliki dəfn etdikdən sonra evinə daxil olduq, kitablarını çıxardıq. Gördük ki, içində İbn Şihəb’in hədislərindən ibarət yeddi fundaq var, arxası da, üzü də doludur. Onda həmçinin fundaqlarla və ya sandıqlarla dolu Mədinə əhlindən hədislər var idi. İnsanlar onları oxumağa başladı və onun üçün dua etdilər: “Ey Əbu Abdilləh! Allah sənə rəhm etsin! Səninlə uzun bir zaman oturub durduq amma bu oxuduqlarımızdan heç bir şeyi bizimlə müzakirə etmədin!**”[579] əl-Qadi İyad əlavə edir: “**İbn İshaq bin Bəbin deyir: “Malikin özündən sonra tərk etdiklərində iki qıfıllı sandıq tapdıq; içində kitablar var idi. Atam onları oxumağa başladı və ağlayaraq dedi: “Allah sənə rəhm etsin! Sən əməyin ilə yalnız Allahın razılığını qazanmaq istəmisən.”... Atiq bin Yaqub zikr edir ki, Malikin ölümündən sonra atası ilə birlikdə onun mənzilinə daxil oldu, kitablarla dolu sandıqlar çıxardı və onları oxudu. Sonra isə bunun bənzərini zikr etdi. Dedi ki, sonra başqa bir sandıq açdı və içindən əz-Zuhri’yə aid on iki min hədis çıxardı. Sonra başqasını açdı və içindən arxası və üzü Mədinə əhlinin hədisləri ilə dolu yeddi fundaq çıxardı. Deyir: “Onların içində tələbələrinin sağlığında müzakirə etdiyi hədislərdən heç birini görmədim.**”[580] Bu xəbərlərin işığında deyə bilərik ki, Malik bin Ənəs’in eşidib yazdığı hədislər rəvayət etdiyi hədislərdən çox olub. O yalnız önəmli hesab etdiyi, mənası aşkar olan, içində önəmli şəri təlimlər daşıyan hədisləri rəvayət edərdi. Yaxud da yalnız qəlbi xətircəm olduğu rəvayətlərlə kifayətlənərdi. Çünki ər-Rabi’ deyir: “**əş-Şafi’ni belə deyərkən eşitdim: “Malik əgər hədisin bir hissəsində şəkk edərdisə onun hamısını tərk edərdi.**”[581]

577. Xəbərlərdə keçən fundəq və ya fundaq sözü o dövrdə vərəqlərə verilən ad idi. Sonrakı əsrlərdə bu söz xüsusilə hesab kağızı, yəni faktura mənasında işlədilib.

578. “Tərtibul-Mədərik va Təqribul-Məsəlik”, 1/186;

579. “əd-Diybəcul-Muzhəb fi Mərifəti Ayən Uləməil-Məzhəb”, 1/113;

580. “Tərtibul-Mədərik va Təqribul-Məsəlik”, 1/187;

581. “Əbul-Valid Suleyman bin Xaləf əl-Bəci və Kitəbuhu ət-Tə’dil vat-Təcrih”,

"əl-Muvatta" kitabını İmam Malik'in dəqiq hansı tarixdə yazdığı bilinməsə də tarixi qaynaqlar onun hicri ikinci əsrin ilk yarısında yazıldığını təsdiqləyir. Bu mübarək kitab ilk yazıldığında həcm baxımından daha böyük bir kitab idi. Hətta Yəhya əl-Qattan deyir: "**İnsanların elmi artırmaqda idi, Malik'in elmi isə azaltmaqda idi.**"[582] Bəzi xəbərlərə əsasən ilk öncə bir neçə minlik hədis məcmusu olan Muvatta kitabı müəllifinin əməyi ilə ixtisar edilib. Çünki Malik kitabına səhih hesab etdiyi və dövrünün alimləri tərəfindən qəbul edilmiş hədisləri daxil etməyə həris idi, fərqli səbəblərə görə rəvayətlərin bir hissəsini kitabından çıxarıb. Üzərində xüsusi bir əmək sərf edilmiş belə bir kitab müasirləri tərəfindən də təqdir ilə qəbul edilmişdir. Hətta tələbəsi və dörd imamdan biri Muhəmməd bin İdris əş-Şafi demişdir: "**Yer üzündə Malikin "əl-Muvatta" kitabından daha doğru sünnət kitabı yoxdur.**"[583] əş-Şafi bu sözü ilə "əl-Muvatta" kitabının dövründəki bütün kitablardan daha üstün olduğunu təsdiqləyir və buradan anlaşılır ki, "əl-Muvatta" kitabı ilə müqayisə edilən başqa hədis kitabları da mövcud idi. İmam Malik ömrünün böyük bir hissəsini "əl-Muvatta" kitabını tələbələrinə öyrədib və bu müddət ərzində kitabında bir çox dəyişikliklər edib. Bəzi rəvayətləri çıxarıb və ya digərlərini daxil edib və yaxud da rəvayətlərin bir hissəsini ixtisar edib. Məhz bu səbəbə görə də "əl-Muvatta" kitabının fərqli versiyaları arasında bəzi fərqlər mövcuddur. Əlbəttə ki, İmam Malik'dən ömrünün axırında "əl-Muvatta" kitabını yazan tələbəsinin bizə çatdırdığı versiya ilə iyirmi və ya otuz il öncə həmin kitabı köçürmüş tələbənin versiyası arasında fərq olmalıdır. Ona görə də biz Yəhyə bin Yəhyə əl-Leysi'nin (h. 152-234) versiyasında mövcud olan bəzi hədisləri Abdullah bin Məsləmə əl-Qa'nəbi'nin (h. 13?-221) versiyasında tapa bilmirik, çünki əl-Qa'nəbi öz kitabını İmam Malikə 161-ci ildə ərz edib, Yəhya əl-Leysi isə İmam Malikin ömrünün sonunda, yəni 179-cu ildə ona ərz edib. Arada təxminən iyirmi il fərq vardır və bu müddətdə müəllifin öz kitabının içində dəyişikliklər etməsi təbii bir hal idi. Hətta "əl-Muvatta" kitabını Malikdən rəvayət etmiş tələbələrindən bəzisi onun özündən təqribən iyirmi il əvvəl vəfat edib. Ümumilikdə isə

2/700;

582. "Tərtibul-Mədərik va Təqribul-Məsəlik", 2/73;

583. İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 1/12; Əbu Nueym, "Hilyətul-Əvliyə", 6/329;

bu mübarək kitabı Malikdən öyrənib rəvayət edənlərin sayı çoxdur. Kitabın raviləri haqqında Əbu Nueym əl-Əsbəhəni, Əbu Muhəmməd Hibətullah bin əl-Əkfəni, Əbu Əli bin əz-Zəhra, İbn Nəsirid-Din əd-Diməşqi kimi islam alimləri əsərlər yazıblar. İbn Nəsirid-Din yazdığı əsərdə "əl-Muvatta" kitabını rəvayət edənlərin sayını 79-a çatdırır. Şeyx Mustafa Azami təhqiqində 100 nəfər ravinin adını qeyd edir və hər biri haqqında məlumat verir. Bəzi alimlər "əl-Muvatta" kitabını fərqli rəvayətləri ilə birlikdə öyrənərdilər və kitabın bu fərqli rəvayətlərinin isnadlarını təqdim edərdilər. Bununla elmi mütaliələrinin və geniş informasiya dairələrinin olduğunu göstərsələr də bizim üçün bu məlumatlar əvəz edilməz bir mənbəyə çevrilib. Misal üçün İbn Tulun əd-Diməşqi "əl-Fihrist əl-Əvsət minəl-Mərviyyət" kitabında "əl-Muvatta"nın rəvayət edildiyi iyirmi dörd fərqli kanalı qeyd edir. Lakin bu rəvayətlərin hamısı bizim zamanımıza qədər gəlib çatmayıb. Müasir çap dünyasında bu rəvayətlərdən bəziləri artıq təhqiq olunub və nəşr edilib. Nəşr edilən rəvayətlər arasında Yəhyə bin Yəhyə əl-Leysi'nin, Əbu Musab əz-Zuhri'nin, Muhəmməd bin əl-Həsən əş-Şeybəni'nin, Suveyd bin Said əl-Hədəsəni'nin, Abdurrahmən bin əl-Qasim əl-Utəqi'nin, Abdullah bin Məsləmə əl-Qa'nəbi'nin, Əli bin Ziyəd əl-Abəsi'nin, Yəhyə bin Bukeyr'in rəvayətlər mövcuddur.

*Şəkil 9: Vyana şəhərində Avstriyanın Milli Kitabxanasında saxlanılan (PERF No. 731) papyrus fraqmenti. Recto üzü*



“əl-Muvatta” kitabının əlyazmaları çoxdur, onlardan bizə məlum olanları içində ən qədimi hicri 277-ci ildə yazılmış əlyazmadır ki, Dublin şəhərində Chester Beatty kitabxanasında saxlanılır. Lakin kitabdan bizim zamanımızda iki səhifə papirus materialı üzərində çatıb. Bu fraqment Avstriya Milli Muzeyində saxlanılır və Nabia Abbott “Studies in Arabic Literary Papyri” adlı çalışmasının ikinci cildində bu materialı nəşr edib və onun hicri ikinci əsrin ikinci yarısına aid olduğunu təsdiq edib. Bu fraqmentə nəzər saldıqda görürük ki, bütün rəvayətlər İmam Malik’in adı ilə başlayır və bu üslub isbat edir ki, bu əlyazma onun hədis məclislərində iştirak etmiş tələbələrindən biri tərəfindən onun sağlığında yazılıb.

*Şəkil 10: PERF No. 731 Verso üzü*



Bu fraqment “cəhənnəmin vəsfi haqqında gələn” xəbərlər haqqında açılmış bölümün sonuncu hədisindən başlayır. Hədis bitdikdən sonra “Bəbut-Tərğibi fis-Sadəqa” (Sədəqəyə təşviq etmək babı) adlı bölüm başlayır. Ümumilikdə bu iki səhifədə yeddi xəbər yer alıb və şəkildən də gördüyümüz kimi hər bir xəbər dairə işarəsi ilə digərindən ayrılıb. Bu hədisləri biz bu gün olduğu kimi zamanımıza qədər

gəlib çatmış və çap olunmuş “əl-Muvatta” kitablarında oxuya bilirik, hədislər eyni mətn və eyni isnad ilə yerini tapır. Şübhəsiz ki, bu bizə İslamda rəvayət mirasının sağlam əsaslar üzərində dayandığını sübut edir.

İmam Malik'in “əl-Muvatta” kitabına nəzər saldıqda görürük ki, onun kitabında zikr etdiyi isnadların xeyli hissəsi qısadır; bir çox halda peyğəmbəri – salləllahu aleyhi va səlləm – görmüş, ona yoldaşlıq və silahdaşlıq etmiş səhabələr ilə İmam Malik arasında sadəcə bir ravinin olduğuna şahid oluruq. Malik - Əbu Həzim bin Dinar – Səhl bin Sa'd əs-Sə'idi, Malik – Humeyd ət-Tavil – Ənəs bin Malik, Malik – İbn Şihəb əz-Zuhri – Ənəs bin Malik, Malik – İshaq bin Abdilləh bin Əbi Talha – Ənəs bin Malik, Malik – Nafi – Abdullah bin Ömər, Malik – Abdullah bin Dinar – Abdullah bin Ömər, Malik – Əbu Nueym Vəhb bin Keysən – Cabir bin Abdilləh, Malik – Said bin Əbi Said əl-Məqburi – Əbu Hureyra, Malik – Muhəmməd bin əl-Munkədir – Umeymə bint Ruqeyqa və başqalarını bu qisa isnadlar üçün misal göstərmək olar. Bu “əl-Muvatta” kitabının nə qədər əhəmiyyətli bir qaynaq olduğunu ifadə edir.

## Abdullah bin Ləhiah'ın səhifəsi

Əbu Abdirrahmən Abdullah bin Ləhiah bin Uqbə misirli alimlərdən olub. Hicri 96-cı ildə anadan olub və 174-cü ildə Misirdə vəfat edib. Misirdə ən çox hədis toplamış və hədis yazmış kəs hesab edilir. Heidelberg papirus kolleksiyasında “Sahifətu Abdilləh bin Ləhiah” adı ilə tanınmış bir əlyazma mövcuddur. Papirus materialından ibarət olan bu lülə formasındakı əlyazmanı ilk dəfə 1906-cı ildə Heidelberg papirusları haqqında çalışmasında alman şərqşünas Carl Heinrich Becker (1876-1933) zikr edib. Macar əslli digər alman şərqşünas Miklos Muranyi 1980-ci ildə “Ərəb Əlyazmaları İnstitutu” jurnalında bu barədə ətraflı bilgiləri daşıyan bir məqalə dərc edir. Miklos Muranyi qeyd edir ki, bu əlyazmanın içindəki hədislərin çoxu Qiyamət günü ilə bağlıdır. Həmçinin orada Osmanın öldürülməsi, İbnuz-Zubeyrin Məkkədə mühasirəyə alınması və bunun kimi tarixi hadisələr də yer alır. Eləcə də dəstəmaz, namaz, məsh ilə bağlı hədislər də keçir.

Bu hədisləri Abdullah bin Ləhiah'dan yazan onun tələbəsi Əbu Yəhya Osman bin Saleh bin Səfvan əs-Səhmi (h. 144-219) olub. Papirus əlyazmanın əvvəlində də onun adı keçir. Görünür ki, tarixən Osman bin Saleh'in İbn Ləhiah'dan bir kitabının olduğu məlum idi. İbn Əbi Hatim ər-Razi deyir: "**(Osman bin Saleh) dedi: "Mənim İbn Ləhiah'dan, onun da Əbu Qabil'dən olan bir kitabım itmişdi, sonra şirniyyat bişirən birinə yönəldildim. Ondan bu qədərə, yəni ucuz qiymətə pul verib aldım.**"[584] Abdullah bin Ləhiah və həmçinin Abdullah bin Saleh öz zamanında səfər edərək kitab toplayan, çox miqdarda hədis yazan alimlər olaraq tanınıblar.

Miklos Muranyi'nin zikr etdiyi papirus materiallarının nəşr olunması barədə çox təəssüf ki, hər hansı bir məlumat ilə qarşılaşmamışam. Lakin qısa bir zamanda nəşr olunacağı gözlənilir.

## Sufyan bin Uyeynə'nin nüsxəsi

Mədinədə imam Malik bin Ənəs olduğu dövrdə Məkkədə hədis rəvayətində barmaq ilə göstərilən alim Sufyan bin Uyeynə bin Əbi İmran əl-Hiləli olmuşdur. Ona görə də İmam əş-Şafi'i məşhur sözündə buyurur: "**Əgər Malik və Sufyan olmasaydı Hicazın elmi itmişdi.**" Hicri 107-ci ildə Kufə şəhərində dünyaya gəlib. Məkkədə və digər bölgələrdə bir çox hədis alimlərindən, ümmətin imamlarından hədis eşitmiş və elm öyrənmişdir. Onların arasında İbn Şihəb əz-Zuhri, İbn Cureyc, əl-Aməş, Suheyl bin Əbi Saleh, Şubə bin əl-Həccəc, Amr bin Dinar, Mə'mər bin Raşid, Hişəm bin Urva, Əbu İshaq əs-Səbi'i kimi parlaq ulduzlar olub.

əş-Şafi'i, əl-Humeydi, Əhməd bin Hənbəl, İshaq bin Rahaveyh, Said bin Mənsur, Abdullah bin əl-Mubərak, İbn Əbi Şeybə, Əli bin əl-Mədini kimi böyük alimlər də ondan hədis yazıblar və çoxca faydalanıblar. Sufyan bin Uyeynə hicri 198-ci ildə vəfat edib. Sufyan bin Uyeynə də digər şeyxlər kimi hədislərini yazıya köçürmüşdür. Biz bu gün İbnul-Ca'd'ın "əl-Musnəd" kitabında bu sözləri oxuya bilirik: "**Mən (hicri) 160-cı ildə Kufədə Sufyan bin Uyeynə'nin**

584. "əl-Cərh vat-Tə'dil", 6/154;

**yanında idim və bizə bir səhifədən/dəftərdən imla edirdi.**"[585] İbn Hibban deyir: "**Abdulquddus bin Abdilqahir əl-Bəcdəi Əbu Şihəb Ərəb yarımadasındakı Bəcdə adlı yerdəndir, Sufyan bin Uyeynə'dən rəvayət edir. əl-Həsən bin Abdilləh əl-Qattan bizə ondan gözəl bir nüsxə rəvayət edib.**"[586]

Sufyan bin Uyeynə'nin bizə qalmış mirası arasında bir yazılı nüsxəsi vardır ki, bunu ondan İmam Əbul-Həsən Əli bin Hərb bin Muhəmməd ət-Tai köçürüb və rəvayət edib. Əli bin Hərb isə əz-Zəhəbi'nin dediyinə əsasən əslən Azərbaycanda doğulmuş və Mosul şəhərində böyümüşdür. Sufyan bin Uyeynə, Hafs bin Ğiyas, Vaki bin əl-Cərrah, Yezid bin Harun kimi imamlar ilə qarşılaşmış və onlardan elm almışdır. Mosul, Hicaz, Kufə, Bağdad, Basra, Vasit kimi şəhərləri gəzmişdir. Onun şeyxi Sufyan bin Uyeynə'dən yazdığı nüsxə zamanımızda "Əhədis əş-Şuyux əs-Siqat" kitabında dördüncü hədis kitabı olaraq nəşr olunub. Əlyazmanı araşdırıb nəşr edən Həmzə Əhməd əz-Zeyn kitabın əvvəlində əlyazmanı oxumuş və oxuduqlarına dair üzərinə qeydlərini əlavə etmiş alimlərin adlarını qeyd edir. Bu qeydlərdə əlyazmanı onlarla alimin oxuduğu və dinlədiyi zikr olunur. Onların arasında Muvaffəquddin İbn Qudəmə'nin də adı keçir və görünür ki, əlyazmanı hədis müəllimısi Şəhdə bint Əhməd'dən köçürüb. İbn Qudəmə əlyazmasının isnadını zikr edərək deyir: "**Qadınların fəxri Şəhdə bint Əhməd bin əl-Fərac bin Ömər əl-Əbri'yə 567-ci ildə (əlyazmanı) oxudum və onu təsdiqlədi: Sizə Əbul-Fəvaris Tarad bin Muhəmməd bin Əli əz-Zeynəbi 490-ci ildə xəbər verdi; dedi: Əbul-Həsən Muhəmməd bin Əhməd bin Razqaveyh bizə bildirdi; dedi: Əbu Cəfər Muhəmməd bin Yəhyə bin Ömər bin Əli bin Hərb bizə bildirdi; Əli bin Hərb bizə bildirdi; dedi: Sufyan bizə ... rəvayət etdi...**" Bu məlumatlara əsasən kitabın Sufyan bin Uyeynə'yə nisbətini anlamış oluruq.

Əli bin Hərb'dən ən ali isnadlar ilə eşidilmiş bu nüsxədə Sufyan bin Uyeynə öz isnadları ilə səhabələrdən hədislər rəvayət edir. Sufyan bin Uyeynə - Hişəm bin Huceyr – İbn Abbas, Sufyan bin Uyeynə - Muhəmməd bin əl-Munkədir – Ənəs bin Malik, Sufyan bin Uyeynə - Vaqid Əbu Yafur – Ənəs bin Malik, Sufyan bin Uyey-

585. "Musnəd İbn əl-Ca'd", (2457)

586. "əs-Siqat", 8/419;

nə - Muhəmməd bin əl-Munkədir – Cabir bin Abdilləh, Sufyan bin Uyeynə - Vaqid Əbu Yafur – Abdullah bin Əbi Aufə, Sufyan bin Uyeynə - əl-Əsvad bin Qeys – Cundub bin Abdilləh əl-Bəcəli, Sufyan bin Uyeynə - Əbuz-Zubeyr Muhəmməd bin Muslim – Cabir bin Abdilləh, Sufyan – İbn Aclən – Abdurrahmən əl-Arac – Əbu Hureyra kimi rəvayət yolları bu sənədlərdən bəziləridir.

Bu isnadlardan aşkar şəkildə görə bilirik ki, Sufyan bin Uyeynə burada Ənəs bin Malik'dən iki tələbəsi vasitəsi ilə, eləcə də Cabir bin Abdilləh'dən də iki tələbəsi vasitəsi ilə hədis rəvayət edir. Biz burada Sufyandan yalnız ən qısa olan isnadlarını qeyd etdik, yoxsa əlbəttə ki, bundan başqa isnadlar ilə də hədis rəvayət edib. Çoxunda səhabə ilə arasında yalnız iki nəfər ravi yer alır. Bu nüsxədə keçən hədislərdən bəzilərini misal gətirib onların digər hədis kitablarındakı paralellərinə nəzər salaq.

Nüsxənin 36-cı hədisində Əli bin Hərb deyir: "**Sufyan bizə Muhəmməd bin əl-Munkədir'dən rəvayət edir ki, o, Ənəs bin Malik'i – radiyallahu anhu – belə deyərkən eşidib: "Allahın elçisi ilə - salləllahu aleyhi va səlləm – Mədinə şəhərində dörd və Zul-Huleyfə'də iki rükət qıldım.**" Bunu İmam Əhməd "əl-Musnəd" kitabında bu cür rəvayət edir: "**Sufyan bizə rəvayət etdi; dedi: İbrahim bin Meysərə'ni eşitdim və Muhəmməd bin əl-Munkədir bizə rəvayət etdi; hər ikisini də belə deyərkən eşitdim: Ənəsi belə deyərkən eşitdik: "Peyğəmbər – salləllahu aleyhi va səlləm – ilə birlikdə Mədinədə dörd, Zul-Huleyfə'də iki rükət qıldım.**"[587] əd-Dərimi bunu Osman bin Muhəmməd – Sufyan bin Uyeynə - İbrahim bin Meysərə və Muhəmməd bin əl-Munkədir – Ənəs bin Malik kanalı ilə rəvayət edir.[588] əl-Buxari "əs-Sahih" kitabında bunu iki ayrı isnad ilə rəvayət edir; onlardan birində Əbu Nueym – Sufyan bin Uyeynə - Muhəmməd bin əl-Munkədir və İbrahim bin Meysərə - Ənəs bin Malik yolu ilə, digərində isə Abdullah bin Muhəmməd – Hişəm bin Yusuf – İbn Cureyc – Muhəmməd bin əl-Munkədir – Ənəs bin Malik yolu ilə rəvayət edir.[589] İbn Əbi Şeybə də "əl-Musannəf" kitabında deyir: "**İbn Uyey-**

587. "Musnəd Əhməd", 19/134;

588. Bax: "Sünən əd-Dərimi" (1549);

589. Bax: "Sahih əl-Buxari" (1089) və (1546);

**nə bizə İbrahim bin Məysəra'dan rəvayət etdi ki, o, Ənəsi belə deyərkən eşidib..."**[590] rəvayət etdi; Digər hədis kitablarına nəzər saldıqda görürük ki, bunu Sufyandan Vaki bin əl-Cərrah, Şueyb bin Amr və başqaları rəvayət ediblər.

74-cü hədisdə Əli bin Hərb dedi: "**Sufyan bin Uyeynə bizə əl-Əsvad bin Qeys'dən rəvayət etdi ki, Cundub'u belə deyərkən eşidib: "Allahın elçisi ilə - salləllahu aleyhi va səlləm – qurban (bayramına və ya namazın)a şahid oldum və bildi ki, və ya güman etdi ki, bir sıra insanlar namazdan əvvəl (qurban) kəsiblər və dedi: "Sizdən kim namazdan qabaq kəsibsə qoy yenisini kəssin, yoxsa sadəcə Allahın adını çəksin və kəssin!**" Bu hədisin eynisini Əbu Davud ət-Tayəlisi'nin müsnədində görürük. ət-Tayəlisi deyir: "**Şu'bə bizə əl-Əsvad'dan rəvayət etdi ki, Cundubu belə deyərkən eşidib: "Peyğəmbəri – salləllahu aleyhi va səlləm – qurban bayramı günü xütbə verərkən eşitdim. Dedi: Sizdən kim namazdan öncə kəsibsə kəsdiyinin yerinə başqasını yenidən kəssin! Kim kəsməyibsə Allahın adı ilə kəssin!**"[591] əl-Buxari "əs-Sahih" kitabında deyir: "**Quteybə bizə rəvayət etdi; Əbu Avanə bizə əl-Əsvad bin Qeys'dən, o da Cundub bin Sufyan əl-Bəcəli'dən belə dediyini rəvayət etdi: "Bir gün Allahın elçisi ilə - salləllahu aleyhi va səlləm - birlikdə qurban kəsdik və bir də öyrəndik ki, bəzi insanlar qurbanlarını namazdan öncə kəsiblər. Ayrıldıqda peyğəmbər – salləllahu aleyhi va səlləm – onların namazdan əvvəl kəsdiklərini gördü və dedi: "Kim namazdan öncə kəsibsə yerinə başqasını kəssin! Namaz qılana qədər bir şey kəsməmiş kəslər isə Allahın adı ilə kəssinlər!**"[592] İmam Muslim də bu hədisi rəvayət edərək deyir: "**Əbu Bəkr bin Əbi Şeybə bizə rəvayət etdi; Əbul-Əhvas Səlləm bin Suleym bizə əl-Əsvad bin Qeys'dən, o da Cundəb bin Sufyan'dan belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – ilə birlikdə qurban bayramında iştirak etdim. O, insanlara namazı qıldırıb qurtardıqda kəsilmiş bir qoyuna baxdı və dedi: "Kim**

590. "Musannəf İbn Əbi Şeybə", 2/200;

591. "Musnəd Əbi Davud ət-Tayəlisi" (978);

592. "Sahih əl-Buxari" (5500);

**namazdan öncə kəsibsə yerinə bir qoyun kəssin! Kim hələ kəsməyibsə Allahın adı ilə kəssin!**"[593] Bu hədisi Muslimin isnadının eynisi isə İbn Əbil-Asim "əl-Əhəd val-Məsəni" kitabında rəvayət edir.[594] əl-Humeydi də müsnədində bunu Sufyan - əl-Əsvad bin Qeys – Cundub əl-Bəcəli kanalı ilə rəvayət edir.[595] İbn Məcə "əs-Sünən" əsərində bunu Hişəm bin Ammar – Sufyan bin Uyeynə - əl-Əsvad bin Qeys – Cundub yolu ilə rəvayət edir.[596] ər-Ruyəni də müsnədində Yunus bin Abdilalə vasitəsi ilə bu hədisi Sufyan bin Uyeynə'dən nəql edir.[597] İmam Əhməd "əl-Musnəd" kitabında bu hədisi İsmail – Əyyub bin Əbi Təmimə – Muhəmməd bin Sirin – Ənəs bin Malik isnadı ilə bənzər rəvayətə yer verir.[598] Ənəsin bu bənzər rəvayətini əl-Buxari "əs-Sahih" kitabında iki yol ilə, həm Musəddəd və Əli bin Abdilləh – İsmail – Əyyub – Muhəmməd bin Sirin – Ənəs bin Malik, həm də Sadəqa – İbn Uleyyə - Əyyub – İbn Sirin – Ənəs bin Malik yolu ilə rəvayət edir.[599] İmam Muslim isə "əs-Sahih" kitabında bunu Yəhyə bin Əyyub, Amr ən-Nəqid və Zuheyr bin Hərb – İbn Uleyyə - İsmail bin İbrahim – Əyyub – Muhəmməd – Ənəs kanalı ilə hekayət edir.[600]

Bu hədisi həm də səhabələrdən əl-Bəra bin Azib'dən və Uveymir bin Əşqar əl-Ənsari'dən rəvayət ediblər. Bu müqayisələr təsdiqləyir ki, bu hədis eyni və ya bənzər sözlərlə çox yoldan rəvayət olunub.

593. "Sahih Muslim" (1960);
594. Bax: "əl-Əhəd val-Məsəni" (2532);
595. Bax: "Musnəd əl-Humeydi", 2/33 (793);
596. Bax: "Sünən İbn Məcə" (3152);
597. Bax: "Musnəd ər-Ruyəni" (956);
598. Bax: "əl-Musnəd", 19/173;
599. Bax: "Sahih əl-Buxari" (954, 5549, 5561)
600. Bax: "Sahih Muslim" (1962)

*Şəkil 11: əl-Əsvad bin Qeysdən rəvayət olunan hədisin şəcərəsi*




Bu hədisi əl-Əsvad bin Qeys'dən sadəcə bu beş nəfər rəvayət etməyib, başqaları da rəvayət ediblər və bu rəvayətlər hədis kitablarında mövcuddur. Lakin biz sadəcə bu beşini zikr etməklə kifayətləndik. Eyni şəcərəni həm də Ənəs bin Malik'dən rəvayət edilən hədis üçün də qurmaq olar. Bu şəcərə bizim üçün isbat edir ki, bu hədisi Cundəb'dən bizə rəvayət edən əl-Əsvad bin Qeys'dir və əl-Əsvad bin Qeys cahiliyyə və İslam dövrünü görmüş, lakin peyğəmbərin – aleyhissalətu vassələm – vəfatından sonra iman gətirmiş və Kufə şəhərində məskən salmış tabiin nəslinin alimlərindəndir. əl-Əsvad bin Yezid bin Qeys hicri 75-ci ildə vəfat edib. Onun Cundub'dan rəvayətinin eynisini Basra şəhərinin imamlarından Muhəmməd bin Sirin rəvayət edib. Bənzərini əl-Bəra bin Azib'dən Kufənin böyük imamı Amir əş-Şa'bi nəql edib. Uveymir bin Əşqar'dan isə Abbad bin Təmim rəvayət edir.

## əl-Aməş'in hədisləri

Süleyman bin Mihran əl-Aməş (h. 61-147 və ya 148) Kufə şəhərinin ən tanınmış mühəddislərindən biridir. Səhabələrdən bəziləri ilə

qarşılaşmış, onlardan hədis eşitmişdir, lakin bir-başa onlardan hədis rəvayət etməyib. Onun hədislərini Vaki bin əl-Cərrah (h. 126-197) bir və ya bir neçə cüzdə toplamış və kitab halında tələbələrinə öyrətmişdir. İslami qaynaqlarda bu kitabın adı fərqli isimlərlə zikr olunur və elm əhli bu kitabı şeyxlərindən hansı isnadlar ilə öyrəndiklərini qeyd edirlər. İbn Rəcəb onu "Vaki'nin əl-Aməş'dən kitabı", əz-Zəhəbi "Vaki'nin nüsxəsi", İbn Həcər "Vaki bin əl-Cərrah'ın nüsxəsi" adlandırır. Həmin kitab Abdurrahmən əl-Fəryəvai tərəfindən 1979-cu ildə iki əlyazmaya əsasən çap olunub.

Əlyazmaların üzərindəki isnadları zikr edərək uzatmaq istəmirəm, lakin bu nüsxədə keçən bəzi isnadlar haqqında danışacam. əl-Aməş səhabə dövrünə çatdığı üçün hədisləri səhabələrdən arada bir nəfər vasitə olmaqla rəvayət edib. əl-Aməş – Əbu Zabyən – İbn Abbas, əl-Aməş – Əbu Saleh – Əbu Hureyra, əl-Aməş – Əbu Saleh – Əbu Said əl-Xudri kitabda keçən qısa isnadlara misaldır. Kitabda 12-ci hədisdə Vaki bin əl-Cərrah deyir: "**əl-Aməş'dən, o da Əbu Saleh'dən, o isə Əbu Hureyra'dan (rəvayət edir) ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Ən xeyirli sədəqə qəni candan veriləndir, verən əl alan əldən xeyirlidir, ilk öncə ailəndən başla!**"[601] Biz İmam Əhməd'in "əl-Musnəd" kitabına baxsaq görəcəyik ki, Əhməd deyir: "**Abdurrazzəq bizə rəvayət etdi; Mə'mər bizə Əyyub'dan, o da İbn Sirin'dən, o isə Əbu Hureyra'dan belə dediyini rəvayət etdi: Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Ən xeyirli sədəqə qəni candan veriləndir. Birinci ailəndən başla. Verən əl alan əldən daha xeyirlidir.**"[602] Abdurrazzəq "əl-Musannəf" kitabında İmam Əhmədin rəvayətini təsdiqləyərək deyir: "**Mə'mərdən, o da Əyyubdan, o da İbn Sirin'dən, o isə Əbu Hureyra'dan belə dediyini (rəvayət edir) ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Sədəqənin ən xeyirlisi qəni candan veriləndir. Birinci ailəndən başla! Verən əl alan əldən üstündür!" (Mə'mər) dedi: "Əyyubdan soruşdum: "Qəni candan vermək nə deməkdir?" Dedi: "Ailənə verdiyindən artıq qalanından.**" Abdurrazzəq

601. "Qəni candan vermək" ilə qəsd olunan öz ailənin ehtiyaclarını ödədikdən sonra artıq qalan hissədən verməkdir.

602. "Musnəd Əhməd", 13/167;

əs-San’ani bu xəbəri zikr etdikdən sonra deyir: “**Mə’mərdən, o da Həmməm (bin Munəbbih)dən (rəvayət edir) ki, Əbu Hureyranı peyğəmbərdən – salləllahu aleyhi va səlləm – Əyyubun hədisinin eynisini rəvayət edərkən eşidib.**”[603] İmam Əhməd müsnədinin başqa yerində deyir: “**Yə’mər bin Bişr bizə rəvayət etdi; Abdullah bizə rəvayət etdi; Yunus bizə əz-Zuhri’dən belə dediyini xəbər verdi: Said bin əl-Museyyəb mənə xəbər verdi ki, Əbu Hureyra’nı belə deyərkən eşidib: “Şübhəsiz Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: “Ən xeyirli sədəqə qəni candan veriləndir. Birinci ailəndən başla!**”[604] “Sahih əl-Buxari” kitabında da bu hədis Said bin Ufeyr – əl-Leys – Abdurrahmən bin Xalid bin Musəfir – İbn Şihəb əz-Zuhri – Said bin əl-Museyyəb – Əbu Hureyra isnadı ilə keçir. Əhməd bir başqa yerdə deyir: “**Vaki mənə rəvayət etdi; əl-Aməş bizə Əbu Saleh’dən, o isə Əbu Hureyra’dan rəvayət etdi...**” və daha sonra hədisi Vaki’nin öz kitabında keçdiyi kimi qeyd edir. Əhməd bu hədisi eyni ləfz ilə həmçinin Abdulməlik bin Amr – Hişəm – Zeyd – Əbu Saleh – Əbu Hureyra kanalı ilə rəvayət edir. ən-Nəsəi də “əs-Sünən” kitabında bunu Quteybə - Bəkr – İbn Aclən – Aclən – Əbu Hureyra yolu ilə zikr edir. Bu hədisi Əbu Hureyra’dan başqaları da rəvayət ediblər. Misal üçün Əhməd – İbn Numeyr – Hişəm bin Urva – Urva bin əz-Zubeyr – Həkim bin Hizəm sənədi ilə gələn uzun hədisin əvvəli belə başlayır: “**Allahın elçisini – salləllahu aleyhi va səlləm - belə deyərkən eşitdim: “Verən əl alan əldən xeyirlidir. Qoy sizdən biriniz ilk öncə ailəsindən başlasın! Ən xeyirli sədəqə qəni candan veriləndir...**” və sonra hədis davam edir. ən-Nəsəi də bu hədisi Amr bin Əli – Yəhyə bin Said əl-Qattan – Amr bin Osman – Musa bin Talha – Həkim bin Hizəm isnadı ilə qeyd edir. İbn Hibban “əs-Sahih” kitabında İbn Abdən - əl-Bəhrani – Əbu Asim – İbn Cureyc – Əbuz-Zubeyr – Cabir bin Abdilləh isnadı ilə bu hədisi Cabir bin Abdilləh’dən rəvayət edib.

---

603. “əl-Musannəf”, 9/75;

604. “Musnəd Əhməd”, 15/122;

## Əbu Əli əl-Əşyəb'in hədis cüzü

Əbu Əli əl-Həsən bin Musa əl-Əşyəb əl-Bağdadi'nin doğum tarixi barəsində tarixi qaynaqlar xəbər vermir. Əslən xorasanlı olduğunu əl-Xatib əl-Bağdadi'nin tarix kitabından bilirik.[605] əl-Əşyəb hədis toplamaqla, onları yazmaqla tanınır. Haqqında gələn məlumatlardan öyrənirik ki, əl-Əşyəb yazıda diqqətli bir mühəddis olub. Əbu Zəkəriyyə Yezid bin Muhəmməd əl-Əzdi (vəfatı hicri 334) deyir: "**əl-Həsən bin Musa əsilzadə, hörmətli biri idi, (rəvayətdə) möhkəm idi, çoxlu yazardı...**" Daha sonra buyurur: "**Əhməd bin Muhəmməd əl-Muqaddəmi mənə rəvayət etdi; dedi: Əhməd bin Mənsur'u belə deyərkən eşitdim: "Yəhyə bin Main, Əhməd bin Hənbəl və Əbu Xeysəmə'nin əl-Həsən bin Musa əl-Əşyəb'in məclisində ikən yanına gəlirdim və o, onlara imla edirdi. Ondan beş min hədis yazdılar. Günlərin bir günü mənə dedi: "Ey Əbu Zəkəriyyə, sizə imla etdiklərimdə dediklərimdə bir xəta gördünmü?" Dedi: "Bəli, bir yerdə xəta etdin." Dedi: "Nədir o?" Dedi: "Şeybən'in Fərva bin Nəvfəl əl-Əşcəi'dən hədisi; orda əslində Urva bin Nəvfəl olmalıdır." Dedi: "Səndə o, ey Əbu Zəkəriyyə, Şeybən'dən başqa birindən varmı?" Dedi: "Xeyr." Dedi: "O zaman bu, mənə qarşı dəlil ola bilməz. Şeybən bu cür dedi və iki çənəsi arasından o şəkildə çıxıb. Bunu sənə o zaman bəyan etdim." Qalxdı və kitabının köhnə əslini çıxardı və gördülər ki, orada ərz etdiyi variantda onun dediyi kimi "Şeybən Fərva bin Nəvfəl'dən" sözləri ilədir. Bunun üzərinə Yəhya (bin Main) susdu.**"[606] İmam Əhməd bin Hənbəl deyir: "**Həsən əl-Əşyəb bizə rəvayət etdi: "Sad bin İbrahim bin Sad mənim yanıma gəlib dedi: "Şubə'nin hədisini sənə ərz etmək istəyirəm." (Əhməd) dedi: "əl-Əşyəb Şubə'nin və başqalarının hədisini dəqiq bilirdi, buna görə də Sad ondan hədisi ona ərz etməyi istədi.**"[607] İmam Əhməd "əl-Müsnəd" kitabında əl-Əşyəb'dən çox yerdə rəvayət edir. Ondan həmçinin Əbu Bəkr bin Əbi Şeybə, Əbu Xeysəmə və Abd bin Humeyd kimi alimlər kitabla-

605. "Tərixu Bağdad", 8/456;

606. "Tərixul-Məvsil", səh: 361

607. "Tərixu Bağdad", 8/456;

rında hədis rəvayət edirlər. Harun ər-Rəşid'in xəlifə olduğu dövrdə bir neçə şəhərdə, əsasən Hims və Mosul şəhərlərində qazi vəzifəsində çalışıb. Xəlifə Məmun olduqda Bağdadda yerləşir və Məmun onu Tabəristana qazi təyin edir. İbn Sad buyurur: "**Məmun onu Tabəristanın qazisi təyin edir, buna görə də ora yola düşür və 209-cu ilin rabi'ul-əvvəl ayında Rəy şəhərində vəfat edir.**"

Əbu Əli əl-Əşyəb'in cüzünün tək əlyazması əz-Zahiriyyə kitabxanasından tapılıb. Kitabı təhqiq edib çap edən Əbu Yasir Xalid bin Qasim ər-Raddədi əlyazma ilə Mədinə Universitetinin kitabxanasında 964-rəqəmli topluda tapdığı surət vasitəsi ilə tanış olub. Hər iki üzü yazılı altı vərəqdən ibarət bu əlyazmanı hənbəli mühəddislərindən Ziyauddin Muhəmməd bin Abdilvahid əl-Məqdisi (h. 569-643) öz əli yazıb. Əlyazmanın içində əlli səkkiz hədis yer alır. Ziyauddin əl-Məqdisi bu əlyazmanı müəllifə çatan isnadını zikr edərək belə başlayır: "**Şeyx Əbu Cəfər Muhəmməd bin Əhməd əs-Saydələni 598-ci ildə ramazan ayında İsfahan şəhərində mənim ona oxumağım surəti ilə mənə xəbər verdi: ona dedilər: Əbu Əli əl-Həsən bin Əhməd bin əl-Həsən əl-Həddəd sizə xəbər verdi; dedi: Əbu Nueym Əhməd bin Abdilləh bin Əhməd əl-Hafiz 429-cu ildə bizə bildirdi: Muhəmməd bin Əhməd bin əl-Həsən əs-Savvaf bizə Bağdadda rəvayət etdi: Əbu Əli Bişr bin Musa bin Saleh bin Şeyx bin Umeyra əl-Əsədi bizə rəvayət etdi: Əbu Əli əl-Həsən bin Musa əl-Əşyəb bizə rəvayət etdi.**"[608] Bu sənədin hamısı hədis məclislərində yazılmış əlyazmalardan ibarətdir. Anlaşıldığı kimi əlyazmanın sahibi əl-Məqdisi onu hicri 598-ci ildə İsfahan şəhərində yazıb. Ziyauddin əl-Məqdisi məşhur mühəddis alimdir, etibarlı və güvənilən bir şəxsdir. Eləcə də şeyxi əs-Saydələni hicri 603-cü ildə vəfat edib. Vaxtının müsnidi sayılan bu alim ittifaq ilə etibarlıdır. Əbu Əli əl-Həddəd isə hicri 515-ci ildə vəfat edib və o da öz vaxtının müsnidi idi. Onun şeyxi Əbu Nueym isə məşhur "Hilyətul-Əvliyə" kitabının müəllifi böyük hafiz imamdır. Etibarlıdır, hicri 430-cu ildə vəfat edib. Əbu Əli əs-Savvaf bağdadlı mühəddis alimdir, siqadır, etibarlıdır. Hicri 359-cu ildə ölüb. Əbu Əli Bişr bin Musa da bağdadlı mühəddisdir, hicri 288-ci ildə vəfat edib.

608. "Cuz'un fihi Əhədisu Əbi Əli əl-Həsən bin Musa əl-Əşyəb", səh: 25-26; Dar Ulumil-Hədis, birinci nəşr: 1410/1990.

Onu bir imam, hafiz və siqa olaraq vəsf edirlər. Əbu Əli əl-Həsən bin Musa əl-Əşyəb isə bildiyimiz kimi bu hədis cüzünün müəllifi sayılır.

Bu cüzdə keçən bəzi hədisləri misal olaraq zikr edəcəyik ki, isnad baxımından içindəki ravilərin tanınmış böyük alimlər olduğunu göstərək. Əbu Əli əl-Əşyəb deyir: "**Həmməd bin Sələmə bizə Səbit əl-Bunəni'dən, o da Ənəs bin Malik'dən rəvayət etdi ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – yatağında uzandıqda bu sözləri deyərdi: "Əlhəmdulilləhilləzi ət'amənə va səqanə va kəfənə va əvanə fəkəm mimmən lə kəfiyə ləhu va lə mu'vi.**" Bu hədis cüzdə keçən ilk hədisdir. Bunu gördüyümüz kimi müəllif Həmməd bin Sələmə'dən eşitdiyini deyir. İmam Əhməd də "əl-Musnəd" kitabında bu hədisi eyni sözlər ilə üç ayrı şeyx vasitəsi ilə Həmməd bin Sələmə'dən rəvayət edir. Bunlar Həsən bin Musa əl-Əşyəb, Əbu Kəmil və Affən bin Muslim'dir. Abd bin Humeyd isə bunu iki nəfərdən, əl-Həsən bin Musa və Süleyman bin Hərb vasitəsi ilə Həmməd bin Sələmə'dən rəvayət edir. Digər kitablara da baxdıqda görürük ki, bunu Həmməd bin Sələmə'dən Yezid bin Harun, Hudbə bin Xalid, İbrahim bin əl-Həccəc əs-Səmi, Ubeydullah bin Muhəmməd əl-Quraşi, Ravh bin Ubədə və daha bir çox zat rəvayət edir. Burada heç bir şəkk yoxdur ki, bu hədis Həmməd bin Sələmə'nin məclisində yazılmış hədislərdəndir və Həmməd bin Sələmə bu hədisi Ənəs bin Malik'in məşhur tələbəsi Səbit əl-Bunəni'dən eşitdiyini deyir.

Daha bir misal olaraq beşinci hədisə nəzər salaq. əl-Əşyəb deyir: "**Əyyub'dan, o da Əbu Qiləbə'dən, o isə Səmura bin Cundub'dan; dedi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – buyurdu: "Sizə paltarın ağını tövsiyə edirəm; onu diriləriniz geyinsin və onda ölülərinizi kəfənləyin, çünki o, paltarlarınızın ən xeyirlilərindəndir.**" Beləliklə də əl-Əşyəb bu hədisi Əyyub əs-Sixtiyəni'dən eşitdiyini deyir. İmam Əhməd "əl-Musnəd" kitabında bu hədisi İsmail → Əyyub → Əbu Qiləbə → Səmura kanalı ilə rəvayət edir. İmam Əhməd bu xəbəri daha bir neçə yol ilə rəvayət edir. Bunlardan birində Əli bin Asim → Xalid əl-Həzzə → Əbu Qiləbə → Səmura kanalı ilə, digərində əl-Fədl bin Dukeyn → əl-Məsudi → əl-Həkəm və Həbib bin Əbi Sabit → Məymun bin Əbi Şəbib → Sə-

mura bin Cundub yolu ilə, bir başqa yerdə isə Vaki və Abdurrahmən bin Mehdi → Sufyan əs-Səvri → Həbib bin Əbi Sabit → Məymun bin Əbi Şəbib → Səmura yolu ilə zikr edir. Üstəlik bu hədisi birdən çox səhih isnad ilə Said bin Cubeyr' vasitəsi ilə İbn Abbas'dan da rəvayət edirlər.

## Abdurrazzəq əs-San'ani və "əl-Musannəf" kitabı

Əbu Bəkr Abdurrazzəq bin Həmməm bin Nəfi' əl-Himyəri əs-San'ani hicri 126-cı ildə doğulub və 211-ci ildə səksən beş yaşında ikən vəfat edib. Hədis hafizlərindən biri olub və "əl-Musannəf" kitabına görə tanınır. Ondan hədis rəvayət etmək üçün Yəhya bin Main, Əhməd bin Hənbəl kimi dövrünün ən böyük alimləri Yəmənə onun yanına səfər ediblər.

Əbu Bəkr Muhamməd bin Xayr əl-İşbili (vəfatı hicri 575) məşhur fihrist kitabında "əl-Musannəf" kitabı haqqında məlumat verir və onu hansı isnadla əldə etdiyini zikr edir. "Bəzi oriyentalistlər "əl-Musannəf" kitabının Abdurrazzəq tərəfindən yazılmasını inkar ediblər. Lakin Harald Motzki "The Author and His Work in The Islamic Literature of The First Centuries: The Case of Abd Al-Razzaq's Musannaf" adı altında yayınladığı məqalədə "əl-Musannəf" kitabının həqiqətən də Abdurrazzaq tərəfindən yazıldığını təsdiq edir. O, bunu isbat etmək üçün kitabın fərqli rəvayətlərindəki hədisləri müqayisə etmişdir. Professor Həbibur-Rahmən əl-Azami 1972-ci ildə "əl-Musannəf" kitabını iki əlyazmaya əsasən çap edib. Bu əlyazmalardan biri hicri 747-ci ilə aid Murad Molla kitabxanasındakı əlyazmadır, digəri isə hicri 606-cı ilə aid olan və Feyzullah Efendi kitabxanasında saxlanılan əlyazmadır. Murad Molla əlyazması üç rəvayət yoluna əsaslanır və Motzki bunu "şərq rəvayətləri" adlandırır: 1)Əbu Said Əhməd bin Muhəmməd bin Ziyad bin Bişr əl-Arabi əl-Basri (h. 246-340) – Əbu Yaqub İshaq bin İbrahim əd-Dəbəri (h. 195-285 və ya 286) – Abdurrazzəq əs-San'ani. 2) Əbul-Həsən Əli bin Əhməd əl-Əsfəhəni (vəfatı ?) – Muhəmməd bin əl-Həsən bin İbrahim bin Hişəm ət-Tusi (vəfatı ?) – Muhəmməd bin Əli ən-Nəccər (vəfatı ?) – Abdurrazzəq əs-San'ani. 3) Əbul-Qasim Abdul-Alə bin Muhəm-

məd bin əl-Həsən bin Abdil-Alə əl-Busi (vəfatı ?) – Əbu Yaqub İshaq bin İbrahim əd-Dabəri – Abdurrazzəq əs-San'ani. Feyzullah Efendi əlyazması isə iki isnad daşıyır: 4) (Əbu Ömər) Əhməd bin Xalid (bin Yezid əl-Qurtubi) (vəfatı hicri 322) – Əbu Yaqub İshaq bin İbrahim əd-Dəbəri – Abdurrazzəq əs-San'ani. 5) Əbu Ömər Əhməd bin Xalid (bin Yezid əl-Qurtubi) - Əbu Muhəmməd Ubeyd bin Muhəmməd əl-Kəşvari (vəfatı hicri 284 və ya 288) – Muhəmməd bin Yusuf əl-Huzəqi (vəfatı ?) – Abdurrazzəq əs-San'ani.

Motzki daha sonra İbnul-Xayr əl-İşbili'nin fihrist kitabında zikr etdiyi sənədlərlə müqayisə aparır. İbnul-Xayr'ın əlindəki əlyazmalar haqqında verdiyi məlumatları bu iki əlyazmadakı məlumatlarla tutuşdurur. Motzky təsdiqləyir ki, İbnul-Xayr'ın əlindəki əlyazmalardakı fərqli kitablardakı isnad fərqləri bu iki əlyazmadakıları ilə uyğun gəlir, lakin bəzi fərqlərin olduğunu gördüyümüz üçün bilirik ki, İbnul-Xayr'ın əlyazması tamamilə başqa əlyazma olub. Motzky sonunda kitabın həqiqətən də Abdurrazzəq tərəfindən yazıldığını təsdiqləyir.

## Maraqlı bir nümunə

Burada zamanımızda mövcud olan fərqli hədis kitablarından bəzi hədisləri və əsərləri paylaşmaq istəyirəm və həmin hədisləri burada qeyd etməyimizin məqsədi vardır. Bu məqsəd bölmənin axırında anlaşılacaq.

**Birinci əsər:** Abdullah bin Vəhb "əl-Cami" kitabında təfsir bölümündə rəvayət edir:

"**Hərmələ bin İmran ət-Tucibi mənə rəvayət etdi; dedi: Muhəmməd bin Abdilməlik bin Mərvan'ı belə deyərkən eşitdim: Müaviyə bin Əbi Sufyan'ı eşidən biri mənə xəbər verdi ki, o, bu ayəni "Kəndə haram etdi" şəklində oxuyurdu.**"[609]

**İkinci əsər:** Yenə Abdullah bin Vəhb "əl-Cami" kitabında deyir:

"**Hərmələ bin İmran mənə rəvayət etdi ki, o, Muhəmməd bin Raşidi atasından belə dediyini xəbər verərkən eşidib:**

609. "Təfsirul-Quran minəl-Cəmi li İbn Vəhb", 3/48 (99);

**Quranı Əbud-Dərdə və Vasilə bin əl-Əsqa'ya, peyğəmbərin – salləllahu aleyhi va səlləm – iki səhabəsinə Dəməşqdə səkkiz dəfə ərz etdim və mənə heç bir şeyi təkrar oxutdurmadılar və o, (ayəni) "haqqa" hökm edir "və O, ayırd edənlərin ən yaxşısıdır" şəklində oxuyardı.**"[610]

**Üçüncü əsər:** Bu əsəri çox hədis kitablarında qeyd ediblər. Onlardan biri İmam Əhməd'in "əl-Musnəd" kitabıdır ki, orada deyir:

"**Əbu Abdirrahmən Abdilləh bin Yezid əl-Muqri bizə rəvayət etdi; Hərmələ bin İmran bizə rəvayət etdi; Əbu Uşşənə əl-Məafiri bizə rəvayət etdi; dedi: Uqbə bin Amir əl-Cuhəni'ni belə deyərkən eşitdim: Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Kimin üç qızı olarsa, onlara görə səbr edərsə, onları öz var-dövlətindən yedirər, içirər və geyindirərsə onun üçün ataşə qarşı bir pərdə olarlar.**"[611]

**Dördüncü əsər:** Bu xəbəri də biz fərqli hədis kitablarında oxuya bilərik, lakin burada da İmam Əhməd'in kitabından nəql edəcəyik. Əhməd bin Hənbəl deyir:

"**Əli bin İshaq bizə rəvayət etdi; Abdullah bin Mubərak bizə xəbər verdi: Hərmələ bin İmran bizə xəbər verdi ki, o, Yezid bin Əbi Həbib'i rəvayət edərkən eşidib ki, Əbul-Xeyr ona rəvayət edib ki, Uqbə bin Amir'i belə deyərkən eşidib: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "İnsanların arasında hökm verilməyənə qədər hər bir kəs sədəqəsinin kölgəsindədir." Yezid dedi: "Elə bir gün olmurdu ki, Əbul-Xayr o gündə sədəqə verməsin, hətta bir şirin çörək və ya soğan olsa belə verərdi.**"[612]

**Beşinci əsər:** Abdullah bin Vəhb "əl-Cami" kitabında deyir:

"**Hərmələ bin İmran mənə Süleyman bin Humeyd'dən rəvayət etdi; dedi: Muhəmməd bin Kə'b əl-Qurazi'ni Ömər bin Abdilaziz ilə danışarkən eşitdim: "Allah cənnət və ataş əhli ilə qurtardıqdan sonra Allah "buludların kölgəsində və**

610. "Təfsirul-Quran min əl-Cəmi li İbn Vəhb" 3/49 (100);

611. "əl-Musnəd", 28/622;

612. "əl-Musnəd", 28/568;

**mələklərlə" gələcək. Dedi: "Cənnət əhlinə ilk dərəcədən salam verəcək və onlar da salama cavab verəcəklər." əl-Qurazi dedi: "Bu da elə Qurandakı – "rəhmli Rəbdən salam deyiləcəkdir" – ayəsidir. Beləliklə deyəcək: "Məndən istəyin!" Deyəcəklər: "Səndən nə istəyək, ey Rəbb?" Deyəcək: "Bəli, istəyin məndən!" Deyəcəklər: "Ey Rəbb, səndən razılığını istəyirik." Deyəcək: "Mənim razılığım sizi kəramətimin evinə daxil etməyimdir." Deyəcəklər: "Ey Rəbb! Səndən (daha) nə istəyə bilərik? Sənin izzətinə, cəlalına və məkanının ucalığına and olsun ki, insanların və cinlərin ruzisini bizə paylasan onları yedirər, onları içirər, onları geyindirər, onlara xidmət edərik, bizdən bir şeyi azaltmaz!" Deyəcək: "Məndə bundan da artığı var." Beləliklə də Allah bunu onlara öz dərəcələrində edəcək ta ki, axırda Öz məclisində istiva edəcək. Sonra onlara Allahdan tövfələr gələcək, onları onlara mələklər daşıyacaq." (Ömər bin Abdilaziz) dedi: "Axirətdə gecə və gündüzün yarısı yoxdur. Orada sadəcə səhər və axşam vardır. Bu da Quranda (Ğafir surəsindəki) Firon ailəsi haqqındakı ayədədir: "Onları səhər və axşamüstü oda salırlar." Eləcə də Cənnət əhlinə dedi: "Orada səhər-axşam onların ruzisi olacaqdır." Dedi: "Özündən başqa ilah olmayan Allaha and olsun ki, hur əl-ayn'dan olan bir qadın qolbağısını göstərsə onun qolbağısının işığı günəşi və ayı söndürər, o zaman qolbağının asıldığı qolu bəs necə?! Allahın geyindirmək üçün yaratdığı elə bir şey yoxdur ki, onun üstündə (hurinin) üzərində olan paltar və bəzəklərdən olmasın.**"[613]

**Altıncı əsər:** Abdullah bin Vəhb "əl-Cami" kitabında deyir:

"**Dedi: Hərmələ bin İmran mənə rəvayət etdi ki, o, Ğufra'nın mövlası Ömər bin Abdilləh'i belə deyərkən eşidib: Allahı (Quranda) "xeyr" deyərkən eşitsən (bil ki, ) o, "yalan danışdın" deyir və əgər Allahı "onların üzlərinə və arxalarına vuraraq" deyərkən eşitsən - dedi: (bil ki,) – onların yanlarını qəsd edir.**"[614]

613. "Təfsirul-Quran min əl-Cəmi li İbn Vəhb", 1/83 (187);

614. "Təfsirul-Quran minəl-Cəmi libni Vahb", 2/57 (113);

**Yeddinci əsər:** Yenə Abdullah bin Vəhb "əl-Cami" kitabında deyir:

"**Dedi: Hərmələ bin İmran mənə rəvayət etdi ki, o, Ubeydullah bin Əbi Cəfər'i belə deyərkən eşidib: "Qulaqları, gözləri və dəriləri onların əleyhində şahidlik edəcəyi gün; dedi: dəriləri övrət yerləridir.**"[615]

**Səkkizinci:** İbn Sad "ət-Tabəqat əl-Kubra" kitabında deyir:"**Xalid bin Xidəş bin Aclən bizə xəbər verdi: Abdullah bin Vəhb əl-Misri bizə xəbər verdi: Hərmələ bin İmran bizə İshaq bin Abdilləh bin Əbi Fərva'dan xəbər verdi ki, o deyib: "Peyğəmbərlərdən üçündən başqa heç birinin qəbri bilinmir: İsmayılın qəbri; belə ki, o, rükun ilə evin arasında novalçanın altındadır və Hudun qəbri, belə ki, o, Yəmənin dağlarından bir dağda qumsal təpənin altındadır, üzərində bir ağac var ki, daim rütubətlidir və o yer Yer üzünün ən isti yeridir və bir də Allahın elçisinin – salləllahu aleyhi va sələm – qəbri.**"[616] Bu hədislər ilə tanış olduqdan sonra gəlin bir papirus fraqmenti ilə tanış olaq. Şəkildə gördüyünüz papirus parçası Amerika Birləşmiş Ştatlarında yerləşən Utah Universiteti'nin nəzdindəki John Willard Marriott adlı kitabxanada Or.P518 rəmzi altında saxlanılır. Material gördüyümüz kimi ərəb dilindədir. Bu fraqment qərb universitetlərindəki akademiklər tərəfindən öz çalışmalarında nəşr olunub və üzərində bəzi araşdırmalar aparılıb.

Bu fraqmentin yeyilmiş hissələrini elmi araşdırmada bərpa etməyə çalışanlar onun şəkildə sol tərəfdə duran üzündən başlayıblar. Ola bilsin ki. ərəb dilində arxa tərəfdən yazıldığını nəzərdən qaçırıblar. Biz bu parçadan oxuna bilən hissələri olduğu kimi təqdim etdikdə sağ tərəfdəki üzündən başlamağın doğru olduğu anlaşılacaq. Aydın olması üçün qeyd etməliyik ki, şəkildə görülən parça bir vərəqin iki ayrı üzüdür. Təqdim edəcəyimiz mətndə boşluqların yerini nöqtələr ilə doldurmuşuq və tərcüməni bacardığımız qədər ərəb dilindəki cümlə tərtibinə uyğunlaşdırdıq:

---

615. "Təfsirul-Quran minəl-Cəmi li İbn Vahb", 2/57 (112)

616. "ət-Tabəqat əl-Kubra", 1/52;

*Şəkil 12: Utah Universitetində J. Willard Marriott Kitabxanasında saxlanılan papirus fraqment*



...Hər bir şey ....................................................................................................................................................................................çatdır... rəvayət etdi mənə...............................................................................................................................bu ayə ............................................................................................................................................................... və Vasilə bin əl-Əsqa s.............................................................................................................................................. ayırd edənlərin... Dedi: rəvayət etdi mənə ......................................................................................onlara görə səbr edərsə ... –dan onları yedirərsə, içizdirərsə və geyindirərsə ...................................
İbn Adiy əl..yə vəz.. peyğəmbərdən bu hədisi ...........................................................................................rəvayət etdi mənə Hərmələ bin İmran ki, Əli bin Əbi Talib öyrətdi bir kişiyə: Həsbi Allah.............. əl-Kərim, mə şəə Allahu kənə va mə ləm yəşə ləm yəkun. Əşhədu ənnə..............................................si va min şərri külli dəbbətin huva axizu bi nəsiyətihə va innə rabbi alə sirat.................................... eşitdim Uqbə bin Amr'ı deyir Allahın elçisi: Hər bir nəfər ..........................................................................Yezid: Elə bir gün olmurdu ki, Əbul-Xeyr o gündə bir şirin çörək sədəqə verməsin......................... İbn əl-M...i atasından, o da babasından belə dediyini: Biz cahiliyyədə hifz edərdik................................. Rəvayət etdi Hərmələ bin İmran mənə Süleyman bin Humeyd'dən; dedi: Eşitdim ...................... cənnət və atəş.. gələcək Allah buludların kölgəsində .................................................................................. Quranda Sa.......................................................................................................................fə..va.................................................................................................................................................səhər və axşam ...................................................................................................................................günəşi və ayı ...............................................................................................................................................n

ki, o eşidib Ömər bin ........................................................
......................................................................................
... üzlərinə və arxalarına ......................................................
......................................................................................
... dərilər ......................................... dedi: ............
......................................................................................
..........................................................................məğri-
bi qılmadan öncə səcdə edirik ..................................
......................................................................................
...səcdə Dedi: Rəvayət etdi Hərmələ bin İmran mənə İshaq bin Abdill............................................... novalçanın altında rükun ilə evin arasındadır və Hudun qəbri, belə ki, o, təpənin ............................ Allah – salləllahu aleyhi va səlləm
.. Hərmələ bin İmran dedi Yezid bin Əbi Həbib'dən ............
.... itirdiyini... zəkatını çıxarmır və mane olmur .................
......................................................................................
Amr bin əl-As'ın yanına daxil olduqda onu dirsəklənmiş halda gördü. Dedi: ...................................... yoxsa yazacam Ömər bin əl-Xattaba sənin əmrini və görüşmədi Amr .....................
............................. sənə ... onların oturduqları kimi otur və sənin yanından çıxdıqlarında ............................................
.... ona çağırıldı və beləcə möminlərin əmirinə möhtac oldu və dedi: Məazallah ..................................... ona oxudu yazdığını və dedi: Məgər izah etmədimmi bunu ...............................
....................................

Fraqmentin azərbaycan dilində tərcüməsini təqdim etdiyimiz bu versiyasının tam şəkildə dəqiq olduğunu iddia etmirik, çünki bəzi sözlər sual işarəsi altındadır. Lakin əmin olduğumuz bu miqdara əsasən səkkiz rəvayəti bərpa etmək mümkündür. Yuxarıda təqdim etdiyimiz səkkiz xəbərin hamısı bu materialın içində mövcuddur. Gördüyünüz kimi burada bərpa edə bilmədiyimiz və paralelini tapa bilmədiyimiz başqa xəbərlər də mövcuddur. Misal üçün Amr bin əl-As haqqında olan xəbərə uyğun bir rəvayətə tarixi qaynaqlarda rastlamaq bizə nəsib olmadı.

Burada Hərmələ bin İmran'ın adının təkrarlanması da ayıq oxucunun diqqətindən yayınmamışdır. Bəli, gördüyümüz bu hədis və ya əsər materialı Hərmələ bin İmranın rəvayətlərindən ibarətdir. Aşkar olan budur ki, onun tələbələrindən biri bunu şeyxi Hərmələ bin İmran'ın məclisində yazıb və yaxud da şeyxinin kitabından köçürüb. Bu əlyazmanı Karim Samji "Studies in Arabic Literary Papyri" adlı tezisində yalnış olaraq hicri üçüncü əsrə nisbət edib. O, paleoqrafik dəlilin bu parçanın ikinci əsrin ikinci hissəsinə aid olduğunu göstərdiyini təsdiqləyir, lakin daha sonra əlavə edir: "**Buna baxmayaraq isnada əsaslanan daxili dəlil göstərir ki, ravilərdən biri, daha dəqiq desək Hərmələ bin İmran, miladi 858/hicri 243-cü ildə vəfat edib, ona görə də burada üçüncü əsr tarixi əsas götürülüb.**"[617] Samji'nin burada etdiyi xəta odur ki, Hərmələ bin İmran'ı onun nəvəsi ilə səhv salıb. Burada Hərmələ bin İmran'ın hicri 160-cı ildə vəfat etmiş baba Hərmələ olmasında şəkk ola bilməz, çünki papirusda keçən adlara əsasən biz Hərmələ bin İmran'ın Yezid bin Əbi Həbib, Süleyman bin Humeyd, İshaq bin Abdilləh bin Əbi Fərva kimi ravilərdən rəvayət etdiyini görürük, bu isə heç şübhəsiz ki, onun əş-Şafi'nin tələbəsi Hərmələ bin Yəhya olmamağını, ancaq babası Hərmələ bin İmran olmağını tələb edir. İbn Yunus tarixində buyurur: "**ər-Rabi bin Süleyman bizə rəvayət etdi; Yəhyə bin Bukeyr bizə rəvayət edərək dedi: Hərmələ bin İmran (hicri) səksəninci ildə doğulub və yüz altmışıncı ildə səfər ayında vəfat edib.**"[618] Bu açıqlamanı əsas alaraq deyə bilərik ki, əlimizdəki papirus fraqmenti Hərmələ bin İmran'ın tələbələrindən birinə aiddir. Bu bir daha kitabın fərqli yerlərində təqdim etdiyimiz məlumatları təsdiqləyir, belə ki, daha əvvəl də qeyd etmişdik ki, o dövrdə yayğın olan kitab tərzi bir şeyxdən öyrənilən hədisləri bir səhifədə cəm etmək idi. Bu material da o tərz çalışmalardan biridir.

Bu hədisləri toplayan tələbənin kim olduğunu müəyyənləşdirmək üçün dəqiq bir yol yoxdur. Amma bəzi faktları nəzərə alaraq yaxın bir təxminə yer vermək olar. Hərmələ bin İmran'dan hədis rəvayət edən ən əsas ravilər Abdullah bin əl-Mubərak, Rişdin bin

617. Karim Samji, "Studies In Arabic Literary Papyri", səh 72; Utah Universiteti, avqust 2008

618. "Tərixu İbn Yunus əl-Misri", 1/112;

Sad əl-Məhri, Həccəc bin Süleyman ər-Ra'ini, Əbu Saleh Abdullah bin Saleh, Əbu Abdirrahmən Abdilləh bin Yezid əl-Muqri, Abdullah bin Vəhb, Cərir bin Həzim, əl-Leys bin Sad və oğlu Abdullah bin Hərmələ'dir. Burda diqqətə alacağımız iki nöqtə vardır. Hər şeydən öncə Hərmələ bin İmran misirlidir və onun bu fraqmenti də misirdə tapılıb. İkinci nöqtə isə budur ki, ondan ən çox rəvayət edənlər dörd kəsdir: Abdullah bin əl-Mubərak, Abdullah bin Vəhb, Abdullah bin Saleh və Abdullah bin Yezid'dir. İbn əl-Mubərak və İbn Yezid misirli deyillər, ona görə də onları hesabdan çıxarmalıyıq. Geridə Abdullah bin Saleh və Abdullah bin Vəhb qalır. Hər iki kəs də hədis yazmaqla məşhurdur. Amma yuxarıda bərpa etdiyimiz rəvayətlər Abdullah bin Vəhb'ə üstünlük verir, çünki bu xəbərlərin çoxunu məhz onun rəvayəti ilə tapa bilmişik. Ola bilsin ki, bu vərəq Abdullah bin Vəhb'in (h. 125-197) tələbəlik illərində yazdığı vərəqlərdən biridir.

# İstifadə olunmuş ədəbiyyat

Abbas əd-Dəvri, "Tərixu İbn Main", Mərkəzul-Bəhs əl-İlmi va İhyə ət-Turas əl-İsləmi, birinci nəşr: Məkkə, 1399/1979

Abdulhəyy əl-Akri (İbnul-İməd əl-Hənbəli), "Şəzəratuz-Zəhəb fi Əxbəri mən Zəhəb", Dar İbn Kəsir, birinci nəşr: Dəməşq, 1406/1986

Abdulkərim əl-Qazvini, "ət-Tədvin fi Əxbəri Qazvin", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1408/1987

Abdulkərim əs-Səm'ani, "Kitəbu Ədəbil-İmlə val-İstimlə", Mətbəatul-Mahmudiyyə, birinci nəşr: Cuddə, 1414/1993

Abdulməlik əl-Himyəri (İbn Hişəm), "əs-Sira ən-Nəbəviyyə", Mustafa əl-Bəbi əl-Hələbi va Əvlədihi bi Misir, ikinci nəşr: Misir, 1375/1955

Abdullah əl-Absi (İbn Əbi Şeybə), "əl-Kitəb əl-Musannəf fil-Əhədis val-Əsər", Məktəbətur-Ruşd, birinci nəşr: Riyad, 1409

Abdullah əl-Beydavi, "Tuhfətul-Əbrar Şərh Məsabih əs-Sunnə", Vazəratul-Əvqaf vaş-Şuun əl-İsləmiyyə, birinci nəşr: Küveyt, 1433/2012

Abdullah əl-Curcəni (İbn Adiyy), "əl-Kəmil fi Duafə ər-Ricəl", Dar əl-Kutub əl-İlmiyyə, birinci nəşr: Beyrut, 1418/1997

Abdullah əd-Dərimi, "Sünən əd-Dərimi", Darul-Muğni, birinci nəşr: Səudiyyə Ərəbistan, 1412/2001

Abdullah əd-Dinəvari (İbn Quteybə), "Təvilu Muxtəlif əl-Hədis", əl-Məktəb əl-İsləmi, ikinci nəşr: Beyrut, 1419/1999

Abdullah əl-Həravi, "Zəmmul-Kələm va Əhlihi", Məktəbətul-Ulum val-Hikəm, birinci nəşr: Mədinə, 1419/1998

Abdullah əl-Humeydi, “Musnəd əl-Humeydi”, Dərus-Səqa, birinci nəşr: Dəməşq, 1996

Abdullah əl-Mərvazi (İbnul-Mubərak), “əz-Zuhdu var-Raqaiq”, Darul-Kutubil-İlmiyyə, Beyrut

Abdullah əş-Şeybəni, “əl-İləl va Mərifətur-Ricəl”, Darul-Xani, ikinci nəşr: Riyad, 1422/2001

Abdullah əz-Zeyləi, “Nəsbur-Rayə li Əhədis əl-Hidəyə”, Muəssəsətur-Rayyən & Darul-Qiblə lis-Səqafətil-İsləmiyyə, birinci nəşr: Beyrut, 1418/1997

Abdurrahim əl-İraqi, “Tarhut-Təsrib fi Şərhit-Təqrib”, Dar İhyə ət-Turas əl-Arabi, birinci nəşr: Beyrut

Abdurrahmən əd-Diməşqi (Əbu Zur’a), “Tərix Əbi Zur’a əd-Diməşqi”, Məcmə əl-Luğatil-Arabiyyə, Dəməşq

Abdurrahmən əl-Cəvzi, “Kəşful-Muşkil min Hədisis-Sahiheyn”, Darul-Vatan, birinci nəşr: Riyad, 1418/1997

Abdurrahmən əl-Cəvzi, “əl-Məvduat”, əl-Məktəbə əs-Sələfiyyə, birinci nəşr: əl-Mədinə, 1388/1968

Abdurrahmən ər-Razi (İbn Əbi Hətim), “əl-Cərh vat-Tədil”, Məclisu Dairatil-Məarifil-Usməniyyə, birinci nəşr: Heydərabad, 1371/1952

Abdurrahmən ər-Razi (İbn Əbi Hətim), “Kitəbul-İləl”, Mətabi əl-Humeydə, birinci nəşr: Riyad, 1427/2006

Abdurrahmən əs-Sadəfi, “Tərixu İbn Yunus əl-Misri”, Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1421/2001

Abdurrahmən əs-Suyuti, “Miftəhul-Cənnə fil-İhticəci bis-Sunnə”, əl-Cəmiah əl-İsləmiyyə, üçüncü nəşr: Mədinə, 1409/1989

Abdurrahmən əl-Uleymi, “əl-Uns əl-Cəlil bi Tərix əl-Quds val-Xalil”, Məktəbətu Dəndis, birinci nəşr: birinci nəşr: Amman, 1420/1999

Abdurrazzaq əs-San’ani, “əl-Musannəf”, əl-Məclis əl-İlmi, Johannesburg, Cənubi Afrika Respublikası, əl-Məktəb əl-İsləmi yayını, ikinci nəşr: Beyrut, 1401/1983

Alfred Guillaume, "The traditions of Islam: An Introduction to the Study of the Hadith Literature", Clarendon Press, Oxford, 1924

Amr əl-Leysi (əl-Cahiz), "Kitəb əl-Heyvan", Mustafa əl-Bəbi əl-Hələbi, ikinci nəşr: ikinci nəşr: 1385/1965

Edward Said, "Orientalism", Vintage Books, First Vintage Books Edition: New York, 1979

Eric Turner, "Greek Papyri: an Introduction", Princeton University Presss, New Jerser, 1968

Əbu Bəkr əd-Dəvadəri, "Kənzud-Durar va Cəmi əl-Ğurar", İsa əl-Bəbi əl-Hələbi, birinci nəşr: Hələb, 1402/1982

Əhməd əl-Asqaləni (İbn Həcər), "Fəthul-Bəri Şərh Sahih əl-Buxari", Darul-Mərifə, birinci nəşr: Beyrut, 1379

Əhməd əl-Asqaləni (İbn Həcər), "Hədyus-Səri Muqaddimətu Fəthil-Bəri", Abdulqadir Şeybə əl-Həməd nəşri, birinci nəşr: Riyad, 1421/2001

Əhməd əl-Asqaləni (İbn Həcər), "İntiqadul-İtirad fir-Raddi aləl-Ayni fi Şərhil-Buxari", Məktəbətur-Ruşd, birinci nəşr: Riyad, 1413/1993

Əhməd əl-Asqaləni (İbn Həcər), "Təhzibut-Təhzib", Mətbəətu Dairatil-Məarif ən-Nizəmiyyə, birinci nəşr: Hindistan, 1326

Əhməd əl-Asqaləni (İbn Həcər), "ət-Təlxis əl-Həbir fi Təxrici Əhədis ər-Rafi'i əl-Kəbir", Muəssəsətu Qurtubə, birinci nəşr: Misir, 1416/1995

Əhməd əl-Bağdadi (əl-Xatib), "əl-Cami li Əxləq ər-Ravi va Ədəbis-Səmi", Məktəbətul-Məarif, Riyad, 1403/1983

Əhməd əl-Bağdadi (əl-Xatib), "əl-Fasl lil-Vasli əl-Mudraci fin-Nəql", Darul-Hicra, birinci nəşr: Riyad, 1418/1997

Əhməd əl-Bağdadi (əl-Xatib), "əl-Kifəyə fi İlmir-Rivayə", Dairatul-Məarifil-Usməniyyə, Heydərabad, birinci nəşr: 1357

Əhməd əl-Bağdadi (əl-Xatib), "Təqyidul-İlm", Darul-İstiqamə, birinci nəşr: Qahirə, 1429/2008

Əhməd əl-Bağdadi (əl-Xatib), “Tərixu Mədinətis-Sələm” (Tərixu Bağdad), Darul-Ğarb əl-İsləmi, birinci nəşr: Beyrut, 1422/2001

Əhməd əl-Beyhəqi, “əl-Mədxal iləs-Sunən əl-Kubra”, Darul-Xuləfə lil-Kitəb əl-İsləmi, Küveyt

Əhməd əl-Beyhəqi, “Mərifətus-Sunən val-Əsər”, Cəmiatud-Dirasət əl-İsləmiyyə, birinci nəşr: Karaçi, 1412/1991

Əhməd əl-Beyhəqi, “əs-Sunən əl-Kubra”, Darul-Kutubul-İlmiyyə, üçüncü nəşr: Beyrut, 1424/2003

Əhməd əl-Beyhəqi, “Şuabul-İmən”, Məktəbətur-Ruşd & Darus-Sələfiyyə bi Bumbey, birinci nəşr: Riyad, 1423/2003

Əhməd əl-Busiri, “İthəful-Xiratil-Məhəra bi Zəvaid əl-Məsənid əl-Aşəra”, Darul-Vatan, birinci nəşr: Riyad, 1420/1999

Əhməd əl-Əsfəhəni (Əbu Nueym), “Hilyətul-Əvliyə va Tabəqatul-Əsfiyə”, Darus-Səadə, birinci nəşr: Misir, 1394/1974

Əhməd ibn Hənbəl, “Musnəd əl-İməm Əhməd ibn Hənbəl”, Muəssəsətur-Risələ, birinci nəşr: Beyrut, 1421/2001

Əhməd əl-İrbili (İbn Xallikən), “Vafəyət əl-Ayən va Ənbə Əbnəiz-Zəmən”, Dar Sadir, saysız nəşr: Beyrut, 1900

Əhməd əl-Qazvini, “Kitəbus-Sərd val-Fərd fi Səhaif əl-Əxbər”, əl-Məclis əl-Vatani lil-Hicra, İslamabad, 1410/1990

Əhməd əl-Qurtubi, “əl-Mufhim limə Əşkələ min Təlxisi Kitəbi Muslim”, Dar İbn Kəsir – Darul-Kəlimit-Tayyib, birinci nəşr: Beyrut, 1417/1996

Əhməd əl-Məqrizi, “əl-Məvaiz val-İtibər bi Zikril-Xutat val-Əsər”, Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1418

Əhməd əl-Məqrizi, “Muxtəsar Qiyəmil-Leyl va Qiyəm Ramədan va Kitəb əl-Vitr”, Hədis Akademi, birinci nəşr: Feysalabad, 1408/1988

Əhməd əl-Muradi (ən-Nəhhəs), “ən-Nəsix val-Mənsux”, Məktəbətul-Fəlləh, birinci nəşr: Küveyt, 1408

Əhməd ən-Nəsəi, “Sunən ən-Nəsai”, Məktəbul-Mətbuat əl-İsləmiyyə, ikinci nəşr: Hələb, 1406/1986

Əhməd ən-Nəsəi (İbn Əbi Xeysəmə), "ət-Tərix əl-Kəbir əl-Məruf bi Tərix İbn Əbi Xeysəmə", əl-Fəruq əl-Hədisə, birinci nəşr: Qahirə, 1427/2006

Əhməd ən-Niysəburi, "Təlxis Tərixi Neysəbur", Kitabxana İbn Sina, Tehran

Əhməd ət-Tahavi, "Şərh Məanil-Əsər", Dar Aləmil-Kutub, birinci nəşr: Riyad, 1414/1994

Əhməd ət-Tahavi, "Şərh Muşkilil-Əsər", Muəssəsətur-Risələ, birinci nəşr: Beyrut, 1415/1994

Əhməd Şakir, "əl-Bəis əl-Həsis Şərh İxtisar Ulumil-Hədis", Məktəbətul-Məarif, birinci nəşr: Riyad, 1416/1995

Əhməd əş-Şeybəni (İbn Əbi Asim), "əs-Sunnə", əl-Məktəb əl-İsləmi, birinci nəşr: Beyrut, 1400

Əhməd əl-Utəki, "əl-Bəhr əz-Zəxxar əl-Məruf bi Musnədil-Bəzzər", Məktəbətul-Ulum val-Hikəm, birinci nəşr: Mədinə, 1418/1997

Əhməd əl-Yaqubi, "Tarix Əhməd bin Əbi Yaqub bin Cəfər bin Vəhb ibn Vadih əl-Kətib əl-Abbası əl-Məruf bil-Yaqubi", Brill nəşriyyatı, Leiden, 1883

Əli əd-Dəraqutni, "əl-İlzəmət vat-Tətəbbu", Darul-Kutubil-İlmiyyə, ikinci nəşr: Beyrut, 1405/1985

Əli əd-Dəraqutni, "əl-Mutəlif val-Muxtəlif", Darul-Ğarb əl-İsləmi, birinci nəşr: Beyrut, 1406Ə1986

Əli əd-Diməşqi (İbn Asəkir), "Tərixu Mədinəti Diməşq", Darul-Fikr, birinci nəşr: Dəməşq, 1415/1995

Əli əl-Əsfəhəni (Əbul-Fərac), "Kitəbul-Əğani", Daru Sadir, üçüncü nəşr: Beyrut, 1429/2008

Əli əl-Əndəlusi (İbn Həzm), "Cəmhəratu Ənsəbil-Arab", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1403/1983

Əli əl-Heysəmi, "Buğyətul-Bəhis an Zəvaidi Musnəd əl-Həris", Mərkəzu Xidmətis-Sunən vas-Sira ən-Nəbəviyyə, birinci nəşr: Mədinə, 1413/1992

Əli əl-Qurtubi (İbnul-Battal), "Şərh Sahih əl-Buxari", Məktəbətur-Ruşd, ikinci nəşr: Riyad, 1423/2003

Əli əs-Sə'di (İbnul-Mədini), "əl-İlləl", əl-Məktəb əl-İsləmi, ikinci nəşr: Beyrut, 1401/1980

Əli əl-Məvardi, "əl-Əhkəmus-Sultaniyyə val-Viləyət əd-Diniyyə", Məktəbətu Dar İbn Quteybə, birinci nəşr: Küveyt, 1409/1989

İbrahim əl-Buqa'i, "ən-Nukət əl-Vafiyyə bimə fi Şərh əl-Əlfiyyə", Məktəbətur-Ruşd, birinci nəşr: Riyad, 1428/2007

İbrahim əl-Cəvzəcəni, "Əhvalur-Ricəl", Muəssəsətur-Risələ, birinci nəşr: Beyrut, 1405/1985

İbrahim əş-Şirazi, "əl-Lumə'u fi Usulil-Fiqh", Darul-Kutubil-İlmiyyə, üçüncü nəşr: Beyrut, 1424/2003

İbrahim əl-Yə'muri, "əd-Diybəc əl-Muzhəb fi Mərifəti Əayən Uləmə əl-Məzhəb", Darut-Turas lit-Tab'i van-Nəşr, Qahirə

Ignaz Goldziher,"Muslim Studies", S.M. Stern və C.R.Barber'in alman dilindən ingilis dilinə tərcüməsi, Aldine Atherton, Chicago, 1971

Ignaz Goldziher, "Tagebuch", E.J.Brill Publishing: Leiden, 1978

İsmayıl əd-Diməşqi (İbn Kəsir), "əl-Bəis əl-Həsis ilə İxtisar Ulumil-Hədis", Darul-Kutubil-İlmiyyə

İsmayıl əd-Diməşqi (İbn Kəsir), "əl-Bidəyə van-Nihəyə", Daru Həcər, birinci nəşr: Cizə, 1417/1997

İyad əl-Yəhsubi (əl-Qadi İyad), "İkməlul-Mu'lim bi Fəvaid Muslim", birinci nəşr: Misir, 1419/1998

İyad əl-Yəhsubi (əl-Qadi İyad), "əş-Şifə bi Tərifi Huquq əl-Mustafə", Dar İbn Həzm, birinci nəşr: Beyrut, 1423/2002

İyad əl-Yəhsubi (əl-Qadi İyad), "Tərtibul-Mədərik va Təqribul-Məsəlik li Mərifəti Əaləm Məzhəbi Məlik", Vazəratul-Əvqaf vaş-Şuunil-İsləmiyyə, ikinci nəşr: Məğrib, 1403/1983

əl-Hakim ən-Niysəburi, "əl-Mədxal ilə Kitəbil-İklil", Dar İbn Həzm, birinci nəşr: Beyrut, 1423/2003

əl-Hakim ən-Niysəburi, “Mərifətu Ulumil-Hədis”, Darul-Kutubil-İlmiyyə, ikinci nəşr: Beyrut, 1397/1977

əl-Hakim ən-Niysəburi, “əl-Mustədrak aləs-Sahiheyn”, Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1411/1990

Həməd əl-Xattabi, “Ğaribul-Hədis”, Darul-Fikr, birinci nəşr: Dəməşq, 1402/1982

Həmid əl-Xurasəni (İbn Zəncəveyh), “Kitəbul-Əmval”, Mərkəz əl-Məlik Feysal lil-Buhus vad-Dirasət əl-İsləmiyyə, birinci nəşr: Riyad, 1406/1986

əl-Həsən əl-Askəri, “Təshifətul-Muhəddisin”, əl-Mətbə’ətul-Arabiyyətul-Hədisə, birinci nəşr: Qahirə, 1402/1982

əl-Həsən əl-Əşyəb “Cuz’un fihi Əhədisu Əbi Əli əl-Həsən bin Musa əl-Əşyəb”, Dar Ulumil-Hədis, birinci nəşr: Fuceyra, 1410/1990”

əl-Həsən ər-Raməhurmuzi, “əl-Muhəddis əl-Fəsil beynər-Ravi val-Vaiy”, Darul-Fikr, üçüncü nəşr: Beyrut, 1404

əl-Huseyn əl-Cəvzəqani, “əl-Əbətil val-Mənəkir vas-Sihəh val-Məşəhir”, Darus-Səmi’i, dördüncü nəşr: Riyad, 1422/2002

əl-Huseyn ət-Tibi, “Şərhut-Tibi alə Mişkət əl-Məsabih”, Məktəbətu Nəzər Mustafa əl-Bəz, birinci nəşr: Məkkə, 1417/1997

əl-Huseyn əz-Zeydəni, “əl-Məfətih fi Şərhil-Məsabih”, İdəratus-Səqafətil-İsləmiyyə, birinci nəşr: Küveyt, 1433/2012

Xalil əl-Aləi, “Cəmi’ut-Təhsil fi Əhkəmil-Mərasil”, Dar Aləmil-Kutub, ikinci nəşr: Beyrut, 1407/1986

Xalil əl-Aləi, “ət-Tənbihət əl-Mucmələ aləl-Məvadi əl-Muşkilə”, Məktəbətul-Ulum val-Hikəm, birinci nəşr: Mədinə, 1412/1991

Xalil əl-Qazvini (Əbu Yalə əl-Xalili), “əl-İrşad ilə Mərifəti Uləmə əl-Hədis”, Məktəbətur-Ruşd, birinci nəşr: Riyad, 1409

Karim Samji, “Studies in Arabic Literary Papyri”, Utah Universiteti, avqust 2008

əl-Qasim əl-Həravi, “Ğaribul-Hədis”, əl-Mətabi əl-Əmiriyyə, birinci nəşr: Bulaq, 1404/1984

Mahmud əl-Ayni, "Umdətul-Qari Şərh Sahih əl-Buxari", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1421/2001

Mahmud Əbu Rayyə, "Ədva aləs-Sunnətil-Muhəmmədiyyə", Darul-Məarif, altıncı nəşr, Qahirə, 1994

Mahmud ət-Tanəhi, "Məqalətul-Alləmə əd-Duktur Mahmud Muhamməd ət-Tanəhi", Darul-Bəşəir əl-İsləmiyyə, birinci nəşr: Beyrut, 1422/2002

Malik bin Ənəs, "əl-Muvatta", Muəssəsətu Zəyid bin Sultan Al Nəhəyən lil-Aməl əl-Xeyriyyə val-İnsəniyyə, birinci nəşr: Əbu Zabi, 1425/2004

Muğlətay əl-Bəkçəri, "İkməlu Təhzibil-Kəməl fi Əsməir-Ricəl", əl-Fəruq əl-Hədisə, birinci nəşr: Qahirə, 1422/2001

Muhəmməd əl-Absi, "Suələt Muhəmməd bin Osman bin Əbi Şeybə li Əli bin əl-Mədini", Məktəbətul-Məarif, birinci nəşr: Riyad, 1404

Muhəmməd əl-Acurri, "Suələt Əbi Ubeyd əl-Acurri Əbə Davud əs-Sicistəni fil-Cərh vat-Tədil", Mədinə İslam Universiteti, birinci nəşr: Mədinə, 1403/1983

Muhəmməd əl-Albani, "Sahih əl-Cami əs-Sağir va Ziyədətuhu", əl-Məktəb əl-İsləmi, üçüncü nəşr: Beyrut, 1408/1988

Muhəmməd əl-Azami, "Dirasət fil-Hədis ən-Nəbəvi va Tərixi Tədvinih", əl-Məktəb əl-İsləmi, birinci nəşr: Beyrut, 1400/1980

Muhəmməd əl-Bağdadi (İbnun-Nədim), "əl-Fihtist", Darul-Mərifə, ikinci nəşr: Beyrut, 1417/1997

Muhəmməd əl-Basri (İbn Sad), "ət-Tabəqat əl-Kubra", Dar Sadir, birinci nəşr: Beyrut, 1968

Muhəmməd əl-Biruni, "əl-Cəməhir fi Mə'rifətil-Cəvahir", Cəmiyyətu Dairatil-Məarif əl-Usməniyyə, birinci nəşr: Heydərabad, 1355

Muhəmməd əl-Buxari, "əd-Duafə əs-Sağir", Məktəbətu İbn Abbas, birinci nəşr: Misir, 1426/2005

Muhəmməd əl-Buxari, "əl-Kunə", Muəssəsətu əl-Kutub əs-Səqafiyyə, birinci nəşr: Beyrut, 1986

Muhəmməd əl-Buxari, "ət-Tərix əl-Əvsət", Darul-Va'y & Məktəbətu Darit-Turas, birinci nəşr: Hələb, 1397/1977

Muhəmməd əl-Buxari, "ət-Tərix əl-Kəbir", Darul-Məarif əl-Usməniy-yə, birinci nəşr: Heydərabad

Muhəmməd əl-Busti (İbn Hibban), "Məşəhiru Uləmə əl-Əmsar", Da-rul-Vafə, birinci nəşr: əl-Mənsura, 1411/1991

Muhəmməd əl-Busti (İbn Hibban), "Sahih İbn Hibban", Muəssəsə-tur-Risələ, ikinci nəşr: Beyrut, 1414/1993

Muhəmməd əl-Busti (İbn Hibban), "əs-Siqat", Dəiratul-Məarifil-Us-məniyyə, birinci nəşr: Heydərabad, 1393/1973

Muhəmməd əl-Fəkihi, "Əxbəru Məkkə fi Qadimid-Dəhri va Hədisi-hi", Dar Xidir, ikinci nəşr: Beyrut, 1414

Muhəmməd əl-Humeydi, "əl-Cəm'u beynəs-Sahiheyn", Dar İbn Həzm – Darus-Sami'i, ikinci nəşr: Beyrut, 1423/2002

Muhəmməd əl-İşbili (İbnul-Arabi), "Aridatul-Əhvazi bi Şərh Sahih ət-Tirmizi", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1418/1997

Muhəmməd əl-İşbili (İbnul-Xayr), "Fihrist İbnil-Xayr əl-İşbili", Da-rul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1419/1998

Muhəmməd əl-Kələbəzi, "Bəhrul-Fəvaid əl-Məşhur bi Məanil-Əx-bər", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1420/1999

Muhəmməd əl-Qeysi (İbn Nəsiriddin əd-Diməşqi), "Tənvirul-Fikra Bi Hədis Bəhz bin Həkim fi Husnil-İşra" Dərut-Təvhid, birinci nəşr: Riyad, 1428/2008

Muhəmməd əl-Qurtubi, "əl-Cami li Əhkəmil-Quran", Darul-Kutu-bil-Misriyyə, ikinci nəşr: Qahirə, 1384/1964

Muhəmməd əl-Quşeyri (İbn Dəqiqil-İd, "Şərhul-İlməm bi Əhədis əl-Əhkəm", Darun-Nəvadir, ikinci nəşr: Suriya, 1430/2009

Muhəmməd əl-Maqdisi, "Əhsənut-Təqasim fi Mərifətil-Əqalim", Brill nəşriyyatı: Leiden, 1904

Muhəmməd əl-Mədəni (İbn İshaq), "Kitəbus-Siyəri val-Məğazi", Da-rul-Fikr, birinci nəşr: Beyrut, 1398/1978

Muhəmməd əl-Məziri, "əl-Mu'lim bi Fəvaid Muslim", əl-Muəssəsə əl-Vataniyyə lit-Tərcumə vat-Təhqiq vad-Dirasət – Beytul-Hikmə, Tunis, 1991

Muhəmməd ər-Rumi, "Şərhu Məsabih əs-Sunnə", İdəratus-Səqafətil-İsləmiyyə, birinci nəşr: Küveyt, 1433/2012

Muhəmməd əs-Səxavi, "əd-Davul-Ləmi li Əhlil-Qarnit-Təsi", Darul-Cil, birinci nəşr: Beyrut, 1412/1992

Muhəmməd əs-Səxavi, "əl-Əcvibətul-Mərdiyyə fimə Suilə əs-Səxavi anhu minəl-Əhədis ən-Nəbəviyyə", Darur-Rayə, birinci nəşr: Riyad, 1418

Muhəmməd əs-Səxavi, "əl-Ğayə fi Şərhil-Hidəyə fi İlmir-Rivayə", Məktəbətu Əvlədiş-Şeyx lit-Turas, birinci nəşr: Cizə, 2001

Muhəmməd bin İdris əş-Şafi, "Kitəb əl-Umm", Darul-Mə'rifə, saysız nəşr: Beyrut, 1410/1990

Muhəmməd əş-Şəvkəni, "İrşədul-Fuhul ilə Təhqiqil-Haqq min İlmil-Usul", Darul-Kitəb əl-Arabi, birinci nəşr: Qahir, 1419/1999

Muhəmməd əş-Şeybəni, "əl-Huccətu alə Əhlil-Mədinə", Dar Aləmil-Kutub, üçüncü nəşr: Beyrut, 1403

Muhəmməd ət-Tabəri, "Cəmi'ul-Bəyən fi Təvilil-Quran", Muəssəsətur-Risələ, birinci nəşr: Beyrut, 1420/2000

Muhəmməd ət-Tabəri, "əl-Muntəxab min Zeylil-Muzəyyəl", Muəssəsətul-Əaləmi lil-Mətbuat, birinci nəşr: Beyrut, 1358/1939

Muhəmməd ət-Tabəri, "Tərix ər-Rusul val-Muluk", Darut-Turas, ikinci nəşr: Beyrut, 1387/1967

Muhəmməd ət-Tirmizi, "əl-İləl əs-Sağir", Dar İhyə ət-Turas əl-Arabi, birinci nəşr: Beyrut, 1357/1938

Muhəmməd əl-Uqeyli, "əd-Duafə əl-Kəbir", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1404/1984

Muhəmməd əz-Zəhəbi, "Mizənul-İtidəl", Darul-Mərifə, birinci nəşr: Beyrut: 1382/1963

Muhəmməd əz-Zəhəbi, "əl-Muğni fid-Duafə", Dar İhyə ət-Turas əl-İsləmi, saysız nəşr: Qatar

Muhəmməd əz-Zəhəbi, "Siyər Əaləmin-Nubələ", Muəssəsətur-Risələ, üçüncü nəşr: Beyrut, 1405/1985

Muhəmməd əz-Zəhəbi, "Tərixul-İslam", Darul-Kitəb əl-Arabi, ikinci nəşr: Beyrut, 1413/1993

Muhəmməd əz-Zəhəbi, "Təzkiratul-Huffəz", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1419/1998

Muhəmməd əz-Zərkəşi, "əl-İcəbə li İradi mə-Stədrakəthu Aişə aləs-Sahabə", Məktəbətul-Xanəci, birinci nəşr: Qahirə, 1421/2001

Muhəmməd əz-Zərkəşi, "ət-Təzkira fil-Əhədis əl-Muştəhira", Darul-Kutubil-İlmiyyə, birinci nəşr: Beyrut, 1406/1986

Muhəmməd əz-Zurqani, "Şərhuz-Zurqani alə Muvatta əl-İməm Malik", Məktəbətus-Səqafə əd-Diniyyə, birinci nəşr: Mədinə, 1424/2003

Muhəmməd əz-Zur'i (İbnul-Qayyim), "əl-Mənər əl-Munif fit-Tashih vat-Təd'if", Məktəbətul-Mətbuatil-İsləmiyyə, birinci nəşr: Hələb, 1390/1970

Muhəmməd əz-Zur'i (İbnul-Qayyim), "Zədul-Məad fi Hədyi Xayril-İbəd", Muəssəsətur-Risələ, iyirmi yeddinci nəşr: Beyrut, 1415/1994

Muhəmməd əl-Yəməni (İbnul-Vəzir), "əl-Avasim val-Qavasim fiz-Zəbbi an Sunnəti Əbil-Qasim", Muəssəsətur-Risələ, ikinci nəşr: Beyrut, 1412/1992

Mustafa Sabri, "Məvqiful-Aql val-İlmi val-Aləmi min Rabbil-Aləmin va İbədihil-Mursəlin", Dar İhyə ət-Turas əl-Arabi, ikinci nəşr: Beyrut, 1401/1981

Mustafa əs-Sibəi, "əs-Sunnətu va Məkənətuhə fit-Təşri əl-İsləmi", əl-Məktəbul-İsləmi, ikinci nəşr: Beyrut, 1402/1982

Nabia Abbott, "Studies in Arabic Literary Papyri", The University of Chicago Press, Chicago, 1967

Osman əş-Şəhrəzuri (İbnus-Saləh), "Mərifətu Ənva Ulumil-Hədis", Darul-Fikr, birinci nəşr: Suriya, 1406/1986

Osman əş-Şəhrəzuri (İbnus-Saləh), "Siyənətu Sahih Muslim", Darul-Ğarb əl-İsləmi, ikinci nəşr: Beyrut, 1408

Ömər əl-Cə'di, "Tabəqat Fuqahə əl-Yəmən", Darul-Qaləm, Beyrut

Ömər əl-Misri (İbnul-Muləqqin), "Muxtəsar İstidrak əl-Hafiz əz-Zəhəbi alə Mustədrak Əbi Abdilləh əl-Hakim", Darul-Asimə, birinci nəşr: Riyad, 1411

Sadi əl-Həşimi, "Əbu Zur'a ər-Razi va Cuhudu fis-Sunnə ən-Nəbəviyyə", Mədinə Universiteti, Mədinə, 1402/1982

Said əl-Cəvzəcəni, "Sünən Said bin Mənsur", Dərus-Sələfiyyə, birinci nəşr: Hindistan, 1403/1982

Süleyman əl-Əndəlusi (İbn Culcul), "Tabəqatul-Ətibbə val-Hukəmə", Muəssəsətur-Risələ, ikinci nəşr: Beyrut, 1425/1985

Süleyman əs-Sicistani, "Suələt Əbi Davud lil-İmam Əhməd bin Hənbəl fi Cərhir-Ruvati va Tədilihim", Məktəbətul-Ulum val-Hikəm, birinci nəşr: Mədinə, 1414

Süleyman ət-Tayəlisi, "Musnəd Əbi Davud ət-Tayəlisi", Dar Həcər, birinci nəşr: Misir, 1419/1999

Süleyman ət-Tufi, "əl-İntisarat əl-İsləmiyyə fi Kəşf Şubəh ən-Nəsraniyyə", Məktəbətul-Ubeykən, birinci nəşr: Riyad, 1419/1999

Süleyman ət-Tabərani, "əl-Mucəm əl-Əvsət", Darul-Harameyn, birinci nəşr: Qahirə: 1415/1995

Süleyman ət-Tabərani, "əl-Mucəm əl-Kəbir", Məktəbətu İbn Teymiyyə, ikinci nəşr: Qahirə

Tahir Hüseyn, "Əbul-Valid Süleyman bin Xaləf əl-Bəci va Kitəbuhu ət-Tədil vat-Təcrih limən Xarrəcə ləhu əl-Buxari fil-Cami əs-Sahih", Darul-Liva, birinci nəşr: Riyad, 1406/1986

Yaqub əl-Fəsəvi, "əl-Mərifə vat-Tərix", Muəssəsətur-Risələ, ikinci nəşr: Beyrut, 1401/1981

